*Bu kitab "**Əkrəm Əylisli.** Seçilmiş əsərləri, 2 cilddə"*
*(Bakı, Azərnəşr, 1987) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.3613 - dc 21**
**AZE**
**Əkrəm Əylisli. Seçilmiş əsərləri.** Bakı, "Şərq-Qərb", 2004, səh 368.

Öz səsi, öz nəfəsi ilə "60-cı illər Azərbaycan nəsri"nin təşəkkülündə bilavasitə iştirak edən yazıçı Əkrəm Əylislinin əsərləri mənəvi-əxlaqi axtarışlar və lirik-psixoloji təhlillər ədəbiyyatının uğurlarının ifadəsi olan bədii söz abidələri sırasındadır. Onun əsərlərində həyat var, insan var, talelər var. Bizim bədii-obrazlı fikrin tarixində artıq klassik peyzajlar sırasına daxil olmuş Buzbulaq həmin əsərlərdəki hadisələrin cərəyan etdiyi konkret bir kənddir.

Əkrəm Əylislinin "həyat şirəsi ilə dolu olan dəqiq və realist nəsri" çay kimi sakit, təmkinlə bir əsərdən o birinə axaraq, süjet sahilləri olmayan özünəməxsus bir məkan yaradır.

Bu kitabda görkəmli nasirin seçilmiş povest və hekayələri toplanmışdır.

**ISBN 9952-418-10-5**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## ÖN SÖZ YERİNƏ

...Hər şeydən çox, dağlar yadımda qalıb.
Bir də günəş yadımda qalıb.
Bir də orası yadımdadır ki, bir zaman gün çıxanda dağlar gülümsərdilər.

Dağların gülümsəməyi hərdən yuxuma girir və hərdən yuxumda dağlar gülümsəyəndə mən dünyada saysız-hesabsız rənglər görürəm. Mənə elə gəlir ki, o rənglərin hamısını haçansa, doğrudan da, görmüşəm. Mənə elə gəlir ki, o rənglərin çoxusunu yavaş-yavaş, yaşaya-yaşaya itirmişəm. Hər dəfə əlimə qələm götürəndə o rənglərin hansınısa tapacağıma ümidim olur. Mən kəndə, uşaqlıq çağlarıma bilə-bilə qayıtmıram. O çağlar ki, dağlar gülümsərdilər, o çağlar ki, dünyada saysız-hesabsız rənglər vardı.

O çağdan nə qədər keçib – bilmirəm. Doğulduğum kəndə sonralar da çox getmişəm, ancaq dağlar mənim üzümə ovaxtkıtək gülümsəməyiblər. Yəqin ki, dağlar dağ qoynunda doğulanların üzünə haçansa cəmisi bircə dəfə o təhər gülümsəyirlər. Elə gülümsəyirlər ki, dağ qoynunda doğulanlar dağları heç vaxt unuda bilməsinlər.

Dünyada haçansa mənim işıqlı dağlarım vardı... O dağlar indi də var, ürəyim işıqsızlayanda o işığı axtarıram. Doğulduğum, böyüdüyüm kəndi mən hələ də o işıqda görürəm. Onsuz kənd yekrəng olur, adi olur; evlər də eyni rəngdə, yollar da eyni rəngdə... Evlərdən yollara açılan qapıların az qala hamısının eyni rəngdə olduğunu mən sonralar dönə-dönə gözlərimlə görmüşəm. Ancaq mənim təsəvvürümdə kənddəki hər qapının öz rəngi qalıb. Bu rəngləri, məndən ötrü, o qapılardan girib-çıxan adamlar yaradıblar: yaxşıların qapısı açıq rəngdə, pislərin qapısı tutqun rəngdə... Dünyada ağappaq bir qapı var, çünki haçansa o qapıdan ağappaq bir qız çıxardı. Dünyada qapqara bir qapı var, çünki dünyanın birinci qara kağızını bir vaxt o qapıya gətirmişdilər... Haradasa bir ev var. O evdən hər axşamçağı təptəzə təndir çörəyinin iyi gələrdi. O evin qapısının kənddəki onlarca boz qapılardan biri olduğunu görəndə mən hələ də təəccüb eləyirəm. Necə də təəccüb eləməyim?! Axı qızmar təndir boz rəngdə olmur və haçansa axşam çağları, o təndirdə bişə-bişə, ətri dünyanı dolduran çörək də boz deyildi: bir az qəhvəyi, bir az qırmızımtıl. Və o qapı mənim təsəvvürümdə məhz bu rəngdə qalıb qəhvəyi-qırmızımtıl rəngdə. Üstəlik, həmin o axşam çağları da: havasından çörək iyi gələn o axşam çağları da haradasa ən isti üfüqlərdə, məndən ötrü, bu günəcən yaşayırlar – təndir rəngli, çörək rəngli qəhvəyi-qırmızımtıl axşamçağları...

Dünyada bir çeşmə var. O çeşmənin qırağında bir ağappaq qız kölgəsi donub qalıb. Kölgə ağ olmur – bilirəm. O qızın çıxdığı qapı da kənddəki onlarca boz qapının biri idi. Ancaq, indi də o qapının qabağından keçəndə mən haradasa bir ağ qapı görürəm. O çeşmənin, o kölgənin yanından kövrəlmədən ötüb keçdiyim olmayıb. Doğulduğum kənd mənim üçün həm nağıldır, həm gerçəklik. Həm də xəyali bir adadır: şəhər uşaqlarının xəyali adaları kimi. Fərq bircə burasındadır ki, uşaqlar böyüyürlər, adanı unudurlar, mənim adam isə, mən yaşa dolduqca, daha qəribə olur, daha sehrli olur...

*1968*





# TƏNHA NARIN NAĞILI*

## I

Dava qurtaran o il, hələ Yaqub əsgərlikdən qayıtmamış, mən yay tətilinə çıxıb, beşinci sinif şagirdi olduğuma görə məktəbdən sevinə-sevinə evə qayıdanda Nabat xala qapımızın qabağında rastıma çıxdı və çeşmədən gətirdiyi dolu güyümu divara dirəyib çox ciddi bir tərzdə xəbər verdi ki, daha mənim küçələrdə veyillənmək vaxtım qurtarıb. Nabat xala kolxoz zəmilərində taxıl yığılandan sonra yerə tökülən sünbüllərdən danışdı; bağlarda qoz ağaclarının dibində nə qədər odun yatdığını söylədi, üstəlik, bizim küçə qapısının böyründəki yekə qarışqa yuvasını və yuvanın ağzından, qara zolaq kimi, divar boyunca düzülüb gedən qarışqa axınını göstərib, mənə nağıla oxşayan bir şey də danışdı: guya orda – divarın dibindəki o dar deşikdə hər qarışqanın düz on illik qış ruzusu vardı... Nabat xala dedi ki, əgər mən ağıllı uşaq olsam, bu yay zəmilərdən bir çuval taxıl yığa bilərəm, xeyli odun gətirərəm, ərikdən, alçadan rastıma nə çıxsa, üç-üç, beş-beş gətirib dama ataram və qışda ciblərimə doldurub məktəbdə ləzzətlə yeyərəm. Sonra o mənə sünbül yığmağın təhrini öyrətdi, hətta odunun hansı bağlarda daha çox olduğunu da dedi; məktəbdə dörd saatlıq dərsdən və uzun-uzadı "tətil iclası"ndan sonra mən özümü həyətimizdəki fındıq kollarının sıx yerinə verməyə nə qədər tələssəm də, axıracan dözüb, onun dediklərinə qulaq asdım.

Ancaq, məsələ bununla qurtarmadı. Hələ yayın ən şıdırğı vaxtları, istidən yer-göy alışıb yananda Nabat xala məni qışla qorxutmağa başladı: "Burda niyə durmusan, bala, qabaqdan qara qış gəlir!" "Qabaqdan qara qış gəlir, a bala, nə küçədə veyillənirsən?.." O yay Nabat xala küçələrdə mənə göz verdi işıq vermədi. Hər görəndə danladı, sıxma-boğmaya saldı. Nəhayət, mən doğrudan da qorxmağa başladım: sanki o il qış gəlməyəcəkdi, o qışın əvəzində kəndimizə nəsə qara, qorxunc bir şey gələcəkdi.

Əgər desəydilər ki, təzədən müharibə başlanacaq, bu məni Nabat xalanın o sözləri kimi qorxutmazdı. Çünki "qara" və "qış" sözlərini, bircə Allah bilir, Nabat xala necə dəhşətlə deyirdi. Hər deyəndə də

* "Adamlar və ağaclar" trilogiyasından

üzünü ən uzaq dağlara tuturdu. Bu qorxunc sözləri eşidəndə, o uzaq dağlara baxanda mənə elə gəlirdi ki, haradasa – yalnız Nabat xalaya məlum olan bir yerdə dağların dalında qara, qorxunc bir şey gizlənib və həmin şey bir gün qəfilcədən bizim kəndin üstünə gələcəkdir.

Küçəmizin ən sərin yeri çeşmənin qırağı idi. Bütün məhəllə uşaqlarının toplaşdığı o sərin yeri Nabat xala mənim gözümdən salmışdı. Çünki mən, daha çox dənə yığmaq üçün, əriyi min müsibətlə qarnıma doldurub, dənələrini aparıb küçədə uşaqlarla "çuxuraatma"[*] oynayanda, oyunun ən şıdırğı yerində Nabat xalanın qara çadrası küçənin o başında görünürdü. Öz qara çadrasında Nabat xala bir qara-qorxu kimi çeşmənin üstünə gəlirdi. Xırdaca sünbül torbasını o, ağzınacan çör-çöplə dolu olan vedrəsinin üstünə qoyurdu. Nabat xala təri süzülə-süzülə çeşmənin qırağında əyləşirdi və sərin suyu ovuc-ovuc doldurub üzünə çırpırdı. Sonra Nabat xala ağzını daş novçaya dirəyirdi: bu vaxtlar su onun damarları görünən arıq boğazının hülqumundan qurtaqurt qarnına gedirdi və ağzının qıraqlarından süzülüb, çənəsindən axaraq canına tökülürdü. Adətən bundan sonra Nabat xala mənim üstümə düşürdü. Bəzən mən onu görən kimi qaçıb gizlənirdim, o mənim dalımca deyinirdi. Bəzən də Nabat xala heç nə demirdi, ancaq su içib sərinləyəndən sonra çiynini çeşmənin qırağındakı tut ağacına söykəyib, bir parça qəzetin arasında özünə papiros eşə-eşə mənim üzümə baxmaqla demədiyinin əvəzini üçqat çıxırdı.

Heç bilmirəm sonra necə oldu ki, Nabat xala məndən əl çəkdi. Bəlkə mənim hər dəfə onu görəndə qaçıb gizlənməyim qarıya pis təsir elədi. Bəlkə o, kolxoz qarovulçusu Dəli Əvəzin bağa gedən uşaqları necə döydüyünü öz gözləri ilə görüb inandı ki, bu, o qədər də asan məsələ deyil. Bəlkə də Nabat xala yəqin elədi ki, məndən adam çıxmayacaq: çox güman ki, belə də oldu, çünki belə olmasaydı, mənimlə rastlaşanda o, verdiyim salamısa da alardı.

Payızın ortalarında Nabat xalanın oğlu Yaqub əsgərlikdən qayıtdı. Elə gəldiyi günün axşamı o öz qara əsgər çəkmələrindəcə divardan tullanıb tappıltı ilə bizim eyvanın qabağına düşdü. Sanki Yaqub davadan gəlmişdi. Sanki aradan dörd-beş il keçməmişdi, dörd gün keçmişdi, beş gün keçmişdi. Qısaca salam-kalamdan sonra Yaqub əsgər şalvarının qozla, fındıqla dolu olan qarınlamış ciblərini şaqqıldada-şaqqıldada həyətdə gəzib, məni danlamağa başladı. Çünki mən, yekə oğlan ola-ola, həyətimizdəki ağacların quru budaqlarını sındırıb tökməmişdim. Mən həyəti vaxtlı-vaxtında suvarmamışdım, buna görə də divarın dibindəki ərik ağaclarından biri qurumuşdu. Həyətdə ot çürümüşdü, onu vaxtında biçmək lazım idi. Kəsilmiş ağacların kötüklərini çıxardıb, yerlərində təzə ağaclar basdırmaq lazım idi. Yaqubun dediyinə görə, mən o qədər yekə oğlan idim ki, əgər qeyrətim olsaydı, gərək yazda bütün həyəti belləyib əkmiş olaydım...



Həyətdə lovğa-lovğa dolanıb, hər şeydə bir nöqsan axtaran Yaqub, kənarda durub, fikirli-fikirli baxan, bütün bu söhbətdən aşkar xoşu gəlməyən bibimə heç bir əhəmiyyət vermədən, evimizin divarından qopub sallanan bir yekə suvaq parçasını çəkib yerə saldı. Divarın dibindəki laxlamış pilləkənə bir güclü təpik ilişdirib, cibindəki qozu, fındığı dübarə şaqqıldatdı. Nədənsə o, bircə pəncərəmizə fikir vermədi: bir vaxt altı gözü olan və altı sapsağ şüşəsi olan pəncərənin indi büsbütün şüşəsiz qaldığını elə bil heç görmədi də. Sonra Yaqub getdi. Ayağını laxlamış pilləkənin üstünə qoymamaq üçün divarın böyrü ilə sürüşə-sürüşə, şalvarının cibindəki qozu, fındığı şaqqıldada-şaqqıldada getdi. Yaqub gedəndən sonra xeyli vaxt onun küçədə dişinə salıb sındırdığı qoz-fındığın xırçıltısı eşidildi və o xırçıltıya qulaq asa-asa mən bir vaxt Nabat xalanın bibimin gözünün altındakı qara ləkəyə baxıb, başını yırğalaya-yırğalaya dediyi sözləri xatırladım: "Bah, bah... yazıq Mədinə! Yaqub səni bu gündə görsəydi, bağrı çatlardı. Anası ölmüş səndən yana dəli-divanəydi..."

Əsgərlikdən qayıdandan ikicə gün keçməmiş Yaqub gedib haradansa bir qara və qıvraq eşşək alıb gətirdi. Bundan sonra mənim küçəyə çıxmağım, çeşmənin yanında uşaqlarla oynamağım daha da çətinləşdi. Çünki öz qara və qıvraq eşşəyi ilə Yaqub hər deqiqəbaşı gəlib bizim küçədən keçirdi. Dəyirmana gedirdi, dəyirmandan gəlirdi, kolxozun anbarına ot daşıyırdı, məktəbin həyətinə odun aparırdı və hər dəfə məni küçədə görəndə üstümə qışqırmamış ötüşə bilmirdi: "*Bir də səni burda görsəm, ağzını cıraram, avaranın biri avara!*".

Yaqubun hədə-qorxusundan əsla qorxmasam da, hər dəfə bu sözləri eşidəndə mən hər şeyi buraxıb evə qaçmalı idim. Çünki Yaqub böyük idi: böyüyün sözünü yerə salmaq olmazdı. İkincisi, böyüklərin küçədə bir kəsin üstünə qışqırmağı o deməkdi ki, mən səni özümə yaxın adam bilirəm, yad adamın, özgə adamın özgənin uşağı ilə nə işi vardı?.. Yaqub mənim üstümə qışqırırdısa, deməli, o mənim qohumum idi – hər halda uşaqlar belə hesab eləyirdilər. Mən istəyirdim ki, uşaq-

lar həmişə belə hesab eləsinlər; mən istəmirdim ki, uşaqlar məni kimsəsiz bilsinlər, buna görə də heç vaxt Yaqubun sözündən çıxmırdım.

Əgər camaat mənim çantama yığdığım, taxçalarımızda, eyvanımızda, pəncərəmizin qabağında, hər yerdə səpələdiyim, içərisi neçə illərdən bəri mənə dərs deyən müəllimlərin yoğun, qırmızı karandaşları ilə yazılmış yekə-yekə, yoğun-yoğun, qırmızı-qırmızı "5"lərlə dolu olan dəftərlərimə büsbütün göz yumub, məni az qala bütün məhəllənin ən aciz uşağı hesab eləməsəydi, bəlkə də mən həyətimizdəki bəzi xırda-xuruş işləri görərdim. Məsələn: fındıqdan haça kəsərdim, elə yerdəcə dayanıb ağaclardakı quru odunları qırıb tökərdim. Yaxud döşdə, sumaq kollarının üstündə nə vaxtdan bəri qızara-qızara qalmış sumağı yığıb qurudardım. Ancaq mən heç bir iş görmürdüm, elə bir qəsdən iş görmək istəmirdim.

Dərsdən qayıdandan sonra çox vaxt mən çantamı atıb, bibimin məndən ötrü sulayıb qoyduğu arpa lavaşını təknədən götürürdüm. Heç kəsin gözünə görünməmək üçün qonşu hasarının dibi ilə əyilə-əyilə dağın döşünə qalxırdım. Orada, heç kəsin görmədiyi bir yerdə isti qumun üstünə uzanırdım, çörəyimi yeyirdim və saatlarla kəndə tamaşa eləyirdim.

Mən dağın döşündən bütün kəndi görürdüm, bir yanda – boz torpaqlı damlar, balaca həyətlər, bağçalar; o biri yanda – ucsuz-bucaqsız kolxoz bağları, zəmiləri... Boz torpaqlı damlardı. Axşam çağları arvadlar quru meyvəni yığmaq üçün damlara çıxırdılar. Axşam çağları həyətlərdən tüstü qalxırdı: dadlı tüstü, dadsız tüstü; səhər məktəbə buğda lavaşının içində kartof qızartması, badımcan dolması gətirən uşaqların həyətlərindən qalxan tüstünü mən dadlı hesab eləyirdim, o tüstülərdə kartof qızartmasının, badımcan dolmasının iyini duyurdum. Mən damları iki yerə bölürdüm: davadan gələnlərin damı, davadan gəlməyənlərin damı və bu vaxtlar davanın qurtarmağına heç cür inana bilmirdim, halbuki təzə çıxan kitabların çoxunda bu barədə öz gözümlə nə qədər yazı oxumuşdum, nə qədər şəkil görmüşdüm.

Bəzən mənə elə gəlirdi ki, dava tədricən qurtaracaqdır, bunun üçün birinci növbədə atam əsgərlikdən gəlməli idi. Sonra, mütləq, kolxoz sədrimiz Murtuz dayı gəlməli idi: onsuz müharibənin qurtarmağını təsəvvür eləmək olmurdu. Çünki bir vaxt Murtuz dayı buradaca, xəlvətlikdə dayanıb durbinlə damlara baxardı. Sonra evlərin qabağında hay-küy düşərdi. Axı, Murtuz dayı kimin həyətində neçə ağac



olduğunu əzbər bilirdi – damda meyvə çox idisə, deməli, kolxozdan oğurlanmışdı. Murtuz dayı kolxozdan meyvə oğurlayanları bərk-bərk hədələyirdi, öz qırmızı cib dəftərçəsinə nəsə yazırdı. Sonra Murtuz dayı yoluna düzəlirdi. Belindəki qara durbinə baxmaq üçün biz onun dalınca axışırdıq. O, bizə heç vaxt acıqlanmırdı, çünki bizdə "kapitalist qalığı" yox idi, çünki bir vaxt biz də kolxozçu olacaqdıq, ancaq kolxozun meyvəsini oğurlamayacaqdıq.

1 mayda, 7 noyabrda məktəblilər "Urra!" deyə-deyə küçələrdən keçəndə Murtuz dayı həmişə uşaqların arasında olardı. Biz, "cülلütlər", biz "kolxoz çörəyi ilə böyüyənlər", biz "kapitalist qalığı olmayanlar" sevinə-sevinə sirli, qara durbinin dalınca qaçardıq və Murtuz dayı əl eləyib bizi qızışdırardı. O da "urra!" deyərdi, biz də "urra!" deyərdik, beləcə "urra!" deyə-deyə gedib kolxoz idarəsinin qabağına yığışardıq. Kolxoz idarəsinin qabağında Leninin heykəlinin yanında Murtuz dayı eynən Lenin kimi pencəyinin düyməsini açıb, bir əlini də qabağa uzadıb ucadan danışardı, biz əlimizin qabığı gedənəcən çəpik çalardıq, boğazımız qaşınanacan "urra!" deyərdik.

Ancaq çox vaxt Murtuz dayının gəlməyi ilə də mən davanı bitmiş hesab eləyə bilmirdim. Fikirləşirdim ki, gərək Azərin ağ köynəkli atası da mütləq qayıdıb gəlsin. Gərək tar çalmaq öyrənənlər axşam çağları klubun eyvanında bir-birinin yanına düzülsün və Azərin atası eyvanda gəzə-gəzə onlara tarı necə çalmaq barədə göstəriş versin. Gərək hər axşamçağı Azərin ağ köynəkli atası gəlib küçədən keçsin və küçədəki balaca qızları bir-bir qucağına alıb oynatsın – o, oğlanlarla heç vaxt oynamırdı, mənim özümü də heç vaxt qucağına almamışdı, ancaq mən inanmırdım ki, o gəlməmiş dava qurtara bilər.

Dağın döşündən çinarın dibi görünürdü: ən çox adam olan yer! Vaxt vardı ki, gün çəkilib gedən kimi Aslan baba "cavan uşaqlara su daşıtdırıb, oranı möhkəm-möhkəm suladardı, yaxşı-yaxşı süpürtdürərdi. İndi orada beş-altı qoca çiynini divara söykəyib otururdu; öskürürdü, əsnəyirdi, mürgüləyirdi; hər axşamçağı orada eyni yerdə, eyni səki üstündə oturub, çəliyinin bir ucunu yerə dirəyib fasiləsiz fırladan Aslan baba da elə bil davanın qurtarmağını gözləyirdi. Gözləyirdi ki, "cavan uşaqlar" əsgərlikdən qayıdıb gəlsin, onlara əmr eləyib çinarın dörd bir yanını möhkəm-möhkəm sulatsın, hətta bununla kifayətlənməyib, çinarın dibindən məktəbin qabağınacan uzun, daşlı küçəyə də su səpdirsin. Ancaq "cavan uşaqlar" gəlib çıxmırdılar və Aslan baba

öz naxışlı əl ağacı ilə hər gün yerdə, torpağın üstündə beş-altı dərin deşik açıb gedirdi. Aslan babanın açdığı o deşikləri, yolum çinarın dibindən düşəndə, mən heroqlif yazıları kimi oxuyurdum. Yazırdı ki, dünya xarab olub – indinin uşaqları sözə baxmır; yazırdı ki, bu evi yıxılmış dava nə yaman uzun çəkdi, bəs bu zəhrimar nə vaxt qurtaracaq; yazırdı ki, darıxıram, ölmək istəyirəm, uşaqlar gəlsəydi, bu dünya ilə haqq-hesabı çürüdərdim... Səhərlər mal-davar otlamağa gedəndə dunya və dava barəsindhki o heroqlif yazıları tapdalanıb pozulurdu, sabahısı gün çinarın dibində təzə deşiklər açılırdı.

lardı, bulud az olanda odun çoxalardı. Ancaq, bundan asılı olmayaraq, nənəm odun gətirmək üçün o yekə başmaqları yenə zirzəmiyə sürüyərdi, çünki sobanın üstündəki xörək atam gələnəcən bişməli idi. Atam gələnəcən nənəm uzun-uzun nağıllar deyərdi, bir vaxt tuluğun üstündə Arazdan keçib ziyarətə getdiyi Məkkədən danışardı. Nənəmin dediyinə görə, Məkkədə Ay oğlan libasında idi, Günəş qız libasında idi. Hələ Məkkədəki Günəşin boynunda qızıl boyunbağı da vardı, ancaq Allaha inanmayanlar onu görə bilməzdi. Günəşin boynundakı qızıl boyunbağını yalnız behiştlik adamlar görə bilərdi və (*"yeri-göyü yaradan*

yəqin eləmişdim ki, nənəm çörək qazanmadığına görə yox, məhz Allahı istədiyinə görə atam ona başmaq almır.

Hər səhər mən gözümü açanda hirsli, qara çəkmələr sobanın altından yoxa çıxırdı və dəhlizdəki qorxunc bidon rayona çörək qazanmağa gedirdi. Bu hirsli axşamlardan sonra həmişə səhər açılırdı və o yekə başmaqları nənəm həyətə, tövləyə, zirzəmiy sürüyürdü. Yenə, atam gələnəcən, nənəm nağıl deyirdi. Məkkədən danışırdı və xörək qazanı sobanın üstündə sevinclə pıqqıldayırdı.

*Qarğanın o vaxtkı səsi hər şeydən cox o vaxtın axşam çağları ilə* bağlı idi, çünki o səsdə indi eşidilməyən neçə-neçə kişinin səsi vardı. O səsdə damlardan meyvə qurusu yığan arvadların o vaxtkı şən səsi vardı: arvadlar damdan-dama bir-biri ilə danışardılar. Həyətlərdə tut çırpanlar, alma-armud dərənlər hər yoldan keçəni çağırardılar: "Gəl, alma ye", "Gəl, armud ye"... "Gəl, tut ye" əvəzinə, adamlar: "Gəl, yemiş ye", – deyirdilər, çünki nənəmin dediyinə görə, "*tut ye*" sözü bir az ədəbsiz çıxırdı... Kişilər eyvanlardan bir-birini səsləyərdi. Kişilər arvadların üstünə qışqırardılar. Uşaqlar küçələrdə sevinə-sevinə o baş-bu başa qaçardılar. Qarğanın o vaxtkı səsi bu səslərə qarışardı. Bu səs, mənim təsəvvürümdə, unudulmayan, adsız bir nəğmə idi. Bu nəğməni o vaxtın axşam çağları oxuyardı. O vaxtın axşam çağları sanki böyük bir xor idi. İndi onda yüzlərcə səs çatışmırdı...

Uzaqda – kolxoz bostanındakı yaşıl çalanın üstündə bostançı oğlunun cır səsi hər axşamçağı dağlara düşürdü. Mən o səsdən o vaxtların səsini eşitmək istəyirdim. Quru meyvəni yığmaq üçün dama çıxan arvadlar bir-birindən hal-əhval soruşanda mən ürəkdən sevinirdim. Ancaq çox vaxt arvadlar susurdular. Sanki daha qışqırmağa, bağırmağa, söyüşməyə də söz yox idi: daha elə bil, heç kəsin iti heç kəsin həyətindən gön aparmırdı; elə bil ki, pişiklər cücə boğmağı tərgitmişdilər, toyuqlar hin azdırmağı unutmuşdular...

Axşam çağları arvadların çoxu çeşmənin qırağına doluşurdu. Nə qədər uzaqdan baxsam da, mən onların içində Yaqubun arvadını seçə bilirdim. Mənim Yaqubun arvadına bərk yazığım gəlirdi, çünki o, həddindən çox arıq idi, üzünün lap sümükləri çıxmışdı. Çünki Yaqub əsgərlikdən gələndən sonra Sədəf bacının bir gözü şişmişdi, elə şişmişdi ki, gözü açılmırdı. Sədəf bacının açıq gözündə şişmiş gözün necə ağrıdığı bilinirdi, ancaq o, heç vaxt çarqatını gözünün üstünə salmırdı. Elə bil Sədəf bacı öz şişmiş gözünü göstərib: "*Mənim ərim var*" – demək istəyirdi. Axı, indi çeşmədəki arvadların çoxunun əri yox idi...



Çeşmənin qırağında uşaqlar oynayırdılar, mən onların hamısını uzaqdan tanıyırdım. Mən onların bir neçəsinə ürəkdən nifrət eləyirdim, çünki onlar məktəbə buğda lavaşının içində dadlı-dadlı xörəklər gətirirdilər. Çünki onlar kimsəsiz arvadların su dolu vedrəsinə xəlvətcə torpaq atıb qaçırdılar; heç kəsi olmadığına görə Əzra xala vedrəsini neçə dəfə evə aparıb, çeşməyə gətirirdi, ancaq buğda lavaşı ilə badımcan dolması yeyənlərin ona rəhmi gəlmirdi...

Gün çeşmədən çəkiləndə naxır gəlirdi. Daha doğrusu, indi naxır yox idi, on-on beş inək vardı. Kəndin girəcəyində inəklər bir-bir dağılışırdılar. Onlar gedib tüstüsü dadlı olan həyətlərin qapısında mələyirdilər. Günün işığı bütün dağlardan çəkiləndə keçəl Səfər, pis söyüşlə, balaca-balaca quzuların anasını söyə-söyə gəlirdi. Keçəl Səfər çobanların ən balacası idi, birinci sinfə o bizimlə getmişdi, ancaq orada cəmisi bircə dərs oturmuşdu. Qulağının dibinəcən keçəl olduğuna görə, ikinci dərs başlananda Səfəri sinifdən çıxarmışdılar və o vaxtdan bəri mən Səfərə paxıllıq eləyirdim. İndi mən Səfərə daha çox paxıllıq eləyirdim, çünki onun xırdaca bir küçüyü də vardı. Küçüyün qulaqları təzəcə kəsilmişdi, hələ Səfər onun quyruğunu da kəsəcəkdi. Bu barədə danışanda Səfər zərrə qədər də qorxmurdu, ancaq mən gecə yatanda da o quyruğun barəsində fikirləşirdim: görəsən, Səfər küçüyün quyruğunu necə ürək eləyib kəsəcəkdi, kaş Səfər küçüyün quyruğunu kəsməyəydi...

Xırdaca küçük dağın döşü ilə quyruğunu oynada-oynada Səfərin dalınca qaçıb gözdən itəndən sonra da mən bir müddət öz yerimdə otururdum. Səfər kəndə enirdi, hər qapının qabağında bir dəfə bərkdən qışqırıb quzuları yiyələrinə tapşırırdı. Sonra quzuların da, Səfərin də səsi kəsilirdi. Sonra dağların döşündəki sarı işığın yerini boz bir kölgə tuturdu – bu vaxt mən dağdan enib, gəldiyim yolla da həyətimizə düşürdüm. Həyətə düşəndən sonra da mən ağacların dalında gizlənə-gizlənə hasar boyunca gedib, alçaq divardan ehmalca küçəyə atılırdım. Sonra küçə qapısını açıb təzədən həyətə girirdim. Mən təzədən həyətə girəndə küçə qapısını bərkdən çırpırdım ki, bibim eşitsin. Çünki mənim harada olmağımı çoban Səfərdən başqa heç kəs bilmirdi. Bibimin də bunu bilməyini istəmirdim. Həm də, mən küçədən nə qədər gec qayıtsam da, bibim bir söz demirdi, çünki onun Yaqubdan zəhləsi gedirdi. Yaqub mənim üstümə bağıranda bibimin bərk acığı

tuturdu. O, Yaquba heç nə demirdi, ancaq mənə deyirdi ki, Yaqubun sözünə baxma. Çox vaxt *bibim deyirdi ki, o bizə heç qohum deyil*, ya da deyirdi: bir balaca ata tərəfdən qohumluğu çatır. Ancaq mən Yaqubun sözünə baxmağa məcbur idim, çünki kimsəsiz olmaq bundan qat-qat pis idi. Hər halda buğda çörəyi ilə badımcan dolması yeyənlər bibimin su vedrəsinə torpaq atmağa cürət eləmirdilər, çünki Yaqub hər məni görəndə üstümə bağırırdı. Bir qapıdan yükü düşürtmək lazım olanda eşşəyin boynunu saxlamaq üçün Yaqub həmişə məni çağırırdı – bunun özü heç də az iş deyildi. Yaqub hamıdın güclü idi, hamıdan canlı idi, həm də bütün uşaqlar ondan qorxurdular. Yaqub mənim üstümə bağırmasaydı, mənə eşşəyin başını saxlatmasaydı, bəlkə də uşaqlar həyətimizə girərdilər, evimizə daş atardılar. Əgər Yaqub burada olsaydı, bəlkə, indi pəncərəmizin şüşələri də sağ-salamat idi, nə olsun ki, onda biz Müküşün evində qalırdıq; o sınıq şüşələrə baxanda mən həmişə bunu fikirləşirdim və Yaqub bizə nə qədər uzaq qohum olsa da, özümə söz verirdim ki, heç vaxt onun sözündən çıxmayım.

Bir dəfə dərsdən çıxıb evə qayıdanda Nabat xalanın göstərdiyi o uzaq dağın başında mən dağ kimi dayanmış bulud gördüm: yəqin ki, "*qış*" və "*qara*" deyilən şey o idi. O, doğrudan da dəhşətli idi, doğrudan da bizim kəndin üstünə gəlirdi: bir gecə xəbərsiz-ətərsiz gəldi, göyləri başdan-başa doldurdu, dağları basmarlayıb altına aldı, səhərlərin birində qoz ağacının başında qarğa qarıldayanda mənim onun qart səsindən ilk dəfə xoşum gəlmədi. İlk dəfə mənə elə gəldi ki, *qarğa qar istəyir, qarğa qar yağdıra bilər...*

Bir axşamçağı bibim işdən qayıdanda kolxoz massivindən bir qalaq gübrə kağızı gətirib, pəncərəmizdəki sınmış şüşələrin boş yerlərini saraltdı. Bir səhər qapımızın qabağındakı qara qarışqa zolağı yoxa çıxdı: onlar öz onillik ruzularını yeməyə getdilər.

Qış başlandı.

Müküşün uçub-dağılmış evindən biz iki dəst yorğan-döşək, bir köhnə palaz parçası, bir ayağı qırıq soba, bir də bir yeddilik çıraq gətirmişdik. Sobanı otağın tən ortasında qurub, sınıq ayağın yerinə bişmiş kərpic qalamışdıq. Yorğan-döşəyi, mən gözümü açandan, eyni küncdə gördüyüm, dədə-babadan qalma böyük sandığın üstünə yığmışdıq. Köhnə palaz parçası torpaq döşəməli evin kiçik bir hissəsini tutmuşdu



və Müküşdən qalma yeddilik çıraq o qış bizim öz evimizdə, Müküşün evindən gətirdiyimiz köhnə palaz parçasının üstündə hər axşam yanırdı.

Hər axşam çay-çörəkdən sonra mən dəftər-kitabımı ortaya töküb, lap çırağın dibindəcə özümə məskən salırdım. Bibim məndən bir qədər aralıda çiynini divara söykəyib otururdu; o, yırtıq-yamaq eləyirdi, mən üzüqoylu palazın üstünə sərilib dərslərimi hazırlayırdım. Bəzən bibim də bir kitab açıb dizinin üstünə qoyurdu; biz dinməz-söyləməz oxuyurduq, çıraq səssiz-səmirsiz yanırdı.

Qış vaxtları şamdan sonra bir yerə yığışıb söhbət eləmək, bəzi adamlar üçün, şam yeməyinin özü kimi vacib bir məsələ olduğundan, kənddə bizim evin qapısını da tanıyanlar vardı. Bizə adam gələndə mən dəftər-kitabımı kənara çəkib, çıraqdan bir xeyli aralıda oturmalı olurdum. Bibim də oxuduğu kitabı bükmürdü, onu ağzı üstə çevirib yanına qoyurdu və qonaqlar gedənəcən bibimin fikri-zikri ağzı üstə qoyulmuş kitabın yarımçıq səhifəsində qalırdı.

Bibim nə danışırdı, nə də danışılanlara qulaq asırdı. Ancaq o, arvadların bizə gəlməyindən razı idi. Çünki o qış Nabat xalanın oğlu Yaqub da bizə ayaq açmışdı: arvadlar bizdə olmayanda Yaqubun gəlişi daha pis olurdu. Arvadlar bizdə olmayanda Yaqub bizdə daha çox otururdu, daha çox danışırdı, bu isə bibim üçün çox ağır bir əzab idi.

Gah arvadlar hər gün gəlirdilər, gah da (bərk şaxta olanda) bir neçə gün ara verirdilər. Havalar lap mülayim olanda da onlar soyuqdan büzüşmüş halda içəri girib evin tərifindən söhbətə başlayırdılar, çünki bizim ev dədə-babaların tikdiyi evlərdən idi. Dədə-babaların tikdiyi evlərdə gündə bircə dəfə soba yandırmaq kifayət eləyirdi – bizim evin tərifli cəhəti də elə bu idi.

Evin tərifindən başlanan söhbət yavaş-yavaş uzanıb gedirdi: kəllə qənd yaxşıdır, yoxsa parça qənd? Kimin həyətində daha çox meyvə ağacı var və bu il meyvədən kim nə qədər pul qazanıb?.. Parça qənd Məsmə xalanın ağzında böyüyürdü, Xədicə xala çay yerinə qızılgül dəmləyirdi və onu tut qurusu ilə içirdi. Zivər xalanın çay içməyə tut qurusu da yox idi, beş-altı ərik qurutmuşdu, o da hələ payızda qurtarmışdı...

Arvadlar pensiyalardan daha çox danışırdılar. Onlar bütün kəndi evbəev sayırdılar. Yuxarı məhəllədə pensiya alanlar aşağı məhəllədəkindən çox idi, yaxud aşağı məhəllədə kimsə "fiqtivni" kağız düzəldib pensiyasını artırmışdı. Ölən, oxumuş oğulların analarına guya daha çox

pul verirdilər; Məsmə xalanın böyük oğlu belələrindən idi. Söhbət bundan düşəndə Xədicə xala olduğundan yox olurdu, çünki oğlunun oxuyub müəllim olmağına cəmi-cümlətanı bircə il çatmamışdı. Zivər xalanın əsgər gedəsi adamı yerli-dibli olmamışdı. Elə ki pensiyadan söhbət düşürdü o, aşkar dilxor olurdu.

Arvadlar pensiyaya "*qan pulu*" da deyirdilər, ancaq buradakı "*qan*" sözünün insan qanı ilə sanki heç bir əlaqəsi yox idi. Necə ki, "çay pulu", "meyvə pulu", "yumurta pulu", – bu sözü arvadlar çox asanlıqla deyirdilər. Hələ Məsmə xala aldığı "qan pulu"ndan hər ay beş-üç manat dala atıb, oğlu üçün toy tədarükü görürdü, çünki o, oğlunun ölməyinə inanmırdı. Öz adamının ölümünə heç kəs inanmırdı, yaxud arvadlar pensiya pulunu rahat xərcləmək üçün özlərini belə göstərirdilər... Axı, "qan pulu" ilə alınan qəndi Məsmə xala necə içə bilərdi – parça qənd olmasın, olsun kəllə qənd?

Aldıqları pensiya cəbhədə ölənlərin adı ilə nə qədər bağlı olsa da, arvadlar o adları dilə gətirməkdən ehtiyat eləyirdilər. Lakin bu haqda danışmağa arvadların ürəyində sanki gizli bir ehtiyac da vardı, yaxud buna səbəb söz-söhbətin qurtarmağı olurdu. Bu söhbət araya düşəndə Xədicə xala gözlərini yumub, bütün bədəni ilə yırğalanırdı. Məsmə xala dərindən ah çəkirdi və bu vaxt onun sinəsindən bir dəhşətli xırıltı qopurdu. Məsmə xala uzun müddət öskürürdü və öskürə-öskürə qəzetdən papiros eşirdi. Belə vaxtlarda Zivər xala da özünü qəmli göstərməyə çalışırdı, ancaq Məsmə xala ilə Xədicə xala pensiyadan danışanda o, bundan qat-qat qəmli görünürdü.

Davadan gəlməyənlərin söhbətini arvadlar hər gecə eləyirdilər – bunsuz mümkün deyildi. Hər gecə bizim evdə mənim atamdan da mütləq söz düşürdü; söhbət uzanıb gedirdi. Mən atamın kənddə hamıdan güclü, hamıdan qoçaq olmağına heç vaxt şübhə eləməmişdim. Lakin, elə bil, hər gecə arvadlar məni buna inandırmağa gəlirdilər. Məsmə xala atamın su üstündə bir külfət adamı arxa basıb təkbaşına əzişdirdiyini öz gözü ilə görmüşdü və bu haqda danışmaqdan yorulmurdu. Bundan başqa atam haçansa köç vaxtı qarabağlıların altı qoyununu qapıdan xəlvətcə həyətə ötürüb bir saatın içində yerbəyer eləmişdi və bundan sonra bir ay bizim küçədən kabab qoxusu kəsilməmişdi. Bu haqda danışanda Məsmə xalanın indi də ağzı sulanırdı, halbuki, öz dediyinə görə, Məsmə xala bircə tikə kabab yeyəndə bir həftə naxoş olurdu.



Guya hansı tərəfdənsə bizə qohum olan Zivər xala əsas etibarilə atamın namuspərəstliyindən danışırdı, çünki bir dəfə Zivər xala dağın döşü ilə çeşmədən su gətirməyə gedəndə onun corabsız olduğunu atam "min addımdan" görüb ərinə xəbər vermişdi. Axşam çörək vaxtı, bunun üstündə əri *Zivər xalanı* heyva çubuğu ilə möhkəm döymüşdü, ancaq Zivər xala bu barədə çox fərəhlə danışırdı və təəssüflə başını yırğalayıb, belə qeyrətli kişilərin indi kənddə az olmağından şikayətlənirdi.

Arvadlar istəyirdilər ki, mən də atama oxşayım. Ancaq bu, o qədər də asan məsələ deyildi. Mənim atama oxşamağım üçün gərək bizim bağça kənddə birinci bağça olaydı; dükana qənd gələndə gərək birinci mən alaydım, gecə yel əsib kolxoz bağlarında qozu yerə tökəndə ağacların dibinə gərək mən özümü hamıdan tez yetirəydim. Atama oxşamaq üçün mən xırmandan çuval-çuval saman gətirib tövləmizə yığmalı idim, həyətimizin otunu heç olmasa əlimlə yolub qurutmalı idim. Ancaq mən öz həyətimizin halalca meyvəsini də aparıb sata bilmirdim, "hər ağacın dibində filan qədər pul çürüyürdü"...

Məsmə xala açıq deyirdi ki, mən heç vaxt atama oxşamayacağam, çünki "fərli cücə yumurtadan bəlli elər". Zivər xala cücə barəsində olan o biri misalı çəkirdi. Deyirdi: "Cücəni payızda sayarlar". Ancaq burası da vardı ki, bu sözləri deyəndən sonra Zivər xala mənə və mənim palaz üstə sərdiyim dəftər-kitaba çox birtəhər baxırdı. Bu cür baxışdan mən aşkar hiss eləyirdim ki, Zivər xalanın heç özü də öz dediyinə inanmır. Hiss eləyirdim ki, mən atama oxşamıram və heç oxşamayacağam.

Onu da bilirdim ki, əgər atam davadan qayıdıb gəlsəydi, mənim aciz olmağım belə tez aşkara çıxmayacaqdı, çünki indiki basabasın, vurhavurun qabağında bəlkə heç atam da dükandan qənd ala bilməzdi. İkincisi, belə işləri görməyə məni bibim qoymurdu, ancaq atamın zirəkliyindən və mənim acizliyimdən danışanda, nədənsə, heç kəs buna fikir vermirdi.

Bu adamlar belə söhbətlər zamanı bibimin necə hirsləndiyini də heç vaxt hiss eləmirdilər. Doğrudur, bütün bu deyilənlərin müqabilində bibim bircə söz də demirdi. Hətta o, etiraz əlaməti olaraq, heç bir hərəkət də eləmirdi. Bibimin hirslənməyini mən onun gözlərindən və dodaqlarından görürdüm: gözlərinin qarası çoxalırdı, dodaqlarının qırmızısı azalırdı.

almağından xoşu gəlirdi. O başını irəli uzadıb, qalın, qıpqırmızı dodaqlarını çox gülməli bir tərzdə aralayırdı və belə vaxtlarda həmişə mənə elə gəlirdi ki, indicə Yaqub ağzını açıb uca səslə oxuyacaqdır.

Bizim çöl qapısını bir də taqqıldadıb küçəyə çıxandan sonra Yaqub doğrudan da oxumağa başlayırdı və onun şən, gur səsi küçələrdən tamam kəsilincə bibim əvvəlki vəziyyətində oturub, elə bil, ürəyində nəyisə götür-qoy eləyirdi. Sonra bibim cəld ayağa durub sandığın

də qurtarmışdı. Keçən yay Nabat xalanın qurutduğu sarı tut da qurtarmışdı. Qənddən, çaydan, pensiyadan danışan arvadlar neçə vaxt idi ki, bizdən ayaqlarını kəsmişdilər. Mən kitab-dəftərimi çırağın ətrafına səpələmişdim. Bibim çiynini divara söykəyib oturmuşdu. Bir-birinin üstünə aşırılmış iki zorba qıç yenə də köhnə sandığın qabağında haçalanmışdı. Yenə yoğun və güclü barmaqlar üst-üstdən geyilmiş yun corabların bağlarını oynadırdı. O axşam, nədənsə, Yaqub susurdu və

Sonra bibim hər gün çölə aparıb gətirdiyi vedrəni yerə qoyub həyəti dolanmağa başladı. Çıraqlar yandı, bibim içəri girmədi. O axşam bibim samovar da qoymadı. Biz qaranlıq evdə xeyli vaxt çıraqsız oturduq: sanki çıraq yanmasaydı, pəncərədəki şüşələr görünməyəcəkdi...

Şüşələr göründü – o gün də göründü, o biri gün də. Ən dəhşətli gün o gün oldu ki, məktəbdə tənəffüs vaxtı qadın müəllimlərin ən qocası Tovuz müəllim məni həyətin o başındakı heyva ağaclarının yanına çağırıb sirli-sirli soruşdu: "Yaqub bibini alıb?". O vaxt mən Tovuz müəllimə heç nə demədim, ancaq axşamacan ürəyimdə bu suala cavab verdim: "Yox, Yaqub bibimi almayıb. Yox, Yaqub bibimi almayıb. Yox, Yaqub bibimi almayıb...".

Ancaq bunu heç kəs bilmirdi. Hamı elə bilirdi ki, biz Yaqubu Sədəf bacının əlindən almaq istəyirik. Gözünün altındakı yumruq qarasını fəxrlə arvadlara göstərən Sədəf bacı belə bilirdi: o məni görəndə üzünü yana tuturdu. Nabat xala bibimi danışdırmırdı, mənim salamımı almırdı: axı, sünbül məsələsi çoxdan qurtarmışdı, odun məsələsi çoxdan qurtarmışdı. Məndən adam çıxmayacağını Nabat xala hələ Yaqub əsgərlikdən gələn gün unutmuşdu. Belə olmasaydı, o gün Nabat xala qapının qabağında məni öpərdimi?

Yazın axırlarıydımı, yayın əvvəlləriydimi...

Sobanı çoxdan yığışdırmışdıq və iki ayağının üstündə dura bilmədiyinə görə o, zirzəmidə böyrü üstə yıxılmışdı. Çıraq öz yerində yanırdı və çirkli çarıq gönünə bənzər kağızlar pəncərədə olmadığından, bayırda ay işığı görünürdü. Ay işığı həyətdəki gilas ağacının başına düşmüşdü – gündüzkü qırmızı gilaslar indi ağ olmuşdular. Ay işığı mənim tətilə çıxmış dəftər-kitabımın üstünə düşmüşdü – mən onları pəncərənin qabağında üst-üstə qalamışdım. Mən yenə də çırağın yaxınlığında üzüqoylu uzanmışdım – yazmırdım, oxumurdum – buna vərdiş eləmişdim. Yenə də bibim çiynini divara söykəyib oturmuşdu. Bir-birinin üstünə aşırılmış iki zorba qıç yenə də sandığın qabağında haçalanmışdı. Yaqub bərkdən-bərkdən danışırdı, bibimi yola gətirib, həmin o, gecə ağ, gündüz qırmızı görünən gilasları satmaq üçün məni də özü ilə rayona aparmaq istəyirdi. Və nə qədər təəccüblü olsa da, o axşam bibim buna razılıq verdi.

O axşam Yaqub gedən kimi bibim pəncərənin qabağındakı dəftərlərin birindən bir qoşa vərəq çıxartdı. Qurumuş mürəkkəb qabına samovarın qırnasından su süzüb, bir kitabın arasından qələmi tapıb çıxartdı. Peronu mürəkkəbə batıran kimi onun sifəti dəyişdi! İlahi, necə də gözəlləşdi! Görəsən, yer üzündə əlinə qələm götürəndə mənim bibim kimi sevinən ikinçi bir qadın vardımı, ya rəbb?!

Əlinə qələm götürən kimi elə bil bibim gedib məktəb illərinə çıxırdı: mən haradasa bir sehrli parta görürdüm. Mən bibimin müəllimlərini görürdüm, haradasa çiçək açmış ağacların altında onlar bibim kimi şagirdlərə nəğmə ilə dərs öyrədirdilər. Özünün məktəbə getməyindən bibim o qədər gözəl sözlər demişdi ki, o məktəbin yollarını da mən gülsüz-çiçəksiz təsəvvür eləyə bilmirdim. Sanki bibimin məktəbə getdiyi yollar bizim kənddəki yollar deyildi, yaxud bizim kənddəki yollarda o vaxt saysız-hesabsız gül vardı, çiçək vardı. Hələ Sovet hökuməti kəndə təzə gələndə bibimin hansı yaşıl çəməndəsə öz yoldaşları ilə, öz müəllimləri ilə oturub, oxuya-oxuya ana dili dərsi keçdiyi bağı da mən indiki kolxoz bağlarının heç birinə bənzədə bilmirdim: axı, biz də botanika dərsini çox vaxt bağda keçirdik... O vaxtkı məktəbə gedən yollar mənim təsəvvürümdə bibimin nəğməsindəki "gül bağçalar kənarı" idi. Azərin ağ köynəkli atası da bir vaxt bu nəğməni klubun səhnəsində oxuyardı. Mənə elə gəlirdi ki, əgər o nəğmə olmasaydı və bir də Azərin ağ köynəkli atası olmasaydı, bibim Yaqubu görəndə hirslənməzdi. Mənə elə gəlirdi ki, məhz o nəğməyə görə bibim bir vaxt Müküşlə eləmək istəmədiyini Yaqubla da eləyə bilməzdi...

Qələmi yerə qoyandan sonra tədricən bibimin sifəti dəyişirdi; o vaxtların gül-çiçəyi də tədricən yollardan yığışırdı. O yollar indiki adicə yollara çevrilirdi. Və mən məscidin qabağında dayanmış Müküşü görürdüm. Bir cüt qara çəkmənin zəhmli səsi qulağıma gəlirdi və bir qara zurnanın səsi bu səsə qarışıb gecənin qaranlığında bibimi Müküşün evinə aparırdı. Sonra mən kluba sarı gedən yolda qoca və qəzəbli Haşım müəllimi görürdüm: məktəbi buraxıb ərə getdiyinə görə, o, hələ də bibimin salamını almırdı...

Bibim kağızı yazıb qurtardı, ancaq nədənsə bu dəfə onun üzündəki sevinc xeyli vaxt çəkilib getmədi. O, kağızı səliqə ilə büküb üçbucaq şəkilli məktub elədi. Dedi ki, bunu Mərcan xalaya verərsən. Dedi ki, Mərcan xala çörək dükanında işləyir. Sonra uzun müddət bibim çörək dükanının yerini təsvir elədi. Sonra bibim qələmi götürüb məktubun üstündə Mərcan xalanın adını da yazdı: elə bil yazmaqdan doymamışdı. Bibim dedi ki, məktubu Yaquba tapşıracağam, eşşəyin belinə

qoyacaq. Özün də yorulanda eşşəyin tərkinə minərsən, – dedi, – və palandan bərk-bərk yapışarsan; çörəyini düz çatanda yeyərsən, özü də rahat yeyərsən, bir işin olsa, bir daşın dalına çəkilərsən, məbadə Yaquba görə tələsiyəsən. Nəhayət, bibim dedi ki, (və ilk dəfə dedi ki) Yaqub eşşək *adamdır*, o, belə *şeyləri* başa düşməz.

Səhər idi və biz rayona gedirdik: qabaqda eşşək, sonra Yaqub, sonra mən. Mən əynimə tərtəmiz şalvar geymişdim. Heç bilmirəm bibim onu nə vaxt yuyub-qurutmuşdu (məktub da şalvarın cibində idi). Yuyulmuş qaloşlarımın içinə bibim üç-dörd qat kağız qoymuşdu, an–

bu ağır vedrəni o dağın başına çıxarmalı idim. *Mənim* ağlamağım gəlirdi, ona görə yox ki, daşlar ayağıma dəyirdi, vedrə belimi kəsirdi; ona görə ki, dörd bir tərəf boz, zalım və qəzəbli daşlardan ibarət idi və onları döymək, ağrıtmaq, ağlatmaq mümkün deyildi.

Biz gedirdik və telefon məftilləri boyunca bir boğuq sızıltı gedirdi: elə bil telefon məftilləri ağlayırdı. Hərdən Yaqub əlindəki heyva çubuğunu öz əsgər şalvarının şiş yerinə vururdu: bu vaxt eşşək diksinib irəli cumurdu. Bu boz, zalım və qəzəbli mənzərədə zalım olmayan bircə şey vardısa, o da Yaqubun eşşəyi idi, çünki eşşək Yaqubun çubuğundan qorxurdu. Küçələrdə Yaqubun əmri ilə eşşəyin boynunu sax–

dəm tuturdu. Yaqub ona görə oxuyurdu ki, hələ bizim kef çəkəcəyimiz günlər qabaqda idi: bu yay Yaqubu kolxoza anbardar qoyacaqdılar. O məni də əlinin altında işlədəcəkdi və mən orda doyunca badam yeyəcəkdim, pendir yeyəcəkdim... Biz noxudu bir həftə çəkəcəkdik və hər həftə noxud ən azı bir pud artıq gələcəkdi, çünki noxud nəmçəkən şey idi, ancaq qoz qaldıqca azalırdı. Qoza su səpməyin də qaydası vardı, taxıla qum qatmağın da qaydası vardı; bütün bu qaydaları Yaqub öz atasından öyrənmişdi, çünki onun atası uzun müddət kolxozun anbardarı olmuşdu...

...Sonra mənə elə gəlirdi ki, sağ ayağımın barmaqları yoxdur. Biz dağın ətəyinə çatanda qollarım da yoxa çıxdı. Orada Yaqub vedrəni yerə qoyub dincəlmək üçün mənə icazə verdi. Ancaq mən vedrəni yerə qoymadım. İndi mən heç bir yerimdə ağrı hiss eləmirdim. Bircə onu hiss eləyirdim ki, Yaquba nifrət eləyirəm. İstəyirəm ki, bu nifrət daha da çox olsun, çünki o artdıqca ağrılar azalırdı. O artdıqca elə bil qollarıma qüvvət gəlirdi və dağın zirvəsi mənə yaxın görünürdü. Mən onda, bəlkə də, "nifrət" sözünün mənasını bilmirdim, ancaq vedrəni dağın başına çıxarmaq üçün nə lazım olduğunu bilirdim.

Dağın təpəsində vedrə çiynimdən götürüldü, buradan rayonacan onu eşşək aparacaqdı. Yaqub mənim başıma sığal da çəkdi: elə bil mən vedrə ilə güləşmişdim və Yaqubun oğlu çeşmənin qırağında uşaqların belini yerə vuran kimi, mən o vedrənin belini yerə vurmuşdum. Sonra Yaqub köynəyimi qaldırıb ehmal-ehmal çiynimi ovxaladı, mən qəhərləndim, ancaq ağlamaq istəmədim. Mən sevindim, həm də sevinmək istəmədim, çünki indi "nifrət" dediyim o şeyi itirməkdən qorxurdum. "Nifrət" dediyim o şeyi dağın başında çörək yeyəndə də mən dişimin dibində bərk-bərk tutmuşdum, çünki vedrənin belini yerə qoyduğuma görə, Yaqub çörək dəsmalındakı toyuğun yarıdan da çoxunu mənə vermişdi... Mən toyuğu yeyirdim və haradasa dişimin dibində o nifrəti də saylayırdım – hələ onda mən dağın o tayındakı bağları görmürdüm; hələ onda gilas ağaclarının başına gün düşməmişdi və gilaslar qızıl sırğa kimi parıldamırdı. Dağdan aşıb bağların üstü ilə gedəndə mən "nifrət" dediyim o şeyi bir daşın dibində salıb itirdim və bir qəribə itki qorxusu sonra uzun müddət məni tərk eləmədi. Bibimin Mərcan xalaya yazdığı məktubu əlimin altında bərk-bərk saxlaya-saxlaya rayona çatanacan mənə elə gəldi ki, məktubu salıb itirmişəm, özə də həmin daşın dibində itirmişəm...



Gilası satandan sonra, mən Yaqubun gözündən yayınıb, bazarın qabağındakı küçəyə çıxan kimi çörək dükanını gördüm. Əvvəla, onun çörək dükanı olmağı üstündə yazılmışdı. İkincisi, oradan çıxan adamlar əllərində çörək aparırdılar. Üçüncüsü, o dükanın qabağında adam çox idi və bibimin dediyinə görə, qabağında çox adam olan dükan məhz çörək dükanı olmalı idi. Ancaq bibim bundan başqa o qədər söz demişdi ki, mən gördüyum bu dükanın Mərcan xalanın dükanı olduğuna şübhə eləyirdim. Daha doğrusu, bibimin oranı tapmağı bir çətin şey kimi izah eləməyi məni çaşdırmışdı. Əgər bibimin dediyi uzun küçə bu idisə, bəs o qorxulu, dəhşətli maşınlar harada idi? Bu küçədən, necə deyərlər, ayda-ildə bir maşın gəlib keçirdi, həm də o keçənəcən yolu on dəfə o baş-bu başa gedib-gəlmək olardı. Mən hansı böyük yolun qırağında dayanıb maşınların keçməsini gözləməli idim? Axı, burada bircə böyük yol vardı. Qalan yollar bizim kəndin yollarına bənzəyirdilər, oradakı evlər də kənd evlərinin eyni idi.

Böyük yolun kənarı ilə küçə enişinə su axırdı. Görəsən, bibimin dediyi su arxı bu idimi? Əgər bu idisə, Mərcan xalanın dükanına getmək üçün niyə mən yuxarıdan dolanıb gəlməli idim? Bu arxı adlamağa nə vardı ki?..

Böyük yolun ortasında adamlar dolanırdı: göyərti satırdılar, siqaret satırdılar. Ara-sıra gəlib keçən maşınlar elə bərkdən fit verirdi ki, adamın qulağı batırdı, elə bil sürücülər fit verməkdən həzz alırdı. O yanda, arxın qırağında oturmuş başmaqsilən kişi elə bil şotkaları taxtaya çırpmaqdan həzz alırdı: hərdən o qışqırırdı da. Arxın qırağındakı tut ağaclarının başına doluşmuş uşaqlar da ucadan çığırışırdılar: ağaclarda o qədər uşaq vardı ki, tutların gövdəsi az qalırdı yerindən qopsun. İçinə sement salınmış ağ arxdan sarımtıl su axırdı, suyun qırağında bir neçə cavan oğlan elə-belə, boş-bekar oturmuşdu. Boş-bekar oturanların ikisi başmağını çıxardıb, ayağını suya sallamışdı. Onlar yoldan keçən qızların dalınca baxırdılar. Onlar gözlərini corabsız qızların ayağına zilləyirdi və corabsız qızlar, bayram vaxtları bizim klubun səhnəsinə çıxan məktəbli qızlar kimi, bir nöqtəyə baxa-baxa dümdüz gedirdilər, elə bil kənara baxsaydılar, əzbərlədikləri söz yadlarından çıxacaqdı.

Qızların hamısı yuxarıda, böyük ağ binanın üstündə Kreml bürcünə oxşayan bürcün başındakı ulduza baxa-baxa gedirdi. Yəqin ki, o ulduza, o bürcə, bir də onlardan azca aralıdakı, ağzı bazara sarı olan radioya görə bura şəhər deyirdilər. Orada, lap Kreml bürcündə olduğu

kimi, saat da vardı. Özü də, deyəsən, işləyirdi. Ancaq nə qədər baş sındırsam da, mən saatın neçə olduğunu yəqin eləyə bilmədim.

Mən yolun o biri tərəfinə keçdim. Arxın qırağında bir az dayandım. Mən o arxdan, istəsəm, gözüyümulu tullanardım, ancaq bibimin xatirinə bunu eləmədim. Mən, bibimin xatirinə, uzaqdan hərlənib çörək dükanının qabağına gəldim. İçəridə Mərcan xalanın səsi eşidilirdi. Dörd səfil-sərgərdan it qapının qabağında durmuşdu, onlar hər çörək alanın dalınca qaçırdılar. Mən qapıda dayanıb o vaxtacan gözlədim ki, çörək qurtardı, dükandan çıxmaq istəməyən adamları Mərcan xala zorla çölə çıxartdı. Mərcan xala çörək qırıntılarını piştaxtanın üstündən süpürüb itlərin qabağına tökdü, dükanın qapısını iri açarlarla üç yerdən bağladı və dönüb getmək istəyəndə məni gördü. Mərcan xala məni görəndə nə dedi, nə soruşdu – unutmuşam. Bircə orası yadımdadır ki, məni görən kimi onun ağ kəlağayısının altından yarım kömbə ağ çörək yerə düşdü və bizi dövrəyə almış itlər çörəyə dəymədilər. Mərcan xala çörəyi götürüb öpdü və yenə də kəlağayısının altında gizlətdi. Orası da yaxşı yadımdadır ki, itlər qabığı soyulmuş, budaqları qırılmış bir ərik ağacının yanınacan bizim dalımızca gəldilər. Orada Mərcan xala itləri qovdu və onlar üzüyolalıqla çıxıb getdilər. Dörd it idi. Üçü arıq, çirkli, naxoş. Dördüncü it o birilərə heç bənzəmirdi: iri və sağlam it idi, elə bil çoban sürüsündən indicə ayrılıb gəlmişdi.

Həmin ərik ağacının dibindəcə mən bibimin məktubunu Mərcan xalaya verdim. O, məktubu alıb qoltuğuna qoydu və biz sarı sulu arxın qırağı ilə yolumuza davam elədik. Mərcan xala tez-tez gedirdi. Danışmırdıq. Ancaq hər bir neçə addımdan sonra Mərcan xala dillənirdi: "Sadıq bala, necəsən?". Yoldan keçən adamların hamısı Mərcan xalaya salam verirdi. Mərcan xala onların salamını alırdı və yana çevrilib mənim üzümə gülümsəyirdi: "Sadıq bala, necəsən?" O, əyninə sarı çitdən don geymişdi, ayağında dikdaban tufli vardı, gedə-gedə açarları cingildədirdi və bu cingiltidən mənim xoşum gəlirdi. Mən sevinirdim. Mərcan xala da sevinirdi. Onun ayaqlarına baxa-baxa mən Mərcan xalanın kənddə qar üstündə necə sürüşdüyünü xatırlayırdım. Mərcan xalaya "qəhbə" deyənləri qorxutmaq üçün Azərlə gəzdirdiyimiz dəmir yadıma düşürdü. Mənə elə gəlirdi ki, əgər bu açarlar o vaxt Mərcan xalanın əlində olsaydı, əgər onda da Mərcan xala sarı çitdən don geysəydi, ayağında dikdaban tufli, başında ağ kəlağayı olsaydı, heç kəs ona pis söz deməzdi, hamı ona salam verərdi.



Mən haraya getdiyimi bilmirdim, ancaq o gedişlə bütün günü getməyə razı idim. O anda dünya boz, zalım və qəzəbli deyildi, çünki Mərcan xalaya salam verən adamlar mənim də üzümə xoş sifətlə baxırdılar. Mən istəyirdim ki, yol qurtarmasın, bu şəhərdə nə qədər adam var, hamısı Mərcan xalaya salam versin və mənim üzümə gülümsəsin.

Sonra bir cavan qadın yadıma düşür, çünki o qadın qapıları taybatay açıq olan bir alçaq damın qabağında dayanıb bizə gülümsəyirdi. O qadının qəşəng, ağappaq əlləri vardı və biz taybatay açıq olan qapılardan içəri girəndə o əllərlə qadın mənim başımı sığalladı. Sonra o ağ əllər, içəridə bir-birinin yanına düzülmüş, ağ örtüklü stollardan birinin üstündə gəzdi və biz həmin stolun dalında oturduq. Orası da yadımdadır ki, bircə həmin stolun üstündə bankanın içində solmuş ağ yasəmən vardı, qalan stolların üstü boş idi.

Mərcan xala çörəyi kəlağayısının altından çıxartdı. Böyük açar dəstəsini də stolun üstündə çörəklə yanaşı qoydu. Qadın ağ, qəşəng, təmiz əlləri ilə çörəyi parça-parça qopardıb çini boşqaba yığdı və o, xörək gətirməyə gedəndə Mərcan xala bibimin məktubunu qoltuğundan çıxarıb oxumağa başladı.

Görəsən, necə olmuşdu ki, mən bibimin o məktubu Mərcan xalaya çörək üçün yazdığını yəqin eləmişdim; bəlkə də burda müqəssir mən deyildim, evimizdəki, unu boşalmış dağarcıq idi. Əgər o dağarcığın dibində heç olmasa bir kilo un qalmış olsaydı, mən belə şeyi ağlıma gətirməzdim, əvvəldən bilərdim ki, məsələ nə yerdədir. Axı bunu bilməyə nə vardı ki, Nabat xala bizə salam vermirdi, Sədəf bacı bizi danışdırmırdı; Yaqub öz yanından həyətimizi belləyib əkməyə başlamışdı və o bellənmiş, əkilmiş torpağı görməmək üçün bibim az qalırdı həyətdən didərgin düşsün. Deməli, şüşələr salınan gün bibim pəncərə qabağında gəzə-gəzə bunu fikirləşmişdi. Fikirləşmişdi ki, kənddən qaçsın. Mən bunu Mərcan xala ağzını açan kimi başa düşdüm: "*De gəlsin, işə nə var!*".

Mərcan xala özgə bir söz demədi. O, məktubu qatlayıb təzədən qoltuğuna qoydu. Təkcə kolxoz barəsində o məndən nəsə soruşdu: "Kolxozun bərəkəti qaçıb",– dedim və o saat hiss elədim ki, bunu kimdənsə eşitmişəm.

Mən o yeməkxanada nə yediyimi çoxdan unutmuşam. Ancaq oradan çıxanda o gülərüz qadının başıma bir də sığal çəkməyi indiki kimi

yanında bardaş qurub oturmuş çadralı arvadlarla söhbət eləmək üçün "başmaq seyri"nə çıxanda qapımızdakı qıfılı görəcəkdi: sabah da belə, biri gün də belə... Nəhayət, Nabat xala biləcəkdi ki, biz getmişik. Onda Nabat xala bibimi dindirmədiyinə və mənim salamımı almadığına görə çox peşman olacaqdı və sonra qoz ağacının altında, arxın qırağında çadralı arvadların yanında bardaş qurub oturanda mütləq bibimin yaxşılığına danışacaqdı. Orada bibim, hər şeydən əvvəl, özgənin yetimini öz balası kimi saxlayan behiştlik bir adam olacaqdı, sonra "abırlı gəlin", "ismətli cüvanəzən". Nabat xala oğlunun hələ lap uşaqlıqdan bibimdən ötrü "dəli-divanə" olmağını arvadlara deməyəcəkdi. Hətta Yaqubun hər axşam bizə gəlməyi də o gün, qoz ağacının dibində, düzü-dünyanı ağzına götürmüş nanəcib adamların uydurması olacaqdı. O gün qoz ağacının altında Yaqub, bütün başqa məziyyətləri ilə bərabər, həm də qəlbi yuxa, ürəyi geniş, əliaçıq bir adam olacaqdı və onun bizim pəncərəyə şüşə salmağı bununla izah ediləcəkdi. Əgər Sədəf bacının tez-tez atası evinə gedib-qayıtmağından söhbət düşsəydi, mən yəqin bilirdim ki, Nabat xala nə deyəcəkdi: "Yaqub, anası ölmüş, bir az kəmhövsələdir, Sədəf də, pir olmuş, bir az əldən yavaşdır. Olur da. Ev qovğasız olmaz".

Orada, arxın qırağında arvadların çoxu bibimi qınayacaqdı: tutu ağacda qoyub gedib, gilası qurd-quşun ümidinə buraxıb... Yəqin ki, arvadların içində bibimin dalınca pis danışan da tapılacaqdı: dava vaxtı ərinin topdağıtmaz evini dağıtdı, indi də atasının yurdunu viran qoymaq istəyir...

Hələ arxın qırağı boş idi, Nabat xalanın müşdükdən püfləyib saldığı xırda-xırda "Pamir" kötükləri də hələ arxın içində dururdu. Hələ küçədən mal-davar keçməmişdi və Aslan babanın çinar dibində çəliyin ucu ilə açdığı "heroqlif" yazılarına ayaq dəyməmişdi. Orda-burda itlər hürüşürdü, bu səslərin içində Səfərin balaca küçüyünün səsi aşkar seçilirdi. Bir azdan Səfər də yuxudan duracaqdı və balaca küçük, balaca quyruğunu oynada-oynada, dağın döşü ilə balaca-balaca quzuların dalınca qaçacaqdı... Bir azdan ya Aslan baba, ya Xədicə xala, ya da, kim bilir, bəlkə elə Yaqubun özü beli çiyninə qoyub dəyirman arxından su bağlamağa gedəcəkdi və qıjıltı ilə axan su "Pamir" kötüklərini arxdan yuyub aparacaqdı. Bir azdan sonra qarğa da yuxudan ayılacaqdı və ayılan kimi qoz ağacının başından telefon məftillərinin üstünə atılıb qarıldayacaqdı. Qarğa məni çağıracaqdı. Mən həyətə çıxmayacaqdım:



bu gün də, sabah da, biri gün də... Nəhayət, qarğa da biləcəkdi ki, biz getmişik; görəsən, bundan sonra o, kiminlə danışacaqdı? Görəsən, qarğa bundan sonra o yağışın yağmağını kimə xəbər verəcəkdi və yağış kəsəndən sonra, gün düşəndən sonra yuvasından çıxıb kiminlə sevinəcəkdi?

Görəsən, qarğa mənsiz necə yaşayacaqdı: axı mən illər boyu onun yumurtalarını uşaqlardan qorumuşdum. Yumurtalardan bala çıxanda və qarğa onlara uçmaq öyrədəndə mən itləri, pişikləri o həndəvərə yaxın qoymamışdım; hətta suya, palçığa bulaşa-bulaşa mən qaranlıq lağımlara soxulub, qarğanın balalarını çıxartmışdım...

Biz qapını bağlayanda hələ heç kəs yuxudan durmamışdı. Hələ çox-çox ulduzlar batmamışdı. Göyün tən ortasında dayanmış ay da işığını söndürüb, bir quruca qabıq kimi havanın üzündə qalmışdı və ondan aşağıda səhərin boz toranına bürünmüş qoz ağacındakı qarğa hələ də yatırdı...

Ucsuz-bucaqsız düzəngahda bir bibim idi, bir də mən idim, bir də ayın nazik qabığı havanın üzündə durmuşdu.

Bir vaxt atamın, yanında yıxılıb ağladığı yastı qaya düzün ortasında bozumtul kölgə kimi görünürdü, qorxunc əzgil kolu da yolun qırağında kölgəyə bənzəyirdi. Nə qədər qəribə olsa da, mən o əzgil koluna vahiməsiz baxa bilmirdim. Mənə elə gəlirdi ki, o kol bir naməlum körpə qızı bir naməlum bələkdə boğmuşdur.

Mən sevinirdim, çünki ucsuz-bucaqsız düzəngahda bir bibim idi, bir də mən idim, bir də ayın nazik qabığı havanın üzündə durmuşdu. Məni həm də ağlamaq tuturdu və nədənsə, mənə elə gəlirdi ki, lap bu axşam divardan həyətə atılıb qapımızdakı qıfılı görəndə Yaqubu da ağlamaq tutacaqdı. Mənə elə gəlirdi ki, Yaqub həyətdə, zoğalın dibində, əkdiyi xiyar, kartof arxlarının qırağında oturub ağlayacaqdı. Atam kimi nər kişi ağlayanda Yaqub ağlaya bilməzdimi?..

Yüngül çörək dəsmalı mənim əlimdə idi. Tənziflə bağlanmış kitab-dəftəri bibim aparırdı. Bibimin ayağında yüngül və qəşəng ayaqqabı vardı – hələ bizim kənddə ipək fabriki olanda bir gün işdən sonra bibim də, Mərcan xala da o başmaqdan, hərə bir cüt geyib gəlmişdilər. Bir ay keçməmiş Mərcan xala öz başmaqlarını rayon yollarında dağıtmışdı. Ancaq bibimin başmaqları indiyəcən sandıqda qalmışdı. Elə bil bibim öz başmaqlarını bu gün üçün saxlamışdı və indi onları geydiyinə sevinirdi. Öz təzə başmaqlarında bibim olduqca xoşbəxt görünürdü.

Kim bilir, bəlkə də belə deyildi. Bəlkə bibim o çınqıllı yollarda məni güldürmək, sevindirmək üçün atılıb-düşürdü, məni vurub qaçırdı. Bibim şəhərdəki zavodlardan danışırdı: o yerdə ki, işçilərə hər ay maaş verirdilər, o yerdə ki, işçilərin uşağına paltar verirdilər, başmaq verirdilər... Mərcan xalanın evi də qəşəng ev idi. O evi bibim, bir dəfə, mənim gecikmiş pensiyamı – atamın "qan pulu"nu almaq üçün rayona gedəndə görmüşdü. Mən orada darıxmayacaqdım, çünki Mərcan xalanın evində radio vardı – biz o radioda cürbəcür mahnılara qulaq asacaqdıq. Mən darıxanda çıxıb küçədə gəzəcəkdim: o küçədə də çinar vardı: indi o nar qırmızı-qırmızı güllər açmışdı... Yayda ağacın üstündə balaca-balaca narlar olacaqdı və yayda bibim mənə təzə-təzə kitablar alacaqdı... Bibim şəhər məktəbinin yaxşı-yaxşı müəllimlərindən danışırdı, elə səslə danışırdı ki, mən onun mahnı oxuduğunu zənn elə-

Uca divarlı həyətin altı da, üstü də ev idi. Üstdə bir eyvan uzanıb gedirdi, altda – bir eyvan. Altdakı eyvanın dirəkləri hisli idi, qara idi. Bir-birinin yanına düzülmüş hər iki qara dirəyin arasında bir qaranlıq otaq yerləşirdi.

Otaqların dördü boş idi: onların heç qapısı da yox idi. İkisində adam yaşayırdı: biri – eyvanın o başında, üçü – eyvanın bu başında. Eyvanın yuxarı başında biz olurduq: Mərcan xala, bibim, bir də mən. Aşağı başdakı otaqda Qubad adlı tək bir oğlan qalırdı. Qarayağız oğlan idi. Bir ayağı şikəst idi. Öz dediyinə görə o, Vayenkomun bütün şəhərdə məşhur olan dəli atına baxırdı, ancaq Mərcan xala deyirdi ki, Qubad voyenkomatın süpürgəçisidir.

Üstdəki evlərə çıxmaq üçün taxta pilləkən vardı. O pilləkən biz olan otağın yanından qalxırdı: hər gün o pilləkənlə iki adam çıxırdı, iki adam

göy jaketinin xırdaca cibində idi. Surət bacı pilləkənləri çıxanda o kağızın ucu görsənirdi, pilləkənləri düşəndə kağız cibində olurdu.

Axşamlar işıq yanırdı: iki aşağı evdə, iki yuxarı evdə. Elə ki, çaydanlar qaynadı, qara, hisli neft pilətələri qapıların qabağından götürüldü, (axı, o şəhərdə ocaq qalamağa odun yox idi, samovar salmağa kömür yox idi) elə ki, çaylar içildi, çörəklər yeyildi, taxta pilləkənlərin üstündə bir də taqqıltı düşürdü. Surət bacı bibimə və Mərcan xalaya öz nişanlısından danışmağa gəlirdi. O, eyni məktubları hər gecə oxuyurdu, eyni şəkilləri hər gecə göstərirdi. Hər gecə Surət bacı şəkildəki adamın paqonunda olan ulduzları sayırdı və onunla necə tanış olmağından danışırdı. Surət bacı bu barədə danışanda mən haradasa, qaranlıq bir yolda qara relslərin üstü ilə fit verib sevinə-sevinə gedən bir qatar görürdüm. O qatarla Surət bacı Bakıya qadınlar müşavirəsinə gedirdi. O qatarla bir oğlan əsgər gedirdi və qatarlarda olan hansı pəncərəninsə qabağında o oğlan Surət bacı ilə üz-üzə oturmuşdu. Onlar bir-biri ilə danışmırdılar, bir-birinin üzünə baxmırdılar. Oğlan gözlərini pəncərəyə zilləmişdi və Surət bacı hər dəfə başını qaldıranda görürdü ki, oğlan onun pəncərədən əksinə baxır. Qatar yollarda dayanırdı, ancaq o oğlan gözünü pəncərədən çəkmirdi. Qatardakı adamların hamısı yatırdı, ancaq o oğlan yatmırdı. Surət bacı da yatmırdı, çünki onun çamadanında partbilet vardı. Çamadanında partbilet olanlar yata bilməzdilər, çünki o vaxt çox qarışıq vaxt idi. Surət bacı gözləyirdi ki, oğlan ona bir söz desin, ancaq oğlan heç nə demirdi. Nəhayət, gecənin yarısında Surət bacı özünü saxlaya bilməyib gülümsəyirdi; bu vaxt oğlan gözünü pəncərədən çəkirdi. Onlar bir-birinin üzünə baxıb gülümsəyirdilər. Beləcə, səhər açılırdı, ancaq oğlan bir kəlmə də söz demirdi. Sonra haradansa qatara əsgərlər gəlirdi: onlar qatarda gedənlərin pasportuna baxırdılar. Əsgərlər gedəndən sonra oğlan Surət bacının pasportunu götürüb baxırdı. Surət bacı da onun pasportuna baxırdı. Sonra oğlan bir xırdaca kağız yazıb Surət baçıya verirdi: "*Mən sənin surətini daim qəlbimdə yaşadacağam, Surət*".

Bu sözləri deyəndə Surət bacının hər gözündə bir damcı yaş sevinclə parıldayırdı və o, göy jaketinin cibindən xırdaca, ağ bir dəsmal çıxarıb gözlərinin yaşını silirdi... Sonra onlar haradasa qatardan düşüb, konfet alırdılar. Haradasa oğlan qırmızı gülləri olan baş yaylığı alıb Surət bacıya bağışlayırdı. Sonra qatar haradasa birdəfəlik dayanırdı, ancaq, nədənsə, mən o qatarı dayanmış təsəvvür eləyə bilmirdim.



Hətta qatar birdəfəlik dayanandan sonra, o oğlanla Surət bacının əl-ələ verib Bakının hansı küçəsindəsə saatlarla gəzməyini də mən əlbəəl unudurdum, bircə Surət bacının əksi olan pəncərə yadımda qalırdı. Oğlan uzaq-uzaq cəbhələrə gedib çıxırdı, uzaq-uzaq şəhərlərdən Surət bacıya məktub yazırdı, ancaq bu söhbət qurtaran kimi yenə həmin pəncərə gözümün qabağında dayanırdı, yenə oğlan Surət bacının pəncərəyə düşən əksinə baxırdı və hardasa qaranlıq yollarda, qara relslərin üstü ilə o qatar fit verib sevinə-sevinə gedirdi.

Öz nişanlısından danışanda Surət bacı sevincindən bir yerdə qərar tuta bilməyib, Mərcan xalanın palaz əvəzinə otağa sərdiyi brezentin üstündə fırfıra kimi fırlanırdı. Onun dediklərinə bircə bibim diqqətlə qulaq asırdı, Mərcan xalaya gəldikdə, o, Surət bacının belə həvəslə dediyi sözləri heç vecinə də almırdı. Surət bacı qızğın söhbət elədiyi vaxt birdən görürdün ki, Mərcan xala radionu açıb. O, kefi istəyəndə danışırdı, kefi istəyəndə ucadan gülürdü, ya da, saymazyana, ayaqlarını irəli uzadıb, çiynini divara söykəyib, tez-tez barmaqlarına tüpürə-tüpürə bu gün satdığı çörəyin pulunu sayırdı ki sabah aparıb banka təhvil versin...

Surət bacı məktubları, şəkilləri yığışdırıb qapıdan çıxan kimi biz işığı söndürürdük. Ancaq otaq xəfə olduğuna görə, isti olduğuna görə qapını bağlamırdıq və yatağa uzanandan sonra da mən qarşıdakı uca divarın üstünə yuxarıdakı pəncərədən düşən gur işıqda Surət bacını görürdüm. Mən hər gecə o işığa baxırdım və Surət bacının divarda tərpənən kölgəsini indiyəcən gördüyüm üç kinonun biri olan "Arşın mal alan"dakı Gülçöhrəyə bənzədirdim; bəlkə ona görə ki, Surət bacı eyvandakı işığın üstündə eynən Gülçöhrə kimi gəzirdi, otaqda oxuya-oxuya dolananda eynən Gülçöhrə kimi hərəkətlər eləyirdi: bəlkə də buna səbəb Surət bacının özünün üzdən Gülçöhrəyə oxşaması idi. Bəzən mən kinonun təsirinə o qədər qapılırdım ki, bir azdan tacir Əsgərin, belində boxça, oxuya-oxuya divarda görünəcəyini zənn eləyirdim. Ancaq Əsgər heç vaxt görünmürdü, işığın sönməyinə azca qalmış Surət bacı evdə geydiyi yaşıl donunu dartıb başından çıxarırdı. Bu vaxtlar mən divardakı kölgəyə daha diqqətlə baxırdım, belə şeyi divardakı qara kölgədə görməyin mümkün olmadığını bilsəm də, üstdən qəşəng-qəşəng paltarlar geyən Surət bacının altdan necə paltar geydiyini görmək istəyirdim. Bu vaxt işıq sönürdü, "kino" qurtarırdı. Surət bacının altdan geydiyi paltarı görmək nə qədər maraqlı olsa da, çox vaxt mən işığın sönməyinə sevinirdim. Mən gecələr Surət bacının

oxumağını istəmirdim, çünki bu vaxtlar Bəyxanım qarı evdə olurdu. Mənə elə gəlirdi ki, Surət bacı məhz oxuyub, sevindiyinə görə qarı onu görəndə üzünü yana çevirir...

Surət bacının qara kölgəsi, sarı işıqla birgə, divardan çəkilib gedəndən sonra həyətin aşağı başında Qubadın – eyvanda, iki qara dirəyin arasında qoyub yatdığı – köhnə dəmir çarpayıda cırıltı başlanırdı: Qubad gah o böyrü üstə çevrilirdi, gah da bu böyrü üstə çevrilirdi. Birdən görürdün ki, gecənin yarısında Qubad çarpayının üstündən sıçrayıb bircə alt tumanında tappıltı ilə həyətə düşürdü və yanlarını basa-basa, küçə qapısının altından içəri soxulub qaranlıqda didim-didim didişən pişiklərin üstünə cumurdu. Qubadın yuxusu gəlmirdi, çünki o da mənim kimi səhərlər yuxudan gec dururdu. Hərbi komissarlıqda iş gec başlanırdı, buna görə də Qubad gün-günortayacan yatırdı. Mən Qubadın da gecələr öz çarpayısına uzanıb, Surət bacının divardakı kölgəsinə baxmağını sonra bildim və divara düşən işığı onun da kinoya bənzətməyini eşidəndə lap mat-məəttəl qaldım. Mən Qubaddan o işığı hansı kinoya oxşatdığını soruşmadım, ancaq mənə məlum oldu ki, o divarın üstündə Qubad mənim görə bilmədiyim bir çox şeyləri də görür. Məsələn: Surət bacı oğlanın şəklini necə öpür, onun özü öz döşlərini necə ovur, necə əlləşdirir... Qubadın dediyinə görə, biz hələ "kino"nun yaxşı yerlərini görmürdük...

Yəqin ki, Qubad bir də ona görə yata bilmirdi ki, "kinonun" yaxşı yerləri barədə fikirləşirdi. Bəzən "kino" qurtaran kimi o, yavaşdan məni çağırırdı. Ancaq həmişə yerimin içində oyaq olsam da, mən onun səsinə heç vaxt səs vermirdim. Əvvəla, bibimlə Mərcan xala yorğun-arğın yatırdılar, mən səs eləsəydim, onları yuxudan oyada bilərdim. İkincisi, "kino" əhvalatının üstü açılandan sonra, nədənsə mən divardakı kölgəyə baxmağımı Qubaddan gizlətmək istəyirdim, ancaq hər səhər Qubad bunu mənim boynuma qoyurdu.

Səhərlər bizim söhbətimiz də elə çox vaxt bundan başlanırdı. Mən yuxudan duran kimi Qubad həyətin o başından qışqırırdı:

– Gördün, nə oyunlar çıxartdı?

Mən deyirdim:

– Görmədim. – Ancaq Qubad bilirdi ki, görmüşəm.

Gündüzlər bizdən başqa həyətdə heç kəs olmurdu. Qubad öz xəşilini neft pilətəsinin üstünə qoyub, şikəst ayağının yan tərəfini bərk-bərk yerə basa-basa, eyvanda gəzinirdi və "Arşın mal alan" kinosunun



əvvəlində tacir Əsgərin həyətdə, güllərin dövrəsində gəzə-gəzə oxuduğu mahnını ləzzətlə oxuyurdu, ya da mən yuxudan duranda Qubadı pilətənin yanında qıçlarını uzadıb oturmuş görürdüm. O, xəşilini qarışdırırdı və uzaqdan-uzağa mənimlə sual-cavab aparırdı:

– Rusca çörəyə nə deyirlər?

– Xleb.

– Atan oldu rəhmətdə.

Sonra Qubadın qaşığı bir müddət səssiz-səmirsiz qazanın içində fırlanırdı.

– Bəs qaşığa nə deyirlər?

– Loşka!

– Atan oldu rəhmətdə.

Yenə qaşıq qazanın içində hərlənirdi.

– Keçiyə nə deyirlər?

– Keçiyə? Bilmirəm.

– Qazyol!

Qubad bildiyi sözü fəxrlə deyirdi və qaşıq qazanın içində öz işini görürdü:

– Bəs novçaya nə deyirlər?

– Bilmirəm.

– Onu heç mən də bilmirəm.

Sual-cavab Qubadın xəşili bişənəcən davam eləyirdi. Mən həmişə gözləyirdim ki, Qubad deyəcək: "Rusca xəşilə nə deyirlər?" Ancaq *Qubad xəşili heç vaxt soruşmurdu... O xəşili Qubad hər gün bişirirdi.* Hərdən Bəyxanım qarı bir tikə lavaşın içində qoz boyda kərə yağı gətirib həyətdən keçəndə Qubada verirdi: o günlər Qubadın xəşili yağlı olurdu, qalan vaxtlar Qubad xəşili yavan yeyirdi.

Var-dövlətdən Qubadın evində bir içiboş köhnə sandıq vardı. Onun qalan şeyləri çöldə idi: pilətə, pilətənin yanında yerə salınmış sarı meşok, köhnə çarpayı və çarpayının üstündəki yorğan-döşək.

Qubadın bircə yorğanı təzə idi – hər halda üstdən təzə görünürdü. Yorğanın altındakı döşəyi biz hələ kənddən bura gəldiyimiz günün sabahısı, Məpcan xala ilə bibim evdən çıxan kimi, Qubad bir neçə dəfə o üz-bu üzə çevirib mənə göstərmişdi. Çünki Mərcan xala haçansa Qubada demişdi ki, səndə bit var. Buna görə Qubad Mərcan xaladan bərk incimişdi, onu danışdırmırdı və öz dediyinə görə, Qubadda bit ola bilməzdi, hətta müharibə vaxtı da Qubadda bit deyilən şey olmamışdı.

Əvvəla, ona görə ki, Vayenkomun atını yumaq üçün tez-tez Qubada sabun verirdilər. Qubadda sabun "zibil kimi" idi. İkincisi, Qubad şil deyildi ki, onu bit bassın, lap heç nə olmasa da, Allahın dumduru suyu ki vardı.

Elə bil Mərcan xalanın acığına hər neçə gündən bir Qubad gecələr qaranlıq zirzəminin altındakı göz-gözü görməyən su quyusuna girib şalvarını, pencəyini yuyurdu. Onun bozumtul alt tumanı da eyvanda, iki dirəyin arasındakı məftildən suyu süzülə-süzülə sallananda həyətdə hamı bilirdi ki, Qubad yorğanın altında çılpaqdır və bu gecə çarpayıdan həyətə sıçrayıb pişikləri qovmayacaqdır.

Xəşili yeyib, qarnını bərkidəndən sonra Qubad qoca kişilər kimi "ya Allah" deyib ayağa dururdu. "Gedək o ata da bir şey verək yesin". Həmişə həyətdən çıxanda Qubadın mənə yazığı gəlirdi, çünki mən həyətdə tək qalırdım və o bilirdi ki, darıxıram. Mən bibimin, piltəsi aşağı salınmış pilətənin üstündə hər səhər hazır qoyub getdiyi çaydandan bir stəkan çay töküb, şirin çayla nahar eləyirdim. Mərcan xalanın qapısı qabağında, eyvanda tək-tənha oturub evdəki radioya qulaq asırdım. Hər səhifəsinə gözüyumulu bələd oldugum dərs kitablarımı vərəqləyirdim. Tənha narın barəsindəki nağılı da mən o vaxtlar hesab dəftərimin boş qalmış vərəqlərinə yazmışdım: vərəqlər qurtarmışdı, ancaq nağıl qurtarmamışdı.

Hələ biz birinci dəfə bu həyətə gələndə, onda ki, bibimlə Mərcan xala çörək dükanında təzəcə görüşüb öpüşmüşdü; onda ki, biz böyük küçə ilə yuxarı qalxırdıq,– yenə Mərcaq xala açarlarını cingildədirdi və yenə yoldan keçənlər ona salam verirdi; onda ki, daşlı, dar küçələrdə bibimlə Mərcan xala kənddən, oradakı keçmiş fabrikdən, müharibə vaxtı bizim kəndə gələn saldatlardan danışa-danışa tələsik addımlarla yeriyirdilər və mən onların dalınca qaçırdım – onda mənə elə gəlirdi ki, bu şəhərdə yaşamaq olar, burada da məktəbə getmək olar, baxmayaraq ki, ürəyimin bir yerində kəndə qayıtmaq arzusu get-gedə güclənirdi.

Elə ki, biz qapını açıb həyətə girdik, elə ki, mən uca divarı, çirkli torpağı, bədbəxt nar kolunu gördüm – onda mənə elə gəldi ki, bibimin burada işləməyi və mənim burada məktəbə getməyim hansı əfsanəvi narınsa üstündəki qırmızı güllər kimi boş bir şeydir və biz elə bu gün mütləq kəndə qayıdacağıq.



Mərcan xala öz evinin, bizim kənddəki təndirəsər yerlərinin qapısına bənzəyən, alçaq, qırmızımtıl qapısını açdı. Eyvanda neft pilətəsinin üstündə bizə çay qoydu. Mən qapıda dayandım, çünki o evə girmək istəmirdim. Mən bu saat kəndə qayıtmaq istəyirdim, çünki o evə girmək istəmirdim, çünki Mərcan xalanın otağı alçaq idi, çünki həyət qaranlıq idi, torpaq qara idi, çirkli idi, çünki bibim məni aldatmışdı: narın üstündə qırmızı güllər yox idi.

Ancaq bibim öz qəşəng başmaqlarını qapının qabağında çıxarıb, o alçaq, ala-qaranlıq otağa sevinə-sevinə girdi. O, Mərcan xalanın təzə aldığı samovar örtüyünü təriflədi, ramkadakı şəkillərə baxdı, taxçadakı qab-qaşığa baxdı. Hələ bibim stolun üstündəki aynanın qabağında fırlanıb, çoxdan eləmədiyi hərəkətləri də elədi: saçlarını düzəltdi, qaşlarını düzəltdi, özünün arxa tərəifini də aynada görmək üçün bibim yüz cür oyunlar çıxartdı.

Sonra biz Mərcan xalanın otağında boz, təmiz brezentin üstündə oturub çay içəndə mən ümid eləyirdim ki, kəndə qayıdacağıq. Mərcan xala ilə bibim zavoddan danışırdılar, mən hələ də ümid eləyirdim ki, biz burada qalmayacağıq. Daha mənim üçün kənddə heç nə dəhşətli deyildi: nə Yaqubun bizə gəlməyi, nə camaatın dedi-qodusu... Nə olsun ki, Nabat xala salamımızı almırdı, nə olsun ki, Sədəf bacı bizi danışdırmırdı. Axı, bizim, dağın döşündə evimiz vardı: qabağında bağ, qapısında gül-çiçək; orada tut təzəcə ağarırdı, gilanar təzəcə qızarırdı; nə olsun ki, pəncərəmizin şüşəsini Yaqub salmışdı, nə olsun ki, həyətimizin torpağını Yaqub əkmişdi, o evi ki, bizim əlimizdən alan yox idi.

Məni vahimə bürümüşdü, ancaq bibim sevinirdi. O, çayı nəlbəkiyə töküb, püfləyə-püfləyə, tələsə-tələsə, sevinə-sevinə içirdi və bibimə baxdıqca mənə elə gəlirdi ki, bu qaranlıq həyəti, bu nəmli torpağı, o uca divarları və üstündə bir yığın kül rəngli yarpaqdan başqa heç nə olmayan xırdaca nar kolunu yaxşı-yaxşı görəndən sonra bibim də kənddəki evimizi yadına salır. Mənə elə gəlirdi ki, bibim buna görə sevinir. Ona görə sevinir ki, biz bu gün kəndə qayıdacağıq, qapımızın qıfılını açacağıq, mən ağacın başına dırmaşıb gilas dərəcəyəm, bibim divarın üçtünə çıxıb tut yeyəcək...

Çayını içəndən sonra bibim durub bir də aynanın qabağında hərləndi, ramkadakı şəkillərə bir də baxdı, Mərcan xalanın samovarın üstünə saldığı ağ sapdan toxunmuş örtüyü bir də təriflədi. Sonra bibim həyətə çıxdı və o, sevinə-sevinə qayıdıb gələndə mənə məlum oldu

ki, biz nəinki burada – Mərcan xalanın ala-qaranlıq otağında, hətta eyvanda bir-birinin yanına düzülmüş qara, qapısız otaqların birində də "sil-süpür eləyib" qala bilərik...

Biz o qaranlıq otaqların birində sil-süpür eləmədik – Mərcan xala qoymadı. Biz palazımızı, samovarımızı, yorğan-döşəyimizi də kənddən gətirməli olmadıq, çünki Mərcan xalanın üç-dörd dəst yorğan-döşəyi vardı. O gün bibimlə Mərcan xala məni evdə tək qoyub, iş axtarmağa getdilər və iş tapıb çox keçməmiş sevinə-sevinə qayıtdılar. Onlar evə qayıdıb xeyli vaxt gülüşdülər, xeyli vaxt sevindilər və gülə-gülə, sevinə-sevinə kişiləri ələ salmaqdan danışdılar. Onların söhbətindən belə çıxdı ki, bibimi işə düzəltmək üçün haradasa, hansı "*gic oğlu gici*"sə ələ salıblar. Belə çıxdı ki, bu şəhərdə arvadların işə düzəlməyi üçün mütləq kişiləri aldatmaq lazımdır, dolamaq lazımdır, ələ salmaq lazımdır. O gecə işıq sönəndən sonra Mərcan xala özünün çörək dükanında işə girməyindən bibimə uzun-uzadı bir nağıl danışdı. O nağılda da bir "*gic oğlu gic*" vardı. Özü də o "*gic oğlu gic*" "Raytorq"un sədri idi. Bir əməlli iş almaq üçün Mərcan xala onun yanına gedəndə o adam Mərcan xalanı düz bir ay yozdurmuşdu: demişdi ki, get, axşamçağı gəl. Nəhayət, bir axşamçağı Mərcan xala təzə paltarını geyinib, özünü gəlin gedən qız kimi bəzəyib, "burcuda-burcuda" qapıdan içəri girmişdi və o gic oğlu gicin başına bir oyun açmışdı ki, bugünkü oyun onun yanında heç nə idi. Mən bu gün də, o vaxt da Mərcan xalanın nə cür oyun çıxardığını təsəvvür eləyə bilmirdim və başa düşmürdüm ki, əgər "Raytorq"un sədri olan o adam gic oğlu gic idisə, niyə Mərcan xala hər gün onun evinə dörd kilo ağ çörək göndərirdi... Mərcan xala danışdıqca hər sözün başında bibim şaqqanaq çəkib gülürdü, elə bil biz bu alçaq tavanlı xəfə otaqda deyildik, haradasa, nağıllarda olan böyük, işıqlı bir imarətə düşmuşdük. Elə bil, bizim kənddəki evimiz yox idi, elə bil o ev heç vaxt olmamışdı.

Sonra onlar başqa kişilərdən danışdılar: onlardan iki nəfəri çörək dükanına görə Mərcan xalanı almaq istəyirdi; həm də içərilərində bir "bazburutlu" adam da yox idi, hamısı əl-ayaq altında qalanlar idi. Mərcan xala Qubadı da "gic oğlu gic" elədi, halbuki Qubad Mərcan xalanı hələ çörək dükanı olmamışdan istəyirdi. Bibim Yaqubdan bir kəlmə də söz demədi: Yaqubu gic oğlu giclərin siyahısına mən saldım və o gecəki söhbətdən belə bir nəticəyə gəldim ki, bütün arvadların ürəyində bibimin mahnısı kimi məktəb vaxtından, qızlıq çağından qalma bir mahnı var, həmişə ərə getmək məsələsi olanda o mahnı arvadların yadına düşür və məhz buna görə onlar, Müküş kimi, hətta Qubad kimi kişilərə də ərə getmək istəmirlər.



Bir axşam işdən qayıdandan sonra bibim Mərcan xala ilə məsləhətləşib, səhərlər işə gedəndə məni də özü ilə aparmaq məsələsini həll eləyəndə, bilmirəm, mənim o həyətdə tək oturmağımın neçənci günü idi. Biz kənddən çıxandan sonra, bilmirəm, neçə dəfə gün çıxmışdı, neçə dəfə gün batmışdı, bircə onu bilirəm ki, o gecə bibim mənim həyətdə tək qalıb darıxmağımdan danışanda, az qalıram deyəm ki, daha mən o həyətdə heç darıxmırdım. Daha mən kəndə qaçmaq barəsində fikirləşmirdim, həyətimizdəki divarın üstünə çıxıb, Yaqub küçədən keçəndə başına daş salmaq barədə fikirləşmirdim. Mən eyvanda Mərcan xalanın qapısı qabağında oturub bibimin yolunu gözləyirdim. Gözləyirdim ki, Qubad gəlsin, Vayenkomun dəli atından, yaxud bu gün bazarda baş vermiş əhvalatlardan danışsın. Gözləyirdim ki, Surət bacı gəlsin öz qəşəng əlləri ilə mənim burnumu, qulağımı ovxalayıb, sevinə-sevinə pillələnləri qalxsın. Gözləyirdim ki, Bəyxanım qarı gəlsin, yuxarıdakı eyvanda canamazını açsın, üzünü göyə tutub, namaz qılsın, Allahla danışsın.

Bibimin dediyinə görə, mən haradasa, zavodun qabağındakı bir qəşəng bağda oturacaqdım. Həm də orada böyük yol vardı və mən yoldan keçən maşınlara baxacaqdım, adamlara baxacaqdım, adamlara baxacaqdım. Üstəlik hansı uşaq bağçasınınsa uşaqları tez-tez o bağa gəlirdilər, onda mən heç darıxmayacaqdım. Günortalar bibim zavodun yeməkxanasından xörək alıb gətirəcəkdi; biz həmin bağda oturub xörək yeyəcəkdik... Bundan sonra bibimin yediyi də boğazında qalmayacaqdı və o biləcəkdi ki, xörək yeyir.

O xörəkdən sabah mənim də yeyəcəyimə bibim, Allah bilir, necə sevinirdi. Ançaq mən sevinməyə ürək eləmirdim: qorxurdum ki, orada bağ olmasın, o bağda uşaq olmasın... Axı, mənim hesab dəftərimin boş vərəqlərindəki nağılımda, Mədinə adlı bir bibim də vardı və bir dəfə o, Sadıq adlı bir uşağı aldadırdı: deyirdi ki, narın üstündə qırmızı-qırmızı güllər var; o gülləri görməyəndə Sadıq bibisindən küsüb dağlara qaçırdı. O dağlarda nar ağacları qırmızı-qırmızı güllər açmışdı. Sadıq qırmızı-qırmızı güllər açmış nar kollarının dalında gizlənirdi. Bibisi dağı-daşı dolanıb Sadığı axtaranda nar ağacları öz aralarında xısın-xısın pıçıldaşırdılar. Ancaq onlar Sadığın yerini bibisinə demirdilər, çünki bibisi Sadığı aldatmışdı...

Bağ vardı. Hələ orada ağaclar da vardı: şaftalı, badam, ceviz. Badamların çağalasını yemişdilər, budaqlarını qırmışdılar; cevizə, şaftalıya dəyib-toxunan olmamışdı, çünki onları kal vaxtı yemək olmazdı.

Bibimin işlədiyi konserv zavodu bazarın qabağından keçən böyük asfalt yolun lap axırında idi. Daha doğrusu, ora yolun axırı deyildi, şəhərin axırı idi. Bazardan bir qədər yuxarıda, qabağında Leninin heykəli, içində ancaq yolka ağacları olan bağın yanından başlayan o yol konserv zavodunun qabağından uzanıb, üzü enişə, vağzalacan gedirdi. Bizim kəndə gedən maşın yolu da, zavod hasarlarının qurtaracağında, həmin yoldan ayrılırdı.

Uca hasarların arasında mən konserv zavodunun yalnız uzun, qara borusunu görürdüm. Bir də bir nazik boru içindən ağ buxar buraxıb, vağzaldan keçən qara qatarlar kimi ucadan ulayırdı. Nazik boru ulayan kimi zavodun küçəyə açılan böyük darvazasından, ardı-arası kəsilməyən bir axınla, ağ xalatlı qızlar, qadınlar çıxırdı. Onların hamısının ayağında başmaq əvəzinə bir qalın taxta vardı və onlar asfalt yola çıxanda o taxta başmaqların taqqıltısından küçədə ağız deyəni qulaq eşitmirdi. Sonra qızlar, qadınlar iki-iki, üç-üç, beş-beş ayrılırdılar. Bir dəstə bağa doluşurdu. Bir dəstə yolun qırağındakı çayxanaya girirdi, orada arvadlar çörək dəsmallarını stolların üstünə açıb, nahar eləyirdilər. Zavod işçilərinin bir qismi (əsasən qızlar) iki-iki, üç-üç dəstələnib, nə haqdasa tez-tez danışa-danışa asfalt yolla üzüyuxarı bazara tərəf gedirdilər və özləri gözdən itəndən sonra da, onların tələsə-tələsə sürüdükləri qalın taxta başmaqların taqqıltısı evlərin arxasında, ağacların dalında eşidilirdi.

Sonra zavod darvazasının dalında bibimin ağ tənzif çarqatı və şən, sevincək üzü görünürdü. O, çarqatının altında bir qab isti xörək, həmişə sevinə-sevinə mənə tərəf gəlirdi. Bibim zavod darvazasından hamıdan gec çıxırdı, çünki o, yeməkxanada xeyli vaxt xörək növbəsinə dayanırdı. Hər dəfə bibim oradan çıxanda darvazanın qabağında dayanmış arıq, törə bir kişi bibimin, içində xörək gətirdiyi, balaca qazanın qapağını götürüb-qoyurdu: bibim deyirdi ki, bu, onun vəzifəsidir. Biz bağda bir ağacın dibinə çəkilib, o xörəyi iştahla yeyirdik. Sonra bibim mənə bir manat pul da verirdi ki, ara sakitləşəndə gedib çayxanada çay içim. Bibimin özü heç vaxt çay içə bilmirdi, çünki biz çörəyi yeyən kimi nazik boru ağzından ağ buxar buraxıb ulayırdı və bibim boş qazanı çarqatının altına alıb darvazaya doğru qaçırdı. Bayaq



yol yuxarı taqqıldayan taxta başmaqlar, indi daha da tələsə-tələsə yol aşağı gəlirdi, ağaçların dibi boşalırdı, çayxanada ara seyrəlirdi, ancaq mən çay içməyə getmirdim, pulları yığıb saxlayırdım.

Bibim işdən çıxanacan mən bağda, yolun qırağında avaralanırdım və o yanda – zavod darvazasının qabağında törə, arıq bir kişi avaralanırdı. O törə kişinin vəzifəsi bibimin xörək qabına baxmaq idi, mənim vəzifəm burada durmaq idi, uzağa getməmək idi. Mən onsuz da uzağa getmirdim, təkcə yoldan keçən maşınların bizim kənddən gəldiyini görəndə qaçıb ağacların dalında gizlənirdim. Mən istəmirdim ki, o maşınların üstündə gedənlər məni yolun qırağında görsünlər, çünki o yolun qırağında mən özüm də özümə çox aciz görünürdüm.

Uzaqda, dəmiryol vağzalından qatarlar gəlib keçirdi. Mən oturub saatlarla o qatarların dalınca baxırdım. Qatarların dalınca baxa-baxa mən bir vaxt Surət bacını Bakıya qadınlar müşavirəsinə aparan qatarı fikirləşirdim və nə qədər qəribə olsa da, hələ də mənə elə gəlirdi ki, o qatar haradasa qaranlıq bir yolda, qara relslərin üstü ilə fit verib, sevinə-sevinə gedir və üstündə Surət bacının əksini aparır... Qubadı fikirləşirdim: görəsən doğrudanmı o, Vayenkomun atına baxırdı və doğrudanmı şəhərdə Qubaddan və Vayenkomun özündən başqa heç kəs o ata yaxın düşə bilmirdi?.. Görəsən, o, "raytorq" deyilən yer harada idi, orada qapının qabağında Mərcan xalanı arxadan qucaqlayıb içəri çəkmək istəyən kim idi və nəyə görə Mərcan xala hər gün onun evinə dörd kilo ağ çörək göndərirdi?.. Ağaclara baxa-baxa öz ağaclarımızı yadıma salırdım: görəsən, gilas ağacımızın gilası qalırdımı, görəsən, qarğanın yumurtalarından bala çıxmışdımı... Görəsən, Yaqubun bizim həyətdə əkdiyi xiyarlar, pomidorlar qalxmışdımı?.. Görəsən, Sədəf bacı indi harada idi: Yaqubun evindəmi, atası evindəmi? Görəsən, nə vaxtacan Sədəf bacını qovacaqdılar: Yaqub atası evinə, atası Yaqubun evinə?.. Mən o qədər fikirləşirdim ki, darıxmağa vaxtım qalmırdı, zavodun fiti çalınırdı və bu dəfə adamlar ağ xələtdə yox, hər kəs öz paltarında böyük darvazadan küçəyə çıxırdı. Bu dəfə başmağı olanlar başmağında gedirdi, başmağı olmayanlar yenə də, fasilə vaxtındakı kimi, həmin taxta başmaqları yol yoxuşa sürüyürdülər. Biz hər gün səsli-küylü bazarın yanından keçirdik, Lenin bağının qabağından dönüb evə gedirdik və səhərlər həmin yolla zavoda qayıdırdıq.

Bir səhər biz yenə də bazarın yanından keçib zavoda gedəndə mən bibimə yalvardım ki, daha məni uzağa aparmasın, qoysun elə buradaca

dayanım. Bibim razı oldu, bu şərtlə ki, gərək zavodun fiti çalınmamışdan qabaq mən bağın qabağında hazır olaydım və əgər buralarda Yaquba rast gəlsəydim, gərək olduğumuz evin yerini ona deməyəydim.

Mən nə Yaquba rast gəldim, nə də ona olduğumuz evin yerini dedim. Ancaq bir gün biz elə təzəcə evə qayıtmışdıq ki, birdən-birə Yaqub küçə qapısını açıb içəri girdi.

O gələndə hələ Mərcan xala evə gəlməmişdi. Surət bacı yuxarıdakı eyvanda dodağının altında mızıldaya-mızıldaya, pilətənin üstündə nəsə bişirirdi və onun xırdaca çölməkdə bişirdiyi biradamlıq azca xörəyin həmişəki dadlı iyi yenə də həyəti ağzına götürmüşdü. Qubad da evdə idi. O, səhərlər xəşil bişirdiyi qazanı ağzınacan kartofla doldurub pilətənin üstünə qoymuşdu və Mərcan xaladan küsəndən sonra özü üçün sərhəd yeri elədiyi direyin yanından bir addım da bu tərəfə keçmədən, eyvanda gəzinə-gəzinə yenə bibimlə dava vaxtının aclığından danışırdı. Qubad öz satdığı şeyləri sayırdı, bibim də bizim satdığımız şeylərdən danışırdı. Boylu-buxunlu Yaqub, başının eyvanın alçaq tavanına toxunacağından qoxurmuş kimi, bir qədər əyilə-əyilə bizə tərəf gələndə bibim Qubadla elədiyi söhbətə ara vermədi. Hətta Yaqub Mərcan xalanın qapısı qabağında bizimlə lap üz-üzə dayananda da, ona heç bir əhəmiyyət vermədiyini göstərmək üçün, bibim Qubadla danışmağa çalışdı. Ancaq Qubad bunu başa düşmədi. O, arxasını bizə tərəf çevirib, bir müddət öz kartof qazanının yanında oturdu, sonra durub qaranlıq otağına girdi.

Bir muddət Yaqub çaşqın halda qapının qabağında dayanıb içəridəki kətillərə baxdı, çünki bayırda oturmaq üçün yer yox idi və bibim içəridən onun üçün kətil gətirmirdi. Həm də Yaqubun əlində kağızın arasında pryanik vardı, kağız cırılmışdı, pryanik tökülürdü. Yaqub bilmirdi ki, onu hara qoysun. Bir də, Yaqub bilmirdi ki, kiminlə danışsın; bibim üzünü o yana tutmuşdu, mən başımı aşağı salmışdım və

Bibim o başdakı direyin yanında durmuşdu. Yaqub bu başdakı direyə söykənib dayanmışdı. Bibim səsini çıxarmadı və Yaqub bir də dilləndi:

– Mən gəlmişəm sizi aparım.

Bibim başını qaldırıb şost ilə Yaqubun üzünə baxdı, bu baxmaqla, mən elə bildim ki, bibim deyəcək, qələt eləmisən; məncə Yaqub da belə zənn elədi. Ancaq bibim dedi:

– Eləmi? Sənə əziyyət olub ki...

– Nə olar? Nəcəf əmoğlu çox əziyyətimizi çəkib. Biz də onun bacısının əziyyətini çəkərik. Dünya başlı-başına qalmayıb ki... Hələ Nəcəfin qohumları ölməyib ki, bacısı gəlib onun-bunun həyətində qalsın, itin-qurdun içində!

Bunu deyəndə Yaqub yoğun, qırmızı boynunu çevirib Qubadın kartof qazanına sarı baxdı. Bibim də həmin səmtə baxdı və heyf ki, həmin o bir neçə saniyədə bibim Yaquba deyəcəyi sözlərin çoxunu yenə də ürəyində dedi. Bibimin dildə dediyi ancaq bu oldu:

– Çıx get, Yaqub, çıx get. Bu həyətdəkilər səndən əskik adam deyil!

– Məndən qoy əskik olmasınlar, artıq olsunlar. Ancaq mən namusuma sığışdıra bilmərəm ki, dostumun, qohumumun, minillik qonşumun bacısı gəlib yad yerlərdə, yad adamların içində qalsın. Jüz kişinin arasından keçib getsin, zavodda işləsin. Gül kimi evi qalsın başına. Bağbağçasının meyvəsi ağacların dibində çürüsün. Bəyəm nə olub ki? Çayımız var, çörəyimiz var. Allaha şükür, kolxozun o boyda anbarı da indi öz əlimizdədir. Uşaq, bu qupquru həyətdə bekar-bekar oturunca, gələr bir saatlıq qaraltı eləyər, gedəndə də anbarın olanından qoltuğuna doldurub aparar. Biz də evimizdə rahat oturanq. Bilərik ki, abırımız içimizdədir. Bilərik ki, Nəcəfin özü qalmasa da, el içində namuslu adı qalıb.

Bibim dedi:

– Heç kəs səni Nəcəfin namusuna vəkil eləməyib. İkincisi, əgər

özümü möhkəm-möhkəm sıxmışdım ki, Yaqub danışdırsa cavab verməyim... Sonra onu gördüm ki, Yaqub ehmalca əyilib pryaniki direyin dibinə qoydu. Sonra onu eşitdim ki, Yaqub üç-dörd dəfə “öhə, öhə”

namuslu adamsan, get öz arvadını adam kimi saxla. Həftə səkkiz mən doqquz, gözünün altını qaraldıb dədəsinin üstünə göndərmə. Sonrası, əgər bilmək istəyirsən, mənim o həyətin heç yerində gözüm yoxdur –

– Xeyr, yaxşılığın keçib. Ancaq bundan sonra mən day istəmirəm o yaxşılığı.

– Mən qoymaram səni bu evdə qalasan.

– Sən kimsən?

– Mən heç kiməm, ancaq hamı bilir ki, bu evin sahibi kimdir.

– Bu evin sahibi səndən min pay namuslu adamdır.

– Onun namusunu bütün rayon bilir.

– Gözünlə görmüsən?

– Qulağımla eşitmişəm!

Heç özüm də bilmirəm niyə mən birdən başımı qaldırıb Yaqubun qulaqlarına baxdım və nə üçün mənə elə gəldi ki, onun qulağı olduğunu birinci dəfə görürəm. Bibim dirəyin dibindən aralandı. Qapının qabağındakı vedrəni götürüb, suyunu tələsmədən pilətənin üstündəki çaydana boşaltdı. Sonra bibim əlində vedrə gəlib Yaqubla lap üz-üzə dayandı.

– O qulaq ki, səndədir, – dedi, – çox keçməz mənim də namussuz olmağımı eşidərsən. İndi yeri, çıx get. Səni bura çağıran olmayıb.

Bibim Yaqubun söykəndiyi dirəyin yanındaca həyətə atılıb elə bil vedrəni qəsdən daha bərk cingildədə-cingildədə həyət aşağı getdi. Bir müddət Yaqub bilmədi neyləsin, o yana baxdı, bu yana baxdı, sonra o da cəld hərəkətlə çevrilib küçə qapısına tərəf üz qoydu və bibim artıq dəhlizin altındakı çeşmədə olanda Yaqub qapının çöl tərəfindən başını içəri uzadıb, bilmirəm – mənimmi, Qubadın qaynayan kartof qazanınınmı, yoxsa nəyin üstünə bağırdı:

– Hələ bizim nəsildən binamus adam çıxmayıb. Mən o adamın boğazını cücə boğazı kimi üzərəm!

Yaqub qapını çırpıb getdi. Sonra qapı açıldı – Mərcan xala gəldi. Sonra bibim vedrə əlində qaranlıq çeşmədən çıxdı və Surət bacı eyvandan boynunu uzadıb soruşdu ki, o "yekəbaş" kim idi. Hələ bibim Surət bacının cavabını verməmiş, Mərcan xala özünü yetirib dedi ki, qapıdan bir əntiqə oğlan çıxdı, beləsinin çarığını çıxardasan, boynuna qalstuk taxasan, olar anadangəlmə "minisdir". Surət bacı dedi ki, eləsini gərək salasan qoduqluğa, əlinə bir ağac alıb başına-başına vurasan, bilə ki, Sovet "hökumətində" qadınla necə danışarlar... Surət bacı ilə Mərcan xala yenə də mübahisəni qızışdırdılar. Biri dedi: kobud kişi yaxşıdır; biri dedi: kişi gərək nəcib olsun, "arvadın hüququnu tapdalamasın". Bibim Yaqubun barəsində çox söz demədi. Bircə bunu dedi ki, Yaqub bizim lap uzaq qohumumuzdur, özü də kənddə ondan gönünqalın adam yoxdur. Bibim dedi ki, Yaqub arvadını döyə-döyə azara salıb, əgər Mərcan o yazığı görsəydi, belə danışmazdı.



Yaqubun söhbəti tez qurtardı, ancaq onun pryaniki səhərəcən dirəyin dibində qaldı. Yaqub gedənəcən Qubad evdən çıxmadı. Sonra çıxdı – nə bir söz soruşdu, nə də mübahisəyə qarışdı. Ancaq üç-dörd gün keçəndən sonra bir dəfə biz həyətdə tək olanda Qubad Yaqubdan söhbət saldı:

– Ə, sənin o kətdin lap heyvan adama oxşayırdı ha... Deynən niyə?

Dedim:

– Niyə?

Dedi:

– Zalım oğlu elə bil zooparkdan bezbilet qaçmışdı, içəri girəndə bizə Allahın bir quruca salamını da vermədi.

Üç-dörd gündən sonra Yaqub bazarın qabağında başımın üstünü alıb, bir bükülü dəftər vərəqini hirsli-hirsli mənə uzatdı:

– Bibinə ver!.. Özün də, – dedi, – buralarda bekar-bekar avaralanma, simişqadan-zaddan al, sat!

Mən Yaqubun məktubunu bibimə vermədim, çünki o məktubda bibim bütün bir nəsli bir çolağa satmışdı. Çünki, o çolaq, heç şübhəsiz, Qubad idi və tək mən yox, hamı bilirdi ki, Qubad bibimi yox, Mərcan xalanı istəyir. Tutalım ki, doğrudan da Yaqub bibimi "şah arvadı" kimi saxlaya bilərdi, şah arvadı olmaq bibimin nəyinə lazım idi? Əgər bibim o məktubu oxuyub görsəydi ki, Yaqub təkcə onu yox, hələ ondan başqa "beş-altısını" da şah arvadı kimi saxlaya bilər – buna görə bibim, heç şübhəsiz, sevinməzdi. Bir də Yaqubun döyə-döyə azara saldığı Sədəf bacının özü də o məktubda şah arvadı deyildimi? Nə olsun ki, Sədəf bacı heç kəsdən əskik geyinmirdi və nə olsun ki, Sədəf bacının sandığında "hələ əyinə taxılmamış on dəst ipək paltar vardı, kəlağayılar vardı ki, hələ heç qatı açılmamışdı". Mən o kağızı bibimə verə bilməzdim, çünki orada, atamdan qalan ev də, həyət də mənim idi (bibim evini çoxdan dağıtmışdı). O məktubda Yaqub mənim həyətimə baxırdı. Bir də, ona görə baxırdı ki, o ev-eşik "Nəcəf əmoğlu"nun" idi... Üstəlik, bibim bilsəydi ki, hələ Yaqub bizdən əl çəkməyib və "o, bircə him eləsə, ömrü boyu şah arvadı kimi yaşayar" – onda, yəqin ki, bibimin lap qanı qaralardı...

Mən arxın qırağında oturub məktubu oxudum, xırda-xırda doğrayıb tökdüm suya, su apardı, baxıb həzz aldım. Amma "simişqa" məsə-

ləsi yaman beynimə batdı. Elə həmin gün mən bibimin çay üçün verdiyi və axşamlar çörəyin pulunu sayanda hərdən Mərcan xalanın bağışladığı şax manatlardan üçünü çayçının şəyirdinə verib bir çat stəkan aldım. Torba əvəzinə, konserv zavodunun dal tərəfindəki küllükdən bir ağzı əyri dəmir qab tapdım. Günəbaxanı bir günəbaxan satanın özündən, bahasına aldım. Bazarın qabağında, pinəçi budkasının yanında özümə yer tutdum. Bir neçə gün bibimdən xəlvət "alver" elədim; nahar vaxtı zavodun yanındakı bağa gedəndə və işdən sonra bibim qayıdıb gələndə mənim günəbaxanım pinəçinin himayəsi altında qaldı. Bu əhvalatın üstü bir axşam şam vaxtı açıldı. Ancaq hirslənmək əvəzinə bibim sevindi: dedi ki, heç olmasa məktəb açılanacan uşağın başı qarışar, hətta sabahısı gün, mənim yalvar-yaxarımdan sonra bibim köhnə əski parçasından bir xırdaca torba da tikdi, axşam mən sevinə-sevinə günəbaxanı o torbaya boşaltdım və səhər bazara gedəndə konserv zavodunun dalındakı küllükdən tapdığım əyri dəmir qabı küçəyə tulladım.

* * *

Darıxma, Sadıq, darıxma.

Asfalt yolun üstünə gün düşüb, təzə gün, təmiz gün, lap indicə düşüb. Hələ ki, onu tapdalamayıblar, zibilləməyiblər, hələ ki, arxdan da təmiz su axır – unut getsin o kəndi, çıxart yadından o dağları, o bağı, o bağçanı da yadından çıxart.

Sənin ki, sakitlikdən xoşun gəlir, Sadıq. Hələ ki bazar sakitdir, darıxma. Qoy o radio da o binanın başında nə qədər bağırır bağırsın, fikir vermə. Qoy o arvad o dəmirin içində özünü didib-töksün: "Ayaqlarınızı aralı qoyun... Qollarınızı yuxarı qaldırın... Dərindən nəfəs alın..." Səni qollarını yuxarı qaldırmağa məcbur eləyən yox, ayaqlarını aralı qoymağa məcbur eləyən yox; hələ ki, asfalt yol dərindən nəfəs alır, sən də dərindən nəfəs al, Sadıq.

Yolun kənarındakı dükanlar bağlıdır: "Sənaye malları", "Ərzaq mağazası", "Bərbərxana"... Bircə çayxanalar açılıb və çayçı "şagirdləri" su dolu vedrələri möhkəm taxtaların dəmir qarmağına keçirib, sallada-sallada, iki-iki, dörd-dörd çayxanalara daşıyırlar. Şagirdlər vedrələri çayxanaların qabağına qoyub dərindən nəfəs alır. Nəhəng, sarı samovarlar da hələ çayxanaların qapısı qabağında nəfəs alırlar. Bir



azdan samovarlar qaynayacaq, onda kəndlilər də kəndlərdən gələcəklər. Sən çalış ki, bu dəfə günəbaxanın yaxşısını alasan, Sadıq, yoxsa heç kəs səndən günəbaxan almayacaq, bekar qalıb darıxacaqsan.

Günün işığı yavaş-yavaş pinəçi Səlim dayının budkasına tərəf gəlir. Bir azdan Səlim dayının özü də gələcək. Axı, sən daha gərək darıxmayasan, Sadıq, indi sən pinəçi Səlim dayını tanıyırsan. Sən bilirsən ki, bu gün o, günortayacan bir girvənkə ətin pulunu çıxartsa, axşamacan kefikök olacaq, səninlə zarafat eləyəcək, sənə qəribə-qəribə şeylər danışacaq. Əgər Səlim dayı bu axşam ət yeyibsə, onun sümüyünü dəsmalın arasında mütləq bazara gətirəcək və o sümüyü mütləq qara itə yedizdirəcək. Sonra Səlim dayı qara itin qəşəng başını tumarlayacaq: "*Hürmək lazımdır, a köpək, hürmək lazımdır*".

Dörd köpək çörək bişirilən hisli binanın qabağında dayanıb. Onların üçü "həyasızdır", "dilənçidir" – buna görə də, Səlim dayının onlardan xoşu gəlmir. Səlim dayının qəssab Əlidən də heç xoşu gəlmir, çünki qara köpəyi küçələrə salan o olub. Qəssab Əli qara köpəyi bir kəndlidən bir qoyuna alıb, ancaq evinə oğru gələndə qara köpək hürməyib, oğrular qəssab Əlinin bahalı xalçasını aparıblar, buna görə də Qəssab Əli o qara köpəyi, bəs deyincə döyəndən sonra, qovub küçəyə salıb...

Küçənin o başından qəssab Əli bir kök inəyin boynuna ip salıb darta-darta gətirir. İndicə qəssab Əli inəyin ayaqlarını bağlayıb, bazarın dalındakı qoz ağacının dibinə yıxacaq. Yazıq inəyin boğazından indicə qan fışqıracaq. Qırmızı qan. Sonra qəssab Əli o inəyi bazarın qabağında parça-parça doğrayıb satacaq. Əgər günortayacan bir şey qazana bilsə, Səlim dayı da o ətdən bir girvənkə alacaq və sabah səhər qara köpək o ətin sümüklərini çeynəyəcək. Sabah səhər qoz ağacının dibində bu boyda inəkdən bir qara qan qurusu qalacaq, özgə heç nə qalmayacaq.

Göy satanlar, meyvə satanlar bir-bir bazara axışır – kiminin qolunda vedrə, kiminin çiynində kisə... Başmaqsilən daz Səftər də indicə taxtası çiynində gələcək. Oturacaq, müştəri gözləyəcək. Bir azdan zorba-zorba maşınlar gəlib bazarın qabağında dayanacaq və onların kabinələrindən kolxoz sədrləri düşəcək. Maşınların kabinələrindən düşən kolxoz sədrləri öz palçıqlı çəkmələrini dalbadal Səftərin taxtasının üstünə qoyacaqlar və Səftər o çəkmələrin palçığını sevinə-sevinə təmizləyəcək...

Axı, sən daha gərək darıxmayasan, Sadıq: indi bu Səftər də sənin üçün bir vaxt başmaq şotkalarını taqqataq taxtaya vurub, fasiləsiz çığıran əcaib bir şey deyil. İndi sən bilirsən ki, Səftər adamdır və o, daha çox başmaq silmək istəyir ki, bazardan yaxşı-yaxşı şeylər alıb yesin. Sən bilirsən ki, əgər Səftər səhər-səhər bir şey qazana bilsə, durub sevinə-sevinə bazara qaçacaq, iki iri lavaş alacaq, əlli qram yağ alacaq, əlli qram bal alacaq və mazlı qara əllərini arxın suyunda təmiz-təmiz yuyub, ləzzətlə nahar eləyəcək. Sən hətta onu da bilirsən ki, Səftər ancaq bal-yağ yeyəndə əllərini yuyur, əgər o, çörəyini şorla yeyəsi olsa, əlini yumayacaqdır.

Sən istəyirsən ki, Səftər həmişə bal-yağ yesin, elə deyilmi, Sadıq? Sən istəyirsən ki, Səlim dayının hər axşam əti olsun və hər səhəp o, dəsmalının arasında qara köpəyə sümük gətirsin. Əgər bu gün Səftərin bal-yağ almağa pulu olmasa, buna görə sən darıxma, Sadıq, onun qara, mazlı əllərinə fikir vermə. Yadından çıxarma ki, bu gün olmasa da, sabah Səftər bal-yağ almaq üçün pul qazanacaq və çörəkdən qabaq qara, mazlı əllərini arxın suyunda təmiz-təmiz yuyacaq. Əgər Səlim dayı bu gün də, sabah da ət ala bilməsə, hər halda birigünə onun bir girvənkə ət pulu hazır olacaq, əti dəsmala büküb aparacaq və səhər həmin dəsmalda da itin sümüyünü gətirəcək. Sən belə şeylərə görə darıxma, Sadıq, sən belə şeylərə görə narahat olma.

İtlər çörək bişirilən hisli binanın yanından bazara tərəf gəlir. Qurbanın olum, qara köpək, axı sən niyə həmişə belə fikirli dolanırsan? Bəlkə sən də o dağların dərdini çəkirsən, yoxsa səfil küçə itləri ilə dolanmaq sənə ağır gəlir? Bəlkə sən də qəssab Əliyə nifrət eləyirsən, qara köpək, ona görə ki, səni dağlardan ayırıb, ona görə ki, səni həyətindən qovub. Belə dilsiz-ağızsız olmasaydın, o səni hər görəndə təpikləməzdi. "Hürmək lazımdır, a köpək, hürmək lazımdır".

Gərək nə qədər axmaq olasan ki, çoban itinə həyət gözlədəsən. Gərək nə qədər alçaq olasan ki, hər dəfə o iti görəndə xalçan yadına düşə. Gərək nə qədər qorxaq olasan ki, yaxşı günəbaxan almaq istədiyinə görə səninlə dalaşmağa fürsət axtaran bu torbalı, stəkanlı uşaqlardan qorxasan. Sən gərək qorxmayasan, Sadıq, çünki Səlim dayı yanındadır. Çünki sənin Qubad kimi dostun var, Sadıq, ayağı şikəst olsa da, qolları qüvvətlidir.

Darıxma, Sadıq, darıxma! Bir azdan Qubad Vayenkomun dəli atını gətirib nallatmağa aparacaq, ya da Qubad elə-belə bazara gələcək və



sənin yanında oturub, gözlərini çörək dükanının qırmızı qapısına zilləyəcək. Sən deyəcəksən: günəbaxan götür, götürməyəcək. Qubad deyəcək: satdıq mala haram qatmazlar və əgər bir müştəri gəlsə o, sevinə-sevinə stəkanı günəbaxanla dolduracaq.

Sən istəyirsən ki, Qubad bazarda olanda müştəri gəlsin. Ona görə istəyirsən ki, Qubad sevinə-sevinə stəkanı günəbaxanla doldursun və müştəridən bir manatı alıb, min manatın sevinci ilə sənə versin. Sən istəyirsən ki, Qubad burada olanda Mərcan xala çörək dükanının qapısında görünsün, ya da bazara çıxsın, əllərini arxasında cütləyib, açarlarını cingildədə-cingildədə adamların qabağından keçsin. Sənin özün də Mərcan xalanı o sarı ipək donda və o təzə ağ kəlağayıda görəndə xoşlanırsan, elə deyilmi, Sadıq? İstəyirsən ki, Mərcan xala gündə yüz dəfə bazarın yanından keçib, sənin üzünə gülümsəsin və torbadan bir ovuc günəbaxan götürüb, çırtdaya-çırtdaya bazarı gəzsin. Sən istəyirsən ki, Mərcan xala gündə yüz dəfə buradan keçsin və qəssab Əli sədəf təki dişlərini ağardıb, onun qabağında yaltaq-yaltaq hırıldasın; panamalı, qalstuklu adamlara baş əydiyi kimi, baş əysin. Sən ki, o fil boyda qəssabı gündə yüz dəfə dovşan şəklində görürsən, daha niyə darıxırsan?..

Darıxma, Sadıq, darıxma! Bir azdan zavodun fiti çalınacaq və sən torbanı çiyninə atıb küçə aşağı qaçacaqsan. Sən zavodun qabağındakı bağda bir ağacın sərin kölgəsində oturacaqsan, bibin isti xörəyin içinə xırda-xırda çörək doğrayacaq, sən o xörəyi də, çörəyi də ləzzətlə yeyəcəksən. Sonra sən bazarın qabağında yenə Səlim dayı ilə yan-yana oturacaqsan, Səlim dayı başmaq yamayacaq və sənə də, qara köpəyə də öz cavanlığından danışacaq. Sonra sən, o qara köpəklə birgə, uca dağların başında olacaqsan: o yerdə ki, nar ağacları sərin-sərin sular içir, qırmızı-qırmızı çiçək açır... Sənin qara köpəyin böyük-böyük canavarları boğacaq və həmişə sən ona qoyun əti yedirəcəksən. Sən Səlim dayıya şaqqa-şaqqa qoyun əti göndərəcəksən və Səlim dayının kefi həmişə yaxşı olacaq. Səftərə bal-yağ pulu vermək üçün bu şəhərə gələndə sən həmişə qara çəkmə geyəcəksən, Sadıq və bir gün sən qoz ağacının dibində qəssab Əlini yerə yıxıb, o qara çəkmələrlə budayacaqsan. O qara çəkmələrlə sən arxın qırağında boş-bekar oturub, "detdom" qızlarının çılpaq qıçlarına baxan avaraları vurub arxa salacaqsan və ondan sonra qızların hamısı, yoldan rahat keçəcək. Sən o qara çəkmələrlə bir gün "*raytorq*" deyilən o ağ binanın taxta pilləkən-

lərini cırıldada-cırıldada yuxarı qalxacaqsan və oradakı göy qapının qabağında Mərcan xalanı arxadan qucaqlayıb içəri çəkmək, divanın üstünə yıxmaq istəyən o "gic oğlu gici" ölənəcən döyəcəksən. İndi sən bilirsən ki, niyə Mərcan xala o adamın evinə hər gün çörək göndərir, indi sən çox şey bilirsən, Sadıq, ona görə də daha gərək darıxmayasan...

Axşamlar o uca divarların arasında keçən saatlar da indi əvvəlkindən xoş keçirdi. İndi mənim də saymağa pulum vardı və hər axşam Mərcan xala çörək dükanının pullarını qabağına töküb sayanda mən də öz pullarımı gətirib ortaya tökürdüm. Mən öz əprimiş manatlarımı Mərcan xalaya verirdim, Mərcan xala mənə şax manatlar seçib verirdi. O şax manatları mən böyük pulla dəyişmək istəmirdim, çünki onda mənim cəmisi bir, ya iki pulum olardı. Mənim bir dəstə şax manatım vardı və onun üstünə bircə manat əlavə olunan kimi mən o manatların hamısını sayırdım; yavaş-yavaş sayırdım ki, tez qurtarmasın, aralı-aralı qoyurdum ki, az görünməsin. O pulları saymaq bilmirəm nə qədər vaxt aparırdı, ancaq mən ürəkdən istəyirdim ki, o vaxt daha çox olsun.

Axşamlar, mən pul sayanda, bibimin gözləri həmişə üstümdə olurdu. Ya o mənim bu cür maraqlı məşğuliyyət tapmağıma sevinirdi, ya da bibim mənə baxıb ayrı şeylər fikirləşirdi və axşamlar çiynini divara söykəyib oturanda onun gözlərindən həmişə bir yorğun xoşbəxtlik süzülürdü. Bunun səbəbi, bəlkə də, Yaqubun birdən-birə bizdən əl çəkməyi idi. Axı, buna heç inanmaq olmurdu. Heç inanmaq olmurdu ki, onun bizdən həmişəlik əl çəkməsi üçün bibimin bircə dəfə bazarın qabağından zavoda corabsız getməyi lazım imiş və bütün bu əhvalatlar bir səhər Yaqubun bazarın qabağında məni yaxalayıb, az qala yarım saatlıq hədədən, qışqırıqdan sonra mənə "arvad" deyib üzümə tüpürməyi ilə qurtara bilərmiş. Bibimin bazarın qabağından corabsız getməyini, yəqin ki, Yaqubun özü görməmişdi. Bu xəbəri, yəqin ki, ona bizim kənddən bazara gələnlərin biri aparıb çatdırmışdı. Şübhəsiz, Yaqub bilmirdi ki, kənddən gələndən sonra bibim Mərcan xalanın olan-qalan bir cüt corabını da dağıdıb və Mərcan xala söz verib ki, "raytorqun anbarına" corab gələn kimi bibim üçün də, özü üçün də əl altdan yaxşı-yaxşı corablar götürəcək. Ola bilsin ki, "raytorq"un anbarına tezliklə corab gələcəkdi. Ola bilsin ki, lap yaxın vaxtlarda bibim bazarın qabağından corab geyib keçəcəkdi. Ancaq mən yəqin bilirdim



ki, Yaqub əhvalatı qurtarıb. Bu, həm o vaxt Yaqub bazarın qabağında yarım saatlıq hədədən, qışqırıqdan sonra mənə "arvad" deyib, üzümə tüpürüb gedəndə ürəyimə dammışdı, həm də Yaqub kənddən üc-dörd adamla bibimə sifariş göndərmişdi ki, daha biz qohum-zad deyilik...

İndi Qubad da Mərcan xala ilə barışmışdı. Dirəyin dibində özü üçün qoyduğu sərhədi keçmişdi, hətta çörəkdən sonra o, söhbət eləmək üçün bizim yanımıza gəlirdi. Əslində Qubad Mərcan xala olan yerdə danışa bilmirdi. Mərcan xala ilə üz-üzə duranda, özü demişkən, dili tutulurdu. Qubad dinməz-söyləməz kətilin üstündə otururdu və dinməz-söyləməz çıxıb gedirdi. Bəzən Qubad araq içib gəlirdi, ancaq onun içməyinə heç kəs fikir vermirdi. Bəzən Qubad kobudluq eləməyə çalışırdı: kətili cırıldadırdı, bərkdən danışırdı, yalandan papiros çəkirdi, çünki o bilirdi ki, Mərcan xalanın kobud kişilərdən xoşu gəlir. Ancaq Qubadın kobudluğuna da fikir verən olmurdu. Nə qədər lovğa-lovğa içəri girsə də, otaqdan çıxanda Qubad özünü "kobud" kişiyə oxşada bilmirdi. Bircə gündüzlər Surət bacını görəndə hərdən Qubadın dili açılırdı. Zarafatla deyirdi ki:

– Yoldaş Jenaddel, bəs bizim məsələmizə nə vaxt baxacaqsan? Bu Mərcanı al mənə, canım dincəlsin.

Bu sözləri Qubad uzaqdan-uzağa Mərcan xalanın özünə eşitdirirdi. Çox vaxt Mərcan xala özünü eşitməməzliyə vururdu, bəzən də baş barmağını iki barmağının arasından çıxarıb, uzaqdan-uzağa Qubada göstərirdi:

– Onu görəndə bunu görərsən.

Mərcan xala deyirdi ki:

– Bircə çolağımız əskikdir.

Qubad qətiyyən incimirdi:

– Ayağı salamat olanların başı xarabdır, – deyirdi, – səni alan olmayacaq, axırda mənə qismət olacaqsan.

Beləcə, xeyli vaxt onlar uzaqdan-uzağa bir-birinə sataşırdı. Ancaq axşamlar Mərcan xala ilə üzbəüz oturanda yenə də Qubadın dili tutulurdu. Yenə axşamlar Surət bacı gəlib nişanlısından danışırdı və gecə Qubadla mən divarın üstündə "kino"ya baxırdıq. Bir vaxt, qatarlarda olan, hansı pəncərəninsə üstündə Surət bacının əksinə baxan o oğlan indi başqa bir qatarla gəlirdi. İndi Surət bacı toydan danışırdı və mən istəyirdim ki, o toy bizim həyətdə olsun. Həm də mən Surət bacının bizim həyətdə toy eləməyini istəmirdim, çünki Bəyxanım xalanın

oğulları qayıtmamışdı. Hətta ürəyimin dərinliyində mən Surət bacının heç yerdə toy eləməyinə razı deyildim; istəmirdim ki, o gecə zurna çalsınlar, nağara vursunlar. Çünki bibimi Müküşün evinə aparanda zurna çalmışdılar, nağara vurmuşdular və bibim bu əhvalatı danışandan sonra hələ də mənə elə gəlirdi ki, toylarda zurna çalınanda, nağara vurulanda ərə gedənlərin heç biri xoşbəxt olmur...

Bir səhər bazarın qabağında mən pinəçi Səlim dayıdan eşitdim ki, kimsə əsgərlikdən qayıdıb. Sonra Qubad gəldi və sevinə-sevinə xəbər verdi ki, o adam Surətin nişanlısıdır. Məlum oldu ki, Qubad o adamı tanıyırmış, hətta evlərinin yerini də bilirmiş. Qubad mənə, şəhərin lap yuxarı başında, qabağı bağlı-bağatlı qəşəng bir ev göstərdi və ağzı sulana-sulana dedi ki, bu gün-sabah Surəti "dambadurum ilə aparıb, o evdə dincəldəcəklər". Tez-tez çörək dükanına baxa-baxa bir xeyli Qubad, Surət bacının nişanlısının boy-buxununu təriflədi. Sonra, ümumiyyətlə, qızların gəlin aparıldığı gecədən, yengədən, qapının dalında dayanıb bəylə gəlinin "haqq-hesabının" qurtarmağını gözləyən qırmızı paltarlı arvadlardan... nə bilim daha nələrdən danışdı. Bir sözlə, Qubad məni toy gecəsinin bir çox sirlərindən agah elədi və gedəndə əlini çiynimə vurub dedi ki:

– Daha kino qurtardı!

Surət bacının necə sevindiyini görmək üçün o gün mən hələ bazar bağlanmamış tələsə-tələsə evə gəldim, ancaq Surət bacının qapısı bağlı idi. O gecə divanın üstündə doğrudan da "kino" olmadı, heç ertəsi gün də mən Surət bacının nə vaxt evə gəldiyini və nə vaxt durub işə getdiyini görmədim. Sonra, üç-dörd gün dalbadal Surət bacı iş qurtaran vaxtdan xeyli keçmiş evə qayıdıb, heç kəsi dindirib-danışdırmadan, pilləkənləri tələsə-tələsə yuxarı çıxdı, yenə pilləkənlərdən enib, qaça-qaça harasa getdi. Heç kəsi dindirib-danışdırmayan Surət bacı üç-dörd gün dalbadal küçə qapısına aman vermədi: getdi taqqıldatdı, gəldi taqqıldatdı. Nəhayət, bir axşam çıraqlar təzəcə yananda Surət bacı, kölgə kimi, biz olan otağın qapısından içəri girdi. O, xeyli vaxt dinməz-söyləməz aynanın qabağında dayanıb, xəstəlikdən təzəcə duran adamlar sayağı, diqqətlə öz sifətinə baxdı; Surət bacı xəstə adamın gözləri kimi azca qabarmış gözlərini xırdaca dəsmalının ucu ilə dönə-dönə sildi, qaşlarını düzəltdi, dodaqlarını çəkişdirdi və bütün bunları eləyəndən sonra o, üzünü bibimə tutub:



– Beynini doldurublar, – dedi. Lap astadan dedi və Surət bacı ilk dəfə yerdə, bibimin yanında, bibim kimi çiynini divara söykəyib oturanda mən onun da əynində bibimin, Mərcan xalanın, kəndimizdəki çeşmənin qırağında yan-yana düzülüb, paltar, qab-qaşıq yuyan qızların, qadınların əynində gördüyüm adicə göy tursik gördüm və heç özüm də bilmirəm nəyə görə Surət bacı birdən-birə mənim gözümdə adiləşdi. Surət bacını neçə illərdən bəri Bakıya, qadınlar müşavirəsinə aparan o qatar da elə bil birdən-birə dayandı və onun neçə illər boyunca fit verib sevinə-sevinə getdiyi qaranlıq yollara sükut çökdü.

Otağın ölü sükutunda xeyli vaxt haradansa içəri soxulub, indi çıxmaq üçün yer axtaran yekə bir eşşək arısının dızıltısı eşidildi. Sonra Surət bacı ağlaya-ağlaya oğlanın anasından və bacılarından danışdı: oğlanın anası Surət bacıya demişdi ki, əgər sən düz yuvanın quşu olsaydın, gedib raykoma çıxmazdın; kiçik bacı demişdi ki, əgər abırlı qız olsaydın, indiyədək səni də alan tapılardı; oğlanın böyük bacısı, hamamda çək satan "kaftar bacısı", "donqar bacısı", "aranqutan meymuna oxşayan o ifritə" göz görə-görə Surət bacının üzünə dirənmişdi; demişdi ki, mən sənə neçə dəfə öz əlimlə çək vermişəm, gedib nömrədə kişilərlə çimmisən...

Hələ oğlanın xalası da vardı. "Öz qızını işə keçirmək üçün" o da Surət bacının adına yüz cür böhtan yaxmışdı. Surət bacı o böhtanların da bir neçəsini saydı, ancaq o, kölgə kimi qapıdan çıxıb pilləkənlərlə yavaş-yavaş yuxarı qalxanda Mərcan xala bu deyilənlərin hamısını yalana çıxartdı. Mərcan xala dedi ki, bu deyilənlərin hamısı boş-boş sözlərdir, "daş Surətə ayrı yerdən dəyib". Dedi ki, keçən yay Surət "domkulturanın bir sürü artisti" ilə burdan vurub Sevana çimməyə gedib. O boyda yolu vurub getməyi bir yana dursun, hələ deyilənə görə, orda Surət kişilərlə çaxır içib, kefli olub, yüz cür oyun çıxardıb. Bunun üstündə Surəti raykomdan çıxarmaq istəyiblər, ancaq yazıqları gəlib çıxarmayıblar; bu məsələni oğlana raykomun öz işçilərindən biri çatdırıb və bunu bilən kimi oğlan dili ilə deyib ki, daha mən o adda qız tanımıram...

O gecə də divanın üstündə "kino" oldu, ancaq o kino "Arşın mal alan" kinosu deyildi. O gecə Surət bacı da Gülçöhrə deyildi, bütün qadınlar kimi əyninə göy tursik geyən adicə bir qadın idi və o, pəncərənin qabağında oturub ağlayırdı...

Surət bacı o pəncərənin qabağında neçə gün ağladı – bilmirəm. Sonra mən Qubaddan eşitdim ki, oğlan öz xalası qızı ilə nişanlanıb.

Sonra Mərcan xala xəbər gətirdi ki, o oğlanı "Qorsovet"in sədri qoyublar: o gecə mən qara çəkmələrdə "Qorsovet"in həyətinə girdim və o oğlanın peysərindən yapışıb, həyətdən küçəyə tulladım. "Arşın mal alan" qurtardı, ancaq Surət bacının qara kölgəsi həmişəlik divarda qaldı. Bir səhər mən kəndlilərdən günəbaxan almaq üçün bazara tələsəndə Qubad çarpayısından dikəlib soruşdu:

– Bu gecə baxırdın?

– Yox, – dedim, – mən daha baxmıram.

Və necə dedimsə, Qubad inandı. Qubad məni yanına çağırıb pıçıltı ilə dedi ki:

– İndiyəcən gözümü yummamışam. Bu geçə oğlanın toyu idi, yazıq qız az qalırdı özünü boğsun. Çarqatını boğazına keçirmişdi...

Sonra Qubad əsnəyə-əsnəyə yerində eşələnib:

– Daha mən də baxmayacağam – dedi və o, hirsli-hirsli yorğanı başına çəkəndə mən inandım ki, bu, Qubadın həqiqi sözüdür.

### III

Hələ məktəbin açılmağına xeyli qalmış bir axşamçağı işdən sonra bibim kəndə gedib, mənim beşinci sinfi qurtarmağım barədə kağız alıb gətirmişdi və çoxdan bəri idi ki, o kağız bazardan azca aşağıda, zavod yolunun üstündə dörd tərəfdən ağ divarlarla hasara alınmış uşaq evinin böyründəki "bir nömrəli məktəbdə" idi. Dərslərin başlanmağına üç-dörd gün qalanda daha bibim günəbaxan almaq üçün məni bazara buraxmadı. O üç-dörd günü də mən zavodun ətrafında hərləndim, şəhərin görmədiyim yerlərini gəzib-dolandım, hətta bekarçılıqdan, Qubadın göstərdiyi bağlı-bağatlı həyəti yaxından görmək üçün, gedib şəhərin lap yuxarısına da çıxdım. Mən o oğlanın həyətini yaxından gördüm; o oğlan ki, qatarda olan hansı pəncərəninsə üstündə bir vaxt Surət bacının əksinə baxmışdı, o oğlan ki, haçansa, hansı kağızdasa "Mən sənin surətini daim qəlbimdə yaşadacağam, Surət" sözlərini yazmışdı; o oğlan ki, indi şəhər sovetinin sədri olub, şəhərdə hamının tanıdığı "yoldaş Cəlilov" idi.

Hələ mən birinci sinfə gedəndən yaxşı bilirdim ki, sentyabr ayının biri də bibim üçün Novruz bayramı kimi bir şeydir. Fərq bircə burasında idi ki, Novruz ərəfəsində kənddə hamı çimirdi, hamı paltarını yuyurdu, ancaq dərslərin başlanmağına bir gün qalmış təkcə mənim



bibim Novruz bayramında olduğu kimi əl-ayağa düşürdü. "Sentyabr bayramı" deyilən sözü də mən bibimdən başqa heç kəsdən eşitməmişdim. Mənə elə gəlirdi ki, bir vaxt bu adda da bayram olmuşdu, sonra o bayramı hamı unutmuşdu, bircə bibim o bayramı unutmamışdı. Biz kənddə olanda həmişə dərslərin başlanmağına bir gün qalmış bibim su qoyub, həyətdəcə məni çimdirərdi, əynimə təzəcə yuyulmuş, təzəcə yamanmış şalvar geydirərdi, köynək geydirərdi; bibim məni səkinin üstündə otuzdurub əlimin, ayağımın dırnaqlarını qayçı ilə tutardı. Sonra bibim əlinə uzun bir paya götürub ağacların üstünə düşərdi. Sabah məktəbə aparmaq üçün mənə heyva salardı, şaftalı salardı; bunu o özü eləyərdi ki, mən ağaca çıxıb təzəcə yamanmış köynəyimi cırmayım, təzəcə yuyulmuş şalvarımı çirkləndirməyim...

Dərslərin başlanmağına bir gün qalanda, hələ günorta olmamış bibim işdən icazə alıb tələsə-tələsə evə gəldi. Pilətənin üstündə su qızdırıb, az da olsa, hər halda bayram sevinci ilə mənim paltarımı yudu, dırnaqlarımı tutdu. Axşamçağı Qubad evə gələnəcən paltarlar qurudu və bibim Qubada yalvardı ki, məni hamama aparsın.

Səhərisi gün məktəbə gedəndə mən özümdən çox razı idim. Bibimdən razı idim, çünki o, şalvarımın dizindəki yamağı çox ustalıqla salmışdı. Köynəyimi Surət bacı ütüləmişdi: ömrümdə birinci dəfə idi ki, mən ütülü köynək geymişdim. Mərcan xala çantama dörd pryanik, beş-altı konfet qoymuşdu. Həm də demişdi ki, "bu səhər sən konfet kimi yeməlisən". Qubad da yorğanının altından başını çıxardıb məni xoş sözlə yola salmışdı: "Jelayem udaç!"

Məktəbin bazara sarı olan iki taylı qırmızı qapıları açıq idi. Böyük asfalt yol boyaboy uşaqlarla dolmuşdu və arxın qırağında, pinəçi Səlim dayının budkasının qabağında oturmuş qara köpək məktəbə gedənlərin dalınca nəhayətsiz təəccüblə baxırdı. Qəssab Əli bu gün kəsdiyi heyvanın ətini dirəkdən asmışdı. Başmaqsilən daz Səftər gözlərini yoldan keçənlərin başmağına zilləyib oturmuşdu. Böyük, ağ binanın başındakı radio da bu gün məktəbdən danışırdı və elə bil onsuz da məktəbə tələsən uşaqları daha da tələsdirmək üçün tez-tez musiqi çalırdı. Səlim dayı bir köhnə başmağı dizinin üstünə qoyub tələsmədən yamayırdı və təəccübdən gözləri bərəlmiş qara köpəyə məktəbin nə demək olduğunu aram-aram başa salırdı.

Mən çantamdakı dörd pryanikin ikisini tələsə-tələsə qara köpəyə yedirtdim, bu vaxt ərzində Səlim dayı mənə öyüd-nəsihət elədi,

xeyir-dua verdi. Məktəbin qapısına çatanda mən dayanıb bir də Səlim dayının budkasına tərəf baxdım və hiss elədim ki, indi Səlim dayı qara köpəyə məndən danışır.

VI sinif binanın ikinci mərtəbəsində idi və onu səsli-küylü bazar yolundan bir qalın divar ayırırdı. Əgər o divarda pəncərə olsaydı, mən sinifdə oturub bazara baxa bilərdim, ancaq orada pəncərə yox idi, bir vaxt olmuş pəncərələrin suvanmış, ağardılmış yeri bilinirdi. Sinfin pəncərələri eyvana açılırdı. O pəncərələrdən "detdom"un dörd tərəfdən hasara alınmış böyük həyətindəki uzun qələmə ağaclarını görmək olurdu, bir də uzaqda, lap uzaqda konserv zavodunun qara, tüstülü borusu görünürdü.

Bizdən yuxarıda da eyvan vardı və bizim sinfin pəncərəsindən baxanda o eyvanın uşaq evinə tərəf uzanan kiçik bir hissəsini görmək olurdu. Məktəbin zəngi də orada dirəkdən asılmışdı və tənəffüs vaxtları bəzi müəllimlər o zəngin dövrəsinə yığışıb papiros çəkirdilər.

Hər səhər zavodun fiti çalınanda qoluna qırmızı lent bağlanmış bir müəllim o zəngi çalırdı. Bunun dalınca uşaq evinin həyətində də bir zəng çalınırdı, sonra müəllimlər əllərində jurnal bizim sinfin qabağından yuxarıdakı eyvana qalxan pilləkənlərdən bir-bir enib gəlirdilər. Bu vaxtlar müəllimlərə məxsus olan o eyvanda bircə, məktəbin direktoru Firuzə müəllim qalırdı. Qapqara saçları həmişə parıldayan, enli, gülümsər sifəti təzəcə hamamdan çıxan arvadların üzü kimi həmişə qırmızı və təmiz olan Firuzə müəllim eyvanın məhəccərinə söykənib bütün siniflərdə dərs başlananacan gözləyirdi. Direktor, dərsə gecikib, qapının dalında qalmış uşaqları "bir daha gecikməmək şərti ilə" müəllimlərdən icazə alıb siniflərə buraxırdı. Sonra Firuzə müəllim də eyvandan çəkilib gedirdi və növbəti zəng çalınanacan eyvan boş qalırdı.

Bu məktəbdə mənim adım jurnalın lap axırında idi, özüm də lap axırıncı partada otururdum. Mən istəsəydim, bir az qabaqda otura bilərdim, ancaq sinifdə bircə partadan başqa bütün partalar mənim üçün eyni şey idi. Mənim oturmaq istədiyim partada Xəzər adlı bir oğlanla Həqiqət adlı bir qız otururdu. Şəhər məktəbində mənim üçün ən dəhşətli şey də bu idi.

Bir də ən dəhşətli şey o idi ki, mən heç bir dərsdə Xəzərdən geri qalmadığımı bilirdim. Ən dəhşətli şey o idi ki, müəllimlər hamıdan çox



Xəzərin üzünə gülümsəyirdi və buna görə də Xəzər həddindən çox lovğalanırdı. Xəzərin birinci olmağına mən, bəlkə də, dözə bilərdim, ancaq illər boyu özümün öyrəndiyim müəllim gülüşünü, müəllim mehribanlığını birdən-birə başqasına bağışlamaq çox çətin idi.

Kim bilir, nə vaxtacan mən o axırıncı partada oturub, kənd məktəbini, o məktəbin sinfində də, eyvanında da, həyətində də hamıdan çox mənim üzümə gülümsəyən müəllimləri, oradakı birinci partamı xatırlayacaqdım. Belə getsə, bəlkə də mən məktəbdən soyuyacaqdım. Dərsdən sonra çantamı evə atıb, axşamacan bazarın qabağında avaralanacaqdım.

Kim bilir, nə vaxtacan mən evdə qaşqabaqlı dolanıb bibimi qorxudacaqdım, – əgər o Firuzə müəllim bir gün eyvandan enib bizim sinfə gəlməsəydi. Firuzə müəllim sinfə girəndə biz səsli imlanı təzəcə yazıb qurtarmışdıq. O, mənim oturduğum partadan başlayıb, dəftərlərə baxa-baxa bütün partaları dolandı. Sonra Firuzə müəllim qayıdıb yenə mənim yanıma gəldi.

– Sənin adın nədir?

– Sadıq.

– Sadıq, icazə verirsənmi sənin dəftərini götürüm?

– Bəli.

Firuzə müəllim mənim dəftərimi aparıb, bu gün yazdığım səhifəni yazı lövhəsinin qabağında bütün uşaqlara göstərdi.

– Sadıq bizim məktəbin ən yaxşı şagirdlərindən biri olacaq, – dedi. Sonra, qayıdıb dəftəri partanın üstünə qoydu. O, başımı sığallayıb, sinifdən çıxanda ayağa qalxmış bir sinif uşağın gözü mənim lap axırdakı partama zilləndi.

Bundan bir neçə gün sonra, bizim sinif rəhbərimiz, cəbr dərsi deyən uzun, arıq, bir az da beli bükülmüş Səyyad müəllim qoltuğunda yoxlama dəftərləri içəri girib, məni ayağa qaldırdı. Əvvəlcə o, məndən kənddəki hesab müəllimimin adını xəbər aldı. Atamın-anamın kim olduğunu soruşdu. Sonra Səyyad müəllim mənim lap üstdən qoyulmuş dəftərimi götürub dedi ki, mən evə verilən məsələni də, misalları da hamıdan düz həll eləmişəm. O gün Səyyad müəllimin dərsindən sonra tənəffüsdə uşaqlar mənim başıma toplaşdı. Hətta hamıdan qəşəng geyinən, dərslərdə lovğa-lovğa oturub, tənəffüslərdə lovğa-lovğa gəzən Xəzər də o gün məni adam yerinə qoydu və o gün biz dərsdən sonra bir-birimizi itələyə-itələyə məktəbin darvazasından küçəyə çıxanda mənə elə gəldi

ki, o kök, qırmızıyanaq Həqiqətin yumru, yumşaq əli də mənim əlimə təsadüfən toxunmadı; o özü bilə-bilə əlini mənim əlimə sürtdü.

Xəzərə heç cür bağışlaya bilmədiyim o şeyi, hələ birinci rüb qurtarmamış, mən bütün müəllimlərdən aldım və yerdə qalan üstünlüklərin hamısını ürək genişliyi ilə Xəzərə bağışladım. Sonralar, lap sonralar mənə məlum oldu ki, belə qəşəng-qəşəng paltarları Xəzər təkcə atası dərzi olduğuna görə geymir və təkcə bütün dərslərdən "beş" aldığına görə məktəbdə lovğa-lovğa dolanmır. Müəllimlər jurnalı açıb oxuyanda mən Xəzərin familiyasını gündə neçə dəfə eşitsəm də, onun "Qorsovet Cəlilov"un qardaşı olduğunu bir gün dərsdən sonra, Xəzər şəhərin lap yuxarısındakı bağlı-bağatlı həyəti göstərəndə bildim. O məni evlərinə dəvət elədi, ancaq mən getmədim.

Bir gün dərsdən sonra Xəzər məni daha qəribə bir yerə dəvət elədi. Bunun üçün qabaqca biz bazardan qoz-fındıq almalıydıq. Sonra məktəbin dalından hərlənib, dörd tərəfdən ağ divarlarla hasara alınmış "Detdom" bağının iri darvazasının qabağına getməli idik. Orada Xəzər hüştürək çalacaqdı və Ayişə adlı hansı bir qızsa oradakı darvazanın altındakı deşikdən çıxıb gələcəkdi. Biz qoz-fındığı o qıza verəcəkdik və əvəzində o qızdan "öpüş" alacaqdıq.

Bazardan qoz-fındıq aldıq, özü də mənim pulumla aldıq. Divarın dalında Xəzər hüştürək çaldı və göy darvazanın altındakı deşikdən belinə ağ ip bağlamış bəstəboy, kök bir qız pişik kimi sürüşüb çölə çıxdı. O məni görəndə qapının qabağındaca büzüşüb qaldı: qabaqca qıpqırmızı qızardı, sonra ağappaq ağardı. Ancaq Xəzər özünü itirmədən irəli cumub qoz-fındığı qızın qoynuna tökdü, onun donunu dartışdırdı, döşlərini sıxçaladı. Sonra Xəzər qaça-qaça mənim yanıma gəldi; indi növbə mənim idi. Ancaq mən yerimdən tərpənə bilmədim. Qız bir müddət eyni vəziyyətdəcə dayanıb, qorxmuş gözlərini mənə zillədi, sonra darvazanın altından sürüşüb içəri girdi.

Qayıdanda Xəzər qorxduğuma, rəngimin ağardığına görə məni ələ salıb güldü. Sonra mənim lap "o dünyalıq" olduğumu görüb:

– Nədən qorxursan? – dedi. – Bu yoldan heç vaxt adam keçmir... Sabah gələcəksənmi?

– Yox, – dedim, – mən sabah gəlməyəcəyəm! –Ancaq sabah da gəldim, birisigün də gəldim. Qoz-fındıq hər gün mənim pulumla alındı. Ancaq bir dəfə mən cürət eləyib Ayişəyə yaxınlaşa bilmədim.



Heç özüm də bilmirəm ki, bir vaxt əziyyətlə qazandığım o şax manatları niyə mən belə həvəslə qoza, fındığa verirdim və hər gün dərsdən sonra məni məktəbin dalındakı o göy qapıya tələsdirən nə idi? Hər gün biz o qapının yanına gəlirdik, opadan aralanırdıq, ancaq Ayişənin qorxudan bərəlmiş gözləri göy qapının üstündə qalırdı. O gözləri də, o göy qapını da hər gün mən gözümün qabağında evə aparırdım, gözümün qabağında qaytarıb məktəbə gətirirdim. İndi mən öz axırıncı partamdan uşaq evinin həyətindəki qələmə, söyüd ağaclarına baxanda ancaq bir şey barədə düşünürdüm: görəsən, o acacların yerində niyə qoz əkmirlər? Mən o şax manatları xərcləyəndə də, öz pulumla aldığım qozu, fındığı Xəzərin qara, qəşəng pencəyinin cibinə dolduranda da, göy qapıdan xeyli aralıda oturub, qorxusundan tir-tir əsən Ayişənin o qapının altından nə vaxt sürüşüb həyətə girəcəyini səbirsizliklə gözləyəndə də yaxşı bilirdim ki, Xəzər məni gic hesab eləyir. Hər gün Xəzər o qapıdan qayıdanda mənim gic olmağım daha aşkar bilinirdi. Məni axmaq yerinə qoyduğuna görə Xəzər bic-bic gülürdü, ancaq o vaxtlar mən yalnız bir şey barəsində fikirləşirdim: indi Ayişə dörd tərəfdən ağ divarla hasara alınmış o həyətin lap xəlvət bir yerində, bir qələmə, yaxud söyüd ağacının altında oturub qoltuğundakı qozu, fındığı tələsə-tələsə sındırıb ləzzətlə yeyirdi...

Mən istəyirdim ki, Ayişə hər gün qoz yesin, fındıq yesin – necə ki, Səlim dayının hər gecə ət yeməyini istəyirdim, necə ki, başmaqsilən daz Səftərin hər səhər bal-yağ yeməyini istəyirdim. Bir də, mən Ayişənin qorxudan bərəlmiş gözlərini qara köpəyin iri gözlərinə bənzədirdim və hər gecə göy qapını nəzərimə gətirəndə qara köpəyin gözləri gözümün qabağında dayanırdı. Axı mən məktəbə apardığım çörəyin tən yarısını hər səhər bazarın qabağında qara köpəyə yedizdirirdim və yaxşı bilirdim ki, bunu görsəydi, Xəzər məni daha gic hesab eləyərdi.

Həmişə Xəzərdən ayrılandan sonra mən bazarın qabağında bir müddət avaralanırdım. Qara köpəklə oynayırdım, Səlim dayı ilə söhbət eləyirdim. İndi mən Xəzərin "Qorsovet" qardaşını da tanıyırdım. O, sıx, qara saçlarını yuxarı darayıb, bazarın qabağından başıacıq keçən yeganə kişi idi. Xəzərin qardaşı həmişə yolun eyni yeri ilə dümdüz keçib gedirdi və elə bil yalnız özünün gördüyü bir düz xəttin boyunca, addımını həmin yerdən bir qarış da kənara qoymadan, qayıdıb gəlirdi. O nə qolunu yelləyirdi, nə bədənini yırğalayırdı; bir kəsə salam verəndə başı tərpənirdi, (təkcə başı) salam verməyəndə heç o da tərpənmirdi.

İndi bazarın qabağında əsgərlikdən qayıtmış bir qəribə adam da vardı. Daha doğrusu, o adam deyildi, möcüzə idi. Bütün günü dinməz-söyləməz öz təkərli "araba"sının üstündə oturan o qıçsız adam bağçanın balaca uşaqları dəstə ilə yoldan keçib Lenin bağına gedəndə öz "araba"sı ilə birgə hərəkətə gəlirdi. Əllərindəki taxtaları bərk-bərk yerə basa-basa, gülə-gülə, sevinə-sevinə o, uşaqların dalınca gedirdi və hər gün yolun eyni yerində yorulub qalırdı. Nəfəsi təngiyə-təngiyə, o, yorulduğu yerdə dayanıb, uşaqlar gözdən itənəcən baxırdı, sonra çevrilib arabanı yol aşağı, əvvəlki yerinə sürürdü. Və qəribə burasındadır ki, bağçanın uşaqları qayıdıb gələnəcən bu adam öz dərdli, qüssəli gözlərini Lenin bağından ayırmırdı.

Payız qurtardı. Burada payızın qurtarmağına nə vardı ki, asfalt küçənin qırağındakı beş-altı tut ağacının budaqları çılpaqlaşıb bir-birindən aralandı, uşaq evinin həyətindəki sarı qələmələr ağappaq ağarıb bir quruca skeletə döndü və bir gün Səyyad müəllimin dərsində mən pəncərədən o quru qələmə skeletlərinə baxıb Ayişənin haqqında fikirləşəndə birdən-birə eyvanda Yaqubun uca qamətini görüb mat-məəttəl qaldım. Yaqub alnını pəncərənin şüşəsinə söykəyib bizim sinfə baxdı, sonra gedib o tərəfdən qapını taqqıldatdı və hələ Səyyad müəllim o taqqıltıya cavab verməmiş mən icazə alıb Yaqubun qabağına çıxdım.

Biz, küsülü adamlar kimi, dinib-danışmadan məktəbin qapısından küçəyə çıxdıq. Qapının çöl tərəfində mən dayandım, Yaqub da dayandı. O, əlini cibinə salıb, bir dəstə pul çıxartdı. Pulları əlində tutub heç bir müqəddiməsiz-filansız soruşdu:

– Qırx beş kilo kartof üç manatdan neçə eləyər?

– Yüz otuz beş manat eləyir, – dedim.

Yaqub əlindəki puldan yüz otuz beş manat ayırdı.

– On iki kilo soğan – dörd manatdan?

– Qırx səkkiz manat.

– Yüz otuz beşin üstünə qırx səkkiz gəl.

– Yüz həştad üç, – dedim və mənim bu cür tez hesablamağım Yaquba aşkar ləzzət verdi.

– Yüz həştad üçün üstünə yüz əlli manat da xiyar-pomidor pulu gəl.

Gəldim:

– Üç yüz otuz üç.

– Ala say. Neçə oldu?



– Üç yüz otuz üç, – dedim.

–Daha nə qaldı?

– Bilmirəm.

– Əriyinizi satıb divarlarınızı suvatmışam. Cövüzünüzdən bir meşok çövüz çıxıb; qoymuşam evinizə, bir dənəsinə də əl vuran olmayıb, satıb novdanlarınızı düzəltdirəcəyəm, dama suvaq saldıracağam. Bu il bir dənə də armud yox idi. Daha nə qaldı?

Mən mat-məəttəl əlimdəki pullara baxıb:

– Heç nə, – dedim, – heç nə qalmadı.

– Pulları qoy cibinə!

Mən pulları cibimə qoydum.

–Heç kəsə bir qəpik də verməyəsən. Eşitdinmi? Özünə paltar alarsan!

– Baş üstə! – dedim.

Yaqub bir anlığa dayanıb səssiz-səmirsiz mənim üzümə baxdı: pencəyimə, şalvarıma, qaloşuma. Sonra çevrilib getdi, ancaq qayıdıb bir də mənə tərəf gəldi, pencəyinin cibindən bir ovuc qoz ləpəsi ilə tut qurusu çıxarıb cibimə tökdü.

– Oxuyursan? – dedi.

– Bəli, – dedim, – oxuyuram.

– Yeri get, oxu!

Mən cibimdə pul, tut qurusu, qoz ləpəsi sevinə-sevinə sinfə qaçdım, onda qış tətilinə az qalırdı. Onda Xəzər dərsdən icazə alıb qardaşı ilə Bakıya gəzməyə getmişdi, daha mən Ayişəni də görmürdüm.

Soyuqlar düşdü. Günlərin bir günündə Surət bacı əyninə qəşəng sarı palto geyindi. Günlərin bir günündə Qubad sınıq-salxaq çarpayısını çəkib qaranlıq otağına qoydu. Sonra qar yağdı və elə bil onunla birgə həyətə ağır bir sükut çökdü.

Bazarın qabağındakı küçə də tədricən boşaldı. Səlim dayının balaca budkası bir gün oradan yerli-dibli yoxa çıxdı. Bir gün Səftər də yox oldu. Sonra qəssab Əli də öz ət taxtasını aparıb bazarın örtülü yerinə qoydu. Papiros satanlar, qatıq satanlar isti çayxanalarda özlərinə məskən saldılar. Tədricən bazarın qabağı bütünlüklə qar üstündə sürüşən uşaqların ixtiyarına keçdi.

Böyük ağ binanın başında qar altında qalmış radio bütün qışı öz-özünə soyuq səslə danışdı. Uşaq evinin həyətini dörd yandan hasara

almış ağ divarların üstündə bütün qışı qar qaldı. Mən bütün qışı Ayişəni görmədim, sanki o da haradasa qarın altında qalmışdı.

Yun əlcəkli, qara paltolu, qırmızı şarflı Xəzər Ayişəni unutdu. Hər gün dərsdən çıxandan sonra o, par-par parıldayan qara çəkmələrində saatlarla bazarın qabağında qarın üstündə sürüşdü və həmişə ona baxanda mən düşünürdüm ki, Ayişəni unutmaq da Xəzər üçün qarın üstündə sürüşmək, yaxud bütün dərslərdən "beş" almaq kimi asan bir şeydir...

Mən Ayişəni unutmadım. Onun, indi gecələr öz üç səfil yoldaşı ilə haradasa hamam tulanbarının üstündə, çörək bişirilən yerin hisli divarlarının dibində qısılıb yatan, səhərlər bazarın qabağında üşüyə-üşüyə mənim yolumu gözləyən qara köpəyin gözləri kimi qorxmuş gözləri bütün qışı göy qapının üstündə qaldı. Hələ yaz başlanmamış, uşaq evinin divarları üstündəki qar təzəcə əriyəndə, nə qədər təəccüblü olsa da, bir gün mən özüm Ayişəni Xəzərin yadına saldım. O gün biz, yenə də mənim pulumla, dükandan pryanik alıb, göy qapının yanına getdik və bundan sonra gecəli-gündüzlü mən o qapını Xəzərin yadına salmağımın əzabını çəkdim.

O yaz bizim həyətə qəribə bir sükut çökmüşdü. Yenə nə olmuşdusa, Qubad Mərcan xaladan küsmüşdü. Və qəribə burasındadır ki, indi o, heç kəsi danışdırmaq istəmirdi. Elə bil heç kəsi danışdırmamaq üçün Qubad evə gec gəlirdi, gələn kimi öz qaranlıq otağına girib yatırdı və səhərlər hamıdan sonra yuxudan durub işə gedirdi. Həmişə gülüb-danışan Mərcan xala da son vaxtlar tamam qaradinməz olmuşdu. Neçə gün idi ki, Mərcan xala evə qayıdan kimi çarpayıya uzanırdı,

gələn kimi bibim, qış başlanandan bəri, Surət bacıdan bir-birinin dalınca aldığı kitablara qurşanırdı. Mərcan xala çarpayının üstündə uzanıb qalırdı: ya yatırdı, ya da gözlərini tavana zilləyib fikirləşirdi.

Bir gün Mərcan xala, yatdığı yerdə, birdən çarpayının üstündən sıçrayıb qışqırdı:

– Gedirəm, Mədinə! Nə olacaq, qoy olsun! Axı onun nəyidir? Gül kimi oğlandır: boyu, buxunu! Nə olsun ki, qəssabdır? Mən durub minisdirə ərə getməyəcəyəm ki?

Mərcan xala bunu deyib, əynindəki donun üstündən tələsə-tələsə bir don da geydi, sonra aynanın qabağında dayanıb, kəlağayısını başına bağladı, Mərcan xala küçəyə qaçdı və mən qorxa-qorxa onun arxasınca baxıb fikirləşdim: "Kaş, o adam qəssab Əli olmayaydı".

O günün sabahısı bibim mənə xəlvətcə dedi ki, bu gün evə gec gələrsən, günorta çağı Mərcan xalaya elçi gələcək. Görəsən, bibim bunu niyə qorxa-qorxa dedi, axı o mənim qəssab Əliyə nifrət eləməyimi bilmirdi. Axı, mən nə qara köpəkdən, nə mənə onun nağılını danışan Səlim dayıdan, nə də hər dəfə qara köpəyi görəndə oğurlanmış xalçası yadına düşən o qəssabdan bibimə bir kəlmə söz demişdim. Bəs niyə bibim Mərcan xalanın ərə getməyini məndən gizlədirdi?..

O səhər dərsə gedə-gedə mən bunu öz aləmimdə çox götür-qoy elədim. Nəhayət, belə qərara gəldim ki, məsələ qəssab Əlidə deyil, məsələ ancaq Qubaddadır. Axı bibim bilirdi ki, mən Mərcan xalanın Qubada ərə getməyini istəyirəm. Deməli, bibim bunu məndən gizlədirdi ki, mən uşaqlıq eləyib araya girməyim, bu haqda Qubada söz

başladım. Mən bazarın hər qarışını yoxladım, bütün çayxanalara baş çəkdim, hətta gedib hərbi komissarlığın həyətinə də baxdım; sonra günortadan xeyli keçmiş, qayıdıb evə gələndə gördüm ki, Qubad küçədə bizim qapının qabağında Vayenkomun dəli atının üstündə oturub. Dəli at qabaq ayaqlarını yuxarı qaldırıb kişnəyirdi, dar küçədə iki ayağının üstündə fırlanırdı. Qubad atı qapıya sürürdü, ancaq at qabaq ayaqlarındakı par-par parıldayan nallarla alçaq qapını taqqıldadırdı və yenə dal ayaqlarının üstündə geri çəkilirdi. Görəsən, Qubad neyləmək istəyirdi? Axı, o qapıdan at keçməzdi.

Qapının o başına da, bu başına da adamlar toplaşmışdılar. Atın qorxusundan küçəyə çıxmağa cəsarəti çatmayan qız, gəlin, arvad, uşaq damlardan, divarlardan, ağacların başından Qubada baxırdı. Arvadlar çığırışırdılar:

– Araq içib! Araq içib!

– Xeyr, araq içsəydi, çoxdan aşıb düşmüşdü, gör necə dayanıb.

– Görmürsən gözləri nə gündədir? Vallah içibdir, ağlı başında deyil.

– Bir saatdır qapının qabağını kəsdirib. Belə getsə, Mərcanın elçiləri bu gecə orda qalacaq...

Nisbətən yaxında dayanmış cavan oğlanlar Qubadı qızışdırırdılar:

– Malades, Qubad, bərk dur, gözünə dönüm!

– Zalım oğlu lap Budyonnıdı ki!

– Ədə, Budyonnı nədir, Çapayev de!

– Koroğludur! Qırata bax! Hop, Qırat! Hop, qadan alım sənin!

– Ədə, qaçın, qəssab Əli gəlir!

– Qəssab Əli gəlir!

– Qəssab Əli gəlir!

Qəssab Əli irəli cümub atın cilovundan yapışdı. Tullanıb, atın üstündəcə, Qubada bir şillə vurdu. Şillənin dəyməyi ilə Qubadın üzüqoylu daşların üstünə gəlməyi bir oldu. Dəli at kişnəyə-kişnəyə yol enişə qaçdı. Sonra qəssab Əli üzü üstə qalmış Qubadı təpikləməyə başladı. Mən çığırdım, səsim gəldikcə çığırdım. Mən yerdən iri bir daş götürüb qəssab Əlinin üstünə getdim. Bu vaxt bibim qapını açdı, daş əlimdən yerə düşdü.

Qəssab Əli qapının qabağına yığışmış adamları hədələyib qova-qova yol yuxarı getdi. Küçədə bir Qubad qaldı, bir mən qaldım, bir bibim qaldı. Bibim Qubadın başını qaldırıb, qoluna söykədi: Qubadın bütün sifəti qan içində idi.



Sonra onu gördüm ki, iki nəfər cavan oğlan gəlib Qubadı yerdən götürdü. Sonra onu gördüm ki, Mərcan xalanın həmişə stol üstündə olan böyük, ağ samovarı eyvanda qaynayır. Sonra Mərcan xalanın otağından üç nəfər çadralı qadın çıxıb getdi. Mərcan xala boylanıb qorxa-qorxa həyətə baxdı və qapını bağlayıb içəridə gizlənirdi.

Oğlanlar Qubadı çarpayının üstünə uzadıb getdilər. Bibim tənzif parçasını çeşmədən gətirdiyi soyuq suda bir neçə dəfə isladıb Qubadın üzündən qanı sildi. Axşam işıqlar yananacan Qubad gözlərini açmadı. Axşam işıqlar yananacan o həyətdə heç kəs dinib-danışmadı. Bibim, gözünün yaşını gizlətmək üçün, bir neçə dəfə bayıra çıxıb içəri gəldi. Qubadı bu gündə görəndə Surət bacının da gözləri yaşardı. Bircə mən ağlamadım, nə qədər qəribə olsa da, ağlamadım. Ancaq axşam Qubad gözlərini açıb gülümsəyəndə mən özümü saxlaya bilmədim. Ağladım, hönkür-hönkür ağladım və Surət bacı ilə bibim uzun müddət məni ovuda bilmədilər...

Surət bacı Qubadın köhnə sandığının üstündə oturmuşdu. Bibim Qubadın başını qoluna söykəyib, vermişel supunu onun yaralı dodaqlarından qaşıq-qaşıq ağzına tökürdü. Surət bacı deyirdi ki:

– Qubada Mərcandan da yaxşısını alacayıq. – Bəlkə Qubad buna görə gulumsəyirdi. Bəlkə başını bibimin qoluna söykəmək Qubadın xoşuna gəlirdi? Bəlkə o, dunyada sağ qalmağına sevinirdi? Bəlkə Qubad beləcə, gözləri açıq yatmışdı, bir yaxşı yuxu görürdü?..

Gecədən xeyli keçmiş yatmaq lazım olanda, məni Mərcan xalanın evinə aparmaq üçün, bibim çox dil tökdü, ancaq mən yerimdən tərpənmədim. Surət bacının dediyi sözləri bibim də dedi. Dedi ki, Qubada gözəl-göyçək qız alacağıq. Dedi ki, Əli yaxşı iş görməyib, gərək gəlib Qubaddan üzr istəsin. Dedi ki, Qubadın özü də yaxşı iş görməyib, ancaq olan olub, keçən keçib. Bibim Qubadla Mərcan xalanı barışdıracaqdı, sonra onların hər ücü – bibim də, Mərcan xala da, Surət bacı da Qubad üçün bir qəşəng qız tapacaqdılar. Qubadın toyunda hər şeyi bibim özü eləyəcəkdi: çay qoyacaqdı, xörək bişirəcəkdi, gəlini gətirməyə də özü gedəcəkdi... Ancaq mən yaxşı bilirdim ki, bunların hamısı nağıldır, narın üstündəki qırmızı güllər kimi əfsanədir.

Yox, bibi, mən Mərcan xalanın evinə getməyəcəyəm. Özün də yaxşı bilirsən ki, getməyəcəyəm. Axı, bir dəfə sən özün demişən ki, mənim bir damarım atama çəkib, o tutanda atam kimi inadcıl oluram, atam kimi tərs oluram. Mən atam kimi tərs olacağam, bibi, güclü olacağam ki, qəssab Əli məni döyə bilməsin; axı sən bilirsən ki, qəssab

Əli mənim atamı döyə bilməzdi, o qapının qabağındaca atam yoğun biləkləri ilə qəssab Əlini xirtdəklərdi, sonra onu yerə çırpıb qara çəkmələri ilə ölüncə qarnına, başına vurardı. Mənim ata damarım tutub, bibi və o damardan xoşum gəlir. Daha mənim üçün Mərcan adlı adam yoxdur. Bir qəssab Əli var, bir qara köpək var, bir göy darvaza var – "Detdom" darvazası. Üz-gözü qana bulaşmış bir Qubad var və küçədə qapının qabağında bir daş var ki, sən qapını açmasaydın, mən onu qəssab Əlinin başına vuracaqdım. Get yat, bibi, get yat. Get Mərcan xalanın yanında yat. Ancaq mən bilirəm ki, sən də qəssab Əliyə nifrət eləyirsən. Heç kəs bilməsə də, mən bilirəm...

Bibim məcbur olub Mərcan xalanın evindən yorğan-döşək gətirdi, Qubadın yanında mənə yer saldı. Bibim işığı söndürüb yatmağa getdi. Qubad da gecənin bir aləmində bir dəfə için-için ağlayıb yuxladı, ancaq mənim qəssab Əlinin başına vurmaq üçün yerdən götürdüyüm o daş gözümün qabağından çəkilib getmədi. Ertəsi gün məktəb qapısının qabağında əlimi yerə atanda, elə bil, mən o daşı gördüm, o daşı götürdüm, o daşı mən var gücümlə qabağa tulladım və Xəzər başını tutub, səsi gəldikcə qışqırıb, üzü üstə yerə sərildi.

Mən Xəzərin başına vurduğum o daşı haradan götürdüyümü bilmirəm. Ancaq bir şeyi bilirəm ki, qəssab Əlinin başına vurmaq üçün götürdüyüm daş o gün məktəbdə də, dərs qurtaranacan gözümün qabağında idi. Dərsdən sonra məktəbin qabağında, məni axmaq yerinə qoyduğuna görə, yenə Xəzər bic-bic gülüb:

– Pulun varmı? – deyəndə bu dəfə mən hirsləndim.

– Var. – dedim. – Ancaq bu gün sən Ayişəyə əl vurmayacaqsan.

Xəzər öz pullarını çıxarıb mənim lap gözümə soxdu:

– Elə bilirsən məndə pul yoxdur?

– Səndə pul var, – dedim. – Ancaq Ayişəyə əl vurmayacaqsan.

Xəzər hırıldadı. Sevinə-sevinə atılıb-düşdü.

– Aha, tapmışam! – dedi. – Sən o qəhbəyə vurulmusan!

– Qəhbə sənin anandır!

– Mənə deyirsən?

– Bəli, sənə deyirəm!

Xəzər yumruğunu düyünləyib, mənim burnuma tuşladı, başımı aşağı əydim, yumruq alnıma dəydi. Bəlkə o daşı da mən başımı əyəndə gördüm və bəlkə Xəzər məni vurandan sonra qaçmasaydı, mən o daşı yerdən götürməyəcəkdim.



Sonra bir direktorun kabinetində idik. Xəzəri o başdakı divanın üstünə yıxmışdılar, məni bu başdakı divanın üstündə oturtmuşdular. Qapıları bərk-bərk bağlamışdılar və rəngi ağappaq ağarmış Firuzə müəllim əlləri titrəyə-titrəyə pəncərənin pərdəsini çəkirdi. Mən bütün bunları, elə bil, o dünyadan görürdüm: görürdüm ki, qadın müəllimlərdən biri Xəzərin qanı axan yarasına qoymaq üçün cib dəsmalını yandırır; görürdüm ki, iki kişi müəllim bərk-bərk mənim qolumdan yapışıb; görürdüm ki, Səyyad müəllim əlini mənim alnıma qoyub: "Qorxma, bala, qorxma..."

Elə bil o dünyadan səslər gəlirdi:

– İkisi də əlaçı, ikisi də tərbiyəli...

Firuzə müəllim bir yerdə qərar tuta bilmirdi. Ortada fırfıra kimi fırlanırdı, pəncərənin pərdəsini aralayıb, tez-tez eşiyə baxırdı. İndi onun üzündə zərrə qədər də gözəllik yox idi. İndi onun sifəti çay daşı kimi sərt idi, gözləri şüşə kimi soyuq idi, kəsərli baxışından inciməzdim əgər Xəzərin üzünə baxanda o gözlər dəyişməsəydi.

Xəzəri qaldırıb oturtdular. Onun gözlərinin yaşını Firuzə müəllim öz dəsmalı ilə silib təmizlədi. Firuzə müəllim Xəzərin yanında oturdu, qolunu onun boynuna saldı və nəğmə kimi, layla kimi oxudu:

– Xəzər gözəl baladır, Xəzər qəşəng baladır...

Firuzə müəllim ayağa duranda yenə o sifət çay daşı kimi sərt oldu:

– Adam göndərin, bibisini çağırsınlar!

Sonra o soyuq şüşələr mənim gözümə zilləndi:

– Mən beləsini məktəbdə saxlaya bilməyəcəyəm, qoy getsin öz kəndində oxusun.

Müəllimlər qolumu buraxan kimi mən özümü qapıya çırpıb qaçdım. Aşağıda, pilləkənin altında bir oğlan məni qamarladı. Mən çevrilib geri baxanda yuxarıda, pilləkənlərin başında o soyuq şüşələri bir də gördüm: Firuzə müəllim həmişəki yerində dayanmışdı.

– Saxlama, – dedi, – burax getsin, beləsi bizə lazım deyil!

Mən oğlanın əlindən çıxıb özümü küçəyə saldım. Küçə həddindən çox yüngül idi: bu havada quş kimi uçmaq olardı. Mən bazarın qabağından keçməyə qorxdum. Bir əyri yola buruldum, o yolla çayacan getmək olardı. Sonra çay boyunca baş yuxarı kənd yoluna çıxanacan qaçmaq olardı: salamat qal, qara köpək, salamat qal, Səlim dayı... Ayişə, sən də salamat qal!.. Mən gözləyirdim ki, bir gün o göy qapının qabağında sən Xəzərə bir tutarlı şillə çəkəcəksən. Sən bunu eləmədin. Sən bunu heç

vaxt eləməyəcəksən. Sən ki, bunu heç vaxt eləməyəcəksən, daha mənim bu şəhərdə nə işim qalıb, Ayişə? Mənim Ayişəm, salamat qal...

Vaxt gələr taparam səni. Sən onda da əyninə nazik parçadan yaşıl don geyərsən. Yumru, ağ əllərini qoynuna qoyarsan və titrəyərsən, Ayişə, mütləq titrəyərsən. Mən səni bağrıma basaram, sən mənim quçağımda titrəyərsən. Mən səni öpərəm; burnundan, ağzından, başından, gözündən və mən sənə hər şeyi bağışlaram, Ayişə!..

Mən kənddə gecəli-gündüzlü tək yaşamağa gedirdim. Ancaq hələ hava işıq ikən dərələrdən qorxa-qorxa keçirdim. Ağlayırdım, çoxusu qorxumdan ağlayırdım – səsim dərələrə düşürdü. İndi bibim, yəqin ki, Firuzə müəllimin kabinetində idi və o soyuq "şüşələr" indi bibimin gözlərinə zillənmişdi. Deyirdilər: Sadıq daş atıb, baş yarıb, şübhəsiz ki, bibim inanmırdı. Mən istəyirdim ki, bibim inansın. Lap məndən küssün. Heç məni axtarmasın. Birçə istəmirdim ki, bibim Firuzə müəllimin kabinetində ağlasın, sonra pilləkəndən enəndə, çarqatının ucu ilə gözlərinin yaşını silsin; ancaq yəqin bilirdim ki, belə olacaq.

Qaranlıq qovuşanda mən gedib kəndə çıxdım, heç qorxumdan həyətimizin qapısından da baxa bilmədim. Sonra gedib Yaqubgilin qapısının qabağında oturdum, çünki orada işıq yanırdı, küçəyə işıq düşmüşdü. Sonra mən yavaşca qapını döydüm. Eşidən olmadı, bir də döydüm. Sədəf bacı gəlib qapını açdı, ancaq məni görəndə zərrə qədər də təəccüb eləmədi. Biz təzə salınmış sement pilləkənlərlə dinməz-söyləməz yuxarı qalxdıq. Yaqub evdə yox idi. Onun üç gombul, qırmızıyanaq oğlu palazın üstündə yan-yana oturmuşdu. Qatıq yemişdilər: qab-qaşıq ortalıqda idi. Mən bir künçdə özümə yer eləyib oturunca Sədəf bacı qab-qaşığı yığışdırdı. O biri otaqda əyilib-qalxıb namaz qılan Nabat xala içəri girdi, ancaq mənim burada olmağıma o da zərrə qədər təəccüb eləmədi:

– Gəlmisən, Sadıq bala? – dedi. – A Sədəf, buna çörək gətir.

Ancaq mənim tir-tir əsdiyimi görmüş Sədəf bacı sobanı yandırmaq üçün eyvandan odun yığırdı. Nabat xalanın özü mənə qatıq, çörək gətirdi, sonra o, sandığın bir küncündə əyləşdi.

– Bibin necədir, bala?

– Yaxşıdır.

– Nə əcəb gəlmisən?

Dinmədim. Nabat xala da ikinci dəfə soruşmadı.



– Ye, bala, çörəyini ye, – dedi, – elə biz də qatıq yemişik.

Sonra o, sandığın küncündən durub, qara, uzun tumanını dalınca sürüyə-sürüyə pəncərənin qabağına getdi. Oradan Nabat xala harasa baxdı və yenə qayıdıb sandığın küncündə oturanda, bir əli ilə üzünü tutub, başını yırğalaya-yırğalaya dedi ki:

– Yaqubu tutdurdular, bala, Allah anbar açanın qapısını bağlı qoysun!

## IV

Yuxuda gördüm ki, rayondan kəndə gələn yolda, çayın üçtündə, heyvalıqdayam; qara köpəyi şirnikdirib kəndə gətirmək istəyirəm, qara köpək dalımca qaçır, ancaq o biri arıq-axsaq itlər də gəlirlər, mən nə illah eləyirəm, qara köpəyi onlardan ayıra bilmirəm; qara köpəyin özü də o itlərdən ayrılmaq istəmir: bir az qaçır, sonra dayanıb arxasınca baxır. Mən daş atıb o itləri qovuram, itlər dayanırlar, yenə qara köpəyin dalınca cumurlar... Yuxudan ayılıb, indiyəcən mənə tamamilə real görünən bir şeyin birdən-birə yoxa çıxmağına peşman oldum. Elə bil mən o yuxunu görməsəydim, heç vaxt bilməyəcəkdim ki, qara köpəyi o biri köpəklərdən ayırmaq mümkün olan iş deyil...

Mən yuxudan ayılanda Yaqubun üç gombul qırmızıyanaq oğlu bir-birinin böyründə uzanıb şirin-şirin yatırdı. Nabat xala o biri otaqda qara, sətin çadrasını başına salıb səhər namazını qılırdı; arıq balacaboy Sədəf bacı eyvanda süd qaynadırdı və onun bir pudluq yumru qarpız kimi irəli uzanmış qarnına baxanda adam istər-istəməz o boyda qarnın o qədər nazik qıçların üstündə durmağına təəccüb eləyirdi.

Mən yuxudan ayılanda hələ həyətə gün düşməmişdi, ancaq arxların qırağında, divarların dibində təzəcə baş qaldırmış otların üstündə parlaq, gümüşü işıq vardı. Küçə qapısının qabağından ta eyvanacan əvvəlki torpaq yolun üstünü Yaqub sementlə örtmüşdü. Yaqub həyətin ortasında sementdən hovuz qayırmışdı. Hovuz dolu idi və onun içindəki sərin, dupduru su sement divarlardan sızıb həyətə tökülürdü.

Mən qapının dalından bibimin səsini eşidəndə qulağıma inanmadım, ona görə yox ki, o səs həddindən çox titrək idi, həddindən çox həyəcanlı idi; ona görə ki, səhərin bu vaxtında rayondan kəndə gəlib çıxmaq mümkün olan iş deyildi.

– Sadıq sizdə deyil ki?..

– Bizdədir, Mədinə, keç gəl içəri...

Hələ Sədəf bacı sözünü qurtarmamış mən tələsə-tələsə başmaqlarımı ayağıma taxıb qapıya qaçdım, çünki bibim mənim burada olub-olmamağımı çox ümidsiz soruşdu və o səsi eşidəndə mənə elə gəldi ki, əgər həmin dəqiqədəcə onun gözünə görünməsəm, bibimin ürəyi partlayacaq.

Bibim iplə sarıyıb rayondan gətirdiyi ağır dəftər-kitab bağlamasını ancaq məni görəndən sonra əlindən yerə qoydu. Mən bağlamanı yerdən götürdüm və bibim Sədəf bacı ilə hal-əhval tutandan sonra biz evimizə yollandıq. Yolda biz bir kəlmə də dinib-danışmadıq. Bibim nə Xəzərin barəsində bir söz soruşdu, nə də kəndə qaçdığıma görə məni danladı. Ancaq mən yol boyu hiss elədim ki, bibim ürəyində sevinir, məni tapdığına görə sevinir. Ona görə sevinir ki, küçələr son dərəcə sakitdir, hava son dərəcə yüngüldür, yumşaqdır. Ona görə sevinir ki, arxların qırağında bənövşə var: ağ bənövşə, qırmızı bənövşə, sarı bənövşə...

Bibim küçə qapımızın halqasına qıfıl yerinə keçirilmiş odunu çıxardıb atdı: evimizin dalında, dağın hamar döşünə təptəzə, qıpqırmızı gün işığından elə bil suvaq çəkilmişdi. Uzaqda, payonla kəndin arasında dayanmış dağın döşündəki ağ, dolayı yolda da təptəzə bir gün işığı vardı və o yola, o işığa baxanda, nədənsə, Səyyad müəllim mənim yadıma düşürdü. O Səyyad müəllim ki, bir dəfə məktəbin qabağından Lenin bağınacan bibimlə söhbət eləmişdi. O Səyyad müəllim ki, bibimə demişdi: "Əgər razı olsan, Sadıq sənin də, mənim də balam olar".

Mən istəyirdim ki, bibimdən soruşum: məktəbdə sənə nə dedilər, Mərcan xala qəssab Əliyə getdimi, Qubad yerindən durdumu... Ancaq bütün bunların əvəzində mən tamam başqa bir şey dedim. Dedim ki:

– Daha mən o şəhərə getməyəcəyəm.

Bibim evimizin qapısındakı paslı qıfılı açdı, onu divarın dibindəki yumşaq torpağın üstünə atdı və qapını itələyib dəhlizə girəndə dilləndi:

– Heç mən də getməyəcəyəm.

Otağımız işıqlı idi, həddindən çox işıqlı idi. Bir vaxt Yaqubun saldığı şüşələr pəncərədə olduğu kimi də qalmışdı. Ağzı kəndirlə bərk-bərk bağlanmış bir tay qozu Yaqub divarın dibinə qoymuşdu. Bibim dizini kisəyə söykəyib tələsmədən kəndiri açırdı.



Dedim:

– Bibi, Yaqubu tutublar, bilirsən?

– Bilirəm.

Bibim kisənin ağzını açdı, iki qoz götürdü. Qozları əlində sındırıb, bir qanadını ağzına qoydu, qalanını yerinə tulladı.

– Sən dərsindən qalma, Sadıq, – dedi.– Mən yorulmuşam, bir balaca yorulmuşam, uzanım bir az yatım.

Bibim palaza bükülmüş yorğan-döşəyi yerə açıb uzandı.

*1967*

## BİR MİSRANIN YUXUSU

*(YAXUD YAS YERİNDƏN REPORTAJ)*

### 1

O gün Sadıq kişi, bu gün də bu. Qəribə işdir: sən demə buzbulaqlılar Bakıda da ölə bilərmiş. Amma bunun nəyi qəribədir görəsən? Adam adamdır, ölüm də – ölüm. Adam hər yerdə ölə bilər. Axtarsan, lap Berlində də bəlkə Buzbulaq adamının qəbri tapılar. Mən hələ köhnə əyyamları – Məkkəni, Bağdadı, Kərbəlanı demirəm. O əyyamlarda buzbulaqlılar o yerlərə həmişə ziyarətə gediblər və heç mümkün deyil ki, o cür uzaq səfərdə kimsə azarlayıb, oralarda ölməmiş ola.

Maraqlıdır, görəsən, buzbulaqlılardan Sibirdə də öləni olubmu? İnanmıram, çünki heç vaxt eşitməmişəm ki, haçansa, hər hansı bir buzbulaqlı "sibirlik" iş tutmuş ola. Biri – kəndin ən nüfuzlu din xadimi Molla Nurməhəmməd idi ki, o da deyirlər, Gəncədə – yəni Kirovabadda ölüb. Biri tacir Məşədi Murtuz idi. Biri – mülkədar Kəblə Kazım idi. Gərək ki, vəssalam. Bunlardan da biri – Kəblə Murtuz isə, deyirlər, Qubadadır, sağ-salamatdır, hətta, deyirlər ki, indinin özündə də, onun (doxsan yaşlı kişinin) dişlərinin hamısı ağzında cağbacağdır.

Deməli, Buzbulaq adamının kənarda öləni indiyəcən də olub, indən belə də olacaq. Onda bəs buzbulaqlıların Bakıda ölməyi niyə mənə belə qəribə gəlir? Bəlkə ona görədir ki, mən indiyəcən bu barədə heç vaxt fikirləşməmişəm? Bir də, belə hadisə indiyəcən Bakıda, deyəsən, heç olmayıb axı. Hər halda, mən Buzbulaqda məktəbi qurtarıb, gəlib burda instituta girənəcən belə şey, şübhəsiz ki, olmayıb. Olsaydı mütləq eşidərdim, çünki kim olur-olsun və harada ölür-ölsün, əgər o adam buzbulaqlıdırsa, onun ölüm xəbəri Buzbulağa gec-tez mütləq gedib yetişir. Bir də burası var ki, buzbulaqlılar özlərinin kənardakı adamlarını heç vaxt yaddan çıxartmırlar – o adam Buzbulağın üzünü istəyir lap yüz il görməsin. Çünki kim hara gedir-getsin, ondan Buzbulaqda nəsə mütləq qalır: kiminin qohum-qəbiləsi, kiminin ağac-budağı, kiminin də ki, sahibsiz dam-daşı, yaxud uçuq divarı... Buzbulaqda, hələlik heç vaxt belə iş olmayıb ki, birisi bir yana gedəndə dam-daşını satıb gedə. Dam-daş satmaq Buzbulaqda insan adına yaraşan əməl hesab olunmur. Ya deynə: dam-daşımı satıram, ya da de: insanlıq cərgəsindən birdəfəlik çıxıram – Buzbulaq camaatının təsəvvüründə bunların hər ikisi təxminən eyni şeydir. Ona görə ki, hər kəsin evində onun öz ata-anasının ruhu var və o evdə çıraq yandırıb, ata-ananın ruhunu şad etməyə əgər sənin gücün, mərifətin çatmırsa, qoy o ruhsa da barı orada həmişə rahat qalsın – ata-ana ruhunu yer-yurdundan dərbədər eləmə. Həm də Buzbulaqda çətin adam tapılar ki, kiminsə dam-daşına yiyə dura. Dursa da, beləsini dam-daş yiyəsi hesab eləyən çətin tapılar. Evsizdi, vəssalam. Buzbulaqlıların nəzərində beləsi dünya durduqca evsizdir.

Buzbulaqda çox evlər var ki, onların yalnız xarabası qalıb. Ancaq o xarabanın yerində də heç kəs gedib, öz başından, özünə təzə yurd bina eləməz. Ya gərək xarabanın yiyəsi tapıla, ya da o xarabaya heç olmasa az-maz haqqı çatan bir adam. Gərək o adamın, necə deyərlər, saqqalının altından mütləq keçəsən, halallıq verəsən, icazə alasan. Əlbəttə, əgər ev tikən insandırsa və o evdə insan kimi yurd salmaq istəyirsə.

Və, deməli, buzbulaqlıların yadından heç vaxt çıxmamaq üçün orada səndən lap bir quruca xaraba da qalsa kifayətdir. Buzbulaqda dörd yaşlı uşaqlar da bilir ki, o uçuq ev, elə-belə uçuq ev deyil, məsələn, Molla Nurməhəmmədin xarabasıdır, yaxud, tutaq ki, Məşədi Murtuzundur, yaxud rəhmətlik Kəblə Kazımındır. Deyirlər, eşidir, bilir. Burda möcüzəli bir şey yoxdur. Bu işin az-maz möcüzəsi varsa, o da bəlkə orasındadır ki, istəyirsən lap yüz ildən sonra qayıt Buzbulağa gəl, əgər bir vaxt Buzbulaqdan getmisənsə, yenə buralısan, buzbulaqlısan. Evin qalırsa – sənindir, evinin xarabası qalırsa, o da sənindir. Və əgər birisi sənin xarabanın yerində səndən xəbərsiz təzə dam-daş salıbsa, o dam-daşın heç olmasa bir otağı, sözsüz, səninkidir, buna şübhən olmasın. Təki sən gəl çıx Buzbulağa. Küçədə rastına çıxan birinci uşaqdan xəbər al, deynən: "Kəblə Kazımın evi hardadır?" Uşaq deyər ki, Kəblə Kazım Zaqatalada ölüb, amma evi filan yerdədir. Qabağa düşüb səni gətirib bir uçuq divarın yanına çıxardar və sən öz gözünlə görərsən ki, Zaqatalada ölən Kəblə Kazım Buzbulaqda hələ də qalır. Və elə o uçuq divara baxdığın yerdəcə, bəlkə, səni çağıran da tapılar. Dönüb baxanda görərsən ki, küçənin bir yerində sən adda bir uşaq gizlənpaç oynayır. Məsələn Nurməhəmməd adında... Və onda arxayın olarsan ki, hətta Allahın özünün də sərfnəzərindən çoxdan düşmüş o cür məğmun bir peşə sahibinin bu cür uzun,

əndazəsiz adını da Buzbulaq camaatı yerdə qoymayıb (burası sənə xüsusilə ləzzət verər).

Amma orasını da deyim ki, bu Buzbulaq uşağına gərək çox da üz verməyəsən. Yoxsa qoşun kimi dalınca tökülüşərlər. "Molla əmi, molla əmi" – deyə-deyə düz Kirovabadın qəbiristanlığınacan səni meymun təki oynada-oynada apararlar. Necə ki, buna oxşar bir oyunu keçən yay o uşaqlar rəhmətlik Sadıq kişinin başına açırdılar. Halbuki Sadıq kişi molla deyildi.

Hə, qardaş, necədir sənin üçün? Buzbulaq uzun işdir, canım-gözüm. Buzbulağın belə-belə qanunları ha çox. Amma sən heç də elə bilmə ki, Buzbulaq belə-belə işlərdə yeganə ekzemplyardır. Göydən düşüb, ya da mən buzbulaqlı olduğuma görə burda, yas yerində oturub, bekarçılıqdan olanı-olmayanı öz-özümə çərənləməklə məşğulam. Bir də, sən allah, elə bilmə ki, Buzbulaqda kənd soveti yoxdur. Var. Kənd soveti də var, kolxoz idarəsi də. Qanun da var, kitab-dəftər də. Amma orası da var ki, bu dediklərim olan yerdə dəftər-kitab lazım olmur. Bu yerdə Buzbulağın özü həm dəftərdir, həm kitabdır, gərək (incimə, mən ölüm!) bir balaca savadın ola ki, o kitabı oxuya biləsən. İncimə, canım-gözüm, elə mən özüm də institut qurtarmışam. Əslində, sən deyən kəndlilik də qalmayıb məndə. İyirmi ildir ki, şəhərdə yaşayıram. Amma Buzbulaq adamının Bakıda ölməyi, neynim, qəribə gəlir mənə. O gün Sadıq kişi, bu gün də bu...

## 2

Bəlkə, bir saatdan çox olardı ki, mən burdaydım: bu həyətdə, bu boz brezent çadırın altında, bu yas yerində. Ölən yaxın adam idi, qadın idi, qapıbir qonşu idi, hətta bir vaxt ibtidai məktəbdə bir müddət mənə dərs də demişdi. Amma sən bir işə bax ki, yasına gəldiyim bir adamın, qapıbir qonşumun, müəllimimin sifətini bircə anlığa gözümün qabağına gətirmək üçün bir saatdan da çox idi ki, mən burda əzab çəkirdim. Nə danışırdım, nə danışılanlara qulaq asırdım. Oturub fikirləşirdim – ağlıma, yaxın-uzaq, min cür şey gəlirdi, ancaq o sifət gözümün qabağına gəlmirdi ki, gəlmirdi.

Sonra, zehnim bir balaca işıqlanan kimi oldu: onların bizim, kənddəki damımıza az qala bitişik olan damlarını gördüm. Buzbulaq məktəbinin həyətini gördüm. Buzbulağın bir-iki çeşməsini gördum və elə



bu yerdə də, nədənsə, o gün rəhmətə gedən Sadıq kişi bir də yadıma düşdü, çünki bildir, yay vaxtı kənddə məzuniyyətdə olanda, mən Sadıq kişini Buzbulağın küçələrində çox görmüşdüm.

Özünün dediyinə görə, Sadıq kişi əlli səkkiz il Buzbulaqda olmamışdı. Yaz açılandan köçüb gəlmişdi. Guya Buzbulaqda həmişəlik qalacaqdı. "Petux", "Bilboteka" – üzün gülsün, Sadıq kişi... Nə isə, Sadıq kişinin kənddəki dam-daşı elə xaraba deyildi ki, içində adam oturaydı. Sadıq kişi rəhmətlik Qəmər arvadın kimsəsiz evində qalırdı. Qəmər arvadın ev-eşiyi nisbətən abad idi, amma həyətin küçəyə sarı divarının biri uçub tökülmüşdü. Buna görə də Buzbulağın hələ təzə-təzə "yumurtadan çıxanları" o divarın yerindəki daş-kərpic qalağının üstündən asanca aşıb, Sadıq kişinin yazda öz əli ilə əkib-becərdiyi və hər çiçəyi, hər yaşıl yarpağı ilə fəxr elədiyi xiyarlığa arabir möhkəm divan tuturdular... Dayan, dayan. O başda əyləşən, Qəmər xalanın oğlu Rəfi deyilmi? Odur, özüdür ki var.

İnsan uçuq divara nə yaman oxşayarmış, İlahi!

## YAZIQ QƏMƏP XALA

Rəfinin Buzbulaqdan haçan didərgin düşdüyünü və niyə didərgin düşdüyünü bilən az idi. Amma Buzbulaqda uşaqlı-böyüklü hamı bilirdi ki, Qəmər xalanın Rəfi adlı bir oğlu var. Sonra dava başlandı və hamı bildi ki, Qəmər xalanın Rəfi adlı oğlu da davaya gedib. Sonra dava qurtardı, hamı bildi ki, Qəmər xalanın Rəfi adlı oğlu o davada ya ölüb, ya da itkin düşüb. Amma Qəmər xalanın Rəfi adlı oğlu, sən demə, nə ölmüşdü, nə itkin düşmüşdü. Sonra eşitdik ki, Qəmər xalanın oğlu əsirlikdən də qurtarıb, gəlib Bakıya. Özü də, deyirdilər, yaxşı qayıdıb: sağ-salamat, ətli-canlı, əynində də təptəzə şivyot kostyum. O şivyot kostyumun xəbərini Buzbulağa gətirən adamın adı da Qəmər idi. Bu Qəmərin işi-gücü Bakıdan iynə, üskük, nəlbəki, dəm çaydanı, arvad trusiki və sair belə-belə qiymətli şeylər alıb gətirib, Buzbulaqda satmaq idi. Nağd da satırdı, nisyə də verirdi. Üstəlik, meyvə qurusundan tutmuş, motal pendirinəcən dişədəyər nə versələr götürürdü.

Bu Qəmərin tez-tez Bakıya getməyinin sayəsində o vaxtlar Buzbulaq məktəbinin lap aşağı siniflərində də hər qızın barmağında bir yalançı üzük parıldayırdı və məktəbin direktoru Zinyət Şəkərək qızının coğrafiya dərslərində o üzüklərin hesabına biz – oğlanlar vaxtaşırı kef elə-

yirdik, çünki o yalançı üzüklərdən birceciyinicə bir qızın barmağında görəndə Zinyət Şəkərək qızı mütləq sinifdəki qızların hamısının əllərinə baxırdı, hətta bəzən yazı lövhəsinin qabağında qızların ciblərini də axtarırdı. Bunun dalınca "yüngül tənbeh" gəlirdi, yəni Zinyət Şəkərək qızı öz qalın xətkeşi ilə qızların əllərini o qədər döyəcləyərdi ki, bundan sonra o qızlar on-on beş gün nə çeşmədə qab yuya bilirdilər, nə evdə saçlarını daraya bilirdilər... Zinyət Şəkərək qızının "ağır tənbehi" lap uzun iş idi. Bura, xətkeşdən əlavə, bir ayrı cəza da daxil idi: Oğlanların qabağında qızları hönkür-hönkür ağlatmaq. Məsələn: "Baxın, uşaqlar, başında bit var bunun. Ay qız, sən heç utanmırsan? Başında bit ola-ola barmağına üzük taxırsan?.." (İndi gəl ağlama, görüm necə ağlamırsan). Cəza qurtarandan sonra Zinyət Şəkərək qızı həmin o yalançı üzüklərin arxasında gizlənən dəhşətlərdən, keçmişdən və gələcəkdən xeyli vaxt sakitcə söhbət eləyirdi. Nə köhnə dərsi soruşurdu, nə təzə dərs tapşırırdı. Beliliklə də, bizim həm bugünkü dərsdən canımız qurtarırdı, həm də təzə dərsi öyrənməyə sərf edəcəyimiz vaxt özümüzə qalırdı. Və nəhayət, bir vaxt Buzbulaq məktəbində sözlərin ən məşhuru olan "meşşan" sözü də şübhəsiz ki, Qəmər arvadın Bakıya tez-tez getməyinin sayəsində meydana çıxmışdı. İlk dəfə, Zinyət Şəkərək qızının bizim məktəbin həyətində, həmin o yalançı üzüklərə həsr olunmuş böyük iclasda dediyi o söz bir müddət bütün müəllimlərin dilinin əzbəri olmuşdu. Və bəzi qadın müəllimlər o sözü təkcə dərs vaxtı deyil, hətta çeşmədə qab yuyanda və təndirdə çörək bişirəndə də deyirdilər, çünki insanın savadlılığına dəlalət eləyən bu cür sözlərin sayı Buzbulaqda o qədər də çox deyildi və üstəlik, insanın savadlılığına dəlalət eləyən hər təzə söz də bu qədər asanlıqla dilə yatmırdı.

Amma söhbət bunda deyil. Söhbət burasındadır ki, Qəmər arvadın Rəfi adlı oğlunun Bakıdan heç vaxt gəlməyəcəyi xəbərini də bir gün Buzbulağa həmin o iynə, üskük, nəlbəki, dəm çaydanı, arvad trusiki və yalançı üzük satan Qəmər gətirdi və bu gözlənilməz xəbəri kənddə uzun müddət hərə öz bildiyi sayaq yozdu. Kimi dedi, bizim yer sərhəd yeridir, Rəfi də hökumətə etibarsızlıq eləyib, buna görə onun Buzbulağa gəlməyinə icazə vermirlər; icazə versəydilər, gələrdi. Kimi dedi, sərhəd-zad bəhanədir, istəsə gələr, yəqin ona görə gəlmir ki, yenə böyük iddiası var: indi də Bakıda bir ayrı professornan kəllə-kəlləyə gəlməyə hazırlaşır. Dedilər: Rəfinin anası da kitabdır, arvadı da. Və bunu, o biri Qəmər az sonra, Bakıdan gətirdiyi təzə xəbərlə təsdiqlədi:



guya Rəfi öz dili ilə ona deyib ki, mənimki Buzbulaqnan çoxdan qurtarıb. Deyib ki, anama deyin, elə bilsin mən adda oğlu-zadı yoxdur, elə hesab eləsin ki, mən o davadan da heç gəlməmişəm, ölüb qalmışam oralarda. Amma belə şey heç mümkün idimi ki, əynində təptəzə şivyot kostyumu olan sağ-salamat bir adamı göz görə ölmüş hesab eləyəsən. Və günlərin bir günü Qəmər arvad o biri Qəmərə qoşulub Bakıya getdi. Hamı belə hesab eləyirdi ki, oradan Qəmər arvad ya Rəfi ilə bir yerdə gələcək, ya da əgər Rəfisiz gəlsə, çox pis gələcək – gərək bundan sonra bir müddət Qəmər arvadın gözünə görünməyəsən. Qəmər arvad Bakıdan Rəfisiz gəldi, amma qətiyyən pis gəlmədi. Əksinə, mən deyərdim ki, hələ getdiyindən də qat-qat yaxşı gəldi: qıvraq, sevincək, həmişəki kimi zarafatcıl; üstəlik, əynində də (çadrasının altında) bir təzə şivyot pencək – kişi pencəyi. Və Bakıdan gələn kimi Qəmər arvad kənddə birinci bunu elan elədi ki, bəs bütün Yer üzündə Sovet hökumətinə bərabər qeyri bir hökumət-zad yoxdur, əgər əvvəllər o, buna bir inanırdısa, indi, gedib Bakını və Rəfini görəndən sonra, hesab eləyin ki, min inanır. Dedi ki, dünyada o cür yerlər ola-ola ağıllı adam bu Buzbulaqda gəlib heç yaşamaz da; nə var burda dərədəntəpədən savayı. Bura, dedi, yaşamalı yer olsaydı, yüz iyirmi dörd min peyğəmbərin heç olmasa tək birinin qəbri burda olardı. Və Rəfi də lap yaxşı eləyir ki, gəlmir bura. Gəlib burda neyniyəcək? Bir para görməmişlər kimi bu kolxozu çalıb-çapmayacaq ki? Qəmər arvad dedi ki: bu kəndi ac qurd kimi söküb dağıdanlar var. Amma mən, dedi, oğul böyütmüşəm, qurd böyütməmişəm. Və heç istəmirəm də ki, mənim oğlum gəlib burda bu cür qurdların üzünü görsün...

Bəli, Qəmər arvad o vaxt Bakıdan belə gəldi. Amma o vaxt Qəmər arvad Bakıya gedəndə, sən demə, Rəfi Bakıda heç yerli-dibli yoxmuş. Hardaymış, Allah bilir, amma Bakıda yoxmuş. Və Qəmər arvadın əynindəki o şivyot kişi pencəyi kiminmiş – bunu da bircə Allah bilir. Sonra, gah dedilər ki, Rəfi Moskvadadır, gah dedilər, onu Yerevanda görən olub. Və Buzbulaq yekdilliklə bu qərara gəldi ki, yenə Rəfi Bakının professorları ilə yola getməyib. Və Buzbulaq Rəfinin barəsində uzun müddət elə bu fikirdə də qaldı, çünki Buzbulaq üçün belə sərfəli idi. Çünki Buzbulağın uca dağları da vardı, alçaq təpələri də vardı və madam ki, bunlar vardı, deməli, Buzbulağın, Bakının professorları ilə kəllə-kəlləyə gələsi bir adamı da mütləq olmalıydı. Bu mənada, Rəfinin şübhəsiz ki, baxtı yaxşı gətirmişdi... Lap elə Qəmər

arvadın öz baxtı da... Çünki Rəfinin böyük-böyük professorlarla kəllə-kəlləyə gəldiyini görməzə-bilməzə qəbul eləyən buzbulaqlılar Qəmər arvadın Buzbulaqda məhz belə bir oğul anası kimi gəzib dolanmağına niyə də mane olmalı idilər?

Və uca dağları da, alçaq təpələri də olan Buzbulaqda, qocalıb əldən-ayaqdan düşənəcən, Qəmər arvad məhz beləcə də yaşadı: ayağına yamaqlı qaloş geymədi, çadrasına ütü çəkməmiş toya-yasa getmədi. Taxılı biçilib daşınmamış kolxoz zəmilərindən arvadlar torba-torba sünbül gətirəndə Qəmər arvad onların arasında heç vaxt görünmədi və dükanın qabağında çit üstündə, manpası üstündə çığırtıdan qulaq batanda, orada Qəmər arvadın səsini heç kəs eşitmədi. Kim bilir, ölüm vaxtında gəlsəydi və o Rəfi neçə-neçə illərdən sonra Bakıda təzədən peyda olmasaydı, bəlkə Qəmər arvad bu dünyadan beləcə də köçüb gedəcəkdi. Amma ölüm vaxtında gəlmədi. Üstəlik, qocalıb əldən-ayaqdan düşmüş Qəmər arvad yorğan-döşəyin içində zarıya-zarıya, evinə gedib-gələnlərə Rəfidən təzə-təzə gileylənməyə başlayanda, Bakıdan belə bir xəbər gəldi ki: bəs Qəmər xalanın Rəfi adlı oğlu orada heç bir böyük iş-zad da görub-eləmir, adicə kitabxanaçı işləyir. Bu xəbər Qəmər xalanın öz qulağına da çatdı, ya çatmadı – bilmirəm. Ancaq o vaxt Bakıya gedəndə Rəfinin Bakıda olmadığını Qəmər xala məhz bu xəbər çıxandan sonra boynuna aldı.

Günlərin bir günü Qəmər arvadı aparıb basdırdılar. Qəmər xalanın sandığından xeyli pul tapıldı və o pulu dönə-dönə sayıb, ağsaqqalların, ağbirçəklərin uzun-uzadı məşvərətindən sonra, aparıb Bakıda Rəfiyə çatdırmağı qərara aldılar. Bundan ötrü həmin o, iynə-üskük satan Qəmərdən əlavə kəndin cavanlarından da iki nəfərini seçdilər. Qəmər xalanın pulunu, onların iştirakı ilə, bir də saydılar. O puldan qəbirqazanın, mürdəşirin və Bakıya yollanası o üç nəfərin o baş-bu başa yol xərcini hesablayıb götürdülər – qalanını Rəfiyə göndərdilər.

Qəmər xalanın pulu olmalı idi, çünki Buzbulağın ərlik qızlarına nişan aparan da o idi və sonra, bir gün o qızların doğmaq sancısı tutanda qollarını dirsəyəcən çırmalayıb (çayından, kefindən də qalmadan) uşağı dünyaya gətirməyə hazır dayanan da Qəmər xalaydı. Həm də Qəmər xala təndirdə çörək yapmağın da yaxşı ustası idi və üstəlik, deyilənə görə, haçansa, "dünyanın düz vaxtları" Qəmər xalanın hələ bundan da savayı sənəti varmış: bir vaxt o, evlərdə uşaqlara nağıl



deyib, vaxt hesabı, zəhmət haqqı alırmış. Əlbəttə, hər evdə yox, çünki *allahın nağıl deyəninə də zəhmət haqqı vermək hər adamın işi deyildi* və lap zəhmət haqqı bir yana dursun, bol odunu, isti sobası olmayanın və o sobanın üstündə xörək qazanı qaynatmayanın nağıl nəyinə gərək idi. Və heç "dünyanın o düz "vaxtlarında" da yəqin ki, Buzbulaqda hər adamın isti sobasının üstündə xörək qazanı qaynamamışdı. Amma bütün bunlar öz yerində, əgər nağıl danışmaq Qəmər xalanın peşəsi idisə, deməli, Qəmər xala ya gərək təzə nağıllar öyrənəydi, ya bildiyi köhnə nağılları dəyişib-təzələyəydi, ya da gərək özündən təzə nağıllar quraşdıraydı. Və Qəmər xala özündən saysız-hesabsız şərli-şərsiz təzə nağıllar quraşdırmışdı. O nağılların çoxusu namusdan, etibardan, ər yolunda, namus yolunda boynunun vurulmağına razı olan gözəl qızlardan, gəlinlərdən, qoca ata-ananın hörmətini dünyada hər şeydən üstün tutan ağıllı, qeyrətli övladlardan idi, çünki isti sobalarının üstündə həmişə xörək qazanı qaynayan o evlərdə Qəmər xala öz nağıllarını, əsasən, hələ ərlik vaxtı çatmamış qızlara danışırdı və o qızların ata-anaları Qəmər xalaya əbəs yerə əmək haqqı vermirdilər.

Buzbulaqlılar bir vaxt üç adamlıq nümayəndə heyəti ilə Bakıya göndərdiyi pulun içində Qəmər xalanın nağıl haqqından bəlkə vardı, bəlkə yoxdu. Amma, deyilənə görə, o pul xeyli pul idi. Və Rəfi o xeyli pulun bir qəpiyini də götürməmişdi. Və nə yaxşı ki, götürməmişdi, yoxsa uca dağları və alçaq təpələri olan Buzbulaq Rəfinin adını insanlıq cərgəsindən birdəfəlik silərdi. Və indi, o vaxtdan iyirmi, iyirmi beş il keçsə də, burada bu yas yerində, bu qədər buzbulaqlının içində Rəfi heç bir vəchlə gəlib otura bilməzdi.

## 3

Yas yerinin bir küncündə Rəfi yazıq-yazıq qısılıb oturmuşdu. Nə çay içirdi, nə papiros çəkirdi, nə də bir kəsin üzünə baxırdı. Rəfinin sir-sifəti elə bil əprimişdi, bürüşmüşdü, bozumtul şlyapasının altında alnı görsənmirdi, təkcə gözləri görsənirdi; gözləri hərəkətsizcə, dümdüz qabağa zillənmişdi və əgər o gözlərdə zərrəcən işıq vardısa, deməli, o işığın yönü geriyə olmalı idi, Rəfinin öz içinə sarı tuşlanmalı idi, çünki onun qabağa zillənən gözlərində işıqdan-işartıdan əsər-əlamət də yox idi.

Rəfinin bir tərəfində rəhmətlik Sadıq kişinin oğlu Nəriman əyləşmişdi. Nə Nəriman bu yas yerinə yaraşırdı, nə bu yas yeri Nərimana

yaraşırdı: o, ömründə Buzbulaq üzü görməyən ortayaşlı bir adam idi və (burası nə qədər qəribə olsa da) onun ömründə Buzbulaq üzü görməməyi elə bil baxışındaca açıq-aşkar bilinirdi. Burada oturanların bir qismini Nəriman, deyəsən, birinci dəfə görürdü, bir qismini isə, güman ki, ilk dəfə atasının yas məclislərində görmüşdü. Və gözlərini dolandırıb, o başdan bu başacan yasda oturanların hamısını baxışından diqqətlə keçirə-keçirə elə bil, buradakı adamlardan hansının o yasda da olduğunu və hansının olmadığını özü üçün dəqiq müəyyin eləmək istəyirdi. Burasını dəqiq məlum eləmək o qədər də asan deyildi. Amma yasda oturanların böyük əksəriyyətinin buzbulaqlı olmağına heç bir şəkk-şübhə yox idi. Və sən demə, bu Bakı kimi yerdə, bir brezent çadırın altına yığışanda, buzbulaqlılar elə sir-sifətdən də bir-birlərinə yaman oxşayırmışlar. Savadlı-savadsız – bəlkə əllidən də çox adam olardı: bildir, inişil institut qurtarıb, Bakıda hələ təzə-təzə özlərinə yer eləyənlər; Sumqayıtda fəhlə işləyənlər; Bakının bazarlarında il uzunu meyvə qurusu satanlar... Yasda oturanların üç nəfəri isə Buzbulaqdan yəqin ki, elə bu gün gəlmişdi. Və sanki buranın yas yeri olduğunu vaxtaşırı yada salmaqdan ötrü, onlar öz aralarında qabaqcadan şərtləşmiş kimi, növbə ilə, fasilə ilə orda-burda ağlayıb, əllərinin dalı ilə gözlərinin yaşını silirdilər. Onların yuxusuz olmaqları gözlərindən bilinirdi; oturmaqlarından, baxmaqlarından bilinirdi ki, Buzbulaq elə həmişəki Buzbulaqdır və üzlərinin qızartısı ilə əllərinin çatından fərz eləmək olardı ki, Buzbulağa qar yağıb, şaxta düşüb...

Sənin anan Qəmər xala da qışda öldü, Rəfi. Gecə qar yağmışdı – qəribə yumşaq qar idi, qışın, gərək ki, birinci qarı idi. Əksinə, o qar yeri bir az da yumşaltmışdı və qəbirqazanlar da, deməli, qəbir yiyəsini söyməmişdilər... O qar isti idi, pambıq kimi yüngül idi; Buzbulaq məscidinin taxçasında həmişə ağzıaşağı dayanan tabutun üstündə də qar vardı, Rəfi! Və o gün, əvvəl Qəmər xalanın ölməyindən xəbər tutub, sonra məscidin taxçasında o tabutun yerini boş görənlər yəqin ki, səni də xatırlamışdılar.

Sənin götürmədiyin o pulun min beş yüz manatına Qəmər xala üçün bir yaxşı başdaşı yazdırdılar. Sonra bir yaxşı mal alıb kəsdilər; təndirdə təzə çörək yapdılar; çayxananın böyük samovarlarını gətirib, sizin evin eyvanında qaynatdılar - Qəmər xalaya ehsan verildi və o ehsanda səni də xatırladılar, Rəfi. Dedilər ki, o Rəfiyə də Allah səbir versin, mərhəmət versin. Dedilər ki, Allah onun çətin işini asan eləsin.



Dedilər ki, Allahın dərgahına üz tutun, ey camaat, Allah alidir, rəhmdildir, keçər Rəfinin günahından! Sən bizim o bədbəxt Rəfini cəhənnəm əzabından hifz elə, ya pərvərdigar! – dedilər. – Barı o dünyada, qoy ana övladdan, övlad anadan ayrı düşməsin. Qoy, qadir Allah ana ürəyinin mərhəmətini heç nankor övladlara da əsirgəməsin, – dedilər. Və hamı bir ağızdan "amin, ilahi!" – dedi.

Qəmər xalanın ehsanında buzbulaqlılar Rəfini Allaha tapşırdılar, amma Allaha tapşırılmaq hələ bağışlanmaq demək deyildi: yəni, bu qəliz əhvalatı Allah öz bildiyi kimi həll eləsə yaxşı idi, təki bir vaxt yerdən göyə qalxan o ana fəryadının qəzavü-qədəri Buzbulağın başından uzaq olaydı. Amma burası da var ki, ağlı-başı yerində olan sağ-salamat bir adamı Allaha tapşırmaq, o adama təkcə rəhm eləmək deyildi, həm də onu dolayısı ilə, bəlkə qarğımaq deməkdi, çünki Allahın mərhəməti şikəstlərin, bir də pis gündə, dar ayaqda çarəsiz, günahsız əzab çəkənlərin payına düşürdü. Rəfi isə Bakıda sağ-salamat idi və üstəlik, kefi istəyəndə hələ Bakının professorları ilə kəllə-kəlləyə də gələ bilirdi.

Və kim bilir, bəlkə Rəfi Bakının professorları ilə bir vaxt doğrudan da kəllə-kəlləyə gəlmişdi və o gün Rəfini Allaha tapşıranda, bəlkə buzbulaqlılar işin bu tərəfini də nəzərə almışdılar... O vaxt Rəfi xəstə olmasa da, bəlkə, pis gündəydi, dar ayaqdaydı? Bəlkə Rəfinin heç bir günahı yox idi, günah faşistlərdə idi – o faşistlər ki, onun Buzbulağa gəlmək kimi olduqca sadə bir işini bu cür dolaşığa, çətinə salmışdılar. (Və belə şeyi açıb-ağartmağa bəlkə Rəfi utanmışdı, yaxud bunu kiməsə söyləməkdən, bəlkə, sadəcə ehtiyat eləmişdi).

Bəlkə günah heç o faşistlərdə də deyildi. Rəfinin Buzbulağa gəlməməyinin baiskarı, bəlkə elə doğrudan da Bakının professorları idi. Yaxud, Rəfini həmin professorlarla kəllə-kəlləyə gətirən, bəlkə, o Buzbulağın özününcə elə böyük bir dərdi idi ki, lap doğma ananın ölümü də o dərdin qabağında adi bir şey idi?.. Hər halda, bu işin bir ciddi səbəbi olmalı idi. Axı, Rəfinin Qəmər arvadla incikliyi olmamışdı, Buzbulaqla küsülülüyü olmamışdı (əgər belə şey olmuş olsaydı, bunu Buzbulaqda mütləq bilərdilər).

Bir sözlə, bu əhvalat qəliz əhvalat idi, insan ağlına o qədər də sığan şey deyildi və insan ağlına o qədər də sığmayan belə qəliz bir əhvalatı, içi Rəfi qarışıq, Allahın ixtiyarına verməkdə buzbulaqlılar, heç şübhəsiz, ən ədalətli yol seçmişdilər... Qəmər xalanın ehsanında

hamı doyunca yeyib-içdi, hələ yemək artıq da qaldı. Üstəlik, o ehsandan min manata yaxın pul da qaldı və o pulun hamısını kor Cəfərə verdilər. Kor Cəfərin o çağacan patefonu vardı. İndi kor Cəfər "priyomnik" almaq fikrinə düşdü. Əsgərlikdən təzə qayıtmış bir bığıburma buzbulaqlı balası o pulu götürüb, kor Cəfərə "priyomnik" almaq üçün, bir payız, Bakıya yola düşdü. Getdi və heç vaxt qayıtmadı.

### 4

Onda əllinci illərin təxminən əvvəlləri idi, indi – yetmişinci illərin axırları. Qəmər xalanın dediyinə görə, Rəfi düz otuz beşinci ildə və düz on yeddi yaşda Buzbulaqdan Bakıya oxumağa getmişdi. Deməli, bu hesabla Rəfinin indi altmışa yaxın yaşı olmalı idi. İndi Rəfi tarix elmləri namizədi idi. Haradasa arxivdə işləyirdi, haradasa mikrorayonda yaşayırdı. Bura isə şəhərin nisbətən mərkəz yeri idi. Ölənin qırxı idi. Və görünür, bugünkü ehsana Bakıda yaşayan buzbulaqlıların hamısını çağırmışdılar.

Bayırdakı böyük binanın hansı mənzilindənsə hərdən arvadların ağlaşma səsi gəlirdi. Mən bir vaxt o mənzildə olmuşdum. Tələbə vaxtlarımda mən ora Buzbulaqdan bir zənbil meyvə gətirmişdim. Qabaqca telefonla zəng elədim. Telefonda danışan rəhmətliyin özü idi. Mən o zənbili gətirəndə qapını açan da o idi. Bəs indi mən onun sifə-

də, gilası soruşmaqda tamam başqa bir məqsədin vardı. Demək istəyirdin ki, biz qonşuyuq, yaxın qonşuyuq, o qədər yaxınıq ki, birimizin gilas ağacı o birimizin damına əyilir. Ancaq sən bir şeyi bilmirdin. Bir əsas şeyi bilmirdin. Bilmirdin ki, o damda, həmin o gilas ağacının budaqları altında, sən bir axşam divarın dibinə qısılıb, xəlvət-xəlvət, için-için ağlayanda mən sənin səsini eşitmişdim... Sonra nə oldu, qonşu? Sonra o oldu ki, sən ağlayıb, inadını yeritdin: səni Əlinin oğlu Vəliyə ərə vermədilər. Və sənin yaşamaq ixtiyarın yenə özündə qaldı. Bərkdən danışmaq ixtiyarın, ucadan gülmək ixtiyarın. Könlünə tut düşəndə tut ağacının başına dırmaşmaq, könlünə nəğmə düşəndə o ağacın başında nəğmə oxumaq ixtiyarın...

Sənin, yenə o gilasın budaqları altında, o damda o divarın dibində xəlvətə çəkildiyin başqa bir axşam da yadıma gəlir. O gün sizə elçi gələnlər Bakıdan idilər. Və o axşam, o gilasın budaqları altında sən xəlvət-xəlvət, için-için ağlamırdın. Gizlənmişdin, çünki gizlənməli idin. Çünki qayda beləydi: madam ki, o elçilər sizin qapıya sənə görə düşmüşdülər, sən gərək bir yer tapıb gizləneydin. Amma o elçilərin gəlməyi xeyli sonranın əhvalatı idi. Bundan qabaq hələ aylar vardı, illər vardı. Hələ rayon mərkəzindəki pedaqoji texnikum vardı. Buzbulaqdan rayon mərkəzinə gedən dağlı-düzənli yolların yazı vardı, qışı vardı. Buzbulaq məktəbinin həyətində, bir yaz fəsli, budaqları salxım-salxım saralan nişnisə ağacı vardı. Və dünyada bir qəribə şeir

qırmasaydı, Səfurə bacının yaddaşının itməyi də, onun Bakıda körpə qoyub gəlməyi də bəlkə Buzbulaqda o qədər tez bilinməzdi.

O qapı hər dəfə açılanda Səfurə bacının anası Gülgəz xala (qapı açanın kimliyindən asılı olmayaraq) ucadan, yanıqlı-yanıqlı qışqırırdı:

– O qapını bərk çək, ay evi yıxılmış. O qapını bərk bağla, ay qapısı bağlanmış. Qaçar, vallah, qaçar. Qaçıb dağda-dərədə qurda-quşa yem olar. Bakıda balası qalıb...

Amma Səfurə bacı qaçana oxşamırdı, heç oxşamırdı. O sözləri də Gülgəz xala, mən bilən, yandığından deyirdi. Gülgəz xala qışqırıb, yanğısını söndürüb susurdu; eyvanın bir küncündə, həmişə oturduğu yerdəcə oturub, ya corab toxuyurdu, ya düyü arıdırdı, ya da yun çırpırdı, yaxud yun əyirirdi. Hər halda Gülgəz xala heç vaxt bekar durmurdu. Bir də Gülgəz xala heç vaxt ağlamırdı, sızlamırdı (qoy kim nə deyir desin: Buzbulaqda dərdə dözmək asan olur!) Gülgəz xala hərdən Səfurə bacıya acıqlanırdı, onu yamsılayırdı, söyürdü, danlayırdı:

– "Qövsi-qüzeh", "qövsi-qüzeh" – deyirdi. – Görüm yox olaydı o qövsi-qüzeyi. Bir kəlmə sözü ağzına salıb, səhərdən-axşamacan saqqız kimi çeynəyirsən. O arxın başına dolanıb, arsız-arsız mırıldanırsan. Kəs, bəsdi. Dəlisən e, kül başına! Bakıda balan qalıb e, balan qalıb!..

"Bala" sözünü bərk-bərk qışqıra-qışqıra elə bil Gülgəz xala Səfurə bacını hansı yuxudansa oyatmaq istəyirdi. Səfurə bacı isə, elə bil, doğrudan da yuxuda idi və yuxuda Səfurə bacı Gülgəz xalanın sözlərini heç vaxt eşitmirdi.

Bir misra şerin yuxusu! – Qəribə deyilmi?.. Və o bircə misra şerin yuxusunda, arxın suyuna baxa-baxa, bəlkə Səfurə bacı Buzbulağın

məktəbini görürdü: o məktəbdə ki, Səfurə bacı vur-tut bircə ay dərs . demişdi...

ki, hər səhər xoruz banında rayona gedən o beş nəfərin ikisi birdən-birə müəllimə oldu; Buzbulaq məktəbində oxuyan qızların evi onda yıxıldı ki, hər səhər xoruz banında, bir-birlərini qapı-qapı səsləyə-səsləyə rayona gedən o beş nəfərin üçü birdən-birə müəllim oldu. Qızlarımız oğlanlarına vuruldu, oğlanlarımız qızlarına vuruldu. Və vallah-billah, o bir ay dərs olmadı, bir qəribə sevmək xəstəliyi oldu. Nə bilim, bəlkə ən yaxşı dərs də elə o idi...

O yaz Səfurə bacı ilə Buzbulaq məktəbində dərs deməyə gələn üç oğlanın biri Natiq idi, biri Həsən idi, biri Sabir idi. Və bəlkə bu dünyada o üç nəfərdən savayı başqa bir Əlinin oğlu Vəli də vardı və kim bilir, o bircə misra şerin yuxusunda bəlkə Səfurə bacı həmin o Əlinin oğlu Vəlini də görürdü... Bəlkə Səfurə bacı Buzbulağın günəşindən məst olmuşdu? Bəlkə Buzbulağın çiçəklərinin ətrindən məst olmuşdu? Bəlkə Səfurə bacı, Bakıda o arxın həsrətini o qədər çəkmişdi ki, indi heç körpə balası da gözünə görsənmirdi?..

O – azar idimi, yuxuydumu, ya nəydi – bilmirəm. Hər nəydisə, bir gün Səfurə bacı ondan ayrıldı. Özü də, bir gecə hönkür-hönkür ağlayandan sonra ayıldı. Sən demə, o dərdin dərmanı da elə bu imiş. Sən demə, bu dərmanı Gülgəz xala çoxdan bilirmiş. Və o danlaq da, o söyüş də, sən demə, elə Səfurə bacını ağlatmaqdan ötrü imiş.

– "...Elə o gecə bildim ki, sağalacaq. Gözləri yaşaranda bildim. Uzatdım yorğan-döşəyə, gördüm ağlayır. Dedim: ağla, bala, ağla. Evin yıxılıb, dedim, dəli olmusan. Bakıda südəmər balan qalıb, ağlamalı günündü, doyunca ağla... Birdən hönkürdü, nə hönkürdü. Gecəni yatdı, səhər duran kimi uşağı xəbər aldı. İsə bax, bunacan yazıq balamın heç

doğmağından xəbəri yox idi..."

Bir zaman Gülgəz xala Səfurə bacının sağalmağını Buzbulağın

## KÖMÜRLƏ YAZILAN ŞEİR

Özü də Fizzə müəllimənin barəsində. O Fizzə ki, bir zaman bizim küçədən, səhərlər xoruz banında, Səfurə bacını ucadan səsləyirdi. O Fizzə ki, bir yaz bizim məktəbə Səfurə bacı ilə birgə dərs deməyə gəlmişdi. Fizzə müəllimənin sarı jaketi vardı, sarışın saçları vardı və Buzbulaq məktəbinin həyətindəki pişpişə ağacı da o yaz sapsarı pişpişələr açmışdı. Və o ağac Fizzə müəlliməyə yaman oxşayırdı...

Sonralar Fizzə müəlliməni böyütdülər, onu irəli çəkdilər. Məktəbin eyvanına, ibarənin qabağına, qapılara, divarlara, hər yerə Fizzə müəllimənin şəkli vuruldu. Və Fizzə müəllimənin barəsindəki o şeir də elə o vaxt peyda oldu. O şeri gecələrin birində kimsə, qara kömürlə, məscidin ağappaq taxçasına yazmışdı:

Aşura gecəsində,
Misirxan küçəsində,
Fizzə Mehdiyevanın
Əl gəzib məməsində.
Buzbulaq oldu rüsvay,
Əliəsgər ağam vay!

Guya aşura gecəsi, camaat Molla Teyyubun evinə yığışıb, xəlvəti imamların təziyəsini saxlayanda, kimsə Fizzə müəllimənin evindən qara kostymlu bir kişi çıxdığını görmüşdü. Guya o adam Buzbulaq adamı deyilmiş, rayondan gəlmə imiş. Özü də elə bir adammış ki, onun kim olmağı – bu dünya durduqca sirr olub qalmalı imiş.

Məscidin ağappaq taxçasında qara kömürlə yazılan o şeir Buzbulaqda aşuradan da betər bir vaveyla qopardı. O şeirdən, əvvəl uşaqlar xəbər tutdular. Səhər tezdən məscidin qabağında uşaqlar qışqırışmağa, atılıb-düşməyə başladılar. Sonra, yoldan keçən qızlar, arvadlar (oxuya biləni də, oxuya bilməyəni də) dayanıb taxçaya boylandı; o şeri yaşlı kişilər də gördülər, amma nə qədər qəribə olsa da, onu o taxçadan pozmaq heç kimin ağlına gəlmədi. Sonra kənd sovetinin sədri Talıb dayı gəldi, kənd sovetinin katibi Ceyran bacı gəldi və o qara, kömür yazısını da məscidin taxçasından elə onlar pozdurdular. Amma, sən demə, o yazı məscidin taxçasında hələ bir müddət də qalmalı imiş; o yazının guya şəkli çəkilməli imiş, çünki bunsuz, o şeri yazan adamı tapıb ortaya çıxarmaq mümkün deyildi. Və işin bu tərəfi rayondan üç



nəfər adam gələndə məlum oldu. Talıb dayı, Ceyran bacı, Zinyət Şəkərək qızı, bir də rayondan gələn həmin o üç nəfər o gün bizim direktorun kabinetində bu işin üstünü açmaq üçün çox əlləşdilər: soruşmadıqları uşaq qalmadı, baxmadıqları dəftər qalmadı; o yazının kimin xəttinə oxşadığını o gün məscidin qabağında görsənən uşaqların hamısından birbəbir xəbər aldılar, amma o şeri yazan, sən demə, rayondan gələn o üç nəfərdən də bic adammış, çünki şeir çap hərfləri ilə yazılmışdı – belə yerdə xətti necə ayırd eləmək olardı? Və o xətti ayırd eləmək heç cür mümkün olmadı. O xətt də sirr olub qaldı. Aşura gecəsi guya Fizzə müəllimənin qapısından çıxan o qara kostyumlu adam da sirr olaraq qaldı. Bir də, məscidin ağappaq taxçasındakı kömür qarası... O şeir pozulandan sonra da o kömürün qarası məscidin taxçasından uzun müddət pozulub getmədi.

### 5

O şeir Fizzə müəllimənin təmiz adına heç bir ləkə gətirmədi. Fizzə müəllimə deputat da oldu, ərə də getdi, uşaq da doğdu. Vaxt keçdi – məscidin divarında kömür qarasının heç izi-tozu da qalmadı. Amma o ləkə haradasa, sən demə, qalıbmış. Sən demə, "Buzbulaq" deyilən yerdə heç kömür qarası da asanca, izsiz-tozsuz itib-gedə bilməzmiş. Bu isə lap sonralar Mücrü arvadın oğlu Rəcəb əsgərlikdən qayıdanda məlum oldu. O Rəcəb ki, əsgər getməmişdən qabaq kolxozun ilxısını otarırdı. O Rəcəb ki, əsgərlikdən qayıdıb, kolxoz sədri Cümşüdü gecənin hədd yarısı dəyirman arxında möhkəmcə döyüb, gedib öz ayağı ilə türməyə girmişdi. Rəcəb iki il türmədə yatmışdı. İndi Sumqayıtda, hansı zavoddasa fəhlə işləyirdi. Və bu saat bu yas yerində o mənimlə yan-yana əyləşmişdi.

Rəcəbin əyin-başı yaxşı idi. Sifəti diri idi, hökmlü idi. Başını aşağı salıb papiros çəkirdi. Hərdən gözlərini dolandırıb, yasda oturanlara baxırdı və bu baxmaqla da elə bil aşkar deyirdi ki, bəli, Rəcəb mənəm, Cümşüdü mən döymüşəm və mən kişi adamam, buna şübhə eləyən yoxdu ki?

Cümşüdü döyməyi öz yerində, amma kişilik sarıdan Rəcəbin işləri doğrudan da yaxşı gətirmişdi. Az vaxtda Sumqayıtda mənzil almışdı. Evlənmişdi, anasını Buzbulaqdan Sumqayıta köçürmüşdü. Və Buzbulaqda vur-tut dörd-beş il əvvəl baş verən o əhvalatı da indi Rəcəb,

elə bil, yerli-dibli unutmuşdu. Amma yox, belə şeyi unutmaq çətin ki, mümkün olaydı. Belə hadisə bizim zəmanədə nəinki Buzbulağın, lap cəmi bəşər əhlinin həyatında, mən deyərdim ki, o qədər də tez-tez baş vermir. O əhvalat çox qəribə əhvalat idi, daha doğrusu, əhvalat deyildi, nağıl kimi bir şey idi.

## RƏCƏBLƏ RUZGARIN NAĞILI

Biri sağıcı, biri ilxıçı. Yəni, hər ikisi ferma işçisi. Cümşüd isə, Rəcəb əsgər gedəndə, hələ kolxoz sədri deyilmiş, kolxozun mal həkimi imiş, – bunu da yadımızda saxlayaq.

Rəcəblə Ruzgar bir-birini çoxdan istəyirmiş. Rəcəbin əsgərlik söhbəti çıxanda nişanlanırlar. Rəcəb əsgərlikdə olanda onlar məktublaşırlar, ya məktublaşmırlar – bilmirəm. Amma eşitdiyimə görə, bu nağılın əvvəli Rəcəb əsgərlikdən qayıdan gün elə vağzaldaca başlanır.

Rəcəb qatardan düşəndə görür ki, Buzbulaq kolxozunun maşını vağzaldadır. Maşını sürən də, görür ki, elə həmişəki Möhsündür. Amma Möhsün, onlar Buzbulağa gedəndə, yolda özünü çox birtəhər aparır: lal-dinməz, qaşqabaqlı; Rəcəbin soruşduğu sözlərə ya könülsüz, ağızucu cavab verir, ya da heç cavab vermir. Rəcəb dilxor olur. Elə bilir ki, ya anasının, ya da Ruzgarın başına bir iş gəlib. Soruşur ki, anam sağdır? Möhsün deyir ki, sağdır. Deyir: Ruzgar necədir? Möhsün deyir: lap yaxşı. Amma sözü demək də var, demək də. Möhsünün o təhər könülsüz danışmağı Rəcəbi möhkəm şübhələndirir. Sonra Rəcəbin ağlına nə yerləşirsə, maşını dayandırır. Möhsünü sürüyüb maşından yerə salıb deyir ki: indi, danış görüm, Buzbulaqda nə var, nə yox? Möhsün and içib, aman eləyir. Deyir: vallah, billah, heç nə yoxdur. Anan da sağdır, – deyir. – Ruzgar da sağdır. Amma Ruzgar, – deyir, – bu saat kənddə yoxdur. Üç gündür ki, Bakıya gedib.

– Ruzgar niyə gedib Bakıya?

– Iclasa gedib.

– Iclas nədi?

– İclas da, necə yəni iclas nədi?

– Iclasa kim göndərib onu?

– Onu öz dostundan soruşarsan.

– Dostum kimdi?

– Cümşüd də, dostun deyil?



– Cümşüd nəçidi?

– Sədrdi də, xəbərin yoxdu?

Amma Möhsün bircə şeyi demir. Demir ki, Ruzgarı deputatlığa veriblər. Demir ki, bu saat Buzbulağın hər yerində (məktəbində, klubunda, çayxanasında) divarlardan, qapılardan Ruzgarın şəkli asılıb. Ya paxıllıqdan demir, ya da qorxudan demir. Və Rəcəb də bundan sonra daha heç o maşına da minmir. Gecənin zülmətində xeyli vaxt pay-piyada yol gedir və Ruzgarın deputatlağa verilməsini də guya o, hələ kəndə girməmiş, kolxoz tövləsinin qarovulçusundan eşidir.

Deyilənə görə, Buzbulağa çatan kimi (hələ heç evə də baş çəkməmiş) Rəcəbin gördüyü iş o olur ki, qapılardan, divarlardan Ruzgarın şəkillərini qopardır. Sonra gedib, qaranlıqda kibrit çəkib məscidin üç taxçasının hər üçünü, dəlmə-deşiyinəcən, dönə-dönə yoxlayır. Ordan da birbaş cumur Cümşüdün yanına ki:

– Bəs sənin etibarın bu idimi, ay əclaf! Mən orda əsgərlik çəkirəm, burda nişanlım, mənsiz, Bakının qəstinsələrini gəzir.

Insafən, deyirlər ki, o gecə Cümşüd özünü çox səbirli aparır, Rəcəbi sakitləşdirməyə çalışır, deyir ki: Ruzgarın namusunu indiyəcən nə qədər uca bilmisənsə, indi ondan da on mərtəbə uca bil. Deyir ki, biz sənnən dağda-daşda bir pud duz yemişik, mən sənin nişanlına xor baxsam, gərək o duz gözlərimdən töküIə. Deyir ki, Ruzgarın deputat olmağı sənin başının ucalığıdır. Deyir ki, bilmək istəsən, bu işdə mənim heç sən deyən rolum-zadım olmayıb... – Get yat, – deyir. – Səfehləmə. Yaz açılanda səni fermaya müdir qoyacağam. Bundan belə bu dünyada kef bizimdir.

Amma Rəcəb ipə-sapa yatmaq istəmir:

– Hə, – deyir, – kef bizimdir. Adam oğraş olandan sonra kef eləməyə nə var ki! Sən, – deyir, – oğraşsan, Cümşüd, buna görə də, mən səni döyməliyəm.

Cümşüd bu boyda zəhəri də udur.

– Döy, – deyir, – nə olar? Amma qışqırma, sən allah, arvad-uşağı yuxudan eləmə.

– Onda dur çıxaq bayıra.

Çıxırlar bayıra. Cümşüd elə bilir ki, Rəcəbi yumşaldacaq. Danışa-danışa gedib dəyirman arxına yetişirlər. Biri barışığa çəkir, o biri davaya. Axırı da bu olur ki, Rəcəb dəyirman arxında Cümşüdü ölüncə döyür, leşini dalına alıb, gətirib arvadının üstünə atır.

Bu əhvalatın mabədini isə Buzbulaqda yalan-doğru belə nəql edirlər:

Guya Rəcəb Cümşüdün "mitilini" aparıb evlərinə atandan sonra gedib anasına baş çəkib. Deyib ki, əsgərlik vaxtımı uzadıblar, bircə saatlığa buraxıblar ki, gəlib səni görüb qayıdım. Sonra, elə həmin gecə, guya Rəcəb gedib şofer Möhsünü də yuxudan oyadır və ondan Ruzgar barəsində elə qəribə şeylər soruşur ki, başı havalı olmayan adam belə şeyi ömründə ağlına gətirməzdi.

Məsələn:

– Ruzgar vağzala kimin maşınında gedib?

(Bu kolxozda guya Möhsünün maşınından savayı bir özgə maşınıda var idi!)

– Gedəndə əyninin paltarı necə idi, başının yaylığı necə idi?

– Maşında danışırdı, yoxsa danışmırdı?

– Vağzalda Ruzgar kimlərlə salamlaşmışdı?

– O minən vaqona kim minmişdi?

Hətta bunacan ki:

– Ruzgarın mindiyi vaqona bir qara kostyumlu kişi də minmişdi, yoxsa minməmişdi?..

Bir sözlə, başı havalı adamın sayıqlamağı. Sonra isə, guya Rəcəb Möhsünə deyib ki, o qara kostyumlu kişinin Fizzənin evindən çıxmağını, uşaq vaxtı, bir dəfə guya o özü də görübmüş. Bunu deyib, çıxıb gedib. Amma guya elə həmin gecə Rəcəbi Fizzənin qapısında üzüqoylu səkinin üstünə sərilib ağlayan da görüblər. Bu isə, şübhəsiz ki, nağıldır. Ümumən, bu əhvalatın tam yarısı heç şübhəsiz uydurmadır. Çünki Buzbulağın köhnə xasiyyətidir: bir söhbət ki, dilə-ağıza düşdü, onu nağıla döndərməyincə Buzbulağın canı rahat olmaz. Buzbulaq nağılsız ötüşəmməz – istəyirsən hər evə üç televizor qoy, hər küçədə yüz dənə elektrik lampası yandır... Burasını elə bu, Rəcəb və Ruzgar əhvalatının lap sonluğu da sübut eləyir:

Bakıdan qayıdandan sonra Ruzgarın ayaqyalın, başıaçıq rayona cümmağı; Rəcəbin yatdığı dustaq otağının qapısı dalında bir gecə səhərəcən yalvarıb, göz yaşı axıtmağı, bir həftə sərasər ac-susuz, türməyə keşik çəkməyi və s. və i. a.

Guya Ruzgar Rəcəbin türmədən buraxılmağına da icazə alır. Ancaq Rəcəb türmədən çıxmır. Deyir ki, çıxsam səni öldürəcəyəm, tikə-tikə doğrayıb, kolxozun itlərinə yedirəcəyəm. Bir sözlə, belə bir qəribə sonluq. Yarı gerçək, yarı uydurma... Özü də, o vaxt türmənin



qapısında guya gözlərinin yaşını axıdıb, ölənəcən ərsiz qalacağına and içən Ruzgar indi ərdə idi. Həm də (gərək ki) üç uşaq anası idi.

Görən, Ruzgarın barəsində lap bu son günlərdə qəzetdə çıxan məqaləni Rəcəb də oxumuşdumu? Yuxarıda: "Sabahın xeyir, Ruzgar bacı!" Aşağıda: "Neymət Namaz". (Bizim buzbulaqlı Neymətulla Namazovun yaxşı qələmi var). Və indi o, Neymət Namaz da burdaydı, yas yerində idi. (Onun qırmızı "Jiquli"sini hələ bu həyətə girməmişdən, bayırda, darvazanın dalında görmüşdüm). Həmişə zirək, həmişə xeyrə-şərə yarayan Neymətulla! Özünün də belə bir yaxşı xasiyyəti var ki, qəzetlərdə məqaləsi çıxanda Bakıdakı buzbulaqlıların hamısına bir-bir zəng eləyib xəbər verir. Ruzgarın barəsində məqaləsi çıxan qəzeti isə Sadıq kişinin ehsanında o özü mənə vermişdi. Mən də məqaləni oxuyub, elə oradaca qəzeti Neymətullanın özünə qaytarmışdım...

## 6

Elə o Neymət Namaza baxa-baxa da fikrim necə dağıldısa, bir də gördüm ki, Rəcəb yanımda yoxdur. Rəcəb durub getmişdi. Bir də, Buzbulaqdan bu gün gələnlər yox idilər. (Yəqin ki, gecə qatarı ilə onlar elə bu gün də yola düşəcəkdilər, indi vağzala bilet almağa getmişdilər). Qalanların hamısı yerində idi. Amma Rəcəb, bir də o üç nəfər buzbulaqlı durub gedəndən sonra yas yeri, içi Neymət Namaz qarışıq, mənə tamam boşalmış kimi görünürdü. Bunun bir səbəbi bəlkə o idi ki, qalan adamların əksəriyyətini mən nisbətən yaxşı tanıyırdım. Daha doğrusu, bu adamların məndən ötrü elə bir sirli cəhətizadı yox idi. Bilirdim ki, bu adamlar da mənim kimi institut qurtarıb; təxminən eyni kitablardan, təxminən eyni dərsi oxuyub (10 il geç, 10 il tez, fərqi nədir ki?); bir yerdə işə düzəlib, təxminən mənim qədər maaş alırlar. Və mənim mənzilim kimi bir mənzildə, elə təxminən mənim kimi də yaşayırlar. Üstəlik, sizi inandırıram ki, bu adamların baxmağında, danışmağında və hətta stəkanı əllərində necə tutub, çayı nə təhər içməklərində də kifayət qədər oxşar cəhətlər var idi. Və açığını deyim ki, belələrinin yanında hətta Sadıq kişinin oğlu Nərimanın özü də məndən ötrü qat-qat maraqlı idi.

Nərimanın sir-sifətindən heç olmasa onu bilmək olurdu ki, bu adamın dünyanın min bir xırda fırıldağının heç birindən sən deyən

köklü-əsaslı xəbəri-zadı yoxdur. Məsələn, bu adam heç vaxt kolxozun bostanından yemiş oğurlamayıb, nənəsinin sandığından kökə çırpışdırmayıb. Məktəbdə, əyin-başı nimdaş olduğuna görə, müəllimlər onu dal cərgədə otuzdurmayıblar. İnstitutda, müəllimlərin gözünə girməkdən ötrü, o özü gedib qabaq cərgədə əyləşməyib. Bilinirdi ki, bu adam ömründə nə komendant üzü görüb, nə upravdom üzü görüb, ömründə nə bir adama rüşvət verib, nə bir adamdan rüşvət alıb. Hətta (sizə təəccüblü gəlməsin!) ömründə heç nədən ötrü heç kəsə yaltaqlanmayıb da... *Nərimanın sifətində belə-belə şeylərin əsər-əlaməti* yox idi. Olsa-olsa bir balaca gücsüzlük əlaməti var idi, bir azca da yorğunluq və biganəlik...

Nəriman hansı zavoddasa mühəndis işləyirdi. Sadıq kişinin hələ iyirminci illərdə aldığı üçotaqlı adi mənzildə yaşayırdı. Hal-hazırda isə Rəfinin böyründə çənəsini ovcuna qoyub, dinməz-söyləməz əyləşmişdi.

Rəfinin o biri tərəfində oturanın adı Dəyyan idi və bundan məşhur ikinci bir ad, mən bilən, Buzbulaqda heç olmamışdı. Əvvəla, ona görə ki, Dəyyanın Buzbulaqda azı on ev qohum-əqrəbası vardı və bu on evin hərəsindən, çox demirəm, bircə adamın küçədə, çeşmədə, təndir başında, gündə bircə dəfə, "Dəyyan əmim", yaxud "Dəyyan dayım" *deməyi bir adın Buzbulaqda məşhurlaşması üçün tam* kifayət idi. O ki qaldı bu on evin hərəsində beş-on nəfər də uşaq ola. Və azı on evlik bütöv bir nəsil neçə-neçə illər idi ki, böyüklü-kiçikli, yeri oldu-olmadı, həmin bu Dəyyanın əziz canına and içirdi.

*Dəyyanın məşhurluğunun ikinci səbəbi isə onun* Buzbulaqdakı badamlığı idi. Eni-uzunu görünməyən böyük badam bağı. Badam da ki, nə badam: qabığı kağız kimi napnazik. Bəzilərinin dediyinə görə, o badamın şitilini Dəyyan Yunanıstandan gətirmişdi, amma yaşlı kişilər deyirdi ki, Yunanıstandan gətirməyib, Krımdan gətirib. Ancaq məsələ bunda deyil. Məsələ burasındadır ki, o badamlıq Buzbulaqda hələ də qalırdı. Və o bağ çoxdan kolxoz bağı olsa da, Buzbulaqda ona hələ də "Dəyyanın badamlığı" deyirdilər. Deməli, Dəyyanın adı bir də bu səbəbdən Buzbulaq camaatının dilindən düşmürdü.

Amma dünyanın qəribə işləri var. İndi, bu Dəyyanın üzünə baxanda heç cür inanmaq olmazdı ki, bu sir-sifətdə adam haçansa bağ salıb, ağac əkib, çünki bağ salanın, ağac əkənin elə sir-sifətində də o bağdan, o ağacdan nəsə bir nişanə olur, deyəsən. İnsanın ağaca oxşayan cəhəti az deyil. Onun ağaca oxşamayan əsas cəhəti isə, yəqin ondan



ibarətdir ki, ağac torpaqdan üzüləndən sonra yaşaya bilmir, ancaq insan torpaqdan üzüləndən sonra da kefin istəyən qədər yaşaya bilir. Dəyyanınkı da bir növ belə gətirmişdi.

O, Buzbulaqdan Rəfidən də üç-dörd il qabaq çıxmışdı. Gedib, Tiflisdə, deyilənə görə, bir müddət hamamda müdir işləmişdi, sonra ticarət sisteminə keçmişdi: çayçı, bufetçi, zavmaq, bir sözlə, yüz cür fırıldaqdan çıxmışdı. Özü də bütün bunlar sonradan məlum olan şeylər idi. Əvvəllər Buzbulaqda hamı belə hesab eləyirdi ki, Tiflisdə bir əsas şəxsiyyət varsa, o da elə Dəyyandır. Lap mənim özümdən ötrü də, uzun müddət, *Tiflis* – Dəyyan demək idi, Dəyyan – Tiflis demək idi. Üstəlik, bir vaxt mən möhkəm inanırdım ki, "Tiflis" deyilən yer başdan-ayağa badamlıqdır, çünki bu Dəyyan mənim beynimə öz badam ağacları ilə yaman həkk olunmuşdu. Amma, heyf ki, günlərin bir günü Dəyyan öz ayağı ilə peyda olub, mənim onun barəsindəki gül kimi təsəvvürümü alt-üst elədi. Açığını deyim ki, o gün mən Dəyyanı möhkəm söyəcəkdim –

## ƏGƏR O BADAM AĞACLARI OLMASAYDI

Təxminən on il qabağın söhbətidir. Bakıda təzəcə mənzil aldığım vaxtlar idi. Günlərin bir günü (hələ səhər saat yeddi olardı, ya olmazdı) qapının zəngi basıldı. O vaxtacan ömrümdə üzünü görmədiyim həmin bu Dəyyan kişi içəri girib birinci bundan başladı ki, bəs belə olmaz, bala, çox yatırsan.

– Mən, – dedi, – yetmiş yaşlı kişiyəm, amma səhər açılandan qırx beş dəqiqə bulvarda fizkultura eləmişəm. Qayıdıb on beş dəqiqə soyuq suyun altında çimmişəm. Çay içmişəm, çörək yemişəm. Bazara gedib-gəlmişəm...

– Bağışlayın, – dedim, – axı mən sizi tanımadım.

Kişi əməlli-başlı incidi.

– Tanımazsan da, böyümüsən! Sən bizim Qurbanəlinin nəvəsi deyilsən? Aşağı məhəlləli Zır Qurbanəlinin, "Zır" deyəndə incimə ha, zır, yəni cannı, qüvvətdi, əldən-ayaqdan zirək. Kaş elə sənnən mən də onun kimi zır olaydıq. Dədəm Məşədi Həsənnən qardaş kimi idilər.

– Bəli...

– Bəlin şirin. Ancaq bu, heç bir dəftər-kitaba yazılmayıb ki, mən boyda kişini məcbur eləyəsən ki, durub sən boyda bir uşağın ayağına gəlsin. Gərək, qanuna görə, sən məni axtarıb tapaydın. Bəlkə düz demədim?

– Düz deyirsiz, ancaq...

– Nə "ancaq"? Dəyyan adında adam eşitməmisən?

(Bu yerdə, həm o badamlıq gözümün qabağına gəldi, həm də dal-badal səslər eşitdim: "Dəyyan əmim", "Dəyyan dayım", "Dəyyan dayımın canı", "Dəyyan əmimin ölmüşü...")

– Eşitmişəm, – dedim. – Amma...

– Guya sən bilmirsən ki, mən düz yeddi aydı ki, Tiflisdən Bakıya köçmüşəm?

– Vallah, eşitməmişəm.

– Yəni, sən bulvarda-zadda da görməmisən məni?

– Bəlkə görmüşəm. Ancaq mən sizi tanımıram, axı... Daha doğrusu, indiyəcən tanımırdım.

Dəyyan kişi tərs-tərs üzümə baxdı və mənim ağlıma gəldi ki, yəqin bir yerdə kimsə məni ona qıraqdan göstərib. Yəni odur: filankəsdir, bu da buzbulaqlıdır. Və bunu fikirləşdiyim yerdə Dəyyan kişi mənə təzə sual verdi:

– Səncə, Bakıda nə qədər buzbulaqlı olar?

– Bilmirəm, – dedim və fikirləşdim ki, belə şeyi bilmək pis olmazdı. Amma, sən demə, hal-hazırda Dəyyan kişini maraqlandıran statistika məsələsi deyildi.

– Bakıdakı buzbulaqlıların hamısı bilir ki, mən Tiflisdən yeddi aydı ki, köçmüşəm. Əksəri də mənim evimdə olub. Ayrı şeyimiz olmasa da, pitidən, bozbaşdan həmişə tapırıq.

– Bəli.

– Bəlin şirin.

(Və bir xırdaca fasilədən sonra):

– Deyəsən, bərk içirsən axı...

Dəyyan kişi diqqətlə otağın bur-bucağına baxıb, elə bil mənim içməyimə əşyayi-dəlil axtardı. Ancaq burası lap ağ idi. Axırıncı dəfə haçan içməyim yadıma gəlmirdi. Söz məni tutdu, nə tutdu.

– Bağışlayın, – dedim, – siz mənim içməyimi hardan bilirsiniz?

Dəyyan kişi tam qətiyyətlə:

– Bilməsəm, deməzəm, – dedi. – Bu dəfə tavana baxdı: guya mənim içməyimə dair əşyayi-dəlil məhz o tavanda idi. – İçmək çoxlarının həyatını məhv eləyib.

Ürəyimdə söz qoydum ki, daha bu adama bir kəlmə də cavab verməyəcəyəm. Qoy, ağlına nə gəlir danışsın. Ümidim ona idi ki, mən dillənməsəm, bu adam bəlkə tez çıxıb gedər. Az sonra Dəyyan kişi, doğrudan da ayağa durdu, amma getmədi, balkona çıxdı; oradan harasa bir xeyli baxıb qayıdıb:

– Pis yaşayırsan, – dedi. – Şəhərdə yaşamağın təhrini bilmirsən. Sən gərək evlənəsən.

Dəyyan kişi gözümün içinə elə baxdı ki, gördüm dinməsəm olmayacaq. Əlacsız:

– Elədir, – dedim.

– Bakılı qızı almayasan!

– Gözüm üstə, – dedim. (Taktikanı dəyişmək lazım idi).

– Bu evi haçan almısan?

– Baş üstə.

– Deyirəm evi haçan almısan?

– Evi? Haçan? Bilmirəm.

– Demək, papiros da çəkirsən. İçki cəhənnəm, hərdənbir iç, sözüm yoxdu. Amma papirosu rədd elə getsin. Başdan-ayağa zəhərdir. Qəzetləri oxuyursan?

Axırıncı taktikanı da unudub, tam ciddi bir tərzdə:

– Elə oxuduğum qəzetdir, – dedim.

– Görürsən də hökumət neyniyir: papirosun zəhər olmağını qəzetdə açıqca yazır. Ordan da tənbəki planı dolmayanda, kolxoz sədrlərinə o söz... Demək, hökumət istəsə, papiros çəkməyin qabağını zorla da ala bilər. Ancaq istəmir ki, zor işlətsin, istəyir ki, camaatın özü başa düşüb, o zəhərdən könüllü surətdə əl çəksin. Heç bilirsənmi, burda nə boyda palitka var?

Bu axırıncı sözləri Dəyyan kişi elə bir vəhmlə dedi ki, açığı, mən bir az diksinən kimi oldum, ancaq cavabımdan da qalmadım.

– Bəli, – bilirəm, – dedim. – Burda çox böyük palitika var, amma vallah mən papiros çəkən deyiləm.

Mənim bu dəfə dediyimi Dəyyan kişi elə bil heç eşitmədi.

– Xeyr, bilmirsən, – dedi. – Bilsən, o zəhrimarı çəkməzsən. Sənin nə vaxtındır ki, indidən söz danışanda fıs-fıs fısıldayırsan, dilin-dodağın gömgöydür indidən. Günü sabahdan mütləq basseynə get. Suda çox qalmağı məsləhət görmürəm, amma qıraqda çox hərəkət elə. Atıl-düş, hisin-pasın açılsın. Demək, deyirsən ki, evi haçan aldığını bilmirsən?

– Bilirəm, niyə bilmirəm! Orderi fevral ayının düz iyirmi birində almışam.

Dəyyan kişi saymağa başladı:

– Fevral, mart, aprel, may. Deməli dörd aydı. Ancaq remont lazımdı. Bizim qonşuluqda yaxşı ustalar var. Əsilləri Tiflis tərəfdəndi. Sabah bir az tez dur yuxudan, deyək gəlib başlasınlar. Yoxsa Bakının lotu-potu ustalarına ilişərsən, qanın gedər.

Az qala yenə "baş üstə" deyəcəkdim, amma yaxşı ki, birdən-birə ağlım işlədi.

– Sağ olun, çox razıyam, – dedim. – Mən sabah tezdən ezamiyyətə getməliyəm. Uzun müddətə.

– Bilet almısan.

– Bəli.

– Səfər uzağadı?

– Bəli, uzağadı, – dedim. – Ural tərəfədi.

Çünki o səhər bu Dəyyanın əlindən mən lap Sibirə getməyə də razı idim.

Bu yerdə Dəyyan kişi durub, bir də balkona çıxdı və qayıdıb:

– Mat qalmalı işdi, – dedi. – Sən bu otaqda necə boğulmursan?

– Boğuluram, – dedim. Və baxıb gördüm ki, əllərimin hərəsi bir dizimin üstündədir, özləri də əl deyil, yumruqdur. Möhkəm pərt oldum.

– Hava da pulnandır?

– Hi... hi...

– Yatanda o pəncərəni niyə açıq qoymursan?

– Küçədən səs gəlir.

– Səs yaxşıdı, yoxsa boğulmaq yaxşıdı?

– Boğulmaq yaxşıdı, – dedim, çünki bu adama nə deməyin daha məndən ötrü heç br fərqi yox idi.

Dəyyan kişi ayağa durub:

– Boğul, boğul, – dedi. – Qazandığını da apar oralarda xərclə matuşkalara. Baban Zır Qurbanəli Uralda qızıl basdırıb sənin üçün.

Mən bu yerdə mütləq nəsə deməli idim, ancaq demədim, qorxdum ki, Dəyyan kişi təzədən otura. Çünki bu dəfə Dəyyan kişi, deyəsən, doğrudan da gedirdi. Xoşbəxtlikdən belə də oldu. Və elə bu yerdə də mənim ağlıma gəldi ki, çıxıb balkonda dayanım, Dəyyan küçədə görsənəndə onu yuxarıdan aşağı möhkəmcə söyüm. Hətta çıxdım da. Ancaq hələ Dəyyan kişi küçədə görsənməmiş, o badam ağacları hardansa gözümün qabağında peyda oldu və mənim Dəyyan kişini söyməyə dilim gəlmədi...



İndi isə, bir məclis Buzbulaq adamının arasında yalnız Dəyyan kişinin səsi eşidilirdi:

– ... uşağın tərbiyəsində, düzdü, atanın da rolu çoxdu, amma ananın verdiyi tərbiyə ayrı şeydi. Bu gün bu məclisdə əyləşən savadlılar yaxşı bilər: Amerikada Benjemin Spok adında bir alim həkim var. O yazır ki...

Və təkcə Neymətulla, boynunu bir xeyli qabağa uzadıb, Dəyyan kişinin söhbətinə diqqətlə qulaq asırdı. Amma yazıq Rəfi. Rəfi o stolun dalında nə yaman büzüşmüşdü, ilahi. Elə bil indicə stolun altına girəcəkdi.

– ... Benjemin Spok...

Mənim yaxınlığımda oturan bir nəfər o birinə:

– Deyirlər, Qənbəri yenə tutublar, – dedi. – Görəsən doğrudurmu?

Kimsə o başda yanıqlı-yanıqlı pıçıldadı:

– Ə, görəsən, biz niyə bir-birimizin evinə gedib-gəlmirik?

Və başqa birisi həmin sözləri elə bil havadaca tutub ucadan təkrar elədi:

– Niyə biz bir-birimizin evinə gedib-gəlmirik, Dəyyan dayı?

Dəyyan kişi bir iri boşqabın içindəki halvanı qabağına qoyub, təkbaşına, tələsmədən yeyirdi.

– Ona görə ki, hamınız xəsissiz, – dedi. Və "Spok" söhbətini yarımçıq qoyub, bu cari mətləbə keçdiyi yerdə həmin adam ona ayrı sual verdi:

– Bəs sən niyə Buzbulağa getmirsən, Dəyyan dayı?

– Mən o xarabaxanaya niyə getməliyəm ki?

– Necə niyə? Vətəndi axı.

– Mənim vətənim-zadım yoxdu.

Kimsə aşağı başda bic-bic pıçıldadı:

– Burasını düz dedi.

– Mən o yerə vətən deyərəm ki, mənim orda... – Boğazında halva qaldığına görəmi, ya nədənsə Dəyyan öskürməyə başladı.

Və o "bic" səsin yiyəsi:

– ... badamlığım ola! – deyib, Dəyyan kişinin yarımçıq cümləsini öz bildiyi kimi tamamladı. – Bu saat Buzbulaqda torpaq başına qalıb. Əkib-becərən axtarırlar!

Amma bayaqkı sualı verən də, deyən, tərs adam idi.

– Get barı, bacılarını, qardaşlarını gör.

– Mənim orda qardaşım-zadım yoxdu.

– Bəs Müslüm? Müslüm sənin qardaşın deyil?

– Xeyr, qardaşım deyil. Əgər o mənim qardaşım olsaydı, gedib şipiyon Qaraxanın qızını almazdı. O vaxt mənim dədəmi şeytanlayıb, beş ay türmədə yatırdan həmin o Qaraxan idi.

– Yox, bu olmadı, sən elə hər sözə bir bəhanə tapırsan.

– Söz demək üçün də gərək adamın ağlı ola. – Bu yerdə Dəyyan kişi, mənalı-mənalı, Neymət Namazovun üzünə baxdı. – Savadı ola, havayı danışmağın nə mənası var?.. İndi mən bu məclisdə əyləşən savadlı yoldaşlara bir sual verəcəyəm. Xahiş eləyirəm, diqqətlə qulaq asasız: dünənki "İzvestiya" qəzetində...

Və qəribədir, olduqca qəribədir, həştada yaxın yaşı olan bir adam ağsaqqala oxşamırdı, qətiyyən oxşamırdı. Hər halda Buzbulağın tarixində bu vücudda, bu baş-qulaqda ağsaqqal heç vaxt olmamışdı. Dəyyan kişi bir az hamam müdirinə oxşayırdı, bir az pensionerə oxşayırdı və bir azca da, deyəsən... Lənət şeytana, burasını heç deməsən yaxşıdır.

Və ağacların bəlkə xoşbəxtliyi də burasındadır ki, onlar torpaqdan üzüləndə ölürlər.

Sonra adamlar üç-üç, beş-beş cəmləşdilər, qruplaşdılar. Hərə öz müsahibini tapdı, hərə öz söhbətini başladı. (Yas yerlərində həmişə belə olur).

Nəriman ayağa durub, başını tərpədə-tərpədə, hamı ilə xudahafizləşib çıxdı. O, gedəndən sonra Rəfi bir müddət əsəbi halda yerində qurcalandı, amma durmadı, dura bilmədi, çünki Dəyyan kişi bayaqdan bəri Rəfinin qulağının dibində nəsə üyüdüb-tökürdü və Rəfinin biləyi də deyəsən, Dəyyan kişinin əlində idi.

O başda bir xeyli adam Neymət Namazın söhbətinə diqqətlə qulaq asırdı, çünki Neymət Namazın həm yaxşı danışıq qabiliyyəti vardı, həm də dünyada çox şeylər vardı ki, onları yalnız Neymət Namaz bilirdi. Məsələn, Neymət Namaz gözəl bilirdi ki, "vətən" dediyin nə Bakıdır, nə Buzbulaqdır, nə də Dəyyan kişinin Buzbulaqdakı badam bağıdır. Vətən – bir ülvi amaldır, bir yüksək məqsəddir. Özü də, hər nədirsə, onun, bu məclisdə, hamıdan çox Neymətullaya aidiyyatı var. Daha doğrusu, Neymət Namaza. Neymətulla Namazov olmağa nə var ki, kişisən Neymət Namaz ol! Və Neymət Namazın hər sözünün təsiri oturanların üz-gözündən uzun müddət asılıb qalırdı və bu təsir (bir çoxlarının sifətində) durub Neymətullanı qucaqlayıb öpmək dərəcəsində güclü idi (yas yerlərində hərdən belə də olur).



Rəcəb isə, yəqin ki, bu saat ya metroda, ya trolleybusda, ya da avtobusda yol gedirdi. Və mənə, nədənsə, elə gəlirdi ki, Sumqayıta gedən Rəcəb bu saat xəyalında həm də Buzbulağa gedir. Ya gedir ki, Cümşüdlə barışsın. Ya gedir ki, Cümşüdü dəyirman arxında bir də döysün. Ya da elə-belə, bir vaxt ilxı otardığı yerləri görməyə, gəzməyə gedir (bu mənada, tək bir nəfər kəndlinin bu metrolarda, trolleybuslarda, avtobuslarda getdiyi yolun uzunluğu bəlkə ən uzaq ulduzların özündən də bir az o yana olar!). Bəlkə, o metroda, avtobusda, ya trolleybusda, indi Rəcəb Buzbulağa çoxdan çatmışdı, Cümşüdlə haqq-hesabı çoxdan çürütmüşdü və indi Fizzə müəllimənin qapısında Rəcəb yenə hönkür-hönkür ağlayırdı. İndi Rəcəb ona görə ağlayırdı ki, Sumqayıt Buzbulaq deyildi. Ona görə ağlayırdı ki, indiki arvadı (lap mələk olsa belə) hər halda Ruzgar deyildi. Və Rəcəb (nə bilmək olar?) bəlkə bir də ona görə ağlayırdı ki, həmin o Fizzə müəllimə bir vaxt mələk kimi gözəl idi və Fizzə müəllimənin mələk kimi gözəl olduğu o vaxt daha geri qayıtmayacaqdı.

**BƏS O QƏNBƏR NECƏ?**

İndicə yas yerində deyirdilər ki, Qənbəri yenə tutublar. Qənbəri içib avaralanmağının üstündə tez-tez tutub buraxırdılar. Amma kim deyə bilər ki, lap o Qənbərin özü də bu saat o türmədə Buzbulaq yolu getmirdi? Və elə o türmənin özünə də yenə Qənbər bəlkə ona görə düşmüşdü ki, bir vaxt bu dünyada Fizzə müəllimə vardı və o Fizzə müəllimə mələk kimi gözəl idi... O içkinin xəstə aləmində bəlkə qənbər Buzbulağın başgicəldən sarı günəşini görürdü. Və bəlkə Qənbərin sevgisi, gücü, həvəsi bir insan dərisinə sığışmırdı və canına bilə-bilə qəsd eləməklə Qənbər o sevginin, o gücün, həvəsin bir insan dərisinə sığacaq qədərini saxlamaq istəyirdi... Hər halda, Buzbulaq uşaqlarının içində, bir vaxt, Qənbərdən zirəyi, Qənbərdən qüvvətlisi yox idi. Ağacların ən uca budağına Qənbər çıxardı. Buzbulaq çayının ən qorxulu yerlərində Qənbər üzərdi. Və qaranlıqda qəbiristanlıqdan keçməyə təkcə Qənbərin cəsarəti çatardı – bu isə xırda cəsarət deyildi.

Buzbulaq məktəbinin balaca atamanı. Konsertlərdə, kinolarda kluba pəncərədən girənlərin ən birincisi. Novruzda ən yaxşı yumurta döyüşdürən və kolxoz bostanından yemişlərin ən yaxşısını bir göz qırpımında çıxardan Qənbər... O məndən iki sinif yuxarıda oxuyurdu.

Və onlar Bakıya köçməzdən bir az əvvəl biz hələ təzə-təzə Qənbərlə dostluq eləməyə başlamışdıq.

Bir gün Qənbər dərsə gəlmədi və o gün elə birinci tənəffüsdə qızlardan biri məni xəlvətə çəkib sirli-sirli dedi ki, Qənbər dərsdən sonra səni filan yerdə gözləyəcək. O qız mənə ayrı heç nə demədi və mən özüm də ayrı heç nə fikirləşmədim, çünki Qənbərin çağırdığı yerə getmək hər kəs üçün fəxr idi, getməmək isə sadəcə mümkün deyildi. Və o gün bir uzaq kolxoz bağında, bir kolluqda, xəlvətlikdə mən Qənbərdən eşitdim ki, o daha heç vaxt məktəbə gəlməyəcək. Qənbər gizlincə dedi ki, əmisi türmədən çıxıb. (Qənbərin əmisi kolxozda hesabdar işləyəndə tutulmuşdu. Çoxdan türmədə idi. Atası isə davadan gəlməmişdi). Dedi ki, əmim Bakıda ev alıb, gəlib bizi də aparacaq. Amma heç kəsə deməyəsən.

Bunu deyəndən sonra Qənbər xeyli vaxt mənim üzümə baxdı. Və birdən:

– Bəs niyə ağlamırsan?– dedi.

– Niyə ağlayım ki? – Mənə elə gəlirdi ki, belə şeyə ancaq sevinmək olar.

– Dost deyilsən?

– Dostam, – dedim və baxıb gördüm ki, Qənbərin gözləri dolub. Xeyli vaxt gözlərimi ovuşdurdum, ancaq gözlərim yaşarmadı.

Qənbər buna görə məndən incimədi.

– Elə eləmə, – dedi. – Gözünə kirpik düşər. Eybi yoxdu, mən gedən gün ağlayarsan. – Və necə dedisə, mən birdən-birə kövrəldim.

Hiss elədim ki, doğrudan ağlamağım gəlir. Bunu Qənbər də gördü və bunu görəndə Qənbər yaman sevindi.

– Doğrudan dostmuşsan, – dedi. – İndi gördüm ki, dostmuşsan...

Sonrası lap qəribə oldu: məktəbdə mənə Qənbərin sifarişini yetirən o qız da gəlib həmin bağa çıxdı. Özü də elə bil qeybdən peyda oldu – bir də baxıb gördüm ki, o, bizim lap yanımızda dayanıb.

Və o qıza gözucu baxandan sonra Qənbər üzünü mənə tutub, bir gülümsəmək gülümsədi ki, o vaxtdan bəri hər yadıma düşəndə mən Qənbəri elə o sir-sifətdə görürəm.

– Bilirsən də?..

– Bilirəm, – dedim.

Qənbər yerdən torpaq götürdü, bir çimdik qızın başına səpdi, bir çimdik mənim başıma səpdi.



– Gözlərinizi yumun, – dedi. – Açın. Bu gündən bacı-qardaşsız. – (Və nə qədər qəribə olsa da, Qənbərin yəqin ki, elə o bağdaca birdən-birə ağlına yerləşmiş o "sehrdən" sonra bir müddət mənə elə gəldi ki, biz o qızla doğrudan da bacı-qardaşıq). – İndi sənə bir sual versəm, inciməzsən ki?

– İncimərəm, – dedim və nədənsə, məhz bu məqamda, həm də, bəlkə birinci dəfə hiss elədim ki, mən bu Qənbərdən haradasa bir azca qorxuram. Üstəlik, orasını da gördüm ki, o qız Qənbərdən yaman qorxur.

– Bacının namusunu kim çəkməlidir?

Belə yerdə çaşmaq pis olardı, ayıb olardı, amma mən çaşmadım və nə yaxşı ki, çaşmadım:

– Qardaş çəkməlidir! – dedim və sevindim.

(Və elə sevindim ki, o sevinc hələ də yadımdan çıxmayıb)

– Malades! – Qənbərə də elə bu cavab lazım idi. – Bunu sənə tapşırıram. Kinoya-zada qoyma. Bədən tərbiyəsində "Zinyətin tursiqi"ni geysə, mənə yazarsan... – Qənbərin dediyi – Zinyət Şəkərək qızının, o il dərs başlanandan bəri, bədən tərbiyəsit dərslərində Buzbulaq məktəbinin qızlarına geydirmək istədiyi idman paltarı idi. Bundan ötrü Zinyət Şəkərək qızı hətta bir neçə dəfə məktəbdə valideyn iclası da çağırmışdı, amma kənar adamlar bir yana, heç bizim müəllimlərin özü də o paltarı qızlarına geydirmək istəmirdilər. Buzbulaqda, hələlik, vur-tut bircə qız, əmisi bircə dəfə o paltarda idman dərsinə gəlib, özünü "rüsvayi-cahan" eləyəndən sonra o paltarın adı "Zinyətin tursiqi" qalmışdı. Və bu yerdə Qənbər elə bil doğrudan da hirsləndi: "O paltarı geysən, gəlib başını kəsərəm!" – dedi. Sonra mənə baxıb qıza əmr elədi: – Sən yeri get!

Qız getdi. Və Qənbərin kolxoz bostanından o gün çıxartdığı iki iri qovunun birini biz elə o bağcada ləzzətlə yedik. O biri qovunu Qənbər bir kolun içində otun-alafın altında yaxşı-yaxşı gizlətdi və Qənbərin – mənim həmişəlik yadımda qalan o qəribə gülümsəməyini bu yerdə mən bir də gördüm:

– Bilirsən də?..

– Bilirəm, – dedim. Və Qənbərin qız üçün gizlətdiyi o qovunu mən o gecə səhərəcən yuxumda gördüm.

Onlar, doğrudan da, kənddən gizli köçdülər. Gecə köçdülər. Bir səhər Buzbulaqdan iki ailə birdən yoxa çıxdı: biri Qənbərgilin ailəsi, biri Qənbərin əmisinin öz ailəsi. Amma Qənbərin əmisi o türmədən,

sən demə, bir il əvvəl çıxıbmış. Haradasa işə düzəlib, Bakının ətraf kəndlərinin birində hətta bir yaxşı ev də tikdiribmiş. Onun bütün bu işləri belə gizli görməyininsə Buzbulaqda, əlbəttə, öz nağılı, öz əfsanəsi vardı...

O brezent çadırın altından şəhərə çıxanda mənə, hər şeydən əvvəl, orası qəribə gəldi ki, hələ heç axşam da əməlli-başlı düşməmişdi, hələ küçələrdə işıqlar yanmırdı: təxminən iki saat qabaq, mən o ehsan yerinə gedəndə hava necə idisə, indi də eynən elə idi: bulanıq, rəngsiz, işıqsız dekabr havası. Burası daha qəribə idi ki, elə bil bu iki saatın içində vaxt da qətiyyən hərəkət eləməmişdi, yaxud bu bulanıd, bu rəngsiz havada vaxtın hərəkətini görmək qədərində işıq yox idi. Və mənə elə gəlirdi ki, on il, ya iyirmi il bundan sonra da eynən belə bir dekabr günü olacaq, bu küçədə adamlar onda da eynən beləcə yeriyəcək, binalar eynən beləcə dayanacaq və o binaların üstündəki yazılar da eynən indiki məzmunda qalacaqdır... Deməli, vaxtın hərəkəti – bu vaxt ərzində – nəyinsə məzmunca dəyişməyi deməkdi. Və bu hərəkəti görmək üçün sən özün o məzmunun tərkib hissəsi olmalıydın. Məsələn, haçansa Yunanıstandan, yaxud Krımdan gətirdiyi badam şitillərini Buzbulaq torpağına basdıran Dəyyan kişi bir yaz, o ağaclar çiçək açanda, vaxtın hərəkətini görmüşdü. Və elə o Rəfinin özü də bəlkə məhz vaxtın hərəkətini görmək üçün bir vaxt Bakının professorları ilə kəllə-kəlləyə gəlmişdi... Bəlkə Qənbər o içkinin köməyi ilə vaxtı bir az geri çəkmək istəyirdi? Bəlkə Rəcəb Cümşüdü döyməklə vaxtı bir az irəli çəkmək istəmişdi?.. Və bəlko Sadıq kişinin özü də, keçən yay, Buzbulağa məhz vaxtın hərəkətini görməkdən ötrü gəlmişdi –

**ÖZÜ DƏ ƏLLİ SƏKKİZ İLDƏN SONRA!**

Mən ora gedəndə Sadıq kişi cəmisi üç-dörd ay idi ki, Buzbulaqdaydı və bu üç-dörd ayda buzbulaqlılar Sadıq kişi ilə o qədər qaynayıb-qarışmışdı ki, əgər onun geyimindən, bir də danışmağından az-maz şəhərlilik bilinməsəydi, Sadıq kişinin əlli səkkiz il Buzbulaqda olmamağı bəlkə adamın heç ağlına da gəlməzdi. Buzbulaqda Sadıq kişi yaşda

laqlılar Sadıq kişini bir azca da hökumət adamı hesab eləyirdilər. Amma Sadıq kişi heç hökumət adamı olmasaydı da, ona gündə iki dəfə çeşmədən bir vedrə su gətirən, əlbəttə, tapılardı. Ustəlik, Sədi kişi də sağ idi. Və bu həmən Sədi kişi idi ki, bir vaxt Sadığın köməyi ilə Bakıda doktor Nərimanovun qəbuluna düşüb, həm şəkər azarından qurtulmuşdu, həm də, özü demişkən, bir "bəyzadə" kişi görmüşdü ki, Allah onu elə binadanca başda oturmaq üçün yaratmışdı. "Rəhbər olan kəs gərək hər kəsin azarını bilə ki, sonra hamının azarından baş çıxara". Sədi kişinin o görüşdən sonrakı əsas qənaəti bu idi. Şəkər azarının dərmanı isə, sən demə, Buzbulaq dağlarının o bol baldırğanı imiş. Sədi kişi çadır qurub, bir ilin düz üç ayı, gündə beş-altı dəfə o baldırğanın suyunu təzə-təzə içib, şəkərlə haqq-hesabı həmişəlik çürütmüşdü və burdan özü üçün belə bir nəticə də hasil eləmişdi ki: "Rəhbər olan kəs hər dərdin dərmanının harda olduğunu da mütləq bilməlidir".

O zaman Sadığı görəndə Nərimanovun necə sevinməyini, onun Sadıqla necə "qol-boyun" olmağını və necə zarafatlaşmağını Sədi kişi Buzbulaqda, şübhəsiz ki, elə o vaxt, Bakıdan qayıdanda danışmışdı. Və o vaxtdan bəri buzbulaqlılar hər dəfə Nərimanovun adını eşidəndə yəqin Sadıq kişini də xatırlamışdılar.

Öz dediyinə görə, Sədi kişi həmişə bilmişdi ki, Sadıq sağ-salamatdır. Əvvəllər ondan bilmişdi ki, Sadığı yuxuda görəndə, həmişə ya ağac altında görmüşdü, ya su qırağında görmüşdü – su da, ağac da ömür uzadan şeylər idi. Sonralar Sədi kişi ondan-bundan soraqlaşıb xəbər tutmuşdu ki, Sadıq sağ-salamatdır.

O şəkər azarının əhvalatı isə təxminən əlli beş ilin əhvalatı idi. Bu əlli beş ildə onlar heç vaxt görüşməmişdilər. Və o əlli beş il də elə bil heç olmamışdı.

Sadıqla söhbət eləyəndə Sədi kişi həmişə uşaq kimi sevinirdi. Onun qızları, nəvələri Sadıq kişinin evini süpürürdülər, paltarını yuyurdular. Öz xörəyini Sadıq kişinin özü bişirirdi: "Gərək mən də bir iş görəm, ya yox?" Amma Buzbulaqda hamı bilirdi ki, Sadıq kişi yeməyini ayrı adama etibar eləmək istəmir. "Kişi canının qədrini bilir" – deyirdilər. Və əgər Sadıq kişinin hökumətdən aldığı o pul yüz həştad yox, barı həştad manat olsaydı, bəlkə onun tək yaşamağına da Sədi kişi ömründə yol verməzdi. Amma belə şeylərdə Buzbulaq adamı arif olur:

Sədi kişi ilə Sadıq kişi Buzbulaq məscidinin qabağında yanaşı oturanda onların yan-yörəsi həmişə adamla dolu olurdu. Oradakı söhbət də elə çox vaxt həmin o Nərimanov söhbəti idi, çünki Buzbulaq kimi bir yerdə o cür sakitlikdə, asudəlikdə bundan maraqlı bir söhbət bəlkə heç ola da bilməzdi və üstəlik, işin bu tərəfi də vardı ki, qocaların ikisi bir yerdə olanda söhbət əsnasında həmişə cürbəcür təzə əhvalatlar da tapılıb çıxırdı. Məsələn, o vaxt "o boyda Bakıda" Sadığı necə axtarıb tapmağından danışanda Sədi kişinin yadına hər dəfə qəribə-qəribə macəralar düşürdü. Sadıq kişi isə, sən demə, bir vaxt Həştərxan yolu ilə (gəmidə) haradansa komissarlara hələ silah da gətirmişdi... Bir sözlə, söhbət uzanıb gedirdi. Və Nərimanovdan başlayan o söhbət, nədənsə, hər dəfə hərlənib-fırlanıb, əvvəl-axır gəlib kolxoz sədri Cümşüdün üstünə çıxırdı, çünki bu məsələdə Sadıq kişinin zəif damarını buzbulaqlılar çoxdan tutmuşdular. (Ağlına nə yerləşmişdisə, Buzbulağa ayaq qoyduğu lap ilk gündəcə Sadıq kişi elə o meydandaca, hamının yanında birinci bunu elan eləmişdi: Qaraxanın oğlundan kolxoz sədri olmaz!)

İndi Buzbulaqda Qaraxanın keçmişindən, əlbəttə, az adamın xəbəri vardı. Qaraxandan narazılığının səbəbini Sadıq kişi heç vaxt izah eləmirdi. Sədi kişi isə Qaraxandan, Cümşüddən söhbət düşəndə əvvəl uzun müddət için-için gülürdü, sonra Qaraxanın barəsindəki bir əhvalatı həmişə eyni sözlə başlayıb, eyni sözlə də qurtarırdı və yenə öz səssiz gülüşü ilə gözləri yaşaranacan gülürdü.

– Hə, bir gün atıla-atıla gəldi ki, bəs gəl, ikimiz bir yerdə kolxoza girək. Ə, mənə dədəmdən, deyirəm, heç olmasa, bir at qalıb, iki öküz qalıb. İşdi-şayəd, mən o kolxozda işləyəmməsəm, atnan öküzlər işlər mənim əvəzimə. Bəs sənin dədəndən, deyirəm, nə qalıb? Vur-tut bir eşşək qalıb ki, onun da adı Qaraxandı. Səndən, ay dəyyus, dedim, kolxoz quran olar? Sən işləyənsən? – dedim. – Əgər işləyən idin, bəs indiyəcən niyə işləmirdin? Dədəndən qalan torpağı niyə Kəblə Kazıma satıb, qumara qoyurdun, qurumsaq? Tüpürdüm üzünə, çıxdı getdi. Sonra neçə il kolxoza qaravulçuluq eləyib, orda-burda kölgələnib, donuz kimi piy bağladı. Oğrunun yekəsi də elə özü idi.

Sədi kişi Cümşüdün özü barədə heç nə demirdi. Bəlkə ehtiyat eləyirdi. Bəlkə bu haqda Sadığın söz deməyini daha münasib sayırdı. Və bəlkə, bir vaxt özü də kolxoz sədri olduğuna görə, indiki sədrin dalınca danışmağı Sədi kişi, sadəcə, şəninə sığışdırmırdı. Sadıq kişi



Cümşüddən narazılıq eləyəndə, yaxud bir ayrı şeyə görə gileylənəndə də Sədi kişi, nədənsə, həmişə gülürdü. Sədi kişi yaxşı bilirdi ki, Sadığın bir dövranı olubsa, o da bəlkə inqilabın vurhavur vaxtlarında olub. Sadıq kişidə o savad hardandı ki, bu zəmanədə böyük mənsəb sahibi olaydı. Sadıq kişi xırda-mırda işlərdə baş girləyib, özünü, ailəsini, bir də bəlkə təmiz adını saxlamışdı və o yüz həştad manatı da Sadıq kişiyə yəqin ki, elə o inqilab vaxtı zirək olduğuna görə verirdilər. Bunları bilmək çətin deyildi. Amma neynəyəsən ki, iş gəlib o Cümşüdə dirənəndə də özünü başçı görmək, bünövrə qoyanlardan hesab eləmək Sadıq kişiyə ləzzət verirdi. Və məhz bunu bildiyinə görə də, Sədi kişi hər söz başı ona, "Öz əməlindi" – deyirdi.

– Qanmazdı, qulturası yoxdu. Danışanda ağzının tüpürcəyi adamın gözünə girir.

– Öz əməlindi.

– Kəndə baxmır. Bilbotekanı remont elətdirmir. Camaatnan kobud rəftar eləyir.

– Öz əməlindi.

Sadıq kişini, əlbəttə, qəsdən qızışdıranlar da olurdu. Bəziləri onun sadəlövhlüyündən istifadə eləyirdilər, çünki Sadıq kişi doğrudan da hədsiz dərəcədə sadəlövh idi. O gah öz yanından kitabxananın təmirinə girişirdi, gah kənddə hamam "tikirdi", məktəb üçün təzə bina yeri fikirləşirdi və bunların heç birindən bir şey çıxmayanda bir də görürdün ki, Sadıq kişi bir dəstə uşağı başına yığıb, şıdırğı "rus dili" öyrədir. Sadıq kişinin əlli səkkiz il Bakıda yaşadığını həmişəlik yaddan çıxarmaq üçün onun "dərslərinə" bircə dəfə qulaq asmaq kifayət idi.

Sadıq kişi kitabxanaya, bir qayda olaraq, "bilboteka" deyirdi, arıya "piçol" deyirdi. Budaqda qəşəng meyvə görəndə, yaxud çayda rəngbərəng daş görəndə, dayanıb heyran-heyran baxırdı, "Nasdayaşi isqusdo" deyirdi – indi gəl baş çıxart ki, "isqusdo" – "iskusstvo" deməkdi.

Sadıq kişinin hirsli vaxtları olurdu:

– Mən o revalyusyanı Qaraxanın oğlu üçün eləməmişəm.

Yaxud:

– Heyvərəydiz, yenə heyvərəsiz, – deyirdi. – Bir ağzınızdı, bir qarnınız. Nə gözünüz bir şey görür, nə qulağınız bir şey eşidir.

Və yəqin ki, Sadıq kişinin, Buzbulaqda, darıxan vaxtları da olurdu:

– Mən kefimi Bakıda çəkmişəm. Bura ölməyə gəlmişəm.

Ancaq Sədi kişi yarıciddi-yarızarafat deyirdi ki:

– Düz danış, sən o Bakıda heç bir kef-zad çəkməmisən. Özün də, bura ölməyə-zada gəlməmisən. Görmüsən ki, ölüm yaxındadı, qaçmısan ki, bəlkə ondan uzaq olasan...

Bir sözlə, Sadıq kişi də belə Sadıq kişi idi. Mən onu yayda Buzbulaqda qoyub gəldim. Payızda eşitdim ki, Sadıq kişi Bakıdadır. Və bir də o öləndən qırx gün sonra bildim ki, Sadıq kişi yoxdur.

– Hə, qardaş, belə-belə işlər.

Deyəsən axır ki, evə çatıram. Bir azdan Rəcəb də, yəqin ki, Sumqayıta çatacaq. Mücrü arvad deyəcək ki:

– Məclis necə keçdi, oğul? Buzbulaqdan çoxmu adam vardı?

Rəcəb deyəcək ki:

– Lap yaxşı keçdi. Buzbulaqdan da adam çox idi. Elə çoxusu buzbulaqlı idi.

Və Mücrü arvad başlayacaq ki: – Filankəs də oradaydımı? Bəs filankəs necə?.. O qədər sorğu-sual eləyəcək ki, Rəcəb hirslənəcək.

– Əl çək! – deyəcək. – Cəhənnəm olsun Buzbulaq da, buzbulaqlılar da. Qoy yatım, səhər işə gedəcəyəm.

Onda Mücrü arvad yazıq-yazıq deyəcək ki:

– Boy-buxununa qurban olum, oğul. Məni məbadə buralarda basdırasan...

Mücrü arvad ağlamsınacaq və daha Rəcəb heç nə deməyəcək. Rəcəb yıxılıb yatacaq və yuxusunda görəcək ki...

Nə isə. Bu söhbət qurtaran söhbət deyil. Yaxşı olar ki, öz yuxumu danışım. Mən o gecə yuxuda çox qəribə bir vaqiyə gördüm. Vaqiyə, nə vaqiyə –

## YAS YERİNDƏN REPORTAJ

Gördüm ki, yenə yas yerindəyəm, adamlar da, əksərən, elə həmin adamlardır, ancaq çadır o boz çadır deyildi, ağappaq çadır idi, özünün də eni-uzunu görsənmirdi. Sonra gördüm ki, dörd tərəf badam ağacıdır və bu badamlıq Dəyyanın Buzbulaqdakı badamlığına oxşayır da, oxşamır da. Bir də orasını ayırd eləyə bilmədim ki, badam ağacları çadırın çölündədir, yoxsa içindədir, çünki badamın çiçək açan vaxtı idi; çiçək ağ, çadır ağ – ağlıqdan adamın gözü qamaşırdı, (yuxu olanda nə olar!). Samovar,



dəm-dəsgah – bir aləm idi ki, gəl görəsən. Özü də, haradansa tanış bir səs gəlirdi: musiqi idi, samovar dızıltısı idi, badamın çiçəyinə daraşmış arı səsi – ya nə idi, Allah bilir, amma son dərəcə tanış səs idi. Və axırda belə məlum oldu ki, o səs badam çiçəklərinin öz səsidir. (Kərəminə min şükür, Pərvərdigarə, gör haçandan çiçək səsi eşitməmişdik!).

Sonra fikrimdən keçdi ki, bəlkə bura yas yeri deyil, toy yeridir. İstədim biləm ki, mən özüm hardayam: o çadırın içindəyəm, yoxsa çölündəyəm. Və elə bunuca bilmək istədiyim yerdə, bir də baxıb gördüm ki, Neymətulla əlində mikrafon ortalıqda dayanıb. (Mikrafonun uzun bir şnuru vardı: bir ucu burda, o biri ucu, atalar demişkən, Ərdəbildə). Neymət Namaz deyirdi:

– Yas yerindən reportajımıza başlayırıq. İlk söz hörmətli Dəyyan müəllimindir. Buyurun, Dəyyan müəllim!

Neymətulla bunu deyib əlindəki mikrafonu Dəyyan kişinin ağzına yaxınlaşdırdı və Dəyyan kişi boğazını arıtlayıb, təxminən belə bir cəfəngiyat başladı (bu cür cəfəngiyatı, əlbəttə, ancaq yuxuda eşitmək olardı):

– Yoldaşlar, bildiyiniz kimi, mən həmişə yatmağın əleyhinə olmuşam. Ona görə də əgər səhər saat altıda yuxudan durub, bir stəkan çay içməyəndə, saat on birin yarısınacan çörək boğazımdan keçmir. Burda böyük palitka var, yoldaşlar. Benjemin Spok demişkən, evinizi remont eləyin ki, havası təmiz olsun. Və mütləq papirosu tərgidin. Onu da deyim ki, mən bu gün fədakar tütünçülərimizin bayramına əliboş gəlməmişəm. Sizə bir şeir... bağışlayın, onu demək istəyirəm ki, sizin hamınızı evimə dəvət eləyirəm. Ayrı şeyimiz olmasa da, pitidən, bozbaşdan həmişə tapırıq. Qaldı ki, zamarojenni ət...

Bu sözlərlə də Dəyyan kişi, deyəsən, işləri xarablayacaqdı. Neymətulla onun qanının arasına lap vaxtında girdi. Mikrafonu bir göz qırpımında Dəyyan kişinin əlindən alıb:

– Reportajımızı davam etdiririk, – dedi. Şnuru dalınca çəkə-çəkə Rəfiyə tərəf yeridi. Və bu yerdə əməlli-başlı pərtlik olacaqdı, çünki Rəfi başını Qəmər arvadın dizinin üstünə qoyub şirin-şirin nəsə deyirdi, amma layla deyirdi, ya nağıl deyirdi, – burasını ayırd eləmək çətin idi. Neymətulla yaxınlaşanda Qəmər arvad yavaşca:

– Tss, – dedi. – Mənim balamnan işin olmasın. Mənim balam yaman yorulub. Mənim balam yatır.

Və yenə Dəyyan kişinin səsi gəldi:

– Mən həmişə yatmağın əleyhinə olmuşam!

Neymət Namaz camaatın arasında kimisə axtarırdı.

– Sakit, yoldaşlar. Reportajımızı davam etdiririk. Növbəti söz...

– Saxla! Saxla! – Bu sözləri Dəyyan kişi, yəqin ki, Neymət Namaza deyirdi. – Qoy görək, o kimdir ki, mənim ağacımın dibində... onun nə ixtiyarı var ki... – Və qışqıra-qışqıra Dəyyan kişi əli ilə nəsə göstərirdi.

Mən Dəyyan kişinin göstərdiyi səmtə baxdım. Gördüm ki, Sadıq kişi orda bir qəşəng badam ağacının dibində dayanıb çiçəyə tamaşa eləyir. (Sadıq kişinin arxa tərəfində, kolun dalında da, deyəsən, bir adam gizlənmişdi. Ancaq Sadıq kişi o adamı görmürdü).

– Nasdayaşi isqusdo!

– Çto?.. – Dəyyan özünü yetirib, tərs-tərs Sadıq kişinin üzünə baxdı. – Yoxsa elə bilirsən ki, biz ayrı dil-zad bilmirik?

– Bağışlayın, mən sizi...

Dəyyan kişi:

– Hə də, tanımazsan, – dedi. – Çünki böyümüsən. Amma onu bil ki, məni tanımamaq sənin üçün çox baha oturacaq!

(Arxadakı kol yenə tərpənirdi).

– Sakit, yoldaşlar! – Bu isə, əlbəttə, Neymətulla idi. Şnurunu dalınca sürüyə-sürüyə o, indi də, deyəsən, Sadıq kişinin üstünə gedirdi. Və Neymətulla gedib ora çatmamış, həmin o kolun dalından bir saqqallı adam da peyda oldu.

Dəyyan kişi:

– Ə, Kəblə Kazım, sənsən? – dedi. Özü də, nədənsə, yaman cır səslə dedi. Elə bil yazığın boğazında ehsan halvası qalmışdı. – Xeyir ola, çoxdandı ki, yasda-zadda görsənmirsən?

Kəblə Kazım, deyəsən, möhkəm yorğun idi. Keçib badam ağacının dibində bardaş qurub əyləşdi.

– Kərbəladan gəlirəm, – dedi. – Yunanıstandan keçəndə yolda bir qədər ləngiməli oldum. Ona görə də bir az yorulmuşam.

(Sadıq kişi hələ də, altdan yuxarı ağaca baxırdı).

Dəyyan kişi sevincək:

– Bah! – dedi. – Səndə xəbər var ki! – Gedib Kəblə Kazımın yanında oturdu. – Kiprdə vəziyyət nə yerdədir?

Kəblə Kazım yazıq-yazıq:

– Kərbəlada şəhid olmuş o imam Hüseynə and verirəm, a Dəyyan! – dedi. – Mənə bir də belə sual vermə. Axı sən özün yaxşı bilirsən ki,



mənim siyasətnən heç vaxt işim olmayıb. – Özü də, elə bil, qəsdən ucadan dedi ki, bu sözləri Sadıq kişi də eşitsin. Amma Sadıq kişinin, deyəsən, o badamın çiçəyindən savayı, gözünə heç nə görünmürdü.

– Yalan demə! – Dəyyan kişi qəzəblə Kəblə Kazımın üstünə bağırdı. – Sən köhnənin siyasətçisisən. Əgər düz adamsan, de görüm, sən o Yunanıstana niyə getmişdin? Badam şitili gətirib, mənim bağımı hörmətdən salmaq üçün! Sonra da o badamı Məşədi Murtuza satıb, mənim ağacımın meyvəsini ağacda çürütmək üçün. Saqqalından utanmayıb, hələ mənə kələk gəlirsən. Bu, siyasət deyil, bəs nədir?

Kəblə Kazım:

– Mən o Məşədi Murtuzu gör haçandan görmürəm, – dedi. Və birdən hönkür-hönkür ağlamağa başladı. – Mənim otuz pud baramamın pulunu elə o Məşədi Murtuz batırmadımı?

– Məşədi Murtuz Qubada sağ-salamatdır!

Və bu vaxt Sadıq kişi elə bil o badam çiçəyinin yuxusundan ayıldı.

– Kim? – dedi. – Məşədi Murtuz? Ola bilməz! – Və elə Kəblə Kazımı da, Sadıq kişi, deyəsən, bu vaxt gördü. – O! Kəblə Kazım, maya paçtenni! Sən hara, bura hara?

Kəblə Kazım yorğun-yorğun:

– Kərbəladan gəlirəm, – dedi və nədənsə, yenə ağlamağa başladı.

– Qələt eləmə, Yunanıstandan gəlirsən! O şitilləri də, bilirəm, harda gizlətmisən? – Və Dəyyan kişi bunu deyib, birbaş bayaq sirli-sirli tərpənən kola sarı cumdu. Amma (yuxunun qəribəliyinə bax!) daha orada kol-zad yox idi. O kolun yerində bir ağappaq tül pərdə yellənirdi. Neymətulla əlində mikrofon o pərdənin qabağında dayanmışdı.

– Fədakar üzümçülərimizin adından, indi də söz...

Kimsə, haradasa, qadın səsi ilə:

– İndi də söz, musiqinindir, – dedi və bu dəfə mən haradasa səhnəyə oxşayan bir yer gördüm, bir qəribə arx gördüm, o arxın qırağında bir cavan gəlin gördüm. Yenə həmin şnur, həmin mikrafon. Və o gəlin, əlində mikrafon, o arxın başına dolana-dolana, bir dəhşətli mahnı oxuyurdu və mən o mahnının yalnız bircə misrasını eşidə bilirdim. Haradasa su şırıldayırdı. Elə bil ya mikrafon xarab idi, ya da o mahnının eşidilməyinə camaatın şıdırğı əl çalmağı mane olurdu...

*1977*

## KÜR QIRAĞININ MEŞƏLƏRİ

### 1

Kəndin ətəyindəki yol ayrıcından evlərinin qapısınacan Qədiri köhnə tay-tuşlarından biri müşayiət elədi, bir də yolda bir-iki uşaq tapıldı – qapı-qapı, tin-tin arta-arta onlar yekə bir dəstə oldular, gəlib Qədirgilin qapısının ağzına yığışdılar.

Açıq küçə qapısını Qədir ehmalca itələyib həyətə girdi. Dəhlizin qapısı da açıq idi, deməк, Səltənət evdə idi. Dəhliz qapısının qabağındakı üç pillənin üçünü də Qədir birdən qalxdı. Səltənət qapını açdı və onlar üz-üzə gəldilər.

Beş-altı ilin ayrılığından sonra bu, onların birinci görüşü idi. Ancaq nə əl verdilər, nə bir-birlərinin halını soruşdular. Dikə-dik üz-üzə dayandılar: Səltənət astananın qabağında, Qədir pilləkənin başında; biri divar kimi, çəpər kimi, o biri qurumuş ağac kimi.

Az durdular, çox durdular, nəhayət, Qədir dillənə bildi:

– Salamməleyki, Səltənət, – dedi, – mənəm, Səltənət, gəlmişəm...

Səltənətin nə halında bir dəyişiklik oldu, nə baxışında bir şey təzələndi.

– Bah, – dedi, – əleykəsalam! Yəni gəlmisənmi, gözümüz aydın!

Yenə Səltənət astanada dayanmışdı, yenə Qədir pilləkənin başında durmuşdu. Əlindəki ağır çamadanı Qədir hələ də yerə qoymamışdı və qəribədir ki, çox qəribədir ki, bu ağırlığı o, qətiyyən hiss eləmirdi.

Sonra Qədir ağırlığı hiss elədi, çamadanı əlindən yerə qoydu. Səltənət də astanadan çəkildi, ancaq onda aradan xeyli vaxt keçmişdi; qapıya yığışmış uşaqların bir neçəsi həyətə soxulmuşdu, bir neçəsi hasarın başına dırmaşmışdı; Qədirin "gəldi" xəbəri də, yəqin ki, bütün kəndə yayılmışdı – onun köhnə şofer dostu Qasım indicə, bu saatca küçə qapısını açıb həyətə girmişdi, əlində bir şüşə araq, sevinə-sevinə dostunun üstünə gəlirdi.

Qədir öz köhnə dostu ilə qucaqlaşmaq hayında deyildi. Köhnə dostun özü Qədiri qucaqladı, bərk-bərk qucaqladı, dönə-dönə öpdü, hətta, ağladı da; əməlli-başlı ağladı və Qasımın yaşlı, parıltılı gözləri sonra Səltənətin üzünə zilləndi, çünki Qədir ona baxmırdı, Səltənətə baxırdı.

Sonra onlar qapının qabağındakı iri sal daşı altlarına çəkib oturdular. Ancaq Səltənət hələ də astanadan azca aralıda, dəhlizin divarına söykənib dayanmışdı. Onun iri gözləri elə bil həyətdə, qapıda, yerdə, yerdəki araq şüşəsində, Qədirin çamadanında, buradan azca aralıdakı hasarın üstündə və hasardan çox-çox uzaqdakı ucsuz-bucaqsız meşələrdəki nəsə gözəgörünməz, balaca, bambalaca bir şey gəzirdi. Gözlər sönük idi, hərəkətsiz idi və o qədər sönük və hərəkətsiz idi ki, Səltənət azca hərəkətə gəlib divardan aralananda, onun gözlərindəki parıltını Qədir aşkar görə bildi. Səltənət dəhlizə girdi, oradan kuzəni götürüb çıxdı. "Gedirəm, bir kuzə su gətirim", – dedi və elə getdi ki, elə getdi ki, elə bil o bir kuzə su olmasaydı, bu saat dünya alışıb-yanacaqdı...

Səltənət gedəndən sonra köhnə dost, gözləri işarə-işarə, bir müddət Qədirin üzünə baxdı. Sonra yanındakı araq şüşəsinə göz vurub: "Ux!" – deyib, əlini əlinə çırpdı, əlini əlinə sürtdü. (Bir vaxt yolda, rastlarına qəşəng qızlar çıxanda onlar eynən bu cür göz vurardılar, eynən bu cür "ux" eləyərdilər, əllərini əllərinə çırpardılar, əllərini əllərinə sürtərdilər...)

Sonra Qədirin köhnə dostu ayağa durdu, boylanıb yan-yörəsinə baxdı, arağı töküb içmək üçün qab axtardı: yaxınlıqda qab-qaşıq gözünə dəymədi, o yanda hasarın üstündəki, qapının qabağındakı uşaqlar gözünə dəydi. O gedib uşaqları həyətdən çıxartdı, hasardan düşürdü, onları bir xeyli də küçə ilə qovub, bu həndəvərdən tamam uzaqlaşdırandan sonra, qayıdıb astana dibindəki daşı ayağı ilə qapının dalına itələdi, gəlib oturdu, gözlərini Qədirin üzünə zilləyib:

– Ə, niyə beləsən? – dedi və sonsuz, görünməmiş bir təəccüblə öz köhnə dostuna baxıb-baxıb əlavə elədi: – Dur, evdən iki dənə stəkan gətir.

Qədir yerindən tərpənmədi. Bir yarımkiloluq banka ilə bir köhnə dəmir parçı dəhlizdən Qasımın özü gətirməli oldu. Qasım arağı qablara tökdü, parçı Qədirin qabağına qoyub, bankanı yuxarı qaldırdı:

– Götür iç, ə! İç, adam ol. Mən bu saat çıxıb gedirəm.

Elə bil bu adamın bu saat çıxıb getməyi üçün Qədir arağı birnəfəsə başına çəkib, Qasımın cibindən çıxarıb verdiyi beş-altı qoz ləpəsinin hamısını birdən ağzına atdı. Danışmadılar, dinməz-söyləməz qoz ləpəsini çeynədilər. Qasım ayağa durdu. Pilləkənin dibindən küçə qapısınacan – uzun xiyabanı da onlar səssiz-səmirsiz ötüb keçdilər və yalnız qapının qabağında söhbətə başladılar:

– Bə niyə belə, ə?..

*Bununla Qasım Qədirin geç gəlməyinin səbəbini soruşurdu.* Qədir sualı düz başa düşdü.

– Gəlmək fikrim yoxudu, – dedi.

– Bəs bir qulaq kağıza nə gəlmişdi?

Yenə Qədir həmin cavabı verdi:

– Gəlmək fikrim yoxudu.

– Harda olurdun?

– Belorusiyada.

– Evlənmişdin?

– Evlənmişdim.

– Uşaq-zad necə?

– Var.

– Əməlli qaçmısan?

– Necə ki?

– Deyirəm, yəni adresini-zadını bilmirlər ki?

– Bilirlər.

– Uşaq birdi?

– İkidi.

– Aliment verəcəksən?

– Bilmirəm.

Papağını çıxarıb, başını cani-dildən qaşıya-qaşıya Qasım əvvəl uzun müddət Qədirin ayaqqabılarına baxdı, sonra ütülü şalvarına, təmiz pencəyinə, ağ köynəyinə, qalstukuna... sonra isə üzünə lap sonra baxdı, baxdı və dedi:

– Bura bax, Qədir, elə bilmə ki, mən səni başa düşmürəm. Yorğunsan, yol gəlmisən, gərək yatasan. Qürbətdə iki uşaq qoyub gəlmisən, bunu da bilirəm, eşşək deyiləm. Səltənəti də gördüm: dilxor idi, gəlməyinə sevinmirdi, bu da öz yerində. Bunların hamısı öz yerində, hamısı keçər gedər. Ancaq Qədir, mən ölüm, Qədir, mən ölüm qağa, incimə məndən... belə birtəhərsən e... Lap birtəhərsən... *elə bil çastlarını* dəyişiblər.

Qasım bəstəboy idi, Qədir ucaboy idi. Qədiri öpmək üçün gərək Qasım dikələydi, çox dikələydi. Dostunun öpüşmək istədiyini Qədir özü başa düşdü; başını əydi və Qasım gülə-gülə onun boynuna sarıldı. Beləcə gülə-gülə Qasım ağlayıb, Qədirin də üz-gözünü islatdı və gülə-gülə, ağlaya-ağlaya da çıxıb getdi.



Qasımdan qalmış araq şüşəsini Qədir əvvəl ayağı ilə itələyib, dəhlizin qapısından uzaqlaşdırdı; bir müddət eyvanda gəzindi, sonra qayıdıb şüşəni götürdü və həyətin lap o başındakı kol-kosun arxasına tolazladı.

Sonra Qədir bir-iki dəfə də eyvanın o baş-bu başına gedib gəldi. Sonra banka ilə dəmir parçı ayaq altından götürüb, divarın dibinə qoydu, çamadanını qırağa çəkdi, bayaq Qasımla üstündə oturduqları nəhəng sal daşı əvvəlki yerinə sürüdü; gözünü bankaya, bir də parça zilləyib, *bir müddət* key-key baxdı, sonra *onları* götürdü, bankanı da iylədi, parçı da iylədi, aparıb ağzı üstə çevirib pəncərənin çıxarındakı hisli çırağının yanına qoydu.

Yenə Qədir eyvanın o baş-bu başına gedib gəlirdi. Eyvan böyük idi, hər tərəfdən açıq idi, bir dəhlizin və bir böyük otağın qabağınca uzanıb gedirdi. Dəhlizin qapısı və otağın böyük bir pəncərəsi bura baxırdı. Qapı açıq idi, pəncərə bağlı idi. Qədir alnını pəncərənin şüşəsinə söykəyib, otağın içinə baxdı: otaq son dərəcə təmiz idi, səliqəli idi; döşəmənin yarısına palaz salınmışdı, yarısına boz brezent döşənmişdi; köhnə dəmir çarpayı, çarpayının başında iri, tox balınclar – iki balınc; *balıncların üstünə ağ sapdan toxunma üzlük salınmışdı* və o yanda, açıq taxçada, aynanın yanındakı samovarın üstündə də buna oxşar, toxunma örtük vardı. Günçıxana açılan o biri pəncərənin qabağına Səltənətin dibçəkləri düzülmüşdü: ətirşah, gülsabah, sırğagülü...

Pəncərədən aralanandan sonra Qədir gəlib dəhlizin açıq qapısı qabağında durdu. Dəhliz ala-qaranlıq olduğundan buradakı şeylər zorla seçilirdi: çörək taxtası, doşab teşti, köhnə güyüm, böyük vanna... Və bayaqdan özünü tox tutan Qədir, nədənsə, məhz bu şeyləri görəndən sonra qəhərləndi, az qala ağlaya-ağlaya Səltənətə demək istədiyi sözləri dəhlizdəki çörək taxtasına, doşab teştinə, köhnə güyümə, böyük vannaya dedi:

– *Sevinmədin,* saymadın, – *dedi,* – Səltənət, *nə* olar, *canın* sağ olsun. Döymüşəm səni, çox döymüşəm, bilirəm, yadımdan çıxmayıb. Gecələr bu evə içib gəlmişəm, yediyini burnundan gətirmişəm, yuxunu zəhər eləmişəm. Sənə bir ağ gün verməmişəm, Səltənət, elə bilmə ki, yadımdan çıxıb... Ancaq gəlmişdim, qapına gəlmişdim, neçə gün yol gəlmişdim; heç olmasa bir yad qonaq hesab eləyəydin, bir xoş üz göstərəydin, bir stəkan çay verəydin... Bir əməlli üzümə də baxmadın,

bəlkə mən dəyişmişdim, Səltənət... Axı mən dəyişmişəm, Səltənət, mən tamam dəyişmişəm, dərdin alım, Səltənət, gör o vaxtdan neçə il keçir...

O, birdən hiss elədi ki, gözlərindən yaş axır, ağzı şor dadmasaydı, bəlkə heç hiss eləməyəcəkdi. Özünə acığı tutdu, dəhlizin qapısından aralandı, dəsmalını çıxarıb, tez-tələsik gözlərinin yaşını sildi, sonra yenə üzünü dəhliz tərəfə çevirdi, barmağının birini oradakı teştinmi, güyümünmü, nəyinsə üstünə tuşladı və bu dəfə hirsli-hirsli dedi:

– Ancaq onu bil ki, mən sənin evinə girməyəcəyəm, Səltənət, bu astanadan o yana ayaq qoymayacağam!.. Qoysam Qədir deyiləm, kişi deyiləm, bir damcı da namusum yoxdur!.. Sən mənim qabağıma adam kimi çıxmayınca, üzümə adam kimi baxmayınca, sən mənə adam kimi "xoşgəldin" deməyincə, Səltənət... Sonrası öz işindir, istərsən – qalaram, istəməzsən – çıxıb rədd olub gedərəm... Gedərəm, Səltənət, gedərəm, gedərəm, gedərəm!..

Son sözü deyə-deyə Qədir yenə eyvanda gəzinməyə başladı və bu sözü dedikcə, nədənsə o, haradasa uzaq yollarda şütüyən bir qatar gördü, qatar gedirdi və o getdikcə elə bil dəmir təkərlərlə dəmir relslərin arasından səs qalxırdı: "Gedərəm, gedərəm, gedərəm!..".

Yenə eyvan, yenə Qədir. Qədir yenə gəzinirdi. Fərq bircə burasında idi ki, hava bir qədər qaralmışdı, kəndə axşam düşürdü. Bir də fərq orasında idi ki, gəzinə-gəzinə Qədir indi başqa bir sözü təkrar eləyirdi: "Altı il, altı il, altı il...".

Sonra Qədir yorulub, eyvanın məhəccərinə söykəndi. Buradan bəzi evlərin damı görünürdü, bəzi ağacların başı görünürdü. Buradan görünən kənd elə həmin kənd idi – Qədirin altı il əvvəl gördüyü kənd... Bu həyətdə də heç bir şey dəyişməmişdi. Bircə ağac qurumuşdu, kötüyü qalmışdı... Qədir evin içini təsəvvürünə gətirdi: çarpayı öz yerində, samovar öz yerində; taxçaları, tirləri, pərdələri – həp şeyi yerində idi. Ancaq burada nəsə dəyişmişdi. Görəsən, dəyişən nə idi? Qədir bunu birdən tapa bilmədi. Dəhlizdəki şeyləri nəzərinə gətirdi, sonra evin içini bir də təsəvvür elədi və yadına düşdü ki, döşəməyə salınmış boz brezent əvvəl yox idi, əvvəl onların üç palazı vardı, döşəməni boyaboy tuturdu; bir də Qədir əsgər getməmişdən, içəridə bir yaxşı limon ağacı dururdu; günçıxan tərəfdəki pəncərədə, indiki gül dibçəklərinin yerində...



Üstü kirəmitli damlar. Damlar elə bərk dayanmışdılar ki!.. Ağaclar elə bil milyon kilometrlərlə kök atıb, yerin dibinə getmişdilər. Qədirə elə gəlirdi ki, bu ağacları heç nə yerindən tərpədə bilməz. Balıncların və samovarın üstündəki örtüklər də Qədir üçün dəhlizdəki teşt, güyüm, çörək taxtası kimi ağır olmuşdu, Səltənətin baxışları da məhz bu ağırlıqda olardı. Qədir qəribə bir ağırlıq altında qalmışdı və bu ağırlıqdan başqa o, heç nə hiss eləmirdi. Sonra Qədir hiss elədi ki, o altı il burada keçməyib. Sarsıldı, ümidsizləşdi. Və elə sarsıldı, elə ümidsizləşdi ki, bədəninin tən yarısı cansız bir əşya kimi məhəccərdən o yana sallandı... Qədirin dəyişdiyini Səltənət hiss eləməyəcəkdi, çünki onun özü dəyişməmişdi. Çünki burada altı il keçməmişdi, altı il orda keçmişdi... Altı il. Altı il. Altı il.

Sonra Qədir gözlərini kəndin qurtaracağındakı meşəyə zillədi – axşamın alatoranı meşənin üstünə çökmüşdü. Meşənin o tərəfi Kür idi, ancaq Kür görünmürdü. O tərəflərdə, göyün lap aşağısında bir topa bulud qızarırdı. Bayaq orda bulud yox idi, bayaq Səltənət o tərəfə baxırdı. Tez-tez o tərəfə baxırdı. "Görəsən niyə baxırdı?.." Qədir qorxa-qorxa pıçıldadı. Sonra məhəccərdən aralanıb, eyvanda gəzinə-gəzinə hirsli-hirsli, ağlamsına-ağlamsına əlavə elədi: – Birdən başına bir iş gətirərsən, Səltənət, gedib özünü Kürə atarsan!.. Mən gərək gəlməyəydim, bilirəm... Gəlmişəm, nə olar, çıxıb gedərəm...".

Səltənətin çeşməyə getmədiyini Qədir yəqin bilirdi, çünki o cür çeşməyə getmək olmazdı; olsa-olsa Səltənət öz evlərinə gedə bilərdi *– altı il bundan əvvəl Səltənətin bir qoca atası və bir qoca anası vardı.* "Kaş Səltənət elə ora getmiş olaydı... Bəs özgə hara gedə bilər?"– Qədir öz-özünə danışırdı, fikirləşirdi və arabir qorxa-qorxa Kür tərəfə, meşə tərəfə baxırdı.

Onun evdən çıxmaq fikri yox idi. Heç kəsi görmək istəmirdi. Qədir yetim böyümüşdü, bu kənddə onun vur-tut bir neçə uzaq qohumu tapılardı, onların da bəziləri Qədirdən üz döndərmişdi (nadincliyinə görə, şərəşurluğuna görə); bəzilərindən də Qədirin özü üz döndərmişdi, çünki onda Qədir başqa Qədir idi, bu kənddəki adamların da çoxusu Qədirin nəzərində o vaxt adam deyildi, ilbiz idi, soxulcan idi və çox içib sərxoş olanda bu "ilbiz", "soxulcan" sözünü Qədir bu camaatın üzünə az deməmişdi: "İlbizlər, soxulcanlar, kərtənkələlər... Qınınıza çəkilmisiz, yaşamaqdansa sürünürsüz. Araq içmirsiz, pul yığırsız. Yumruq davası eləmirsiz, qeybət eləyirsiz. Hələ utanmayıb, Allaha da

yaltaqlanırsız ki, sizin üçün o dünyada da rahat yer düzəltsin... Elə sürünə-sürünə də gəbərəcəksiz, ilbizlər, soxulcanlar, kərtənkələlər...".

Damlar. Kök atıb, milyon kilometrlərlə yerin dibinə getmiş ağaclar... Bu alçaq damlar elə bil dünya durduqca durmaqdan ötrü idi. Kənd elə həmin kənd idi. Bu damların altında yaşayan adamları Qədir çox söymüşdü, çox incitmişdi. Həm də təkcə özlərini yox, allahlarını da, peyğəmbərlərini də! Həm də təkcə allahlarını, peyğəmbərlərini yox, qızlarını da, arvadlarını da. Bir dəfə qəhqəhə çəkib gülməkdən ötrü Qədir maşının kabinindən əl atıb, yolla gedən qızların başından yaylığını qapmışdı; hörmətli-izzətli kişilərin üstünə maşın sürmüşdü, arvadların su dolu vedrəsinə qum atmışdı, qoz qabığı atmışdı, papiros kötüyü atmışdı... Qədir heç nəyi unutmamışdı. Hər şey Qədirin yadında idi. O, bu adamları çox söymüşdü, çox incitmişdi, hətta döymüşdü də... Ancaq altı il bundan qabaq. Altı il bundan qabaq! "Altı il. Altı il. Altı il...".

Onun bu kəndə gəlməyə, doğrudan da, heç bir üzü yox idi. O, buraya həmin o altı ilə ümid olub gəlmişdi və yeganə pənah gətirdiyi həmin o altı ilin burada altı il olmadığını Qədir getdikcə daha aşkar hiss eləyirdi. Bir kəsin qapıdan girməməyi, bir kəsin onu adam yerinə qoymamağı, hətta Səltənətin çeşmə adına çıxıb harasa getməyi də Qədiri bu qədər incitmirdi.

" – Uşaqlar, – dedi. – Uşaqlar da qaçdılar, qayıtmadılar. Gedib xəbər tutdular, bildilər Qədirin kim olmağını. "Qədir dəlidir, Qədir banditdir, xuliqandır, başkəsəndir; Qədirin yatmadığı türmə yoxdur... Qədirin həyətinə girmək olmaz, qapısında oynamaq olmaz, barısına dırmaşmaq olmaz..." Bildilər, eşitdilər hamısını. Qorxdular. Uşaqlar qorxdular, qayıdıb gəlmədilər...".

Yenə həmin damlar, yenə həmin ağaclar... Orda-burda çıraqlar yanırdı. Çıraqların işığı ağacların budaqlarına düşmüşdü. Bu damların altında yaşayanlar, görəsən, Qədirin gəldiyini bilirdilərmi? Əlbəttə, bilirdilər... Qoy gəlməsinlər, qoy saymasınlar, evi yoxdu. Ancaq

Sonra ayaq üstdə durmaqdan yoruldu. Pəncərənin dibində, yerdəcə, quru döşəmənin üstündə oturub, başını dizlərinin arasına aldı.

Əsgər getdiyi günün axşamını Qədir yaxşı yadına sala bilmirdi. O gecə Qədir evə sərxoş gəlmişdi, daha doğrusu, özü gəlməmişdi, Qasım onu darta-darta gətirib, qapıdan içəri salmışdı. Həmin o sonuncu gecə Səltənətlə necə rəftar eləməyi də Qədirin yadında deyildi. Ancaq bir şey yaxşı yadında idi: evə içib gələndə o, həmişə Səltənəti daha çox istəyirdi. İstəyirdi onu öpsün, oxşasın, Səltənətlə uşaq kimi oynamaq istəyirdi, ər-arvad kimi yatmaq istəyirdi. Belə vaxtlarda Qədir arvadının saçlarına əməlli-başlı divan tuturdu; Səltənətin bir cüt yoğun hörüyünü açırdı, balıncın üstünə sərirdi, öpürdü, iyləyirdi, ağlayırdı və öpməkdən, iyləməkdən, ağlamaqdan doymurdu: "Saçlarından anamın iyi gəlir, Səltənət, yuyanda da, yumayanda da, görəsən, bu necə işdir?..". Ancaq məhz bu vaxtlar Səltənət çox qəddar olurdu, Qədiri qovurdu, itələyirdi, bacarsa heç cür yaxına buraxmırdı və onların qovğaları da çox vaxt elə bundan törəyirdi. Elə olurdu ki, Səltənət gecəynən çıxıb atası evinə gedirdi və Qədir ya sabahısı gün lap tezdən, ya o günün axşamı, ya da bir həftədən, on gündən, on beş gündən sonra gedib Səltənəti gətirirdi. Bəlkə məhz əsgər getdiyi gecə Qədir elə bir pis hərəkət eləmişdi ki, bu hərəkəti unutmaq mümkün deyildi? – Bunu yada salmaq çətin məsələ idi. Ancaq onun ertəsi günü Qədirin lap yaxşı yadında idi:

Sübh tezdən. Meşə yolu. Elə bir Qədirə yanıq vermək üçün ağaclar həmişəkindən gözəl görsənirdilər. Elə bil ağacları çimdirmişdilər, yarpaqları yumuşdular, təzələmişdilər, sanki ağaclar sevinirdi, gülümsəyirdi: vələs, cökə, şam, palıd... Yamyaşıl meşə yolu ilə onlar Kürün qırağına, bərənin yanına gedirdilər. Qədirin başı ağrıyırdı, ürəyi bulanırdı və məhz onun başı ağrıdığına, ürəyi bulandığına görə elə bil meşə də belə qəribə olmuşdu, ağaclar da belə gözəl, belə xoşbəxt görünürdülər. Başı ağrıdığına görəmi, əsgər getdiyinə görəmi, nədənsə, Qədir çox hirsli idi. Ancaq onlar yavaş danışırdılar, az qala pıçıldaşırdılar. Qəribə

– Sevinərsən, həlbət ki, sevinərsən.

– Madam ki, belədir, qoy düzünü deyim: bir özün fikirləş, Qədir, mənim yerimdə kim olsa sevinməz? Sənin kimi ərə kim dözərdi, kim bu zülmə tab gətirərdi?! Bir gün evdəsən, bir gün türmədə. Bir ayıq gününü görmədim, bir ağıllı vaxtını görmədim. Evdə zülüm, çöldə zülüm. Evdə sənin yumruğun, təpiyin, çöldə camaatın dedi-qodusu, umu-küsüsü. Sənin əlindən başımı qaldırıb, bir əməlli xalqın üzünə də baxammırdım, çünki heç kəsdə abır-həya qoymamışdın. İndi çıxıb gedirsən, görürsən, bir yola salan da yoxdur, bir dalınca ağlayan da yoxdur. Kim eşitsə sevinəcək, çünki camaatın canı qurtarır sənin əlindən... Özün de, Qədir, insafın olsun düzünü de, belə ərdən qurtaran sevinər, ya sevinməz?..

Hətta bu dəhşətli sözləri də Səltənət elə sakit demişdi ki, elə yavaş demişdi ki... Görəsən, niyə?.. Bəlkə meşəyə görə? Qəribə şeydir – meşədə bərk danışmaq olmur. Meşə adamı bərk danışmağa qoymur. Ancaq bərk de, yavaş de, nə fərqi var, söz deyilmişdi və Qədiri içindən doğramışdı.

– Gəlməyəcəyəm, Səltənət, gəlsəm it oğluyam.

– Nə it oğlu ol, Qədir, nə eşşək oğlu ol. Ancaq gəlmə, sən canın, gəlmə, dərdin alım, Qədir. Ha çoxdu dünyada yaxşı-yaxşı yerlər. Get bir yerdə işlə, evlən, neynirsən elə, ancaq gəlmə.

Bu sözləri Səltənət bir yoğun vələs ağacına söykənib demişdi və oradan aralanıb bir müddət içindən kəsilə-kəsilə gedəndən sonra, başqa bir vələsin yanında Qədir qısaca cavab vermişdi: "Gəlməyəcəyəm, xatircəm ol". Vələsdən bərənin yanınacan onlar səssiz-səmirsiz yerimişdilər və onların bərənin yanındakı söhbətləri də Qədirin indiki kimi yadında idi:

– Gəlməyəcəyəm, gəlsəm – arvadam, kişi deyiləm!

– Arvad da olma, heç nə də olma, kişisən, gəlmə, Qədir!

Bərə gəlmişdi, hazır idi, ancaq Qədir, nədənsə, Səltənətdən ayrıla bilmirdi:

– Bir ayrı söz de!

– Nə deyim?

– Bir adam sözü de. Deynən: yaxşı yol, sağ-salamat gələsən.

Səltənət dedi:

– Yaxşı yol, sağ-salamat qalasan...

Ancaq "gələsən" demədi.



Fikirləşə-fikirləşə Qədir mürgülədi. Yuxusunda qarmaqarışıq bir meşə gördü. Meşə elə həmin meşə idi: vələs, cökə, şam, palıd... təkcə buradakı Səltənət bayaq kuzəni götürüb, çeşmə bəhanəsi ilə Qədirdən qaçan Səltənət deyildi. Məhz o vaxtkı Səltənət idi. O vaxt Səltənətin bətnində neçə aylıq uşaq vardı, Səltənət tezliklə doğacaqdı.

Vələsə söykənəndə, bərənin yanında duranda o vaxt Səltənət çarğatının bir ucunu qarnının üstünə salmışdı, bəs necə olmuşdu ki, bayaq, meşəni yadına salanda Qədir həmin Səltənətin yerində indiki Səltənəti görmüşdü?.. Doğrudanmı Qədir bu qədər yorğun idi?.. Bəlkə zəhrimar araq onu tamam üzmüşdü, key eləmişdi... Bəlkə Qədir bayaqkı ağır baxışın altında qalmışdı: əzilirdi, çapalayırdı, çıxa bilmirdi. Meşəni, vələsi, bərəni bir də nəzərinə gətirəndən sonra, Qədir havalı ayağa durdu: "Axı Səltənət boylu idi, Səltənətin uşağı vardı!– dedi və pəncərədən boylanıb qaranlıq otağa elə maraqla baxdı ki, guya həmin uşaq indi orada, o qaranlıq otaqda ola bilərdi.

## 2

– Gülgəz bacı, ay Gülgəz bacı!..

Qarnı lap iriləşib, üzünə bozumtul ləkə düşmüş Səltənət bir evin küçə qapısında dayanmışdı. Həyətdə, eyvanda heç kəs yox idi. Eyvanın qabağında bir balaca küçük atılıb-düşürdü, Səltənətə hürmək istəyirdi, hürə bilmirdi. Küçüyün yan-yörəsində toyuqlar eşələnirdilər.

– Gülgəz bacı...

Səltənət bir də çağırdı və bu dəfə həyətin lap o başından, ayaqyolu tərəfdən səs gəldi:

– Gəlirəm, ay qız, gəlirəm. Keç gəl içəri.

Səltənət içəri keçdi, eyvanın qabağında durdu; bir azdan Gülgəz arvad, əlində aftafa, ağacların dalından çıxdı.

– Otur, Səltənət, – dedi, – ayaq üstdə durma. – Səndən nə əcəb, ay qız?

Eyvanın qabağında keçi dərisi vardı, Gülgəz arvad dərini götürüb, pilləkənin üstünə atdı.

– Sən lap bugün-sabahlıqsan ki, ay qız! Otur, otur, uşağı incitmə, yazıqdır, Allaha xoş gəlməz, bala.

Ancaq Səltənət oturmadı:

– Sağ ol, bu saat gedirəm, – dedi. – Sənə bir işim düşüb, Gülgəz bacı: istəyirəm ikicə gecəliyə Sona gəlsin mənnən qalsın. Çox yox, ikicə gecəliyə.

Gülgəz arvad bir az fikirləşdi:

– Sonamı?.. Nə olar, bir söz demirəm. Amma, ay qız, Sonadan nə çıxacaq sənə? Gərək yanında elə bir adam ola ki, əlindən bir iş gələ. Heç olmasa bir-iki qarın doğmuş ola. Özün də birinci dəfə doğacaqsan. Ananı niyə çağırmırsan ki?

– Anam azarlıdır, Gülgəz bacı, neçə gündür yatır.

Gülgəz arvad Səltənətin irəli çıxmış qarnına elə diqqətlə baxdı ki, hələ doğmadığı uşağın boyunu-buxununu Səltənət həmin baxışda gördü.

Sonra Gülgəz arvad dedi:

– Sonaya görə demirəm, Səltənət, ancaq, mən bilən, gedib orda doğsan yaxşı olar: öz dədənin evində. Anan da, naxoş olsa da, yanında olacaq. Necə olsa, dədə evidir. Yaxşı olar, salamatçılıq olar.

Səltənət dedi:

– Dədəmdən utanıram, Gülgəz bacı.

Gülgəz arvad bir də fikirləşdi:

– Balnisə necə? Getmək istəmirsən?.. Deyir, rayon balnisəsində indi arvadlara yaxşı baxırlar. Doyunca yemək-içmək də verirlər, müftəcə, pulsuz-pənəsiz...

– Yox, Gulgəz bacı, balnisəni istəmirəm. Öz evimdəcə doğacağam, nə olacaq, ölməyəcəyəm ki. Bir də, ölsəm nə olacaq, mənsiz dünya qara geyməyəcək... Ancaq istəyirəm ki, yanımda bir adam olsun, sancım tutanda gedib mamaça Münəvvəri çağırsın.

Gülgəz arvad, nəhayət ki, razılaşdı:

– Yaxşı, yeri get, – dedi. – İndi ki, oturmursan, yeri get... Sonanı göndərrəm gələr. Lap elə dərsdən gələn kimi göndərrəm. Get yat, ayaq üstə çox dolanma.

Qədir əsgər gedəndən təxminən bir ay, ay yarım sonra, gecələrin birində Səltənətin sancısı tutdu. Heç mamaçanın gəlməyinə də ehtiyac olmadı. Səltənət gözünü açanda gördü ki, Sona başının üstündə dayanıb; gördü ki, böyründə ağ mələfəyə bükülmüş uşaq var; gördü ki, uşaq ölüdür, qapqaradır; gördü ki, Sona ağlayır və gözlərini yumdu. Səltənət nə hıçqırdı, nə zarıdı, onun yumulu gözlərindən xeyli vaxt



sakitcə yaş axdı və Sona, ölü uşaq bükülmüş, həmin mələfənin uclarıyla Səltənətin göz yaşını sildi...

Üzülmüş, əldən düşmüş Səltənət elə həmin gün, axşamçağı, gün təzəcə əyiləndə həmin ağ mələfədəcə uşağı qucağına alıb, qəbiristanlığa apardı. O, qəbiristanlığa çatanda qəbirqazan öz işini görüb qurtarmışdı. Külüngünü, belini bir tərəfə qoyub, əli belində, qazdığı qəbrin yanında durmuşdu.

- Bura qoy... Tez elə... Gərək özün qoyasan!..

Yəqin ki, Quranda belə yazılmışdı, ana öz körpəsini öz əli ilə qəbrə qoymalı idi. Balaca qəbir. Başdaşısız-filansız. Belə balaca qəbirlər bir aydan, iki aydan, üç aydan sonra mütləq yox olmalı idi, bu da, yəqin ki, Quranda yazılmışdı. Ancaq qəbir dərin qazılmışdı, çox dərin, lap böyüklərin qəbri kimi.

Qəbirqazan ucadan qışqırdı:

– Qoy da, nəyi gözləyirsən?

Səltənət onun bir də qışqırmağını gözləmədi, əyilib uşağı qəbrə qoydu və dikələndə gördü ki, körpənin yanında balaca, bapbalaca, əl boyda işıq var – gün işığı.

– Əlini uşağın döşünə qoy!

Səltənət əlini uşağın döşünə qoydu.

– Götür, bir ovuc torpaq at üstünə.

Səltənət bir ovuc torpaq götürüb uşağın üstünə atdı.

– İndi çəkil dur qıraqda!

Səltənət çəkilib aralıda dayandı və qəbirqazan altdan xırdaca bir sal daş qoyub, qəbri torpaqla örtəndən sonra, nədənsə, Səltənətə elə gəldi ki, bayaqkı işıq da orada, daşın-torpağın altında, körpənin yanında qaldı – əl boyda bapbalaca gün işığı...

Bir ay, iki ay, üç ay keçdi, həmin o axşamçağı, gün təzəcə əyiləndə, bir parça gün işığı ilə yan-yanaşı basdırdığı körpə, Səltənətin yadından heç vaxt çıxmadı.

Körpə tələf olandan sonra bir müddət Səltənət yoxa çıxdı, nə küçədə gözə dəydi, nə çeşmədə göründü. Ancaq bundan bir o qədər də keçmədi ki, bu kənddə, kəndin küçəsində, çeşməsində tamam başqa bir Səltənət peyda oldu: gülən, danışan, hamının kefini soruşan. Və bu gülən, danışan, hamının kefini soruşan Səltənət təzədən peyda

olduğu gündən yerli-yersiz, böyüyə, kiçiyə hamıya car çəkməyə başladı ki: bəs dədəm evinə köçmüşəm... Dədə evinə köçmək, əlbəttə, elə böyük bir xoşbəxtlik deyildi. Buna görə də, bütün kənd bu qərara gəldi ki, ərinin əsgər getməyinə Səltənət sevinir. "Canı qurtarıb", – dedilər. "Əl-ayağı açılıb" – dedilər.

### 3

Gecənin hansı aləmi olduğunu bilmək çətin idi. Ay çıxmamışdı, yaxud çıxmışdı da, batmışdı da. Sıx, parlaq ulduzların işığında yatmış kəndin özü də bir tutqun yuxu kimi görünürdü: damların özü yox idi, kölgəsi vardı; hasarların özü yox idi, kölgəsi vardı... Göydə ulduzların işartısı, yerdə qurbağaların qurultusu, ucu-bucağı görünməyən gecənin nəhayətsiz zülmətini fasiləsiz səsləndirən qurbağaların sayı da elə bil göydəki ulduzların sayı qədərdi... Bir də haradasa tək bir it hürürdü, daha doğrusu, hürmürdü, ulayırdı, kiçik fasilələlrlə, qorxunc, tükürpəşdirici bir səslə ulayırdı və gecəni – zülməti vahimə ilə doldururdu...

Qədir əl çırağını yandırıb yanına qoymuşdu. Başının altında çamadanı, çamadanın üstündə – bükülüb-bürmələnmiş pijaması. Paltosunu altına salmışdı, pencəyini başına çəkmişdi.

Haradasa kəndin ətəyində gur səsli bir it heybət-heybət hürdü. Sonra kənddə başqa itlər də hürüşdü. Sonra itlər lap yaxında hürüşməyə başladı. Qədir dikəlib oturdu, gözlərini qapıya tərəf zillədi, azca keçəndən sonra it səsi tamam kəsildi, ancaq Qədir gözlərini qapı səmtdən ayırmadı; o vaxtacan ayırmadı ki, nəhayət, qapı yavaşca cırıldadı; qapı açıldı, örtüldü – həyətə bir adam girdi, ancaq bu tərəfə gəlmədi, astananın qabağında donub qaldı.

Qədir küçə qapısını görmürdü – qabağını ağaclar kəsmişdi. Ancaq o oturduğu yerdə heç bir hərəkət eləmədi, dayanıb sakitcə gözlədi. Aradan xeyli vaxt keçdi: it uladı, qurbağalar quruldaşdı... Qədir gələnin ayaq səsini eşitmədi, bir azdan ağacların bu tərəfində onun özünü gördü. Səltənət idi, əlbəttə, Səltənət idi, bir ağacın dibində donub qalmışdı, sanki o da ağac idi: əlində kuzə, bir də... başmaqları...

– Gəl, Səltənət... Qorxma, Səltənət, mənim sənnən işim yoxdur. – Qədir xəstə kimi zarıdı, ancaq Səltənət yerindən tərpənmədi.



– Get yat. Mən içəri girməyəcəyəm. Mən buradaca yatacağam. Gəl, Səltənət, oyun çıxartma.

Səltənət bir-iki addım qabağa gəldi, yenə durdu:

– Elə bilirdim sən yatmısan, – dedi.

Sonra Səltənət pillələnləri qalxdı. Qədirdən xeyli aralıda, məhəccərə söykənib dayandı:

– Kürə getmişdim. Özümü öldürməyə getmişdim. Sən niyə gəldin, Qədir, niyə gəldin?!

Səltənət danışa-danışa ağladı, ağlaya-ağlaya danışmağa başladı:

– Altı il idi ki, getmişdin. Altı il idi ki, mənim də qulağım dinc idi, huşum başımda idi. Gəldin, yenə huşumu başımdan çıxartdın, dəli-divanə eləyib saldın məni bu çöllərin düzünə. Demişdin gəlməyəcəyəm, and içmişdin, söyüş söymüşdün. Bəs indi mən neyniyim, Qədir, mən başıma nə daş salım?..

Qədir bayaqkı yerindəcə paltosunun üstündə tərpənmədən oturmuşdu. Səltənət məhəccərə söykənib dayanmışdı, lap o vaxtkı kimi dayanmışdı – vələs ağacının dibindəki kimi və indi də o vaxtkı kimi yavaş danışırdı, o vaxtkı kimi dəhşətli sözlər deyirdi:

– Gedib indiyəcən Kürün qırağında oturmuşam. Gecə yarıyacan lələ-giryan, meşəni dolanmışam. Bir yalquzaq da tapılmadı ki, parçalaya, canım qurtara; bir quduz qaban da rastıma çıxmadı... Öldürəcəydim özümü, Kürdə boğacağıdım. Vallah, boğacağıdım, Qədir, dədəmə yazığım gəldi. Bir ildi ki, bir sağ günü olmayıb. Bir saat ayağa duranda üç gün yorğan-döşəkdən qalxa bilmir. Qorxdum ki, ölər, meyidini yerdən götürən olmaz, yoxsa qayıtmayacaqdım, Qədir. Getmişdim, qayıtmayacaqdım!

"Baxmır. Üzümə baxmır! Baxsa, bəlkə görərdi, bəlkə inanardı: inanardı ki, mən o vaxtkı Qədir deyiləm". Haradasa dəstədən ayrılıb: azıb, sonra öz cəbhəsinin, öz ordusununca başqa bir dəstəsində casus vəziyyətinə düşmüş adamlar kimi Qədir nə edəcəyini bilmirdi. O, bu vəziyyətdən çıxmaq istəyirdi. İstəyirdi ki, Səltənət onun üzünə baxsın, yoxlasın Qədiri, pasport kimi, hərbi sənəd kimi yoxlasın, ancaq Səltənət ona baxmaq istəmirdi; gecəyə baxırdı, zülmətə baxırdı...

Qurbağalar quruldaşırdı, it ulayırdı, ulduzlar, duru göydən dinməz-söyləməz yerə baxırdılar. Nəhayət, Səltənət gözünü zülmətdən ayırdı, Qədirə baxdı və Qədirin cəsarətlənməyi üçün, danışmağı üçün elə bu bircə baxış tamam kifayət oldu.

ondan da anasının iyi gəlsin, bəlkə Qədir böyük qızının saçlarını iyləməkdən doymamışdı. O uzaq, soyuq vilayətdə Qədirgilin evinə gedib-gələnlər Qədirin balaca qızına "Satana" deyirdilər; "Satana" onların dilində şeytan demək idi, qız özü də şeytan qız idi, yaman qız idi. "Səltənət, tı moy kroşka, tı moy koşka"... Hər halda, qıza ad verəndə Qədir, bir vaxt onu, o balaca Səltənəti haradasa uzaqlarda qoyub buraya, bu daşürəkli Səltənətin yanına gələcəyini fikirləşməmişdi.

Qədir Səltənəti çağırmadı, oyatmadı. Ürəyində Səltənətə cavab verdi: "Bir yadına sal, Səltənət, axı onda dünya belə deyildi. Mən qızdan qorxmurdum, adamlardan qorxurdum. Mən o adamları incitmişdim, çox incitmişdim, axı onlar da məni az incitməmişdilər. Kimin toyuğunu tuturdular – Qədir. Kimin otunu yandırırdılar – Qədir. Bilqeyisin xalçası yadındadırmı: rayondan it gətirdilər, bir yığın milsəner tökülüb gəldi. Bizi klubun yanında yan-yana düzəndə axı sən özün də orda idin, bir yadına sal, Səltənət, neçə nəfər olardıq?.. İyirmi nəfər, otuz nəfər... Ancaq it neynədi – düz gəlib mənim ətəyimdən yapışdı. Mən axmağın ağlına bax: o vaxtacan elə bilirdim ki, bu itlər də bir şey qanır, adam tanıyır, oğru tanıyır. Son demə, bu da bir fırıldaq imiş. İt bilirmiş kimi tutmaq lazımdır. Qulağına deyiblərmiş, ona görə də gəlib məndən yapışdı. O xalçanın üstündə mən yazıq beş ay türmədə yatdım. Ancaq mən ömrümdə o xalçanın üzünü görməmişdim, mən ömrümdə bir kəsin bir çöpünə əl vurmamışdım, sən ki bilirdin bunu, Səltənət, heç kəs bilməsə də, sən bilirdin. Mən qızdan qorxmurdum, məni o murdar itə nişan verənlərdən qorxurdum. Qorxurdum ki, qızım olar, mənim qisasımı ondan alarlar, namusumu ləkələyərlər... Bilən gündən ki, sənin qarnında uşaq var, mən bircə bunu fikirləşirdim, ayrı şey fikirləşə bilmirdim. Fikirləşəndə ki, mənim qızım olacaq, gedib birinin arvadı olacaq, birinin qapısını süpürəcək, az qalırdı başıma hava gəlsin; neynim, Səltənət, onda o cür idim, ağlım kəsmirdi, sonra başım çəkdi, bildim ki, günah özümdə olub..."

Qədir ürəyində Səltənətlə danışırdı, gözləri isə yenə orada idi, soyuq vilayətdə idi.

Onların xırdaca bir rayon mərkəzində qəşəng, tərtəmiz evləri vardı. Qızların anası ilə Qədir bir vaxt elə buradaca, bu balaca şəhərcikdə tanış olmuşdu. O vaxt evlənmək barədə onların arasında heç söhbət də olmamışdı... Bu balaca şəhərdən köçüb gedəndən sonra bir gün Qədir



məktub aldı, bildi ki, uşağı olacaq, bir vaxt yollarında nəhəng hərbi maşınlar sürdüyü bu balaca şəhərə Qədir qısaca, çox qısaca bir cavab məktubu yazıb göndərdi: "Zdrastvuy, Marina. Yesli devoçka budet nazavi Leyla. Druqoy prozba net".

Əsgərliyini qurtarandan sonra Qədir çox düşündü, çox daşındı. Düşünüb-daşınmaq nədir ki, hətta o, üç-dörd gün vağzallarda yatdı, səhərdən axşamacan perronlarda avaralanıb, Qafqaz tərəfə gedən neçə-neçə qatarlar yola saldı, neçə-neçə qatarın dalınca baxdı... Yollarında bir vaxt nəhəng maşınlar sürdüyü bu balaca şəhərə nə vaxt gəlib çıxdığını heç Qədirin özü də bilmədi. Gəlib gördü ki, burada Leyla adlı qız var – onun qızı!.. Bir yad şəhərdə qalmaq, yaşamaq üçün bəzən insana bir ad da kifayət olur... Üstəlik, Marina... Onun sədaqətlə yol gözləməyi... Qədirin heç vaxt, heç kəsdən görmədiyi mehribanlıq...

Bu balaca şəhərdən bir vaxt getməli olacağını Qədir əvvəl heç ağlına da gətirmirdi. Nə olsun ki, soyuq idi; nə olsun ki, yer-göy həmişə yaş idi, palçıq idi, ilin az qala on ayı yağış yağırdı, qar yağırdı. İsti Kür, Kür qırağının isti meşələri, isti ağacları hərdən Qədirin yadına düşürdü, ancaq nə olar, – burada da meşələr vardı, çaylar vardı... Qaldı ki, insanlar... İnsanlar elə insan idilər, onların haçansa ilbiz, soxulcan, kərtənkələ olduqlarını Qədir çoxdan unutmuşdu.

4

Dəyişiklik sürətlə başlanmadı, sürətlə davam elədi. Yox, Qədirin nəzərində insanlar təzədən ilbiz, soxulcan, kərtənkələ olmadılar, yad oldular, tamam yad oldular. İnsanlar yad-yad yeriməyə başladılar, yad-yad danışmağa başladılar – yad yollarda, yad evlərdə, yad ağacların dibində... Və yağışlı, çənli-çisəkli bir gün öz nəhəng "samosval"ını, bəlkə də min dəfə keçdiyi bir yolla sürüb keçəndə, o yolun qırağındakı qəbiristanlıq, necə oldusa, Qədirə heç vaxt görünmədiyi qədər dəhşətli göründü, elə dəhşətli göründü ki, Qədir gözlərini yumub, dəli kimi maşının əyləcini basdı. Sonra o, maşını buradan elə sürdü, elə sürdü ki, elə bil, bu saat, bu yağışlı, çənli-çisəkli gündə onu tutub, bu yad qəbiristanlıqda diri-diri basdıracaqdılar.

O axşam Marina ilk dəfə dilə gəldi:

– "Skaji, Kadır, çto s toboy, a?.."

– "Niçivo, niçivo, Marina. – Onda Qədir hələ getmək barədə fikirləşmirdi, getmək istədiyini bilmirdi. Bircə onu bilirdi ki, haradasa isti meşələr var, isti ağaclar var... Haradasa isti bir çay axdığını bilirdi, haradasa isti bir qadın yaşadığını bilirdi... Bir də uzaqda bir qəbiristanlıq vardı, orada Qədirin anası yatırdı; bir də yaxında bir qəbiristanlıq vardı, bir vaxt ölüm gələndə Qədir o qəbiristanlıqda yatmaq istəmirdi: – Niçivo, Marina, çesni slova, niçivo ni prisxodit. Ustal ya. U mne qlava balit..."

Bundan sonra, haradansa bir ölüm yuxusu peyda oldu – insan nə qədər yatarmış, ilahi!.. Bundan sonra yer üzündə elə bil bir maşından və bir çarpayıdan savayı, heç nə qalmadı. Maşından düşən kimi Qədir özünü evə yetirib, çarpayının üstünə sərildi. Bundan sonra, Marina işdən çıxıb, uşaqları yaslidən götürüb evə gələndə həmişə Qədiri çarpayıda gördü. On gün belə, on beş gün belə... Və günlərin bir günü Qədir qalxıb, yatmaqdan şişmiş gözlərini Marinanın üzünə zillədi:

– "Ya xaçu uyexat, Marina! Tı mne prasti, Marina! Ya xaçu uyexat!"..

Qədir ayaqlarını çarpayıdan aşağı sallayıb, beli bükülü oturmuşdu. Uşaqlar yerdə oyuncaqları ilə oynayırdılar. Marina nəsə ütüləyirdi, ütüsü əlində qalmışdı.

– "Ya znala... Ya toqda srazu poçuyala, – pomniş, sprosila, çto s toboy... A deti-to kak je, Kadır?! Eta yeşo malenkaya, a Leyla – ona j v tebe duşi ne çayet!.. Bez otsa rasti budut?!"

Bu söhbətin üstünə onlar bir daha qayıtmadılar, özlüyündə Qədir bu son ümiddən də əl çəkdi. Yenə dünyada bir maşın qaldı, bir çarpayı qaldı... Bəlkə hər şey elə beləcə də qalacaqdı, bəlkə də Qədir dəyişəcəkdi, o nagahan sıxıntıdan qurtaracaqdı, o ölüm yuxusundan ayılacaqdı. Ancaq olmadı, mümkün olmadı, Marina özü qoymadı. Bir gün işdən qayıdanda Qədir stolun üstündə bir iri çamadan gördü. Çamadan təzə alınmışdı. Açıq idi – içində Qədirin ütülənmiş şalvarları görünürdü, köynəkləri görünürdü; bir-iki qutu vafli, bir-iki qutu peçenye; konfet, süd konservi, balıq konservi... Və Qədirin pijamasını da ütüləyib hazır eləyəndən sonra Marina çamadanı bağladı, gedib paltosunun cibindən nəsə götürüb qayıtdı. Bütün bunlara təəccüblə baxan Qədir, bileti görəndə lap təəccübləndi.

– "Vot, bilet kupila. U menya kassirşa znakomaya na stansii. Poyezd v desyat çasov, no seyças uxodi, detey ne dojidaysya. İx Vera seqodnya vozmyot, ya poprasila".



Sonra onlar vağzalda idilər. Qatar tərpənməkdə idi, ancaq Qədir tərpənmirdi, çaşıb qalmışdı. Marina onu silkələyirdi, vaqonun girəcəyinə itələyirdi, elə bil yuxudan ayıltmaq istəyirdi: "İdi, idi, vsyo ravno tak nelzya! Vsyo ravno – ne jizn..."

O, Qədirin dodağından öpdü və uzun müddət perronda, qatarın dalınca baxaraq, öz əsən dodaqlarını çeynəyə-çeynəyə qaldı.

Qədir ha çalışdı, yata bilmədi. Durub, ehtiyatla otağın qapısı qabağında hərləndi. Qapının şüşəsindən qorxa-qorxa içəri baxdı, yavaşca dəstəkdən yapışdı, dəstəyi qorxa-qorxa özünə tərəf çəkdi... Qayıdıb təzədən yerinə uzananda haradansa Qasımın səsi onun qulağına gəldi: "...elə bil, çastlarını dəyişiblər..."

"– Sən əvvəlki Qədir olsaydın, bu qapının dalında yetim kimi qısılıb qalmazdın. Sındırardın bu qapını, bircə təpiklə sındırardın... Bəs sonra?.. Nə sonra?.. Bir arvadın qollarını qatlamağa gücünü çatmayacaqdı?.." Səs yenə də Qasımın səsi idi. Qədiri yatmağa qoymayan da elə bil Qasım idi. Sanki bu səsdən qaçmaq üçün Qədir çırağı püfləyib söndürdü, yorğanı başına çəkdi. Handan-hana yuxuya getdi və özünü Kürün dibində gördü. Kürün dibində gün çıxmışdı, Kürün dibində işıqdan göz qamaşırdı, Kürün dibində Qədir körpəcə, lap körpəcə bir uşaq tapmışdı və balıqların, yosunların arasında üzə-üzə Səltənəti axtarırdı. Qədir sevinirdi, balıqlar, yosunlar da sevinirdilər. Balıqlar, yosunlar körpəni dövrəyə almışdılar, toy qurub oynayırdılar: "Oğlandır, oğlandır"... – deyirdilər. Qədir nur içində üzürdü, balıqlar da onun dövrəsincə üzürdülər, uşağın başına toplaşırdılar: "Diridir, diridir..." – deyirdilər. Qədir uşağın ayaqlarından tutmuşdu, suyun üzünə çıxarmaq istəyirdi, Səltənəti axtarırdı, Səltənəti çağırırdı: "Səltənət, ay Səltənət, hardasan, səs ver, tapmışam uşağı!.."

Ayılanda gördü ki, səhərdir, dəhlizin azca aralı qapısından içəriyə gün düşüb. Gördü ki, otağın qapısı da açıqdır, orada da gün işığı var. Eyvan tərəfdəki pəncərənin qabağında çörək gördü, pendir gördü; bir qutu çay, bir ovuc qənd, su çaydanı, dəm çaydanı... Evə baxdı, həyətə baxdı... kuzəni də yerində gördü, ancaq Səltənəti görmədi.

Sonra bir yekə maşın gəlib qapıda durdu. Qasım idi, əlbəttə, Qasım idi. Qasım qapının qabağından qışqırdı:

– Durmusanmı, ə, yaxşısanmı?

Qasım gəlib, pilləkənin altında dayandı:

– Rayona gedirəm, – dedi, – sədri aparıram. Istəyirsən sən də gəl gedək. Gəzərik, sənin üçün maşın yeri də eləyərik... Nə olub, ə, yenə gözümə ala-bula görsənirsən. Səltənət hanı? Evdədir?.. Səltənət, ay Səltənət! Aaz, Səltənət, hardasan?..

Qədir başını tərpətdi:

– Yoxdur, – dedi, – bağırma!

Ancaq Qasım kefini pozmadı:

– Hələ düzəlməmisiz? – dedi. – Dilxor olma, ə, düzələcəksən. Qorxub-eləmə, harda olsa, gəlib çıxacaq. Arvadlarımı tanımırsan? Olərlər, naz eləməsələr.

Qasım, əlləri ciblərində, pilləkənin altında dolandı:

– Nə təhər deyirsən? Qalırsan?.. Qal, yaxşı, bu günü də dincəl. Buralarda eşələn, başın qarışsın... Mən sənin yerində olsam, bu arxları elə bu saat qazıb, bir az dərinə salaram. Bu gün-sabah yay gəlir, su bağlayacaqsız, daşıb həyət-bacanı korlayacaq... Bu kötüyü də çıxart at getsin. Narların dibi də bellənməyib, bəlkə bir az gec gəldim. Darıxma, kefini də pozub-eləmə, düzələcəksiz, öz canım üçün... Çoxdan gedib? Bilmirsən hara gedib?.. Hara gedəcək? Yəqin dədəsinə baş çəkməyə gedib, ya da istəyir ki, bir az qorxutsun səni, yumşaltsın. Qorxub-eləmə, ə, bərk dur. Görərsən, mələyə-mələyə gələcək...

Qədir bir tikə pendir-çörək yedi, üstündən bir stəkan su içdi. Sonra *Qasımın tapşırıqlarını, ən yüksək rütbəli komandir əmri kimi*, yerinə yetirməyə başladı: əvvəl arxları qazdı, torpağı səliqə ilə yan-yörəyə bərkitdi. Sonra kötüyə girişdi. Kötüyü çıxarmaq çox uzun çəkdi. Günorta Səltənət doğrudan da gəlib çıxdı. O gələndə Qədir narların dibini belləməyə başlamışdı. Yenə bir müddət Səltənət qorxa-qorxa qapının qabağında durdu, oradan yazıq-yazıq Qədirin üzünə baxdı; sonra gəlib, pilləkənlərin yanında bir ağaca söykənib fikrə getdi, xeyli vaxt fikrə getdi və nəhayət dilləndi:

– Gəldim, Qədir, pal-paltarımı aparım. Dədəm də razıdır, bir söz demir. Gəlmisən – qal, niyə gedirsən? Oz evin-eşiyindir. Oz həyət-bacandır, ək, becər. Maşın götür, işlə, maaş al. Evində də heç nəyinə əl vurmamışam, nə qoyub getmişdin, o da qalır; dava vaxtı bircə palazını satmışam. Allaha şükür, hər şeyin var, evlənərsən, subay qalmayacaqsan ki!.. Beş-altı metrə parça alacaqsan, qurtardı getdi... Qız da



var, dul da var, nə qədər desən. Dul niyə alırsan, qız alarsan. Əyin-başın, boyun-buxunun... Allaha şükür bir az da cavanlaşmısan. Üzüyün də, saatın da sandıqdadır, heç birinə əl vurmayacağam. Öz pal-paltarımdan başqa mən burdan bir çöp də aparmayacağam, Qədir, özününküdür, özünün olsun, halal-xoşun olsun. Getmə. Qal. Evlən.

Səltənət sözünü deyib qurtarıb, evə yüyürdü, Qədir qüvvətsiz-taqətsiz, nar ağacının dibində qaldı. Çıxartdığı nəhəng kötüyə baxdı, ayağı altındakı torpağa baxdı, göyün tən ortasında dayanmış Günəşə baxdı... Səltənət, boğça əlində, evdən çıxdı, yavaş-yavaş pilləkənləri enib, küçə qapısına tərəf addımladı. Qədir Səltənətin dalınca baxmadı, yenə kötüyə baxdı, Günəşə baxdı, ayağı altındakı torpağa baxdı; beləcə xeyli vaxt – taqətsiz, qüvvətsiz... Güc-qüvvət Qədirin canına necə gəldisə, birdən gəldi, elə bil kötükdən gəldi, Günəşdən gəldi – Günəş kimi isti, kötük kimi sərt və Qədir birdən-birə hiss elədi ki, bu nəhəng kötüyü götürüb dünyanın lap o başına ata bilər, bu qoca nar ağacını kökündən çıxarda bilər. Hələ kötük nədir, nar nədir ki, lap Günəşin özünü də... göyün tən ortasında dayanıb, həyasız-həyasız baxan o əclafı, altı ildə bir zərrə də dəyişməmiş o köhnə qurdu, köhnə vicdansızı... Ancaq Qədir nə kötüyə əl vurdu, nə ağacı yerindən tərpətdi, bircə Günəşə baxıb dişlərini qıcırdatdı, yumruqlarını düyünlədi. Sonra Qədir evə cumub palazın üstünə sərildi, düyünlənmiş yumruqlarını başına çırpdı, qıcırtdanmış dişləri ilə əlini-qolunu gəmirdi, palazı-brezenti didib tökdü...

## 5

Qədir bilirdi ki, əynində təzə kostyum var, təmiz köynək var, başmaqlarının da təzə və təmiz olduğunu bilirdi. Qalstukunu özü bağlamamışdı, bilirdi ki, bağlamayıb. Qədirin bir alnının qarasından xəbəri yox idi, bir də gözlərindən. Alnındakı zədənin heç olmasa küt ağrısını hiss eləyirdi – bilirdi ki, alnı çarpayının dəmirinə dəyib, gözlərindənsə Qədir tam xəbərsiz idi, xəbərsiz olmasaydı, küçədə rastına çıxan bu ilk adamın hərəkəti Qədiri təəccübləndirməzdi...

Onda ki Qədir arxı qazırdı, kötüyü çıxarırdı, narın dibini belləyirdi, onda ki Səltənət gəlməmişdi, getməmişdi; onda ki göyün tən ortasında dayanmış Günəş həyasız, vicdansız və zalım deyildi, onda Qədirə elə gəlirdi ki, bu həyətdə yüz il yaşaya bilər, o narın dibini yüz il belləyə

bilər, o Günəşin işığını yüz il uda bilər... O həyətdə, o Günəşdə Qədirin altı il həsrətini çəkdiyi hər şeydən bir az vardı. Bir az isti, bir az işıq, bir az nar sevinci, bir az torpaq iyi... Ancaq elə ki Səltənət gəldi, getdi, elə ki Qədir evə cumub üzüqoylu yerə sərildi və üstəlik başını da çarpayının dəmirinə çırpandan sonra, ayağa durub, yan-yörəsinə baxanda hiss elədi ki, burada dayanmaq mümkün deyil, burada nəfəs almaq mümkün deyil. Başmağını geydi, pencəyini geydi, alnının qarasından, bir də gözlərindən xəbərsiz küçəyə çıxdı... Dükançı Ərşadın qapısı. Qədirin rastına çıxan bu ilk adam da yəqin ki, dükançı Ərşadın oğlu idi. Səkkiz-on yaşlı oğlan. Qapıda oturub siqaret satırdı və əgər Qədirin öz gözlərindən xəbəri olsaydı, səkkiz-on yaşlı bu uşağın hərəkətlərinə bəlkə də təəccüb eləməzdi.

– Ərsadın oğlusan?

– Hə...

– Dədən yenə dükanda işləyir?

– Hə...

– Siqareti neçəyə verirsən?

– Neynirsən? Sən siqaret alansan? Alacaqsan, pulunu verməyəcəksən.

– Nə bilirsən, verməyəcəyəm?

– Bilirəm də, sən Qədirsən, Qədir deyilsən?

Dükançının oğlu olasan, dükandan yüzcə addım aralıda oturub, dükanın siqaretini üç qat bahasına satasan, özün də belə tərs olasan, quduruğan olasan. "Yox, burda heç nə dəyişməyib. Bu da Ərşaddır, özüdür ki, var. Kərtənkələdir, ilbizdir, soxulcandır, hər nədirsə, insan deyil". Qədir təpiklə vurub, uşağın bərk-bərk qoruduğu siqaretləri dağıtdı. Əvvəl uşaq dinmədi, dağılmış "Avrora"ları tələsə-tələsə köynəyinin ətəyinə yığdı. Sonra qaçıb həyətə soxuldu və həyətdən Qədirin arxasınca qışqırdı:

– Dəli Qədir, xuliqan Qədir, oğru Qədir! Elə bilirsən tanımadım? Qədirsən də, şofir Qədirsən, Bilqeyisin xalçasını oğurlayan Qədirsən!..

Sonra yollar boş idi. Dükanın yanında da heç kəs gözə dəymirdi. Orada Ərşad kətil qoyub, öz dükanının qapısında tək oturmuşdu. Yox, Qədirin gözlərindən xəbəri yox idi; xəbəri olsaydı, bu sısqa, bu qozbel kişinin bu cür əl-ayağa düşməyinə də təəccüb eləməzdi.



– Paho, Qədir, tanımaq olmur səni, maşallah, maşallah, geyimdə, bazburutda bizim raytorqun müdirini vurub keçmisən ki! Bəs çöləzada niyə çıxmırsan, ə?.. Dünəndən gəlmisən, evdə neynirsən?.. İstəyirdim gələm, necə olsa qonşuyuq, haqqı-salamımız var, ancaq dedim, birdən narahat eləyərəm... İçəri keç, əyləş görək. Nə içirsən, yenə araq, yoxsa...

Qədir oturdu, dükana ötəri nəzər yetirdi, Ərşadın üzünə baxmadan:

– Yeməyə nəyin var? – dedi.

– Piçennidi, görürsən də, özgə bir şey yoxdu. İstəsən sənin üçün bir başsoğan da taparam.

Qədir dinmədi. Ərşad bir şüşə araq gətirdi, stəkan gətirdi, qutudan peçenye ovuclayıb piştaxtanın üstünə qoydu, bir yekə baş soğanı yumruğu ilə əzdi və şüşədən araq süzüb stəkanı doldurdu. Qədir arağı götürüb, dinməz-söyləməz içdi. İçəndən sonra da bir müddət susdu. Peçenyeyə və soğana gözünün ucu ilə də baxmadı. Ərşadın üzünə baxdı və yenə:

– Yeməyə nəyin var? – dedi.

– Olanım budur, Qədir, ayrı bir şeyim yoxdur, olsa ayıb şeydi ki!

– Orasını bilirəm. Onu demirəm. Deyirəm ki... sənin o raytorqun gələndə nə verirsən, kolxoz sədri gələndə, ispalkom gələndə... Onlara verdiyindən deyirəm, başa düşmədin?..

Ərşad başa düşdü. Bu müştərini Ərşad yaxşı tanıyırdı. Həmin müştəri idi, səsi də, duruşu da, baxışı da... Bir toyuğun tən yarısı, bircə dəqiqə keçməmiş, piştaxtanın üstünə gəldi, təptəzə təndir çörəyi gəldi, pendir gəldi, badımcan turşusu gəldi. Qədir gətirilənin hamısını yedi. Bircə arağın hamısını içmədi. Yarım stəkan da içdi, qalanını yavaş-yavaş yerə süzdü. Sonra o piştaxtanın ortasında, üstündə kibrit qutusu olan, ağzı açıq "Avrora"nı götürüb cibinə qoydu, cibindən bir şax yüzlük çıxartdı, Ərşadın yanına atdı və dinməz-söyləməz çıxıb getdi...

Ərşad yüzlüyü cibinə qoydu. Toyuqdan qalan sür-sümüyü piştaxtanın üstündən tez-tələsik yığışdırıb, qolu gəldikcə tolazladı. Bayırdan quru torpaq gətirib, yerə süzülmüş arağın da izini itirəndən sonra Ərşad Qədirin getdiyi səmtə baxdı, "Tfu" – deyib, səsi-nəfəsi gəlikcə gedənin dalınca tüpürdü. Ancaq, onda, Qədir uzaqlaşmışdı, çox uzaqlaşmışdı. Çayxanada, nərdtaxta oynayanların başına toplaşmış bir dəstə adamın arasında dayanmışdı. Zərlər Qədirin ovcunda idi. Qədir zərləri oynadırdı:

– Mənnən kim oynamaq istəyir?

Oyunu yarımçıq qalmış iki nəfər nərdtaxtanın dalından dinməz-söyləməz Qədirin üzünə baxırdı. Oynayanları hər tərəfdən dövrəyə almış azarkeşlər də sakitcə Qədirə baxırdılar. Aralıda, samovarın yanında durmuş çayçının da gözü Qədirdə idi: ağsaqqal, qədd-qamətli kişi, əynində parusin pencək, başında bahalı buxara papaq.

– Mənnən kim oynamaq istəyir?

Burada nərdtaxtanın başına yığışanların çoxusu cavan oğlanlar idi: bığ yeri təzəcə tərləyənlər. Elə bil hamısı bir boyda idilər, bir yaşda idilər. Bircəsi boy-buxunu ilə seçilirdi. Zorba şey idi, yaman şey idi. Boyda Qədirdən geri qalmazdı, kürəkdə, biləkdə bəlkə Qədirdən zorba idi. O, Qədirə başqaları kimi baxmırdı, sakitcə, mehribanca baxırdı və elə bil qəfildən peyda olub, bütün çayxananı çaşdırmış, susdurmuş bu adamın nə dərəcədə güclü olmağının, öz aləmində, dəqiq haqq-hesabını aparırdı.

Nərdtaxta dalında oturmuş iki nəfərin biri, nəhayət, səsini çıxartdı:

– Gəl otur, – dedi, – mən oynayıram.

Qədir oturdu:

– Nədən oynayırıq?

– Nədən istəsən.

Qədir çevrildi, yan-yörəsinə baxdı, gözünü çayçının buxara papağına zillədi.

– Qeybullanın papağından!

– Yox, aşna, bu ki zarafat oldu, sən nərd oynayana oxşamırsan. – Və oğlan nərdtaxtanın dalından qətiyyətlə qalxdı.

Yenə Qədir ovcundakı zərləri oynatdı:

– Qeybullanın papağından! Kim oynayır, otursun!

Yenə hamı susub dayandı. Hamı Qeybullaya baxdı. Qeybulla özünü eşitməzliyə vurdu və bayaqdan Qədirin hər bir hərəkətini diqqətlə izləyən nəhəng oğlan gəlib, səssizcə, Qədirlə üzbəüz oturdu.

– Mən oynayıram. Ancaq şərti necə olacaq? Uduzan...

– Uduzan Qeybullanın papağını götürüb, – Qədir pəncərənin altındakı zibilliyi göstərdi, – bax ora atacaq, o zibilin içinə, udan baxıb güləcək. Razısan?

– Razıyam.

Və elə gərgin bir oyun başlandı ki, bəlkə nərd tarixində belə oyun olmamışdı. Qədir uduzdu, çox tez uduzdu – zarafat deyil, altı il oynamamışdı. Uduzub ayağa durandan sonra Qədir bir an tərəddüd



eləmədən, Qeybullaya yaxınlaşdı, özünü mərd-mərdanə karlığa, korluğa vurmuş çayçının başından papağı götürüb zibilliyə tulladı. Ancaq heç kəs gülmədi, bir kəsin dodağı da qaçmadı və qəribə burasındadır ki, çayçının özü də zərrə qədər halını dəyişmədi. Gedib papağını gətirdi, silib başına qoydu, sakitcə, lap sakitcə Qədirin üzünə baxdı.

– Öz aramızdır, köhnə heyvərəliyində qalmısan ha, Qədir, – dedi, – heç dəyişib-eləməmisən.

– Sən dəyişmisən, görürəm: qeyrətini ucuz tutmağı öyrənmisən. – Qədir çayçının papağını göstərdi. Sonra çevrilib, çayxanada yeniyetmələrdən başqa kim vardısa, hamısını birbəbir sadaladı: – Sən də dəyişmisən, sən də, sən də... Hamınız dəyişmisiz, ancaq elə köhnə qurumsaqlarsız! İlbizlər, soxulcanlar, kərtənkələlər...

Sonra Qədir bir yol tutub sərxoş-sərxoş başyuxarı gedirdi. Bura kəndin mərkəzi idi – kitabxana, kolxoz idarəsi, həkim məntəqəsi. Kitabxanada da, həkim məntəqəsində də sərxoş Qədiri görmüşdülər, ötən əyyamları yadlarına salmışdılar, qapıları bağlayıb gizlənmişdilər. Qədir kolxoz idarəsinə girdi. İçəridə bircə uçotçu oturmuşdu, iri kağızın üstündə nəsə yazıb-pozurdu; Qədiri görəndə zərrə qədər də halını dəyişmədi, gözucu, ötəricə baxıb, sonra heç başını da kağızdan qaldırmadan:

– Ə, Qədir, gəlmisən? – dedi.

– Gəlmişəm.

– Gəlmisən, xoş gəlmisən, əyləş görək, danış görək – gəzdiyindən, gördüyündən...

O, başını yalnız bu vaxt qaldırdı. Bu vaxt Qədir otaqdan çıxmışdı. Kolxoz idarəsinin qabağındakı uzun dəhlizin bir tərəfində kənd soveti idi, bir tərəfində poçt idi – hər iki bağlı qapını Qədir bərk-bərk çəkdi, bir təpik poçtun qapısına vurdu, bir təpik kənd sovetinin qapısına vurdu, qayıdıb təzədən kolxoz idarəsinə girdi. Pəncərədən çölə baxa-baxa Qədir xeyli vaxt ortalıqda gəzindi, sonra gəlib, yer üzünün ən biganə adamı kimi oturmuş uçotçunun stolunun yanında durdu.

– Ə, Misir, – dedi, – axı sən bir vaxt vururdun.

– Yəni demək istəyirsən ki, vurmağın gəlir? Açıq de də, bizi niyə dolaşdırırsan?

– Gəlir, Misir! Varındısa, çıxart.

Uçotçu başını bir də qaldırmağı lazım bildi:

– Yoxdur, Qədir, cibişdan da boşdur. Cibişdanda bir şey olsaydı, düzələrdi.

Qədir əlini cibinə saldı.

– Var, – dedi, – düzəldə bilirsən, düzəlt.

Yer üzünün ən bigano adamı ayağa durdu. Pəncərədən çölə boylandı. Əlində kitab, bağlı kitabxananın qabağında durmuş bir uşağı çağırdı:

– Ə, a bala, bir bura gəl görüm.

Uşaq gəldi. Qədir cibindəki pulların hamısını çıxarıb stolun üstünə qoydu.

– Araq neçəyədi? – dedi.

Dünyanın ən laqeyd adamı, özünəməxsus bir laqeydliklə, qəh-qəh çəkib güldü:

– Siz bilən neçəyə olar, Qədir müəllim! Ha, ha, ha... Əlli ilin eşşəyi məndən dəyirmanın yolunu soruşur... Biri otuz manatdan, ikisi altmış manat eləsin gərək. Üç olsaydı, doxsan eləyərdi, amma doxsan eləməyi lazım deyil. Artıq olar. – O, Qədirin pullarının içindən altmış manat, bir də bir təklik götürdü. – Al, a bala, Ərşaddan iki araq al gətir, bu təkliyi də bas cibişdana. O kitabı da qoy bura, gələndə götürərsən. Yüyür görüm, cəld ol, tez gəl...

Sonra isə gec idi, qaranlıq düşmüşdü və qaranlıq bir yolla Qədir səndələyə-səndələyə gedirdi... Hansı tindənsə, döngədənsə Qasım peyda oldu. Əlindəki cib fənərinin işığını Qədirin üzünə saldı:

– Hardasan, ə, hansı cəhənnəmdəsən, bayaqdan gəzməmiş yer qoymamışam... Nə pis içmisən, ə? Harda içmisən? Bir saat gözləyəmmirdin? Gəlirdim də, nə xəbər idi! Bizim arvadağa da sənin yolunda özünü həlak eləyib: dolma bişirib, plov-mlov, dəm-dəsgah... Deyirdim bir əməlli oturarıq, neçə ildir oturmamışıq. Sən də gedib özünü bu vid-fasona salmısan. Bəs indi neynəyək deyirsən?.. Bəlkə gedib yatasan? Sabah gündüz oturruq, sabah mən də bekaram.

Qədir yuxulu-yuxulu dilləndi:

– Çıx get, Qasım, get dolmanı ye, məndən əlini üz, o işığı da o yana elə, gözümün giləsini deşmə.

Qasım işığı kənara saldı.

– Nə oldu, Səltənət gəlmədi?

– Sən çıx get dolmanı ye, sənə nə var – gəldi, ya gəlmədi.

– Bəs sən indi hara gedirsən?



– Mən billəm hara gedirəm, dərdi sənə qalmayıb.

Qədir Səltənətin atası evinə gedirdi. Bunu Qasım bilirdi, ancaq Qədirin bu vəziyyətdə ora getməyini Qasım istəmirdi. O, Qədiri aparıb yatızdırmaq istəyirdi, sonra hiss elədi ki, baş tutan iş deyil.

– Bilirəm hara gedirsən, – dedi. – Get, yaxşı, ancaq gedib, mən ölüm, hay-küy salma, Səltənəti dədəsinin yanında döyüb-eləmə, yazıqdır, kişi lap qocalıbdır, neçə vaxtdır yorğan-döşəkdədir.

Sonra Qədir bir qoca xəstənin çarpayısı qabağında durmuşdu:

– Mənəm, gəlmişəm, Qədirəm, sənin kürəkəninəm, gözün aydın, kişi!

Hər sözü dedikcə Qədir yumruğunu döşünə çırpırdı, elə bil sinədən deyirdi:

– Sevinmirsən? Sevinə bilmirsən? Yoxsa... ölürsən? Ölmə, kişi, ölmə. Ölməli adamlar çoxdur.

Ancaq qoca sevinirdi. Gözləri parıldayırdı. Dikəlmişdi. Əllərini Qədirə sarı uzatmışdı.

Qədir çarpayının yanında diz çöküb oturdu, qoca onun başını qucaqladı, qoca uşaq kimi ağladı:

– Ay oğul, ay Qədir, ay oğul, ay oğul!..

Qədir özünün də bu saat hönkürəcəyini hiss eləyib, birdən ayağa durdu, bir küncdə büzüşüb oturmuş Səltənətə baxdı:

– Bəs Qəmər arvad hanı, kişi?

Kişi dedi:

– Qəmər ölüb, çoxdan ölüb. – Ancaq küncdə büzüşüb oturmuş Səltənət hıçqırdı.

Araya bir müddət sükut çökdü.

O sükutu Qədir pozdu:

– İncimə, kişi, qızını aparacağam!

– Apar, ay oğul, nə deyirəm ki. Öz arvadındı, öz evinə aparırsan. Bayaqdan neçə dəfə demişəm get. Deyirəm, bala, bu vaxt adam öz evində olar, öz odunun, öz ocağının yanında olar. Apar, bala, mehriban olun, oğul-uşaq yiyəsi olun, mən qoca da bu gün-sabahlığam. Gedirəm, bala, ayağımın biri ordadır, barı elə eləyin ki, rahat gedim.

Kişi yenə başını yastığa qoydu. Bir müddət sakitcə tavana baxdı – ikicə xırda gözdə nə qədər işıq olarmış, ilahi! Kişi bir dikəldi, elə bil o işıq da birdən qığılcım olub ətrafa səpələndi:

– Səltənət! - dedi. – Sən hələ durmamısan?!

Və necə dedisə, Səltənət dik ayağa qalxdı. Səltənət dinməz-söyləməz qapıya tərəf addımladı, ancaq Qədir gözlərini kişidən ayıra bilmədi, ona baxan iki xırdaca gözün işığından uzaqlaşa bilmədi. Onlar xeyli vaxt beləcə dinməz-söyləməz baxışdılar. Elə bil kişi beləcə dinməz-söyləməz hər şeyi dedi. Ürəyində bircə sözü qaldı və bu bircə sözü qoca, qapıdan çıxan Qədirin dalınca qışqırıb dedi:

– Sən də, ay oğul, az iç o zəhrimarı! Az iç, ay oğul, az iç, az iç,...

...Sonra kəndə təptəzə ay işığı düşmüşdü. O təptəzə ay işığında Səltənət Qədirin qabağına düşüb, bir qara qul kimi gedirdi. Büzüşüb, qısılıb, balacalaşıb, əllərini, qollarını qoynunda, çarğatının altında gizlədib, bu kənddə, bu yolda, bu ayın işığında səssiz-səmirsiz yol gedən bu adama Qədir minnətdar idi; ona görə ki, bu adam vardı; ona görə ki, bu adam yol gedirdi; ona görə ki, bu adam o kişinin yanında Qədiri xəcalətdə qoymamışdı. "Nə yaxşı ki, özün durdun, özün yola düzəldin, Səltənət. Tərslik eləmədin, məni o kişinin yanında xəcalətdə qoymadın..."

Yollar boş idi, pəncərələrdə işıq yanırdı. İdarənin qabağında, bir uzun dirəyin başına bərkidilmiş radioda nəsə – bu kəndə, bu kəndin pəncərələrindəki çıraq işığına, bu kəndin dar yollarına, ayına-ulduzuna heç bir dəxli olmayan bir şey çalırdılar... Bir də, orda-burda, ara-sıra itlər hürüşürdü, qurbağalar quruldaşırdı...

Küçə qapısının astanasından da Səltənət dinməz-söyləməz keçdi. Pilləkənləri qalxdılar, dəhlizə girdilər. Səltənət otağın qapısına dirənib durdu. Əvvəl Qədir dəhlizdəki çırağı yandırdı, sonra evdəkini də yandırdı. Sonra qayıdıb Səltənətin qabağında dayandı:

– Yeri get yat. Rahat yat! Mən yenə burda yatacağam. Ancaq bu gecə qapını bağlamayacaqsan, Səltənət! Bağlasan, özün bil, sındıracağam!

Səltənət içəri keçdi. Qədir özü onun dalınca qapını çəkib örtdü. Dünəndən yerdə qalmış döşəyin üstündə oturdu. Sonra uzandı, pal-paltarlıca yuxuladı və yuxusunda Kür qırağının ucsuz-bucaqsız meşələrini gördü, sonra yenə Kürün dibini gördü, ancaq bu dəfə Kürün dibi işıq deyildi, qaranlıq idi. Qədir Kürdən, qaranlıqdan çıxmaq istəyirdi, ancaq çıxa bilmirdi: Nəsə əlinə, ayağına dolaşırdı, başına-gözünə sarınırdı, elə bil Qədir balıq toruna düşmüşdü. Sonra gördü ki, əlinə, ayağına dolaşan balıq toru deyil, Səltənətin saçlarıdır. Sonra Qədir haradasa, suyun lap dərinliyində öz iki qız balasının üzdüyünü gördü. Qədir qızlara tərəf üzmək istəyirdi, ancaq yerindən tərpənə



bilmirdi. Səltənətin saçları tor kimi əlinə-ayağına dolaşmışdı, başına-gözünə sarınmışdı. Qədir çapalayırdı, boğulurdu, saçlarsa onun əl-qoluna, baş-gözünə get-gedə daha da möhkəm sarınırdı...

Üz-gözünü tər basmış Qədir yerindən dik atıldı, elə bil Kürün dibindən çıxırdı. Oturdu. Bir müddət oturandan sonra da başını silkələdi, elə bil yuxuda gördüyü tor hələ də baş-gözünə dolaşmışdı. Sonra Qədir yerindən qalxıb, otağın qapısını lap ehmalca araladı. Səltənət palazın üstündəcə büzüşüb yatırdı, təkcə başının altına balınc qoymuşdu, çıraq da yanında yanırdı.

Qədir astanadaca dayanıb, xeyli vaxt yatmış Səltənətə baxdı. Sonra çarpayının örtüyünü götürüb Səltənətin üstünə saldı. Sonra, nə fikirləşdisə, örtüyü götürdü, pencəyini əynindən çıxartdı, Səltənəti ehmalca öz pencəyinə bürüdü və çırağın işığını püfləyib söndürdü... Gecənin hansı aləmi olduğunu bilmək çətin idi. Ay batmışdı və bayır elə qaranlıq idi ki, elə bil dünyanın işığı bir də dünyaya qayıtmayacaqdı...

Az keçdi, çox keçdi, yenə dünyanın işığı dünyaya qayıtdı. Yenə gün çıxdı. Kürün bulanıq sularını parıldatdı, ucsuz-bucaqsız meşələrini işıqlatdı. O işıqdan Səltənətin də pəncərəsinə düşdü, evinə düşdü... Dəhlizdəki yorğan-döşəyin üstünə, Qədirin qara, qəşəng çamadanının boş yerinə gün düşdü... Bir-iki qutu vafli, bir-iki qutu peçenye, konfet, süd konservi, balıq konservi... Əvvəl Səltənət Qədirin yorğanını götürdü, aparıb eşikdə tozunu çırpdı, gətirib səliqə ilə çarpayının üstünə açdı. Sonra döşəyi götürdü, döşəyi də çırpdı, döşəyi də çarpayının üstünə açdı və balıncın dalınca getdi...

## 6

O, bircə balıncı çırpmadı, çırpa bilmədi, çünki taqəti üzülmüşdü, gücü qurtarmışdı, nə qolunda, nə qıçında zərrəcə qüvvət qalmışdı.

Səltənət, balınc qucağında, içəri girdi, balınc qucağında çarpayıya yaxınlaşdı; çarpayının yanında, balınc qucağındaca, onun dizləri büküldü və Səltənət gözünün yaşını sel kimi balıncın üstünə axıtdı.

– Qədir, ay Qədir, ay Qədir!..

*1970*

## GÜLLÜ PALTAR MÖVSÜMÜ

### I

Canəli müəllim öz birotaqlı mənzilinin iki pəncərəsinin hər ikisini taybatay açmışdı, eşik qapısını da azca aralı qoyub, çarpayıya uzanıb işsizlikdən, aşkar bekarçılıqdan son dərəcə gülməli bir şeyin barəsində xeyli vaxt idi ki, fikirləşib baş sındırırdı.

Canəli müəllim fikirləşirdi ki, görən Bakının yayı əvvəllər niyə o cür isti olurdu, bunun səbəbi nə idi? Yəni səbəb təkcə o idimi ki, əvvəllər Canəli müəllimin Bakıda öz ayrıca mənzili yox idi? Bəlkə bunun başqa səbəbləri də vardı?.. Bunun bir səbəbi də tutalım o idi ki, mənzili olmadığı vaxtlar Canəli müəllimin elə dolanışığı da sən deyən yaxşı deyildi. Beş il tələbəlik: ayda otuz-qırx manat (köhnə pul ilə üç yüz-dörd yüz). İki il aspirantlıq – bu da deyək ki, yetmiş. Yetmişin on beş manatını Canəli müəllim hər ay Buzbulağa, anası Mahrux arvada göndərirdi. Bu da öz yerində. Bundan sonra – bir il "çasoviklik" dövrü. Bu dövrdə Canəli müəllimin əlinə nəqd yüz beş manat pul gəlirdi, bunun otuz manatı Mahrux arvadın, yerdə nə qalır? Yetmiş beş manat. Düzdür, o yetmiş beş manatla bərabər, o vaxt Canəli müəllimin belə bir mənzili də olmuş olsaydı, söz yox ki, dünya onun gözündə bir az başqa cür də görünə bilərdi, – bu da deyək ki, həqiqətə az-çox uyğun gəlir. Amma bütün bunların havanın isti-soyuqluğuna, yəni doğrudanmı, bu boyda dəxli vardı?..

Canəli müəllim bu sayaq fikirləşirdi.

Buzbulaq camaatının dili ilə desək, bu saat yayın lap "ilanmələdən" vaxtı idi: avqust ayı, avqustun ortaları, – özü də günün isti vaxtı (saat on ikiyə işləyirdi). Və deməli, burada doğrudan da nəsə bir hikmət vardı, çünki dünyanın istisi-soyuğu təkcə dərəcə ilə ölçülə bilsəydi, elə bu dəqiqənin özündə gərək Canəli müəllimin təri dabanından süzüləydi (bu səhər o, bazarın gur səsli radiosunda hava haqqında verilən məlumata qulaq asmışdı və o məlumatda bu gün Bakıda 38-39 dərəcə isti olacağını demişdilər. Otuz səkkiz, otuz doqquz... Bəs o isti hardaydı bu saat? Axı, vaxt vardı ki, 38-39 dərəcənin elə adınca eşidəndə adamın dili ağzından bir qarış çölə çıxırdı... Bəlkə əvvəllər Canəli müəllim, indiyə baxmış, bədəncə zəif idi – onun istiyə-soyuğa indiki qədər dözümü-tabı yox idi?.. Mümkündür, bu da mümkündür.



Buna qalsa, lap elə orası da tamamilə mümkündür ki, bir para xırda-mırda şeyləri qurdalayıb, içindən dərd çıxarda-çıxarda da bu gözəl, gen dünyanı adam özü üçün cəhənnəm kimi isti eləyə bilər: məsələn, niyə mən filankəsə salam verdim, filankəs mənim salamımı almadı! Niyə kolxoz bazarında filan şey filan qiymətə oldu, halbuki filan qiymətə də ola bilərdi? Dekan belə gəldi, zavmaq belə getdi... it hürdü, çaqqal uladı. Və o Fətdah da gedib maşın aldı özünə... Mümkündür, tamamilə mümkündür və bu da tutaq ki, bir səbəb: narahatlıq, əsəbilik, nəyəsə hədsiz nifrət və o nifrətin boğulması, sıxılması, qızışması ilə əlaqədar olaraq... – Canəli müəllim gülümsədi. – Bir sözlə, – dedi – subyektiv amillərin obyektiv mühitə təsiri. Amma doğrudanmı? Doğrudanmı belə-belə şeylərin havaya da təsiri ola bilərdi?

Canəli müəllim rahatca çarpayıya uzanmışdı (və çox güman ki, səhər bazarın radiosunda hava haqqında verilən müfəssəl məlumata qulaq asdığına görə) birdən ağlına yerləşmiş bu qəribə məsələni özü üçün ayırd eləməyə çalışırdı... Eyni vaxtda mətbəxdə Canəli müəllimin bu səhər bazardan aldığı toyuq bişirdi. Eyni vaxtda vanna otağında boruların içi ilə şırhaşır su axırdı. Və görən, Buzbulaq arxlarının qırağında Canəli müəllimin nəyi qalmışdı ki, o suyun şırıltısına qulaq asdıqca, yenə onun fikri-zikri o arxları qarış-qarış dolanırdı?.. Buzbulağın bütün arxları bu saat Canəli müəllimin gözü qabağında idi. O arxların hamısından su gedirdi və o su eyni vaxtda elə bil Canəli müəllimin içindən də axırdı: Buzbulaq bütün arxları ilə birgə elə bil Canəli müəllimin içində idi, yaxud bu dünyada Canəli adında heç bir canlı məxluq-zad yox idi – bir quruca xəyal vardı və bir vaxt Buzbulaq arxlarının qırağında yaranmış o xəyal elə bil yenə ora qayıtmışdı, o arxların suyuna qarışıb sakitcə axıb gedirdi... Və kim bilir, o vaxtların yayı Canəli müəllimə bəlkə bir də ona görə indikindən qat-qat isti gəlirdi ki, onda Canəli müəllim elə xasiyyətcə də, indiyə baxmış, narahat adam idi? Həm özünə bir gün ağlamaqdan ötrü, səhərdən-axşama çalışıb-çabalayasan, həm də gecə-cündüz fikirləşəsən ki, yaş ötür, ömür gedir – canında gecə-gündüz evlənməyin odu ola, yanğısı ola... Mümkündür, bu da mümkündür. Və yayın bu vaxtında, həmin Bakı şəhəri bəlkə Canəli müəllimə bir də ona görə əvvəlkindən sərin gəlirdi ki, o odun, o yanğının istisi də indi onun canından nisbətən çəkilib getmişdi?..

Canəli müəllim uzanıb fikirləşirdi. Eyni vaxtda Canəli müəllimin xəyalı Buzbulağın arxlarını dolanırdı. Eyni vaxtda, mətbəxdə, onun bu

səhər bazardan aldığı toyuq bişirdi. Bayırdakı hündür qələmə ağacının baş budaqlarının zorla seçilən namnazik kölgəsi otağın qarşı tərəfdəki divarının üstünə düşmüşdü. Yay günəşinin isti, qırmızıtəhər işığı da orda idi. Və görən o nə işıq idi ki, (aman, Allah!) bu gecə yenə Canəli müəllimin yuxusuna girmişdi?.. O necə səhər idi? O necə günəş idi? O necə otaq idi ki, bir yaşıl dağın dalından təzəcə baş qaldırıb, dünyanın duruluğu, təmizliyi, zərifliyi barədə məhz bu gün gətirdiyi və çox uzaq, çox mötəbər bir yerdə gətirdiyi şad xəbəri içinin gümüşü aynasında bütün yer üzünə fəxr ilə göstərən günəşin işığı nə ki var orda idi, o otaqda idi... O otağın pəncərələrində ağappaq tül pərdə vardı. O otaqda ağ örtüklü stol vardı və o stolun arxasında bir cüt ağ köynəkli uşaq əyləşmişdi: biri Canəli müəllimin oğlu idi, o biri Canəli müəllimin qızı idi. O yuxuda Canəli müəllimin arvadı da əyninə ağappaq don geymişdi və Canəli müəllimin arvadının da üzündə o qəribə günəşin işığına oxşayan bir qəribə işıq vardı...

Canəli müəllim hiss elədi ki, o odun, o alovun yanğısı içini təzədən göynətməyə başlayır və elə bu səbəbdən də, yəqin ki, Bakının bir zamanlar indikindən nəyə görə isti olmağı barədə o, heç bir dəqiq nəticəyə gəlib çıxa bilmədi.

Canəli müəllim bu qərara gəldi ki, bir müddət fikirləşməsin, heç nə barədə fikirləşməsin – gördüyü o qəribə yuxunun məstliyində Canəli müəllim bir qədər sakitcə uzanmaq istədi və elə o məstlik də, deyəsən, çox keçməmiş Canəli müəllimi tamam başqa bir aləmə aparıb çıxartdı, çünki mətbəxdəki toyuq qazanından, divardakı yarpaq-qarışıq gün işığından, Canəli müəllimin (tələbəlik dövründən qalma) o qəribə yuxusundan və Fətdahın maşın almağından əlavə, bu dünyada bir nağıl da vardı. O nağılı bir vaxt Canəli müəllimə Mahrux arvad danışmışdı (qəribə nağıl idi). Amma necə iş idisə, dünyanın o isti vaxtları (yəni, tələbə, aspirant, "çasovik" olduğu illər) o nağıl Canəli müəllimin bir dəfə də yadına düşməmişdi. Canəli müəllimin "əyyami-qədimdə" eşitdiyi o nağıl günlərin bir günü (elə bu otağın özündəcə) sanki qeybdən zühur eləmişdi və o vaxtdan bu yana Canəli müəllim o nağılı öz beynində elə hey fırladırdı ki fırladırdı. Canəli müəllim nağılı bütöv yadına salmaq istəyirdi, amma heç cür yadına sala bilmirdi, o nağıldan vur-tut ikicə cümlə olduğu kimi yadda qalmışdı, bir də Canəli müəllim nağılın məzmununu, çox dumanlı bir şəkildə, təsəvvürünə gətirə bilirdi. Neçə vaxt idi ki, Canəli müəllim o dumanı dağıtmaq



istəyirdi. Canəli müəllimin hey fikrindən keçirdi ki, bir dəfə kitabxanaya getsin. Gedib indiyəcən çap olunmuş nağıl kitablarının hamısını alıb qabağına töksün, baxıb görsün ki, o nağıl kitablarda var, yoxsa yoxdur. Hətta Canəli müəllimin evdən bu niyyətlə çıxdığı vaxtlar da az olmamışdı, amma bunların heç birində o, gedib kitabxanaya çatmamışdı (görünür, aspirant olduğu vaxtlar kitabxana onu möhkəm bezdirmişdi). Bir də, kim bilir, öz nağılını hər hansı bir kitabda görməkdən bəlkə Canəli müəllim qorxurdu; qorxurdu ki, nağıl onun üçün birdənbirə bakirəliyini itirər, müqəddəslikdən düşər (çünki qara-qura çap maşınlarının, iyli-qoxulu mətbəə havasının bakirəlik-müqəddəslik məsələlərindəki parlaq əməllərindən Canəli müəllimin o dumanı dağıtmaq, o nağılı olduğu kimi təsəvvür eləmək cəhdlərinin özü də, əslinə qalsa, bir növ qəribə məsələ idi (çox güman ki, baş qatmaqdan, vaxt keçirməkdən ötrü idi). Ona görə ki, o dumanın dalında gördüyü aləmi Canəli müəllim dumansız çətin ki, görə biləydi, bir də lap görsəydi belə, ondan bu boyda ləzzəti çətin ki, ala biləydi, çünki bir vaxt o nağıla qulaq asa-asa Canəli müəllimin haradasa gördüyü, göz önünə gətirdiyi aləm hələ dururdu, yox olmamışdı. Bu aləmdə ulduzların rəngindən tutmuş, havanın iyinə-tamınacan min cür göz oxşayan, könül açan şey vardı. Nağıl yadına duşdukcə, bu şeyləri də Canəli müəllim hər dəfə təzədən görürdü. Canəli müəllimin fikrində aləm qarışırdı və o vaxtdan yadında qalan ikicə cümləni dönə-dönə təkrar eləyə-eləyə Canəli müəllim nağılın ayrı yerlərini yadına salmaq istəyirdi.

*"...Dərzinin qızı dərzi, kərdidə reyhanın sayı neçədir?".*

*"...Padşahın oğlu padşah, göydə ulduzların sayı neçədir?".*

Öz nağılını yenə beynində fırlada-fırlada Canəli müəllim bişirdiyi toyuğa baş çəkməkdən ötrü durub mətbəxə getdi. Hələ mətbəx tərəfə gün gəlməmişdi, ancaq günün bayırdakı həyət dolusu işığı mətbəxdən görünürdü. Və indi gözünün bir ucu ilə Canəli müəllim həyətdəki işığa baxırdı, bir ucu ilə qazandakı toyuğa baxırdı. Və gözünün bir uçuyla da o, yenə Buzbulağa baxırdı ki, orda, o Buzbulaqda, Canəli müəllimin fikrincə, bu saat Mahrux arvadın da kefi pis olmalı deyildi, yaxşı olmalı idi. Həyətdə, ocağın üstündə bu saat Mahrux arvadın xörəyi bişirdi. Mahrux arvadın özü isə yəqin ki, kərdinin qırağında əyləşmişdi: reyhandan, soğandan, vəzəridən bir-bir qoparıb çarğatının ucuna yığırdı. Bir azdan Mahrux arvad həmin o reyhanı, soğanı, vəzərini barmaqları arasında bürmələyib, ağzının qabaq tərəfindəki, hələlik

karına gələn, ikicə kötük dişinə sürtə-sürtə günorta çörəyini yeyəcəkdi. Çörəyini yeyə-yeyə Mahrux arvad danışacaqdı, mütləq danışacaqdı; onun səhərdən başladığı söhbət elə başlandığı kimi də davam eləyəcəkdi: gah astadan, gah ucadan, gah aşkarda, gah ürəyində. Və min bir əzabla yediyi o göy-göyərti ağzının qabaq tərəfindəki o ikicə kötük dişi ağrıdanda Mahrux arvad hirslənib, Canəli müəllimi hətta söyəcəkdi də: "Tərs köpəyoğlu, dəli köpəyoğlu, o vədə mən deyənə qulaq asmadın, indi qal. Arvadsız qal. Yaşının bu vaxtında özün çay qoy özünə. Ev süpür, paltar yu, xörək bişir...".

Mahrux arvadın hirsləndiyini görəndə Canəli müəllim gözünü həyətdəki gün işığından çəkdi. Fikirləşdi ki, lap bir günlüyə də olsa, gərək getsin, mütləq getsin, gedib arvada baş çəkib qayıtsın (Canəli müəllimin bu mənzilə köçdüyü birinci il, yazqabağı Mahrux arvad gəlib, bir ay Bakıda qalmışdı. Gedəndə də belə bir ultimatum vermişdi ki: "Bəs bu evə bir arvad alıb gətirməsən, day məndən Bakı adlı yerə ayaq basdı yoxdu").

Hər şey bir yana dursun, Mahrux arvadın "Bakı adlı yerdə" necə darıxmağı Canəli müəllimin lap yüz il bundan sonra da çətin ki, yadından çıxaydı. Onun pəncərənin qabağında oturub, yola baxmağı isə xalis müsibət idi. Əvvəla, ona görə ki, uzun-uzun fasilələrlə gəlib-gedən tramvaydan savayı o yolda baxmalı bir şey yox idi. İkincisi, o yola bu qədər baxmaqda Mahrux arvad həmin o tramvayla bu dünyanın böyük-böyük qatarları arasında deyəsən bir oxşarlıq tapmışdı. Və üçüncüsü, o pəncərənin qabağında əyləşdiyi vaxtlar Mahrux arvad baxmağına tramvay yoluna baxsa da, görməyinə heç şübhəsiz, Buzbulağı görürdü. Dünyanın böyük-böyük qatarlarına oxşatdığı o tramvaylarda yəqin ki, Mahrux arvad bütün günü Buzbulaq yolu gedirdi. Mahrux arvadın gülümsəməyini, hərəkət eləməyini, yaxud onun yolçəkən gözlərində hər hansı bir sevinc əlaməti, həyat nişanəsi əmələ gəldiyini görəndə Canəli müəllim bilirdi ki, arvad çatıb: oradadır, Buzbulaqdadır. Belə vaxtlarda Canəli müəllimin özü də anasının gözü ilə Buzbulağa baxırdı və görürdü ki, Buzbulaq gözəl yerdir, yaşamalı yerdir... Canəli müəllimin Mahrux arvadın gözləri ilə gördüyü Buzbulaq heç olmasa, ona görə yaşamalı yer idi ki, bu Buzbulaq geniş idi, çox geniş idi – onun nə əvvəli, nə axırı vardı. Bu Buzbulağın yaşı daha çox idi, çörəyi daha dadlı idi, suyu daha içməli idi. Və yaşı, suyu, çörəyi bir yana dursun, Canəli müəllimin Mahrux arvadın gözləri ilə gördüyü Buzbulaqda hətta adamın sayı da çox idi, lap çox idi: orada bir dünyanın adamı vardı. Və tramvay yoluna baxdığı vaxt Mahrux arvadın dodaqlarının da tərpəndiyini görəndə, Canəli müəllim yəqin bilirdi ki, arvad danışır, o bir dünya adamın hansı biri iləsə şirin-şirin söhbət eləyir. Və Canəli müəllim onu da yaxşı bilirdi ki, həmin söhbəti qarı, məsələn, dağ ilə, daş ilə, qarğa ilə, toyuq ilə... lap o kərdidəki reyhanın özü ilə də eləyə bilər.

"...Dərzinin qızı dərzi, kərdidə reyhanın sayı neçədir?".

Padşah oğlunun dərzi qızına bu cür sataşmağı ilə başlanan o nağıldakı reyhan kərdisi haradasa ulduzları parıldayan bir dumduru göyün altında idi. Bir qəribə yer idi (Buzbulağa həm oxşayırdı, həm də oxşamırdı). Bir qəribə sərinlik idi, bir qəribə sakitlik idi və o sərinlikdə, sakitlikdə göyün gümüşü ulduzlarından bir reyhan kərdisinin üstünə elə qəribə bir işıq düşmüşdü ki, o işıqda kərdidəki reyhanlar da göydəki ulduzlar kimi sayrışırdılar. Padşah oğlu dərzinin qızını çağıranda ulduzların gümüş gözü kərdidəki reyhanlara zillənirdi. Dərzi qızı padşahın oğluna cavab verəndə kərdidəki reyhanlar başlarını qaldırıb, göydəki ulduzlara baxırdı. Beləcə, bir axşamçağı, bu ulduzlu- reyhanlı dünyada bir qəribə sevgi başlanırdı. İndi isə günorta çağı idi və Canəli müəllimin qoca anası Mahrux arvad yığdığı göy-göyərtini sümükləri görünən üç arıq barmağı arasında bürmələyib, qabaqdakı iki kötük dişinə sürtə-sürtə tələsmədən günorta çörəyini yeyirdi. Buzbulağın alçaq ağaclarının büdaqlarında indi cırcıramalar möhkəm səs-səsə vermişdi. Buzbulağın hündür ağaclarının göyümtül kölgəsi indi günün yandırıb-qarsıtdığı torpaq yolların üstündə idi və o yollardan da elə bil cırcırama səsinə oxşayan sızıltılı-giziltili səs qalxırdı. O yollardan Buzbulaq arvadlarının səsi gəlirdi: "Belə səni xoş görmüşük, Canəli müəllim, həmişə evində-eşiyində. Bəs sən bu kəndə havaxt cüt gələcəksən, ay Canəli, saç-saqqalı ağartdın axı". Dilli-dilavər Buzbulaq arvadları günün yandırıb qarsıtdığı o torpaq yolların üstündə qıvraq-qıvraq yeriyirdi. Canəli müəllim o torpağın üstünə ayağını qorxa-qorxa basırdı, özü də ona görə yox ki, torpaq isti idi, bərk isti idi, – ona görə ki, bu yaşda, Buzbulağa tək gələnin o torpağın üstündə cəsarətlə yeriməyə ixtiyarı yox idi. Ona görə ki, günün bu vaxtında ev içi, ağac kölgəsi nə qədər ləzzətli olsa da, Buzbulaq çeşməsinin suyu da başlı-başına axıb getməli deyildi və deməli, o yolun üstündə bu saat öz vedrəsi, ya güyümü ilə bir başqası da mütləq görsənəcəkdi. "Belə səni

Öz mənzilindən Canəli müəllim razı idi, çox razı idi: qazından da, suyundan da, qış vaxtı, odunsuz-tüstüsüz, tərtəmiz istisindən də... Nə olsun ki, Buzbulaq çeşməsinin suyu da hərdənbir Canəli müəllimin könlünə düşürdü. Nə olsun ki, kənddəki sobaları da hələ Canəli müəllimin yadından çıxmamışdı və bir vaxt o sobanın üstündə bişən əvəlik aşının, erişte şorbasının iyi bu Bakı şəhərində hərdən Canəli müəllimin burnuna dəyirdi... O sobanın istisində ləzzətlə qızınmaqdan ötrü hərdən Canəli müəllimin ayaqları möhkəm üşümək istəyirdi; hərdən onun əlləri də dinc durmurdu: əllər bel sapından, balta sapından yapışmaq istəyirdi; əllər də üşümək istəyirdi; üşüyüb isinmək istəyirdi... Arabir Canəli müəllimə hətta elə gəlirdi ki, dünyanın var-yox ləzzəti də elə bunlardır, bu dünyada bunlardan savayı ayrı ləzzət-zad yoxdur. Amma Canəli müəllim burasını da yaxşı bilirdi ki, bütün bunlar boş şeydir, onun, orta məktəbi təzəcə qurtarmış (səsindən dağ havası, nəfəsindən gül iyi gələn) bir tərtəmiz, gözəl-göyçək kənd qızı ilə evlənmək arzusu kimi heç vaxt baş tutmayacaq puç bir xəyaldır, çünki Canəli müəllimin indiki əqidəsinə görə, o cür qız bu dünyada, çox güman ki, heç yox idi və əgər vardısa da, hər halda dünyanın özündə deyildi, – nağılındaydı, nəğməsindəydi. (və bu dünyada, doğrudan da, bəzi nəğmələr vardı ki, onları eşidəndə bu dünyanın özündə də bir vaxt o cür qızlar olduğuna Canəli müəllim hərdən inanmağa başlayırdı). O qızı Canəli müəllimin ömründən, sanki onun özündən də xəbərsiz, ötüb-keçən illər götürüb aparmışdı. "Apardı sellər Saranı, bir alagözlü balanı..." – bu əhvalatı mahnı dilində təxminən belə də izah eləmək olardı, amma bütün bu işlərin mahnısız izahına gəldikdə, cəsarətlə demək mümkündür ki, Canəli müəllim Bakının rahat qazını burda qoyub, gedib Buzbulaqda ocaq qalayıb, tüstüsünə oturası deyildi...

Və deməli, haradasa həmin o on yeddi yaşlı qız (o qızın rəsmini Canəli müəllimdən ötrü elə bil Allahın özü çəkmişdi – çoxdan, lap çoxdan, bəlkə də Canəli müəllimin ağlı kəsəndən bəri, bəlkə də onun öz kişiliyindən xəbər tutduğu eyni gündə, eyni saatda çəkmişdi. Və sən demə, təsviri sənət sahəsində də Allahın – rəssamlıq, rəngkarlıq işinin yüksək tələbləri səviyyəsindən bir qədər aşağı olsa da – hər halda müəyyən professionallıq səriştəsi varmış, çünki neçə illərdən bəri Canəli müəllim o rəsmə böyük məmnuniyyətlə tamaşa eləyirdi və kim bilir, hələ bundan sonra da nə qədər tamaşa eləyəcəkdi)... Bir də haradasa ocaq tüstülənirdi – Canəli müəllimin burnuna o tüstünün



ləzzətli iyi gəlirdi. Və mətbəxlik işini qurtarıb təzədən çarpayıya uzanmış Canəli müəllim indi onu fikirləşirdi ki, o ocağın tüstüsü görən vaxt keçdikcə unudulacaqdımı, yoxsa o da qız kimi beləcə, indiki sayaq heçdən, gözlənilmədən peyda olub, Canəli müəllimin bu dünya barəsindəki hələ təzə-təzə yoluna düşən əzabsız-ağrısız aydın fikirlərini ara-sıra yenidən dolaşdıracaqdı...

Canəli müəllim fikirləşirdi və haradasa, kiminsə radiosunda bayaqdan bəri oxunan mahnıya qulaq asırdı. Və o ocağın tüstüsünü, o qızın Allah tərəfindən rəsm olunan şəklini də Canəli müəllimin xəyalına gətirən çox güman ki, elə o mahnı idi: "Apardı sellər Saranı...".

Mahnı qurtaranda Canəli müəllim gözucu saata baxdı – on ikinin yarısından vur-tut beşcə dəqiqə keçmişdi. Vaxt ləng gedirdi və vaxtın ləng getməyi ilə də Canəli müəllim havanın xeyli istiləşdiyini müəyyən elədi. O durub dəhlizin qapısını tamam açdı və qayıdıb təzədən çarpayıya uzanmaq istəyirdi ki, açıq qapıdan qonşu qızın sevincək səsini eşitdi: *"Sizi telefona çağırırlar"*.

Təəccüblü idi. Canəli müəllimi o telefona kim çağırırdı? O telefonun nömrəsini o adama kim vermişdi? (Axı qonşudakı telefonun nömrəsini Canəli müəllimin heç özü də bilmirdi). "Birdən – dedi, – birdən" və bunu deyə-deyə Canəli müəllimin içində elə bil nəsə tel nazikliyində bir şey o saatca yandı – yanıb, bir andaca kül oldu, kül olub soyuya-soyuya dağılıb, tezcə də yoxa çıxdı. O telefonun üstünə Canəli müəllim ürəyində ağı deyib Mahrux arvadı çağıra-çağıra getdi. Dəstəyi qaldırıb yazıq-yazıq "bəli" dedi və onun telefonda eşitdiyi səs Buzbulaq adamının səsindən son dərəcə fərqli olduğundan, elə o səsi eşidən kimi də Canəli müəllimin ürəyi yerinə gəldi: onu institutda qəbul imtahanı götürməyə çağırırdılar (görən, gün hardan çıxmışdı!). Səs qız səsi idi: filan saatda, filan qrupda, filan fəndən... Canəli müəllim dəstəyi yerə qoyub, gözucu qonşu qıza baxdı. Qız, bu yayın əvvəlindən Bakıda birdən-birə dəbə düşmüş, uzun, güllü paltarında dayanıb, sirli-sirli Canəli müəllimin üzünə gülümsəyirdi. Canəli müəllim də qızın üzünə gülümsədi və mənzildə ayrı adam olmadığını qonşu qızın elə gözlərindəcə oxuyub, daha burda dayanmağı məqsədəuyğun hesab eləmədi. Canəli müəllim öz otağına qayıdıb, (bir stolu və bir-iki stulu çıxmaq şərti ilə) bu otağın yeganə mebeli sayıla biləcək paltar şkafının aynasının qabağında dayandı. Canəli müəllim o aynada özünə baxdı və elə bil o aynanın harasındasa bir müddət qonşu qızın uzun donunu da

gördü, çünki o donun üstündəki xırda-xırda, qırmızı-qırmızı güllər Canəli müəllimə yaman tanış gəlirdi. Qonşu qızı o paltarda gördüyü ilk dəfədəncə Canəli müəllim o güllərin nə gülü olduğunu az qala hər gün fikirləşirdi və bu fikirləşməyin axırı hər dəfə eyni bir nəticə ilə qurtarırdı: Canəli müəllim yaddaşının korlandığını düşünüb ürəkdən kədərlənirdi.

Bu dəfə Canəli müəllim kədərlənmək istəmədi, çünki zarafat deyildi: ömründə birinci dəfə onu qəbul imtahanı götürməyə çağırırdılar. O qızı da, o donu da, o xırdaca-xırdaca, qırmızı-qırmızı gülləri də Canəli müəllim sanki haradasa o aynanın dərinliyində hələlik rahat qoyub, paltar şkafından aralandı... Filan qrupda, filan saatda, filan fəndən... – Axı, dünya düzəlir, deyəsən, Canəli müəllim, – dedi. Və uzaqdakı tramvay yoluna baxa-baxa sonra Canəli müəllim fikirləşdi ki, Mahrux arvada baş çəkmək üçün kəndə gedəsi olsa, gərək tez getsin, tez də qayıdıb gəlsin, çunki ayın axırlarında, həm burdan bilet alıb Buzbulağa getmək, həm də ordan bilet alıb Bakıya qayıtmaq çətin olacaqdı...

II

– Yox, qardaş, belə yaramaz. Bu təhər fikirləşməyinən sən heç vaxt bir nəticə hasil edə bilməyəcəksən. Fikirləşib yorulacaqsan. Yorulub aləmi qarışdıracaqsan. Sonra – yenə təzədən. Sətir başından. Yeni səhifədən... Beləcə, ölənəcən... Ölənəcən bilməyəcəksən ki, fikrin nədir, azarın nədir. Əgər bacarıb, bu fikir-xəyalətin daşını birdəfəlik atsaydın, əlbəttə, lap əla olardı. Amma madam ki, bunu eləmək əlindin gəlmir, onda, heç olmasa adam ol, bir qədər sistemli fikirləş. Elə fikirləş ki, bundan bir şey çıxsın, bir nəticə hasil olsun. Götür konkret bir məsələni, axıracan fikirləş. Bax, elə bu məsələnin özünü götür: sənə elə gəlir ki, dünya xarab olub, elə deyilmi, qardaş? Belə isə zəhmət çək, papağını qoy qabağına bir əməlli-başlı fikirləş. Fikirləş gör, konkret olaraq, sən bu dünyanın nəyindən narazısan. Bax elə o 1955-ci ildə sən bu Bakı şəhərinə gələndə, bu şəhər indikindən yaxşı idimi? Əgər yaxşı idisə, nəyi yaxşı idi? Allahın beş metrə çitindən ötrü camaat az qalırdı bir-birini qıra... Sən bunu öz gözünlə görmüşdünmü? Görmüşdün. Belə isə bəs indi hər hansı bir "importnu" şey üstündə camaatın mağazada dava salmağı niyə sənə bu qədər yer eləyir? – Canəli müəllim küçənin o başından gələn güllü donlu qızlardan birini qonşu qıza oxşadıb, fikrinə bir anlığa ara verdi, amma fikrin yayınmağına yol vermədi. – Düzdür, – dedi, – o hay-həşirdən, o vurhavurdan sonra, günlərin bir günü o adamlar o "importnu" paltarı əyinlərinə geyib, insan ləyaqətinin, insan mədəniyyətinin və üstəgəl insan gözəlliyinin ən son nailiyyətlərini bu şəhərin küçələrində nümayiş etdirməyə çıxanda sən istər-istəməz çaşırsan. Və sən belə şeylərdə ona görə bu qədər çaşırsan ki, bu adamların o "importnu" paltar, ya ayaqqabı növbəsində – dünən, srağagün, ya elə bircə saat bundan əvvəl insan murdarlığı, insan vəhşiliyi və insan eybəcərliyinin də ən yeni formasını nümayiş etdirən həmin adamlar olduğunu heç cür beyninə sığışdıra bilmirsən. Sənə elə gəlir ki, bax o qırmızı lentli maşında, o qarasaç, qarakostyum oğlanla yanaşı, indicə ZAQS-dan çıxıb, – əlində gül dəstəsi – "26-lar" bağındakı o heykələ doğru gedən şux donlu, şux sifətli o göyçək qız da bir vaxt o növbələrin birində saatlarla dayanıb. Sənə elə gəlir ki, o qarasaç, qarakostyum oğlan da haçansa haradasa bir vaxt nəsə insan adına yaraşmayan bir iş görüb: ya kiməsə yaltaqlanıb, ya kimisə aldadıb, kiməsə yalan deyib... Boli, sənə belə gəlir, Canəli müəllim. Və elə buna görə də sən o qızla o oğlanın bugünkü sevgisinə də, sabahkı ailəsinə də, sonrakı övladlarına da və nəhayət, *onların o heykəlin qarşısına qoyduqları o güllərin özünün də əsl gül olduğuna* şübhə eləyirsən. Sən söz yox ki, çox şeyi şişirdirsən. Bu, düzdür, bu öz yerində. Amma şişirtsən də, şişirtməsən də, fakt budur ki, sən belə fikirləşirsən. İndi gördünmü sistemli fikirləşməyin xeyri nədir?

Verdiyi vədə belə az bir vaxt içində əməl eləyib, sistemli fikirləşməyinə Canəli müəllim ürəkdən sevindi. Hələ imtahanın başlanmağına çox qaldığına görə o, trolleybus dayanacaqlarının birini də buraxdı, bir dayanacaqlıq məsafəni də piyada getməyi qərara aldı. Hava isə isti idi. Bərk isti idi. Yuxarıdan günortanın qızmar günəşi Canəli müəllimin başına od yağdırırdı, aşağıdan asfaltın həniri qalxırdı – təndir istisi kimi onun üzünə vururdu, nəfəsinə dəyirdi. İsti Canəli müəllimi xeyli əzmişdi, xeyli karıxdırmışdı, buna baxmayaraq, Canəli müəllim yenə sistemli düşünməyə çalışırdı.

– Bax o 1955-ci ildən sonra Bakıda nə qədər ev tikilib, nə qədər ağac əkilib. Bulvar tamam dəyişib – 1955-ci iləcən Bakının bulvarı

belə deyildi. Şəhər xeyli dəyişib, xeyli gözəlləşib. Bunun o yan-bu yanı ola bilməz. O ki qaldı camaatın əyin-başına – bu cəhətdən Bakıda heç şübhəsiz, əməlli-başlı inqilab olub. Hər yerdə. Lap o Buzbulağın özündə də. Lap o Buzbulağın özündə bu son vaxtlar nə qədər ev tikilib. Saymaqla hesaba gələn deyil. Amma yazıq Güləli müəllim... Görəsən, Güləli müəllim niyə birdən-birə dəli oldu. Camaat deyir ki, dərddən, qayğıdan olub. Dərddən-qayğıdan hər şey olar. Amma görəsən o nə qayğı idi ki, Güləli müəllimi o günə saldı? Xəstə elədi, öldürdü kişini, heyf ondan, heyf Güləli müəllimdən. Güləli müəllim Buzbulaq məktəbinin gözü idi. Müəllimlərin şahı idi. İndi hanı elə müəllim?.. Gör iş hansı məqama çatıb ki, Fətdah da müəllimdir. İnstitut müəllimi... Hə, harda qalmışdım? Mən indicə nə barədə fikirləşirdim?.. 1955-ci il – deyəsən tapmışıq, Canəli müəllim. vaqondan qarpız iyi gəlir. Kifsimiş qarpız. Susuzluqdan yanırdı vaqon. Camaat hər stansiyada vaqona qucaq-qucaq qarpız daşıyırdı, amma nə o qarpız qurtarırdı, nə camaatın yanğısı sönürdü, nə də asfalt döşəməsi istidən yanıq əski iyi verən o qarpız dolu stansiyaların əvvəli-axırı görünürdü... Vaqon başdan-ayağa şirəydi, qarpız şirəsi. Qarpız toxumu adamın ayağının altında xırçaxırç xırçıldayırdı. Qarpız şirəsi yapışırdı adamın şalvarına... Bir də tər... tər iyi, qarpız iyi... 1955-ci il... 13 nömrəli ümumi vaqon... Amma yox, olmadı, yenə aləm qarışdı deyəsən...

Fikrini cəmləməkdən ötrü Canəli müəllim bir müddət də cəhd elədi, amma olmadı, baş tutmadı. Günortanın dəhşətli istisi Canəli müəllimi bu niyyətdən hələlik vaz keçməyə məcbur elədi.

– Dərzinin qızı dərzi, göydə ulduzların... Yox, ulduzları padşahın oğlu soruşmur, ulduzları dərzinin qızı soruşur. Görəsən, qəbul imtahanlarını ilin bu vaxtına salmaq kimin ağlına gəlib? Ancaq bu güllü paltarı bu şəhərdə dəb salan hər kəsdisə, müdrik adamdı. İlin bu vaxtında – gül-çiçək. Yolda, trolleybusda, hər yerdə. Adamın burnuna yazın qoxusu dəyir. Elə gözü də dincəlir bir az. Görəsən hamısı "importnu"du, yoxsa bizimki də var?.. Xiyar gülündən, zoğal çiçəyinəcən. Bir sözlə, zalım uşağı bütün botanika aləmini bu parçaların üstünə köçürüblər. Çəkilməmiş bir dənə də gül-zad qoymayıblar qala. Hə, qardaş, buna görə də sən gəl mənnən mübahisə eləmə, Buzbulaq doğrudan da gözəl yerdi. Buzbulaq heç olmasa ona görə gözəl yerdi ki, bu güllərin, çiçəklərin hamısı var orda... Aha, pardon, Canəli müəllim, qonşu qızın donundakı gül qarpız gülü deyilmi? Qarpız gülü. Qarpız



gülü... Yox, qarpız gülü deyil, qarpız gülü sarı olur. Bəlkə lobya gülüdür? Lobya gülünün hər rəngi var – ağı da, qırmızısı da, sarısı da... Yox, balam, deyəsən lobya gülü də deyil. Bəs bu sovxa nə gülüdür? – Canəli müəllim təri süzülə-süzülə özünü trolleybusa saldı. Dal tərəfdə, qarının küncündə boş yer vardı, keçib ehmalca əyləşdi. – Bəli, – dedi, – bu qəbul imtahanını ilin bu vaxtına salanın, yəqin ki, çox qiyamət kəlləsi varmış... Belə kəllənin sahibinə heykəl qoymaq lazımdır. – Canəli müəllim ürəyində gülümsədi. – Sistemsiz fikirləşməyin axırı, bax, belə olur – gəlib dirəndik heykələ... Bəs yaxşı, görəsən, Aşqabadda qəbul imtahanını havaxt götürürlər? Daşkənddə, Düşənbədə... Bəs onda o yazıqlar neynəsin, bu səhər Aşqabadı qırx beş dərəcə deyirdi... Aşqabadda qırx beş dərəcə – Ryazanda vur-tut on iki. Səhər deyirdilər ki, Moskvada yağış yağır. Riqada, Tallində, Vilnüsdə də yəqin ki, yağış yağır və Buzbulağın dumduru göyündə yəqin ki, bu gecə də salxım-salxım ulduz olacaq. Lap o nağıldakı kimi: "Göydə ulduzların sayı neçədir?" – Bəli, bunu dərzinin qızı soruşur. Daha doğrusu, dərzinin qızı padşah oğlunun o atmaca sualının qabağında aciz qalmır, çünki dərzinin qızı kimdir? Dərzinin qızı sadə xalqın nümayəndəsidir. Və sadə xalqın nümayəndəsi dünyada bu vaxtacan yaranan nağılların heç birində heç vaxt aciz qalmayıb. Ola bilər ki, bir az tənbəl olsun. Ola bilər ki, çirkin olsun, keçəl olsun. Amma aciz yox. Sadə xalqın nümayəndəsi heç bir nağılda heç vaxt aciz deyil...

Fikrində yenə aləmi qarışdırmış Canəli müəllim yaxında, trolleybusun bilet qutusunun qabağında arxası bu tərəfə dayanmış bir qızın qəşəng donuna tamaşa eləyə-eləyə, ömründə birinci dəfə, özünün dediyi institutda qəbul imtahanı götürməyə gedirdi. Qızın əlində imtahan vərəqəsi vardı, deməli, o da bu yolun yolçusu idi: ya bir yerə imtahan verməyə gedirdi, ya bir yerdən imtahan verib qayıdırdı. Qızın donu, arxadan baxanda, bir iri günəbaxandan ibarət idi. O qəribə günəbaxanın bir az günəşə oxşarı vardı, bir az dənizə oxşarı vardı. Və bir cavan kəndli balası trolleybusun o biri başından qıza heyran-heyran tamaşa eləyirdi – sanki oğlan o dənizdə çimirdi, sanki oğlan o günəşin şüasında yuyunurdu – oğlanın sir-sifəti işıq verirdi. Canəli müəllim qızın üzünü görmürdü, ancaq qız əlindəki imtahan vərəqəsini elə tutmuşdu ki, onun oradakı şəkli üzdəydi, göz qabağındaydı; şəkildə qız pis deyildi, qəşəng qız idi, amma o oğlanın baxmağından belə çıxırdı ki, o qız şəkildə olduğundan da qat-qat gözəl olmalıdır.

sualda baxarıq... Amma arvada gedib baş çəkmək vacibdir. Birdən, Allah eləməsin... Dünyanın işini bilmək olmaz... Hə, belə-belə işlər, Canəli müəllim. Yox, qardaş, bu qızı deyəsən durğuzmalı olacayıq.

Sonra Canəli müəllimin qabağında bir dilli-dilavər kəndli qızı əyləşmişdi. Bir ucdan üyüdüb-tökürdü. Canəli müəllim qızın nə danışdığına bir o qədər də fikir vermirdi, çünki yəqin bilirdi ki, bu qız əlaçıdır. Elə-belə – səsindən bilirdi. Baxışından, duruşundan-oturuşundan bilirdi. Bir də cümlələrin ölçüsündən, söz tutumundan, səs tutumundan. Özü də, qəribədir, çox qəribədir: bu səsdə Canəli müəllim fikirləşə bilmirdi. Beyni birdən-birə elə bil dayanmışdı. Söz dalınca söz, cümlə dalınca cümlə... vergülünə, nöqtəsinəcən əzbərlədiyi mətni qız bir ucadan güllə kimi yağdırırdı və bu güllələr dalbadal Canəli müəllimin beyninə dəyirdi. Beyni haldan düşmüşdü. Canəli müəllim qızı saxlamaq istəyirdi, amma qız Canəli müəllimə aman vermirdi. Qız özü öz danışığından həzz alırdı. Canəli müəllim qızın imtahan vərəqəsinə baxdı: əvvəlki iki fənnin ikisindən də "beş" idi.

– Saxla, saxla! – dedi və özü öz səsindən diksinən kimi oldu. Qız bundan heç nə başa düşmədi. Və dayandı, böyük təəccüb içində birdən dayandı. – Biletini ver görüm... Birinci biletin birinci sualı. Bəsdi, keç ikinci suala. Deməli, "Süjet". Asta danış, aram-aram, avtomat kimi danışma, xahiş eləyirəm... Hələ saxla o avtomatı. Vaxt gələr işlədərsən lazımi yerində. Çıxarsan, danışarsan, sözləri yağdırarsan lap əsl pulemyot kimi – bütün kollektivin adından... Ancaq hələliyinə süjetə *bəlkə bir misal gətirəsən. Məsələn, nağıl süjeti.* "– Dərzinin qızı dərzi, kərdidə reyhanın sayı neçədir?" Belə bir nağıl var, bəlkə, eşitmisən?.. Amma yox, əttöbə!.. Sənə belə sual vermək olmaz. O saat durub cumarsan birbaş rektorun üstünə. Gözlərinin gildir-gildir yaşını güllə kimi yağdıra-yağdıra bir qiyamət salarsan ki, gəl görəsən... bu adam dolaşdırmaq istəyir məni, qiymətimi aşağı salmaq istəyir. Sataşır mənə. Proqramda olmayan sual verir mənə və sair və ilaxır... Sonra mən yazıq gərək sizin hər ikinizi başa salam ki, ədəbiyyat Həsənqulu ilə Hüseynqulunun dərin məzmunlu yaradıcılığına xas olan böyük-böyük nağıllardan ibarət deyil, bu dünyada balaca-balaca nağıllar da var... Deməli, yeddi gün, yeddi həftə, yeddi ay, yeddi il sərasər padşahın oğlu hər axşamçağı eyvana çıxıb, o sualı dərzinin qızına verir və dərzinin ağıllı-tədbirli qızı da padşahın oğluna həmişə o cavabı qaytarır. Padşahın oğlu böyüyür, bir igid oğlan olur. Dərzinin qızı da gündən gözəlləşir: qız demə, deynən bir ay parçasıdır. Bir mələkdir, üzünü görənlər bihuş olur... Axı, hər yetişən meyvə gərək bir gün qopub düşə, canım-gözüm, hər açan gül gərək bir gün dərilə. Amma nə illət eləyirlər, padşahın oğlu evlənmək istəmir. Elçilər dərzinin qapısından kor-peşman qayıdırlar. İş gəlib o məqama yetir ki, padşah əmr eləyir, oğlunu hüzuruna gətirirlər, "Taxtım sənin, tacım sənin... Təbrizdən dəmir qapı Dərbəndəcən dünya bac verir sənə. Dərdin nədi, sərin nədir, oğul? – deyir. – Dünya adlı bu gülzarın dürlü-dürlü güllərindən birini də gözün görmədimi, oğul, könlün sevmədimi?" Padşahın bu üstüörtülü mətləbini oğul başa düşür: "Ürəyindən keçəni duydum, ata. İzin ver, sirrimi açım sənə... Yaxındadı, uzaqdadı, bir almadı, budaqdadı, gözüm görüb, könlüm tutub, izin ver dərim onu..." Padşah sevinib, əhsən deyir oğlunun bu sözlərinə. Ancaq dərzi qızının adı gələndə padşahın halı qarışır. Padşahın halı yaman qarışır, canım-gözüm, bir qara tor gəlir gözlərinə. İşi belə görəndə oğul atanın ayağına düşür. "Onda izin ver, ata, öldürüm onu. Sonra hökm sənindi, kimi desən alaram, çünki nə qədər ki, o qız sağdı, mənim bu gen dünyada bir xoş günüm olmayacaq..." Nağılın, bundan sonrakı ən maraqlı yeri Canəli müəllimin təsəvvüründə son dərəcə dumanlı bir şəkildə idi. Əlacı kəsilmiş padşah, oğlunun bu təklifinə gərək ki, razı olurdu. Padşah dərzi qızına yalan-doğru bir toy da eləyirdi. Ancaq əsl toy (padşah oğlunun vəzirin qızı ilə toyu) bundan sonra olmalı idi. Dərzi qızının al qanından bir kasa içib, sonra öz əsl toyunda oynayacağına *vəd verən padşah oğlunun xəncərini sıyırıb qan tökməyə getməyi;* tədbirli dərzi qızının bundan xəbər tutub, o gecə, padşah oğlu ilə yatacağı atlas yorğanın altında öz əvəzində bir dolu doşab tuluğu qoyub, xəlvətcə pərdə dalında gizlənməyi; padşah oğlunun o tuluğu qılınc ilə necə yarmağı, o doşabı, min il susuz qalan adamlar kimi, kasa-kasa necə doldurmağı, necə içməyi; hətta bütün bunları eləyəndə onun sevincdən, qəzəbdən və bu dünyanın həddi-hüdudu olmayan sonsuz ədalətsizliyinə nifrətdən par-par parıldayan qan tutmuş gözləri də həmişə Canəli müəllimin xatirində, hafizəsində idi... O doşabdan padşah oğlu elə möhkəm sərxoş olurdu ki, toyu da, vəzirin qızını da, verdiyi vədi də unudub, xəncəri əlində diz çökərək, gözlərinin sel kimi yaşını o atlas yorğanının üstünə axıdırdı. Sonra padşah oğlu xəncərin tiyəsini öz ürəyinə tuşlayırdı və bu vaxt haradansa padşah oğlunun qulağına dərzi qızının səsi gəlirdi. "Padşahın oğlu padşah, göydə ulduzların sayı

neçədir?" Dərzi qızı gülə-gülə pərdənin dalından çıxırdı, padşahın oğlu ağlaya-ağlaya sərxoşluqdan ayılırdı. Bütün nağıllarda olduğu kimi bu nağılda da əhvalat onların qırx gün, qırx gecə toy eləyib, xoşbəxt olmağı ilə qurtarırdı. Ancaq Canəli müəllim nağılın belə qurtarmağını nədənsə istəmirdi. Və qarşısındakı stulun üstündə bir-birini əvəz eləyən abituriyentlərə diqqətlə qulaq asıb, oturduğu axırıncı partadan hələ də tərpənmək bilməyən o güllü donlu qıza da hərdənbir göz qoya-qoya, indi Canəli müəllim fikirləşirdi ki, əgər padşahın oğlu o sərxoşluqdan heç vaxt ayılmasaydı və eləcə, sərxoşca da çöl-biyabana düşüb, bir səfil-sərgərdan həyat başlasaydı, bu qəribə nağıldakı məhəbbət daha dərin olardı, daha mənalı olardı. "Qırx gün qırx gecədir ki, sarayda toy çalınır, ancaq padşahın oğlu sərxoşluqdan ayılmır. Vəzirin qızı atlas yorğanda, məxmər balıncda, ağ gərdənini açıb padşahın oğlunu öz ağuşuna çağırır, padşah oğlu isə heç nə anlamır, o heç harada olduğunu da bilmir, çünki padşahın oğlu sərxoşdur, məhəbbətdən sərxoşdur: "Məhəbbət bir bəladır ki, giriftar olmayan bilməz" – deyəsən Füzuli deyib... Oğlanı ayıltmaqdan ötrü gedib dərzinin qızını tapıb gətirirlər. Ancaq oğlan yenə ayılmır, çünki o, indi öz sevgilisini də tanımır. Amma yox, dərzinin qızının gəlməyi artıqdır, çünki onda nağıl olmur, olur "Leyli və Məcnun". Bəli, "Leyli və Məcnun". Özü də Füzulinin "Leyli və Məcnun"u. "Var bir dərdim ki, min dərmandan artıqdır mana..." Belə şeyi ancaq Füzuli deyər. Nizami... Yox, Nizami heç vaxt belə deməz, çünki Nizami dediyini mütləq izah eləməlidir – məntiqi mühakimə əsasında... Bəli, məntiqi mühakimə: dərdim nədir? Dərdim eşq dərdidir. Eşq nədir? Eşq çarəsi tapılmayan bir dərddir, xəstəlikdir... Bəs...

## IV

Və dəhşət orasında deyildi ki, o güllü donlu qızın Canəli müəllimə verdiyi bilet deyildi, kağız idi. Dəhşət burasında idi ki, o kağız Canəli müəllimin öz xətti ilə yazılmışdı: "Əvvəla, atəşin salamlar olsun Buzbulaq xalqının böyük oğluna. İkinci sizə məlum olsun ki, bu qızın adı Dilarədir. Bundan qabaqkı imtahanlardan iki yağlı beşi var bunun. Bir "beş" sizdən, bir "üç" bizdən. Bağışla, imtahandan qabaq tapmadım səni. Böyründə, bir divar bu yanda tarixdən imtahan götürürəm. Siz tərəfdən bir qulaq kağız bəsdir. Şəxsin adı-familiyası. Yaz ver qıza, çatdıracaq mənə. Şanlı ədəbiyyatçılarımıza eşq olsun! Fəti".



Fəti – Fətdah idi. Bundan ötrü fikirləşməyə ehtiyac yox idi. On il Buzbulaq məktəbində o həmişə "Fəti" olmuşdu, Buzbulaqda onun adını Fəti çağıranlar indi də çox idi... Bəs bu xətt, aman Allah! Canəli müəllimin xətti... Deməli, Fətdahın xətti o vaxtdan dəyişməmişdi. Üçüncü sinifdən ta yeddinci sinfi qurtaranacan onlar eyni partanın dalında oturmuşdular. Üçüncü sinfəcən Fəti hələ hərfləri də əməlli yaza bilmirdi. Səni görüm kaftarlayasan, Zinyət Şəkərək qızı. Üçüncü sinifdə, ikinci rübün başlanğıcında təzə üsul tətbiq elədi: "İrəlidə gedənlər geridə qalanları çəksin arxasınca! Buzbulaq məktəbində bir nəfər də zəif şagird qalmamalıdır". Sinfi ələk-vələk eləyib, şagirdlərin yerini bir-bir dəyişə-dəyişə o gün Zinyət Şəkərək qızı Fətini gətirib Canəli yazığın yanında oturtdu. O gündən Canəli yazdı, Fəti köçürtdü. Hesabı da, imlanı da. Evdə də, sinifdə də. Və hələ onlar dördüncü sinifdə oxuyanda günlərin bir günü Canəli baxıb gördü ki, Fətinin xətti onun xəttinin tam eyndir. Sonra bunu Güləli müəllim də gördü. Bunu görəndə Güləli müəllim Fətinin yerini dərhal dəyişdirdi, amma təəssüf ki, gec idi (Güləli müəllim yuxarı siniflərdə dərs deyirdi). Güləli müəllim Fətinin yerini dəyişdirəndə onlar səkkizdə oxuyurdular, Canəlinin öz xəttini dəyişməkdən savayı əlacı yox idi. Və Canəli çox çalışdı, ancaq xəttini dəyişə bilmədi. Sonra əl çəkdi bu işdən, unutdu bu məsələni. Amma Fətinin hər gün məktəbə gətirdiyi və məktəbdən çıxandan sonra da, evdən çırpışdırdığı yağı, çörəyi, pendiri Canəli uzun müddət unuda bilmədi... Onda Fətinin dədəsi Kərim kolxozun anbardarı idi. Onda Buzbulaq kolxozunun sədri Əli oğlu Səməndər idi. Aha, tapdıq ki, Canəli müəllim... Pah atonnan: Gülül!

O gülün nə gülü olduğunu nəhayət ki, yadına salıb ürəkdən sevinən Canəli müəllim əlində tutduğu kağızın kağız, ya imtahan bileti olduğunu da bir müddət yadından çıxartdı. Canəli müəllim bu dəfə qızın donuna rahat baxdı, cəsarətlə baxdı. Sonra Canəli müəllim qızın üzünə baxdı və onda başa düşdü ki, əlində tutduğu imtahan bileti deyil, Fətdahın göndərdiyi kağızdır.

– "Bir "beş" sizdən, bir "üç" bizdən..." "Beş" – "beş"di, bəs "üç" nədi? Bəlkə demək istəyir ki, yəni sən bu işi düzəltsən, sənə "kafi" qiymət düşür. Bəs onda "kafi" niyə? Hə, deməli bu da onun zarafatıdır. "Kafi". Tfu!.. Ay qız, sən keç otur hələ! Görürəm, hazır deyilsən.

O qızı bu imtahan zalında niyə bir də oturtduğunu Canəli müəllim uzun müddət dərk eləyə bilmədi. Yəqin ki, əlacsızlıqdan belə elədi.

Vaxt qazanmaqdan ötrü. Düşünüb, bir qərara gəlmək üçün. Və qız keçib o partanın dalında təzədən oturanda Canəli müəllim başa düşdü ki, düz hərəkət eləyib. Gördü ki, vəziyyətdən çıxmağın yeganə yolu da elə budur: sakit, davasız-dalaşsız; bir kəsi duyuq salmadan, imtahanın gedişatını zərrə qədər də pozmadan. Elə bil heç nə olmayıb. Elə bil heç bir kağız-zad da yoxdu ortada. Amma oturub imtahana hazırlaşanlar qızla müəllimin arasında nəsə bir kələk olduğunu, deyəsən, hiss eləmişdilər. İşin bircə bu tərəfi pis idi. O uşaqların qabağında fırıldaqçı qiyafəsində oturmaq Canəli müəllim üçün çətin idi, yaman çətin idi.

Sonra Canəli müəllimin qabağında rəngi-rufu ağarmış bir oğlan gəlib oturdu. Canəli müəllim gülümsədi. Gülümsədi ki, oğlan qorxmasın. Gülümsədi ki, gedib yenə axırıncı partada bayaqkı yerində əyləşən Dilarə adlı o qız elə zənn eləməsin ki, Canəli müəllim bu saat əsəbidir, həyəcanlıdır. Elə bilməsin ki, o kağız Canəli müəllimi sarsıdıb, haldan-halətdən çıxarıb.

– "Bir "beş" sizdən, bir "üç" bizdən...". Sənin əla dil qabiliyyətin varmış ki, a kişi! Bax belə. Öz sözünnən. Yaxşıdı. Lap yaxşı başlamısan... – Oğlanı, necə deyərlər, "xoda salıb" rahatlanandan sonra Canəli müəllim qızın güllü donuna gözünün uçu ilə bir də baxdı: gülül idi, doğrudan da gülül idi. Və Canəli müəllim fikirləşdi ki, görəsən, ədəbi dildə "gülül" sözü varmı, çünki bu sözü Canəli müəllim yalnız Buzbulaqda eşitmişdi, özü də yalnız o vaxtlar eşitmişdi: o vaxtlar ki, Buzbulaq kolxozunun sədri Əli oğlu Səməndər idi. O vaxtlar ki, Fətinin dədəsi Kərim kolxozun anbardarı idi... Bir isti yaz günü idi. Bir uzun buğda zəmisi idi. O zəmidə hələ təzə-təzə dən tutan sünbüllərin arasında Canəli adlı bir uşaq oturmuşdu. Kolxoz sədri Əli oğlu Səməndər kolxozun anbardarı Kərimin arvad-uşağını pis-pis söyə-söyə o taxıl zəmisinin qırağı ilə gedirdi və gedə-gedə hərdən əlini uzadıb, hələ təzə-təzə dən tutan sünbüllərin arasında – orda-burda bol-bol gül açıb qızaran gülləri dibindən qoparıb hirsli-hirsli kənara tolazlayırdı. "Ay sənin anan belə, bacın belə. Sənin toxumluq taxılın budumu, ay heyvan. Sənin o nəslin-toxumun kəsilsin, əclaf... Toxumu zay eləyib namərd, hələ and da içir mənə. Xəlbirlənmiş buğdanın içində bu qədər gülülmü olar? Toxumluq taxılnan bu boyda zarafatmı olar?.." Dəhşət burasında idi ki, bu sözləri deyə-deyə və gülülləri yola-yola sədr yavaş-yavaş zəminin içinə girirdi, birbaş Canəlinin üstünə yeriyirdi.



Canəli durub qaçmaq istədi, ayaqları sözünə baxmadı – ayaqları elə bil qurumuşdu. Elə bir Canəlinin əlləri də qurumuşdu. Əgər belə olmasaydı, əlindəki xırdaca sünbül torbasınısa da qoltuğunda gizlədərdi – o torbanın dibində cəmisi bir ovuc sünbül vardı... Əvvəl Canəli sədrin bomboz sifətini gördü, sonra onun əlində tutduğu bir dəstə gülülü gördü. Və bundan sonra Canəli sanki heç nə görmədi, çünki onun bundan sonra gördüyünə inanmaq mümkün deyildi: Əli oğlu Səməndər onun ikicə addımlığından ilan görüb çəkilən adamlar sayağı, qəfildən geri dönüb, daha heç bir söyüş-zad da söymədən, əllərini yanına salıb, yavaş-yavaş çıxıb gedirdi... Özü də kim? Əli oğlu Səməndər. Özü də harda? Taxıl zəmisində... Əli oğlu Səməndər sünbülünə hələ təzə-təzə dən düşmüş taxıl zəmisində oğru görmüşdü və çıxıb gedirdi... Əli oğlu Səməndər çıxıb gedirdi... Bəlkə sədr Canəlini doğrudan görməmişdi? Bəlkə sədrin ayağının altında doğrudan ilan var idi? Bəlkə yuxuydu bu?.. Yuxuydu, xalis yuxuydu... Sədr gedəndən sonra Canəli, elə oturduğu yerdəcə, bir xeyli vaxt hərəkətsiz oturdu. Sonra istədi ki, torbanın dibindəki sünbülü yerə boşaldıb çıxıb getsin, amma boşaltmadı, əli gəlmədi. Sonra Canəli o torbanı da, öz ciblərini də ağzınacan sünbüllə doldurdu. Və onlar – ana-bala – o gün o sünbülləri uzun müddət bircə-bircə dənləyib, bir azını elə çiy-çiy, bir azını da tavada müxtəsərcə qovurub, üstünə bir azca duz da səpib yedilər. Ertəsi gün xəbər çıxdı ki, idarədə siyahı tutulub: anbarda ehtiyat üçün qalan taxılı əsgər ailələrinə bölüblər – hərəyə yarım pud taxıl yazılıb. Və o yarım pud taxılı dalına alıb dəyirmana aparanda, yolun bir yerində Canəli sədr ilə üz-üzə gəldi. Sədrə hörmət əlaməti olaraq, Canəli çiynindəki torbanı bir daşın üstünə qoyub dayandı. Dayandı ki, sədr ilə ədəb-ərkanla salamlaşsın. Gözlədi ki, sədr gəlib, onun salamını alıb ötüb keçsin. Amma sədr Canəlinin yanından ötüb keçmədi. Əli oğlu Səməndər o torbanı daşın üstündən götürüb, barmaqlarının ucunda, bir neçə dəfə qaldırıb-qoydu. (Torbadakı taxılın yarım pud olmağına o, deyəsən, inanmırdı). Sonra sədr torbanın ağzını açıb, taxılı tələsmədən eşələdi. Və Canəli onda gördü ki, o buğdanın içində də çoxlu gülül var. Bir suyumu mərciyə oxşayan, ancaq mərcidən də balaca yastı-yastı gülüllər. Gülül pis şey deyildi. Buğda olan yerdə gülül də olmalı idi. (Gülül buğda çörəyini daha da dadlı eləyirdi). Amma çox yox, həddində. Gülül çox olanda, deyilənə görə, buğdanın xəmiri yaxşı gəlmirdi. Gülül çox olanda çörəyin dadı qaçırdı, rəngi o

rəng olmurdu – hər halda dünyanın çörəkli vaxtlarında Canəli böyüklərin ağzından belə eşitmişdi... Canəli kolxoz sədrinin o söhbəti salacağından qorxurdu. Qorxudan Canəlinin ürəyinin tıppıltısı bütün kəndi ağzına götürmüşdü... Amma sədr o barədə Canəliyə nə o gün, nə də başqa bir vaxt bir kəlmə də söz demədi. Sanki belə şey olmamışdı. Sanki belə şey ola bilməzdi... Əli oğlu Səməndər olaydı, kolxozun taxıl zəmisində günün günorta çağı sünbül oğrusu tutaydı, özü də nə döyəydi, nə söyəydi – eləcə dinməz-söyləməz qanrılıb, çıxıb gedəydi. Yox, belə şey doğrudan da, mümkün olan şey deyildi...

– Amma olur, qadası. Dünyada ara-sıra belə-belə işlər də olur. Hər halda o gülülün əhvalatı belə olmuşdu. O gülül Buzbulaqda yəqin ki, indi də var. Amma yox, inanma ola, çünki gülül yerli toxumun tərkibində idi və Buzbulaqda o toxumun kökü çoxdan kəsilib. Bir az camaatın səhlənkarlığından. Bir az kolxoz başçılarının kəramətindən. Bir az o səbəbdən, bir az bu səbəbdən... Bir də sən bilməlisən ki, qadası, Kərim olan yerdə ömründə saf toxum qala bilməz. Saf toxum sən heç bilirsənmi nədi? Saf toxum qəliz şeydi, qadası. Elmdi. Fəlsəfədi. Məktəbdi. Təkcə qarın üçün deyil, həm də qədr üçündür... "Xiyar dedi: çinar qardaş, mən neynim ki, çatım sənə? Çinar dedi: "Çatammazsan, çünki qarın ağacısan..." – Sözə bax: "qarın ağacı". Allah sənə min-min rəhmət eləsin, Güləli müəllim... Bəli, o toxumu Əli oğlu Səməndər kimi nər kişi də saxlaya bilmədi. Buna görə də heç o Əli oğlu Səməndərin də bu saat həmin o Buzbulaqda sən deyən hörməti-zadı yoxdur. Əli oğlu Səməndərin bir-iki pətəyi var, bir-iki toyuğu var. Əli oğlu Səməndərin başının altında bir tikə çörəyi var. Və o çörəyi yeyə-yeyə Səməndər kişi indi bala-bala ömrü başa vurur. İndi Səməndər kişi həyətindəki ağacların dibini belləyir, pətəklərinə ruzu qoyur. Və o pətəklərin birinci – may balını kəsəndə yəqin ki, Səməndər kişi qonşusu Kərimə də pay göndərir, çünki Buzbulaqda əyyami-qədimdən həmişə belə olub: inəyin doğdu – bulamasından, qoyun kəsdin – ətindən, bal kəsdin – balından qonşunun payını mütləq göndərməlisən. Səməndər kişi Kərimin payını mütləq göndərir, amma yeri düşəndə o, öz zarafatından da heç vaxt qalmır. Məsələn, Səməndər kişi Kərimə deyir ki, sən köhnənin qurumsağısan, hətta arvad-uşaq qulağından uzaq yer olanda Kərimin zatbazatını da bir müxtəsər qatıb-qarışdırır. Amma nə ləzzəti? Belə şeylər Kərimin heç vecinə də deyil, çünki Kərim yaxşı bilir ki, belə şeylərin dərininə getməyin



kolxozun toyuq fermasına bir qara qəpiklik xeyri-ziyanı yoxdur. Bir də Kərimin vaxtı hardadı ki, belə şeylərin dərininə gedə. Kərim kolxozun toyuqlarına baxır və bu kolxoz toyuğunda belə bir xasiyyət var ki, yumurta azdırmağa yaman həris olur. Görürsən ki, hin qaldı bir tərəfdə, getdi verdi özünü bir kolun dibinə. Özü də bu damazlığı kəsilmişdə belə bir xasiyyət də var ki, yumurtlayanda birmərrə səsini çıxartmır. Çıxartmır ki, biləsən: gedib harda yumurtlayıb. Əgər Kərim belə-belə şeylərin dərininə gedəsi olsa, onda bəs o yumurtaları kolların dibindən kim axtarıb tapmalıdır? Üstəlik, Kərimin gözü də, öz dediyinə görə, bir o qədər yaxşı görmür. Bir yandan da – Buzbulağın uşaqları. Hələ Kərim gedib o kolların dibinə çatmamış, Buzbulağın uşaqları o yumurtaları, nə ki var, yığışdırıb aparırlar. Buna görə də kolxozun yumurta planı çox vaxt dolmur. Buna görə də çox vaxt planı verməkdən ötrü, Kərim bəzi-para, xırda-xuruş kələk-mələk işlətməli olur.Yəni, bir də baxıb görürsən ki, budur Kərim, əlində iki zənbil yumurta, hıqqana-hıqqana gəlir. Kərim kişinin o yumurtaları hardan gətirdiyini, neçəyə alıb gətirdiyini Buzbulaqda hələ ki, heç kəs bilmir. Kərimin satdığı yumurtanın qiyməti isə bir qayda olaraq, sezondan asılıdır. Məsələn, qışda – onu bir manata, yazda, Novruzqabağı – beşi bir manata. Kərim kişi yumurtanın yazdakı qiymətini yayda da aşağı salmır, çünki yayda Buzbulaqda gəlmə adam çox olur... Bəli, Canəli müəllim, sən, demək, elə bilirdin ki, Fətdah ordadı. Amma sən demə, burdaymış. Burdaymış bu düdəmə... "Bir "beş" sizdən, bir "üç" bizdən..." Aha, tapdıq, deyəsən, Canəli müəllim: o "üç" puldu, ayrı şey deyil, yəni üç yüz manat. Əgər bu it oğlu it üç yüz mənə boyun olursa, deməli, ölüsü bir üç yüz də özünə qalır. Bir "beş"in qiyməti – altı yüz. Üç beşin qiyməti – min səkkiz yüz... Bir elmin qiyməti. Bir institutun qiyməti... Bir... Tfu! Aləm qarışdı yenə. Hə, indi gəl görək, qəşəng qız... Görək sənin öz qiymətin neçədi?

Qız elə bil Canəli müəllimin niyyətini başa düşdü. Qızın sir-sifəti birdən dəyişdi.

– Hansı bileti danışacaqsan, qadası?

– Buy, müəllim, niyə mənə elə deyirsiniz?

– Yaxşı, Dilarə xanım, hansı bileti danışacaqsınız?

– Mən hələ xanım olmamışam, müəllim...

– Deməli hələ xanım olmamısan. Hələ... – Canəli müəllim gülümsədi.

– De görüm bu dünya nədi, qadası?
– Nə deyirsiz, müəllim?
– Deyirəm: dünya nədi?
Yazıq qız Canəli müəllimin şəxsində, deyəsən, nəhayət ki, öz məhrəm adamını tapdı. Birdən-birə qızın qırışığı tamam açıldı. Bayaqkı şübhəsi-narahatlığı bir anın içindəcə çəkilib getdi. Qız nazlandı, nə nazlandı.
– Çətin sual verirsiniz, müəllim.
– Bilirsən, ya bilmirsən?
– Bilirəm. Papam deyir ki, bu dünya bir fındıqdı. Mamam deyir ki... Oy, yadımdan çıxdı! Mamam interesni deyir.
Əvvəl Canəli müəllim Fətdahın göndərdiyi kağızı qızın gözü qabağındaca büküb köynəyinin cibinə qoydu. Sonra qızın imtahan vərəqəsinə kəmali-səliqə ilə "iki" yazdı.
– İndi get, – dedi, – get, qadası... Get mamana de, qoy papana desin ki, bu dünya fındıq-zad deyil. Bu dünya...
Canəli müəllim gözləyirdi ki, qız çoşacaq, hönkürüb ağlayacaq, bağırıb aləmi ayağa qaldırağaq. Amma qız nə coşdu, nə ağladı. Durub dinməz-söyləməz qapıya tərəf yeridi. Qapının qabağında dönüb Canəli müəllimə bir də baxdı və səssiz-səmirsiz çıxıb getdi. O getdi, amma Canəli müəllimin imtahanı hələ qurtarmamışdı. İçəridə hələ beş nəfər adam vardı. Ancaq Canəli müəllimin qarşısındakı stol bundan sonra bir müddət boş qaldı. Canəli müəllim danışmağa təzə adam çağırmadı. Bir müddət dinməz-söyləməz o beş nəfərin üzünə baxdı. O beş nəfər də xeyli vaxt gözlərini Canəli müəllimə zilləyib durdu. Canəli müəllim o gözlərdə öz payına bolluca hörmət gördü – onda Güləli müəllim bir də onun yadına düşdü. Belə bir qəribə fasilədən sonra imtahan təzədən başlananda, bu dəfə Canəli müəllim öz-özünə belə başladı:
– "...dünya nədi?.. Dünya sənin bir cüt gözündü. Bəs göz nədi? Göz ağlın çırağıdı. Ağıl nədi? İnsanın həşəratdan, heyvanatdan fərqidi... Onda həşərata-heyvanata göz niyə verilib? Qarın doydurmaq üçün verilib. Bəs insana niyə göz verilib? Dünyanı görmək üçün verilib... Deməli, bu dünyanı görmək üçün insana nə lazımdı, Fəti? Dur, de görüm. Dur o küt beynini bir yaxşı-yaxşı çalxala... Nə oldu, niyə çıxmır səsin! Yenə zillədin üzümə o dana gözlərini. Deməli, bir Quran sözü mən bayaqdan havaya püfləmişəm. Belə isə onda buyur ərz elə görüm, bax o həşəratdan-heyvanatdan fərqin nədi sənin, Fəti? Və əgər indi yoxdursa, bir zaman olacaqmı bu fərq?.. Xiyar dedi: "çinar qardaş..." Heyf, heyf səndən, Güləli müəllim. Belə-belə söhbətlərin ustasıydı Güləli müəllim. Güləli müəllim deyərdi ki: "Dünyanın üzü daşdandı, ətdən deyil, amma belə getsə, onu da murdar ətə döndərmək olar". Güləli müəllimin dilinin əzbəri idi bu sözlər: filankəs filan yerdə nitq elədi: tüpürdü dünyanın üzünə. Dünən gecə filan şairin kitabını oxudum: tüpürüb dünyanın üzünə. Yox, bala, bu, dərs oxumaq olmadı, bu oldu dünyanın üzünə tüpürmək... Güləli müəllim dərs kitabında bir şey səhv yazılanda da belə deyərdi, pinəçi Allahverdi onun dünyagörmüş başmaqlarını tələsib başdansovdu yamayanda da belə deyərdi. Bir də uşaqlar dərsin mövzusundan uzaqlaşanda. Uşaqlar dərsin mövzusundan uzaqlaşıb, hətərən-pətərən danışmağa başlayanda Güləli müəllim deyərdi ki: "Ə, tüpürmə, dəvə oğlu dəvə. Səni bura dərs danışmağa çıxarmışam"... Güləli müəllimin bu sözləri Buzbulaq məktəbində folklor idi, zərb-məsəl idi. Bu sözləri Buzbulaq uşaqları çayda çiməndə də deyirdilər, kinoya baxanda da deyirdilər. "Ə, Zülfəli, o cür üzmək olmaz axı, dünyanın üzünə tüpürmə". "Ə, Hilayət, o boş başını bir az aşağı əy, dünyanın üzünə tüpürmə". Bu sözlərlə Buzbulaq uşaqları gün uzunu zarafat eləyirdilər, amma Güləli müəllim, sən demə, zarafat eləmirmiş... Güləli müəllim hər işini yaxşı bilirmiş bu dünyanın. Altını da, üstünü də bilirmiş... Axı, doğrudan da, qardaş, gəl bir az dərindən fikirləşək: yəni çoxmu böyükdü bu dünya? Axı, nəyi böyükdü bu dünyanın... Bu dünyanın nəyi böyükdü ki, allahın qripi ki var, o da, görürsən dünən Honkonqda idi, bu gün gəldi çıxdı Bakıya. Bakıdan vurdu getdi Leninqrada. Oradan da ayaq açdı başladı bala-bala o tərəfə – Praqaya, Parisə, Madridə, Lissabona... Deməli, dünya doğrudan da bir o qədər böyük deyil. Deməli, dünyanın üzünü tüpürə-tüpürə doğrudan da murdar ətə dödərmək olar. Və axırda nəticəsi nə olar bunun? O olar ki, dünyada yaşamağa yer qalmaz. Dünyada yaşamağa kimə yer qalmaz? Sənə. Mənə. Əliyə, Aşota, Hansa, Cona, Şarla, Fatmaya, Ancelikaya... Dünya dönüb olar başdan-ayağa fətdahların dünyası. Sönüb gedər Güləli müəllim deyən o ağıl çırağı. İnsanın həşəratdan fərqi qalmaz. Yoxa çıxar toxumların hamısı. Toyuqlar, nə ki var, azdırar yumurtasını. Bütün ağaclar dönüb olar "qarın ağacı"... Bəs sonra? Sonra bu dünya, doğrudan da fındıq olar. Fındıq, canım-gözüm, fındıq. "Bir "beş" sizdən, bir "üç" bizdən".

Yox, kəsmək lazımdı bütün bu fətdahların toxumunu. Silmək lazımdı yer üzündən bunların nəsli-nəcabətini. Nədi? Çətindir? Bəli, çətindir, ona qalsa çox şey çətindi. Bu istidə imtahan götürməyin özü də. Elə bu oğlan da, deyəsən, suala cavab verməyə yaman çətinlik çəkir. Hə, sualımız, demək, belədi ki...

Canəli müəllim biletdəki sualı kəlmə-kəlmə ucadan dedi. Sonra sualın əsas məğzini qarşısında əyləşmiş abituriyent üçün tələsmədən izah eləməyə başladı. Və eyni vaxtda da Canəli müəllim fikirləşdi ki, imtahandan çıxan kimi mütləq vağzala gedib, düz bir həftə qabağa (özü də mütləq yumşaq vaqona) bileti götürmək lazımdır, çünki bu saat qarpızın bol vaxtı idi və belə vaxtda o biri vaqonlardan kifsimiş qarpız iyi gəlmədiyinə Canəli müəllim bir o qədər də möhkəm arxayın deyildi.

*1976*



# CEVİZ KÖLGƏSİNİN NAĞILI

## I

Buzbulaq qış uzunu o qədər darıxmışdı ki, yazqabağı Nəsir müəllimin – arvadı Süsənbərlə, inəyi, qoyun-keçisi, toyuq-cücəsi, har-hacatı – bütün varidatıyla Çığnagüldən həmişəlik yığışıb gəlməyi kənddə əməlli-başlı hadisə kimi qarşılandı.

Nəsir müəllim qırx il əvvəl (toy eləyib evlənməyinin hələ heç bir ayı da tamam olmamış) arvadı Süsənbəri də götürüb Buzbulaqdan çıxmışdı, dumanı-çiskini başının üstündən heç vaxt əskik olmayan uzaq dağ kəndi Çığnagüldə qırx il müəllimlik eləmişdi. İndi də, məlum məsələdir ki, pensiyaya çıxdığına görə yığışıb həmişəlik öz dədə-baba yurduna gəlmişdi.

Nəsir müəllimin Buzbulaqdakı dədə-baba evi kifayət qədər saf qalmışdı, yaxşı qalmışdı. Ona görə ki, qonşusu Molla Məcnun bu evdə neçə illər barama saxlamışdı, evin damına-divarına həmişə baxmışdı.

Təzə yerdə yerbəyer olub rahatlanandan sonra günlərin bir günü Nəsir müəllim səhər tezdən beli götürüb, həyəti belləməyə başladı. Bir bel, iki bel... Üçüncü beli hələ torpağın canına yeritməmiş, Nəsir müəllim birdən-birə tamam həvəsdən düşdü; başını qaldırıb göyə baxdı və o göydən Nəsir müəllimin heç xoşu gəlmədi. Ancaq Nəsir müəllimin xoşuna gəlməyən göyün özü deyildi, uca qəddi-qaməti və iri budaqları ilə o göyün az qala yarısını ağzına almış nəhəng ceviz ağacıydı: Şükür kişinin kənddə adnan deyilən cevizi!.. Ağac Nəsir müəllimin damının dal tərəfindəydi. Damın dalından üzüaşağı, üzüyuxarı küçə gedirdi və o ağac da elə Şükür kişinin küçə divarının dibindən – şaxəli, qollu-budaqlı – göyün üzünə qalxmışdı. Əgər o yekəlikdə qələmə, çinar, ya başqa bir ağac olsaydı, nə vardı ki? Elə müsibət də o ağacın ceviz ağacı olmağındaydı. Bir yerə ki, cevizin kölgəsi düşdü, demək o yerin işi bitdi. Orda nə əkirsən ək, xeyri yoxdur: ya əmələ gəlməyəcək, ya da lap əmələ gəlsə də, ceviz kölgəsində əkilən şeyin heç bir dadı-tamı olmayacaq. İstəyirsən, lobya-noxud ək, istəyirsən, Allahın lap acı soğanını ək. Ceviz kölgəsində yetişən meyvə isə Buzbulaqda heç vaxt məsrəfli meyvə sayılmamışdı.

Qanı qaralmış Nəsir müəllim bel sapının ucunu çənəsinə dirəyib fikrə getdi. Onun Buzbulaqda olmadığı qırx ildə o ceviz ola bilər ki,

bir az da böyümüşdü, yekəlmişdi. Amma o cevizin söhbəti qırx ilin söhbəti deyildi, lap köhnənin söhbətiydi. O ağacın söz-söhbəti Nəsir müəllimin, hələ lap körpəlikdən, bir növ canına hopmuşdu, sümüyünə yerimişdi. Elə indicə, ikicə bel vurduğu torpaqdan da, görünür, Nəsir müəllimin qulağına o ağacın barəsində nəsə bir səs-səda dəymişdi, yəni torpaq da bu barədə öz eşidib-bildiyindən Nəsir müəllimə nəsə demişdi, yoxsa o torpağı, cəmisi ikicə bel ağzı qədərində qurdalayan kimi, niyə Nəsir müəllimin əl-qolu birdən-birə yanına düşməliydi.

Bel sapının ucunu çənəsinə dirəyib durduğu bir neçə saniyənin içində Nəsir müəllim elə bil tək özünün yox, lap uzaq əcdadlarının da bu kənddə keçən ömrünün bütün yaz və payız aylarını bir-bir xəyalından keçirdi, çünki dünya xəlq olandan hər yaz, hər payız o ceviz ağacının söhbəti də bu kənddə həmişə olmuşdu: yazda – hələ ceviz yarpaqlamamış, payızda – cevizin yarpağı tökülən kimi. Söhbət lap qızışıb, dava-dalaş həddinə yetişəndə o cevizin bir budağı aşağıdan kəsilmişdi, sonra başqa bir budaq böyüyüb bu həyətə yenə kölgə salmışdı və o söhbət təzələnmişdi, yenidən qızışmağa başlamışdı.

İndi, Şükür kişinin cevizi hələ təzə-təzə yarpaqlayırdı. Aşağıdan budaqları kəsildikcə ağac boy verib, dikinə getmişdi. Bu hündürlükdə ceviz ağacı yəqin ki, bütün bu mahalda heç yerdə yox idi.

Eyvanın qabağında, samovarı alışdıra-alışdıra, ərinin hərəkətlərinə bayaqdan bəri göz qoyan Süsənbər – Nəsir müəllim beli yerə tullayıb, birdən-birə bayıra hücum çəkəndə – o saatca hər şeyi başa düşdü. Bildi ki, o cevizin başına bu gün mütləq nəsə bir iş gəlməlidir, çünki Süsənbər ərinin xasiyyətinə yaxşı bələd idi. O yürüşlə ki, Nəsir müəllim həyətdən çıxmışdı, deməli, bu gün bu dünyada nəsə dəyişməliydi.

Min ilin qonşusu Şükür kişinin küçə qapısını Nəsir müəllim ayağı ilə vurub açdı. Yaşı yüzü keçmiş Şükür kişi iki otağın arasındakı alaqaranlıq dəhlizdə – o dünya ilə bu dünyanın düz ortasında – paltarlıca uzanıb üç yaşlı uşaq kimi mışıl-mışıl yatırdı. Nəsir müəllim bir istədi gedib sonra gəlsin. Ancaq qorxdu ki, vaxt keçsə, birdən həvəsi, qətiyyəti azalar.

– Şükür dayı, a Şükür dayı! – Nəsir müəllim elə ücadan çağırdı ki, elə bil Şükür kişi bu dünya ilə o dunyanın arasında yox, elə o dunyanın lap göbəyində uzanıb yatırdı.

Şükür kişi gözlərini açıb, nəsə dedi. Ancaq o sözdən Nəsir müəllim heç nə başa düşmədi. Qoca yenə gözlərini yumdu.



– Dur, a kişi! Dur görüm... Səhərdi e, Şükür dayı. Dur çay içək, çörək yeyək.

Bu yerdə Süsənbər də özünü yetirdi.

– Vay, vay, vay, yazıq kişi! – dedi. – Bu yorğan-döşəkdə insan yatar? Bə qızı Raziyə görəsən niyə baxmır buna?

Şükür kişi gözlərini açmasa da, yenə içindən bir qəribə səs çıxartdı:

– Ətses... Sissə...

– Bu nə deyir, Süsənbər? – Nəsir müəllim soruşdu.

– Deyir: ət istəyirəm. – Süsənbər o dünya ilə bu dünyanın arasındakı dil üzrə bir nömrəli mütəxəssis kimi, çox arxayın cavab verdi.

– Xoruzun birini kəsərəm, bişirərsən bu gün. – Bunu Nəsir müəllim (bu dünyada) astadan, Süsənbərə dedi. Sonra sözünü "o dünyaya" da çatdırmaq üçün yenə səsini qaldırdı. – Hələ dur bir çay içək, a Şükür dayı. Günortaya ət də olacaq.

Şükür kişi gözlərini açdı. Hansı dünyada olduğunu bir o qədər yaxşı kəsdirə bilməsə də, hər halda gözlərini təzədən yummadı. Çaşqın, ağzıaçıla bir vəziyyətdə əvvəl Nəsir müəllimin sir-sifətinə tamaşa elədi, sonra Süsənbərə baxdı və o Süsənbərə baxa-baxa da Şükür kişinin elə bil körpəliyi yadına düşdü: yaşı yüzü örtmüş qoca, körpəcə uşaq kimi, birdən için-için ağlamağa başladı.

– Ətses... Sissə...

– İndi nə deyir? – Nəsir müəllim "tərcüməçi"nin köməyinə yenə ehtiyac hiss elədi.

– Elə onu deyir. Deyir: ət istəyirəm.

– Belə lap ƏCCƏB eləyirsən! – Bunu Nəsir müəllim bir qəribə coşqun fərəh içində dedi. – Bu saat xoruzu kəsəcəyəm, suyunnan bir kasa vuracaqsan bədənə. İstəsən, lap toğlu da kəsərəm sənin üçün... Bir yerinnən dur görüm hələ. Ay malades! Sən lap spartsmensənmiş ki, Şükür kişi, özü də lap vışşisindən!

Şükür kişi Nəsir müəllimin köməyilə qalxıb oturdu və yenə, südəmər uşaq anasına baxan kimi, umsuq-umsuq Süsənbərə baxdı.

– Bəs qızın Raziyə baxmır sənə, Şükür dayı? – Süsənbər soruşdu və soruşmağına peşman oldu, çünki qızının adını eşidəndə Şükür kişi elə bir ağlamaq başladı ki, bayaqkı ağlamağı bunun yanında çox-çox şükürlü idi.

– Sən yeri, çay-çörəyi hazırla gətir bura. – Nəsir müəllim Süsənbərə dedi. – Sən də, qonşu, bir toxta görək. Qocalıq, bilirəm, sarsaq şeydi. Ancaq day neyləmək olar? Allahın özü belə hörüb bu dünyanın binasını.

Süsənbər çay-çörəyi gətirənəcən Nəsir müəllim həyət-bacanı, eninə-uzununa, bir neçə dəfə dolanıb, çox asanlıqla bu nəticəyə gəldi ki, qızı Raziyə Şükür kişiyə elə hər cəhətdən pis baxır, yaxşı baxmır. Həyətin günəvər yerlərində bildir əkilən kartof, lobya, soğan və noxud kərdilərinin elə görkəmindən də məlum idi ki, burada kərdi-külə işinə baxan ya naşı adamdır, ya da pintinin, "xalturşik"in lap yekəsindəndir. Nəsir müəllim fikirləşdi ki, əgər Şükür kişi cevizin kəsilməyinə razı olsa, bu həyəti əkib-becərməyin bütün əziyyətini o öz boynuna götürər və burada elə bir təsərrüfat yaradar ki, onun məhsulu Şükür kişinin o cevizdən götürdüyü mənfəəti birə-beş qat artıq eləyər. Nəsir müəllimin haqq-hesabına görə, pulun elə indiki bu ölü vaxtında da ceviz Şükür kişiyə ildə lap uzağı iki min manat gəlir gətirə bilərdi, həyətdən isə, əgər torpağa əməlli can qoysan, ildə azı üç-dörd min manatlıq mənfəət götürmək olardı. Əlbəttə, cevizin indi kölgə saldığı məsrəfsiz yerləri də əkmək şərti ilə... Şükür kişinin həyətindən də o cevizə xeyli tamaşa eləyəndən sonra, Nəsir müəllim bir daha əmin oldu ki, kölgə əsasən o tərəfi – yeni Nəsir müəllimin həyətini tutur. Bunu Nəsir müəllim dünyanın ən böyük ədalətsizliyi hesab elədi və özünü möhkəm-möhkəm inandırdı ki, lap elə bu dünyada ədaləti azdan-çoxdan bərpa eləməyin xatirinə də olsa, Şükür kişinin ceviz ağacının

görə də Nəsir müəllim tez paltarını dəyişib, yenə ildırım süratilə həyətdən çıxdı və qapıdan xeyli aralanandan sonra, küçənin bir yerindən, ucadan qışqırıb Süsənbərə "hava xətti ilə" belə bir qısa məlumat göndərdi ki, bəs:

– Kənd sovetinə dəyirəm, gəlim!

Kənd sovetinin həndəvərinə yaxınlaşanacan Nəsir müəllim qırğı kimi gedirdi. Çathaçatda addımlarını yavaşıtdı. Gördü ki, hələ çox tezdir, hələ heç dükan da açılmayıb. Bircə çayxana açıq idi, özü də çayçı – General Cəfər samovara hələ indi-indi su tökürdü. O "general"dan savayı o həndəvərdə insan naminə gözə dəyən də Pesmis Quluydu. Pesmis Qulu çayxanadan bir qədər aralıda, qapısı bağlı dəllək dükanının qabağındakı açıqlıqda, əllərini arxasında cütləyib – çox amiranə bir görkəmdə – göyə baxa-baxa və öz-özünə danışa-danışa o baş-bu başa gedib gəlirdi. Qulunu orda görəndə Nəsir müəllim istədi geri qayıtsın, çünki "Pesmis" dediyin Buzbulaqda, heç şübhəsiz, "pessimist" demək idi və səhərin bu vədəsində belə bir adamın girinə keçmək xüsusən bu gün Nəsir müəllimə heç sərf eləmirdi. Qulu ilə Nəsir müəllim təxminən bir yaşda olardılar. Ancaq Nəsir müəllimin Çığnagüldə müəllimlik elədiyi qırx ildə bu adam elə bil heç dəyişməmişdi. Əli dalında yeriməyində, yeriyə-yeriyə göyə baxmağında, göyə baxa-

Nəsir müəllimi kənd sovetinə gətirən məsələnin nə məsələ olduğunu poçt müdiri çox tez başa düşdü, ancaq onun ağzını açıb söz deməyi yaman uzun çəkdi. O sözü deyənəcən Allahqulu bir müddət yalandan ciblərini eşələdi: guya poçtun qapısının açarını axtarırdı, bir müddət o başda – göyə baxa-baxa gəzinən – Pesmis Quluya tamaşa elədi, Pesmis Qulunun bayaqdan mənalı-mənalı seyr etdiyi o göyü də öz gözlərilə yaxşı-yaxşı müayinə eləyəndən sonra Allahqulu, nəhayət, Nəsir müəllimin üzünə baxdı.

– Ə, bə heyifdi axı, Nəsir müəllim, – dedi. – Günahdı e, vallah!

– *ALÇAQ-ALÇAQ DANIŞMA!* – Durduğu yerdə birdən-birə bu təhər hirslənməyi Nəsir müəllimin özünə də qəribə gəldi. Ancaq nəyə görə hirsləndiyini Nəsir müəllim yaxşı bilirdi: – *HEYİFDİ, GÜNAHDI* – bu kənddə iti də vursan, eynən belə deyəcəkdi. Guya Nəsir müəllimin həyəti heyif deyildi. Guya o cevizin – az qala Nuh dövründən – o həyətə vurduğu ziyanın günaha-zada heç bir dəxli yox idi... Allahqulunu səhər-səhər o cür acılamaqda Nəsir müəllimin, güman ki, öz içindəki "akkumlyatoru" normal vəziyyətdə saxlamaq niyyəti də vardı. Yəni: o cevizin kəsilməyinin haqq işi olduğunu bu dəfə (lap əvvəldən!) heç kəsin və heç nəyin ayağına verməmək, bu məsələ barəsində Buzbulağın köhnə, çürük, nadan fəlsəfəsinə qarşı axıracan mərdmərdanə sinə gərmək və (ən əsası) bu işdə – heç nəyin xatirinə – heç bir yumşaqlıq, zəiflik-zad göstərməmək... Bundan əlavə, ağaca pərəstiş eləməkdə Buzbulağın elə öz köhnə xasiyyətində qalmağı da Nəsir müəllimin bu təhər qəfildən əsəbiləşməyinə səbəb ola bilərdi, çünki onun qırx il müəllimlik elədiyi Çığnagüldə hər nə olsa, hər halda ağac-budağa sitayiş yerli-dibli yox idi.

– Çox sağ ol. Hörmətin artıq olsun! – Poçt müdiri, Nəsir müəllimin o hirsli sözlərinin müqabilində – deyək ki, "mədəni şəkildə" – elə bunuca dedi. Açdığı qapını bərkdən Nəsir müəllimin üzünə çırpıb, içəri keçdi.

Nəsir müəllim – olduqça açınacaqlı bir görkəmdə – poçtun qapısından aralandı. Kənd sovetinin idarəsi qabağında bir anlığa ayaq saxladı və elə o bir anın içində də bu qərara gəldi ki, o ceviz ağacının barəsində day heç kəsə heç nə deməsin. Raziyəyə başdansovdu xəbər göndərib, elə bu gün işə girişmək lazım idi. Camaatın ağzını yummaq onsuz da mümkün olan şey deyildi. Lap Allahın özü göydən düşüb bu məsələdə Nəsir müəllimin haqlı olduğunu öz dili ilə desəydi də, yenə küncdə-bucaqda dedi-qodu eləyən beş-on nanəcib mütləq tapılacaqdı...



Elə bil dumduru göy üzündə də nəsə ciddi bir nöqsan tapıb, dodağının altında fasiləsiz donquldana-donquldana gəzişməyində olan Pesmis Quluya da gözucu nəzər yetirəndən sonra Nəsir müəllim idarənin qabağından qətiyyətlə uzaqlaşdı. Özünü evə yetirib, Süsənbəri Yuxarı Məhəlləyə – Raziyənin yanına göndərmək istəyirdi. Yolda rastına bir üzüyola uşaq çıxdı. Və o uşaq vur-tut yarımca saatın içində Raziyədən belə bir ikibaşlı xəbər gətirdi ki, bəs: *DƏDƏMİN CƏVİZİN KƏSƏN QOY ONUN ÇÖRƏYİN DƏ VERSİN.*

Raziyənin – xalis Buzbulaq üslubunda – göndərdiyi ultimatumabənzər bu cavabından, əvvəl Nəsir müəllim bir qədər xoflanan kimi oldu. Ancaq bu xof çox çəkmədi. Nəsir müəllim özü üçün birdən yəqin elədi ki, Raziyənin cavabında qorxulu bir şey varsa, o da elə o cavabın məhz üslubundadır. Buzbulağın suyu, havası qədər köhnə və tanış bu "üslubun" məğzində-mayasında xoflanmalı heç bir şey olmadığını ömründə ilk dəfə belə aydın və aşkar dərk eləməyi Nəsir müəllimi hətta bir xeyli sevindirdi də. Nəsir müəllim şüurunda bir qəribə aydınlıq, canında, qol-qıçında yeni güc-qüvvət hiss elədi. Qalın doğanaq ipini belinə sarıya-sarıya, Raziyənin ünvanına:

– Nə olar, qoy sən deyən olsun! – dedi. – Verrəm kişinin çörəyin. Lap, yesə, üç öynə xörəyin də bişirtdirib verrəm. Guya ki, nəymiş yüz yaşlı kişinin yeməyi. Qoy yesin, nə qədər yeyə bilir. Elə billəm, dədəm Məşədihəsən hələ ölmüyüb, sağdı... Ya Allah, ya Məhəmməd, ya Əli!.. – Bu sözləri Nəsir müəllim nacağı da iplə yaxşı-yaxşı belinə bərkidəndən sonra üzünü Süsənbərə tutub dedi.

– Allah köməyin olsun! – Ərinin, sinninin bu vaxtında, o boyda ceviz ağacına çıxmağına ürəyində heç cür razı olmasa da, Nəsir müəllimin xasiyyətinə yaxşı bələd olan Süsənbərin dildə yalnız bu sözləri deməyə əlacı qaldı.

Yaşı yetmişi haqladığına baxmayaraq, Nəsir müəllim bir göz qırpımında ağacın təpəsinə dırmaşdı. Cevizin budaqlarını yuxarıdan bir-bir qırıb tökə-tökə addım-addım üzüaşağı gəlirdi. Özü də, budaqları bacardıqca ucdan, xırda-xırda kəsirdi ki, o budaqlar yerə düşəndə onlardan dama-divara, Şükür kişinin əyrim-üyrüm alçasına, əriyinə, albuxarasına və cevizin həndəvərindəki digər həyət-bacanın ağac-budağına heç bir xətər-filan toxunmasın. Və Nəsir müəllimin, bir təsərrüfatçı kimi, böyük ustalığının sayəsində o budaqlar əsasən küçəyə tökülürdü. Budaqları əvvəl Süsənbər – tək canına – bir-bir, iki-iki

daşıyıb Şükür kişinin damının dalındakı boş yerə yığırdı. Sonra məhəllədən dörd-beş uşaq da tapılıb könüllü surətdə işə qoşuldu: Süsənbər evə – çay-çörək işinə baxmağa getdi. Şükür kişinin özü isə bir qəribə kef içindəydi. Eyvanın qabağında oturub, üz-gözündən nur yağa-yağa

kardan düşmüş gözlərilə uzaqdan görə bilmədiyi ceviz ağacına – öz aləmindən – böyük maraqla tamaşa eləyirdi. Cevizin hər budağı qopub şaqqıltı ilə yerə düşəndə qoca "esse" deyib, toy qaydası sevinclə çəpik çalırdı və onun üz-gözünün nuru bu zaman daha da çoxalırdı.

Günorta yeməyinin vaxtınacan Nəsir müəllim cevizin yaşıl kütləsinin az qala axırına çıxmışdı. Çılpaq budaqlar olduqca pərakəndə bir şəkildə, haça-haça göyə uzalı qalmışdı və o budaqlar – aralıqdan – hansısa əfsanəvi bir yabanın, ya çəngilin uzun dişlərinə bənzəyirdi.

İkiillik ətli-canlı xoruzun bir qazan şorpasından Süsənbər əvvəl bir iri boşqab çəkib Şükür kişinin qabağına qoydu. Şükür kişi quru təndir lavaşını xörəyə doğrayıb, axıracan ləzzətlə yedi və hələ bundan sonra da bir müddət gözünü xörək qazanından ayıra bilmədi. Kim bilir, bəlkə elə o xörəyin iyinə görə cevizin budaqlarını daşımaqda Süsənbərin köməyinə gələn dörd uşağın dördü də o xörəkdən doyunca yedi. Üstəlik, ətin yumşaq yerindən hələ bir-iki tikə də Şükür kişinin şam

ağacı deyildi – ordan düşməyin nəticəsi ya ölüm, ya ömürlük şikəstlik idi. Ceviz ağacına çıxan adamın fikrini yayındırmağın xalis heyvanlıq olduğunu bu kənddə – uşaqdan böyüyəcən – hamının bilməyi Nəsir müəllimə də yaxşı məlum idi. Bununla belə, ağacın kəsilməyini ca-

maatın bu qədər səs-səmirsiz qarşılamağı Nəsir müəllimə bir Allah bilir ki, nə qədər ləzzət verirdi. Qırx il qürbətdə yaşayan Nəsir müəllimin ürəyində öz kəndinin camaatına birdən-birə bir qəribə – o çağacan heç vaxt hiss eləmədiyi – mehr-məhəbbət oyanmışdı. Nəsir müəllimi o ağacın başında şirə-pələngə döndərən ola bilər ki, bir də o məhəbbət idi. Ancaq uzun illərin ayrılığından sonra bu səhər ikicə bel vurduğu o torpaqdan – bu saat, o cevizin başında – Nəsir müəllimin qolunaqıçına gələn güc-qüvvədə məşhur Antey əhvalatından da açıq-aşkar nəsə vardı, yəni o güc-qüvvə Nəsir müəllimin qol-qıçına əsasən yerdən, torpaqdan gəlirdi – daha doğrusu, öz həyətindən. Ağacı həvəslə kəsməkdə ikən – xəyalında – Nəsir müəllim eyni zamanda həm o həyətdə lobya arxı çəkirdi, həm də o arxların boyunca çadır-çadır düzülən lobya kollarından sallanan salxım-salxım lobyaya ləzzətlə tamaşa eləyirdi. O həyətin hələ əkilməmiş yoncası – Nəsir müəllimin xəyalında – kəsdiyi cevizin təzə-tər yaz yarpağından da yaşıl idi və

Ertəsi gün sübh-tezdən yenə Nəsir müəllim quş kimi ağaca dırmaşdı. Qolunda-qıçında, bütün əzalarında bir küt ağrı hiss eləyirdi, ancaq kefi saz idi, zehni, huşu-başı bəlkə dünənkindən də açıq idi.

Dünənki bir qab ət xörəyinin hesabına bu gün Nəsir müəllimdən də qabaq yuxudan durub, tezdən-tezdən üç yumurtanın qayğanağını həzmi-rabedən keçirən Şükür kişi kürəyini eyvanın dirəyinə söykəyib oturmuşdu: samovarın him basmış qapqara maşasını döşünə sıxıb, mizrab yerinə bir qırıq süpürgə çöpü ilə, öz aləmində guya tar çalırdı.

Süsənbər iri su qazanını ocağın üstünə qoymuşdu – Şükür kişinin kirdən qarmaq bağlamış yorğan-döşəyinin mitilini söküb yumağa hazırlaşırdı. Raziyədənsə hələ səs-səmir yox idi. Ancaq onun gəlməyinin qorxusu Süsənbərin də ürəyində dünəndən xısın-xısın dolanırdı. İndi isə, qazanın altını alışdıra-alışdıra Süsənbər elə bir hey boylanıb, küçə qapısına tərəf baxırdı: qorxurdu ki, Raziyə qapını taqqıltıyla açıb, haray-həşirlə içəri girəcək, su qazanını vurub aşıracaq, Nəsir müəllimi söyüb yamanlayacaq, dədəsinin həyətində elə bir qiyamət qoparacaq ki, bütün kənd tökülüb tamaşaya gələcək...

Amma Raziyə o gün də həndəvərdə görsənmədi.

Nəsir müəllim günorta yeməyindən vaz keçib, hələ günün batmağına xeyli qalmış cevizi gövdəyəcən boğazlaya bildi (sonra ağacın dibini dörd tərəfdən qazıb, kökləri balta ilə doğrayıb, gövdəni kökqarışıq həyətdən rədd eləmək fikrindəydi).

Yerdəki yoğun budaqları iri mişarla doğramaq işinə Nəsir müəllim Süsənbərlə ikilikdə girişdi. Sonsuz olmağının, Nəsir müəllimi övladsız qoymağının xəcalətini illər uzunu canında xərçəng xəstəliyi kimi gizlincə gəzdirən Süsənbərin hər iş əlindən gəlirdi. O, övlad əvəzi, qardaş əvəzi, ən çətin işlərdə də həmişə Nəsir müəllimin dadına çatmışdı. O odunu əri ilə birgə axıracan doğramağa da bəlkə Süsənbərin səbri, qüvvəsi çatardı. Ancaq qonşu Molla Məcnun təsadüfən gəlib işin üstünə çıxdı, çarəsiz, könülsüz də olsa (mişar işi hər halda arvad işi deyildi) uzə düşüb, qonşuluq xatirinə və alicənablıq naminə mişarın bir ucundan yapışmalı oldu. Dünən Süsənbərə odun daşımaqda könüllü köməyə gələn məhəllə uşaqları da axşamtərəfi işə qoşuldu. Hələ heç gün batmamış budaqların hamısı doğrandı və Şükür kişinin damının dalında yaş ceviz odunundan yekəcə bir təpə quruldu.

Hələ işıq ikən Süsənbər su qazanını bir də qızdırıb, bu dəfə Şükür kişinin çimməyi üçün hazırlıq gördü: yiyəsizlikdən, baxımsızlıqdan qapısının dəmiri, taxtası çürümüş təndirəsər yerini müxtəsər sahmana salıb, təndirə odun töküb yandırdı ki, orada çimdiyi vaxt Şükür kişiyə soyuq dəyməsin. Nəsir müəllim haradansa bir yastı daş tapıb gətirdi. Şükür kişinin o daşın üstündə otuzdurub, elə o təndirin qırağındaca – ər-arvad – çimdirməyə başladılar...

Şükür kişi – canına su dəydikcə – xoşhallanırdı və xoşhallana-xoşhallana nəyisə yadına salmaq istəyirdi. Daha doğrusu, Şükür kişi özünün lığlanmış, lillənmiş yaddaşının bulanıq sularında ara-sıra balıq kimi batıb çıxan iki insan sifətini – iki qadın surətini biri-birindən ayırmağa faydasız cəhd göstərirdi. Biri – anası Şayəstənin cavanlıq, gəlinlik sifətiydi. O sifətdə Şayəstə oğlu Şükürü yəqin ki, azı doxsan il bundan əvvəl çimdirmiş olardı. O biri sifət arvadı Kubranın sifətiydi. Kubra iyirmi il idi ki, ölmüşdü, deməli, onun da Şükür kişini çimdirməyi çoxdanın əhvalatıydı. Amma qızı Raziyənin sifəti, nədənsə, Şükür kişinin nəzərinə gəlmirdi, halbuki vur-tut altı-yeddi ay bundan qabaq son dəfə Şükür kişini məhz o Raziyə çimdirmişdi...

## III

O cevizin dibində, yol ağzında hər gecə söhbətə yığışan arvadlar o gecə də ora yığışdı. Ancaq o arvadların söhbətə girişməyi bu dəfə yaman çətin oldu, çünki onların hər gecə oturduğu *O YERİN MƏNZƏRƏSİ TAMAM DƏYİŞMİŞDİ* və elə bil o mənzərə dəyişdiyinə görə o arvadlar o cevizin dibində o çağacan elədikləri söhbətlərin mövzusunu da *MÜTLƏQ* dəyişməliydilər.

Başlarını aşağı salıb oturmuşdular. O cəvizin yoxa çıxmış budağınınyarpağının-kölgəsinin yerindəki bir dünya boşluqdan Ayın işığı birbaşa arvadların oturduğu o yerə şığıyırdı. Və o arvadlar o Aya baxmaqdan deyəsən qorxurdular, çünki arvadlar o cevizin dibindən Ayı heç vaxt o şəkildə görməmişdilər: o gecəki Ayın üzü hamamdan təzəcə çıxmış, mütrüfcəsinə işaran kişi sifətinə yaman oxşayırdı, üstəlik hamamdan təzəcə çıxan o "kişi"nin mütrüfcəsinə işaran sifətinə elə bil bolluca ənlik-kirşan da yaxmışdılar. Və o gecə o arvadlar bəlkə bir də ona görə danışmağa söz tapmırdı ki, o "sifət" göyün tən ortasında eləcə işara-işara arsız-arsız o arvadların düz gözünün içinə baxırdı və onların eləyəcəyi söhbəti, açıq-aşkar o da eşitmək istəyirdi.

Ayın o mütrüflüyü, şorgözlüyü birinci Cinni Cəbrayılın qızı Məşuqəni hövsələdən çıxartdı:

– Bu nədi: elə bil *TUMANÇAQ* oturmuşam! – dedi. Və ədəbsiz bir söyüş söyüb, üstəlik "ayıbını" da pis-pis qaşıya-qaşıya durub öz xarabasına üz qoydu.

Məşuqə küçənin o başında, döngədə gözdən itənəcən arvadlar dinməz-söyləməz onun arxasınca baxdılar. Və Məşuqənin gözdən itdiyi o döngədəki ev də elə bu vaxt Ceyranın qızı Bətulənin diqqətini özünə çəkdi. Rayonun *"qəstinsəsində"* *gah gecə, gah gündüz* növbəsində işləyən arverçi Nuriyənin evindən o gecə də işıq gəlmirdi. Ancaq Nuriyənin hələ qızlıq vaxtından tək-tənha yaşadığı evin küçəyə sarı bir cüt pəncərəsinin dümağ pərdələri Ayın işığında par-par parıldayırdı. Ceyranın qızı Bətulə o dümağ pərdələrə bir müddət heyran-heyran tamaşa elədi. Və o heyranlıq üz-gözündən hələ tamam çəkilib getməmiş, Bətulə o cevizin dibində hələ heç vaxt heç kəsin ağlına gəlməyən o təzə mövzunu da birdən kəşf eləyə bildi.

– *O NURİYƏNİ GÜLLƏLƏMƏK LAZIMDI!* – Bətulə o təzə mövzunu bu qorxunc sözlərlə başladı.

Arvadlar bərkdən gülüşdülər. Ona görə ki, onlar Ceyranın qızı Bətulədən belə sözü heç gözləmirdilər. Çünki Bətulə gecələr o cevizin dibinə mırt vurmağa yığışanların ən cavanıydı. Uşaq idi, axırıncı sinifdə oxusa da, hər halda hələ məktəbə-dərsə gedirdi.

– Baxarsız: day bu kənddə heç kəs uşaq doğmayacaq! – Bunu da Bətulə dedi. Amma necə dedisə, bu dəfə arvadlar gülüşmədilər, əksinə, özlərini yığışdırıb, Bətuləyə axıracan qulaq asmağa hazır olduqlarını sidqi-ürəkdən nümayiş etdirdilər. Və bundan xeyli fərəhlənmiş Bətulə sevinə-sevinə söhbətinə davam elədi: – Heç bilirsiz, o ifritə bu saat nə gətirib satır bu kənddə?..

Bu yerdə arvadların biri, nədənsə, dərindən ah çəkdi.

– *PEZELVATİV!* – Yəqin ki, təzəlikcə eşitdiyi bu "importnu" sözü Bətulə xüsusi fəxr ilə dedi.

– *PALAZFƏTIR* nədi? – Həmin o ah çəkən arvad qəmli-qəmli xəbər aldı.

"Pezelvativ" əhvalatının dalınca arvadlar Məşuqənin, beş-altı il əvvəl, guya Molla Məcnundan olan "bic" oğlunun söhbətinə başladılar. Burda, əslinə qalsa, təəccüblü bir şey yox idi: əgər söhbət əri ola-ola uşaq doğa bilməyən arvadlardan gedirdisə, əri olmaya-olmaya uşaq doğan Məşuqə o arvadların yadına mütləq düşməliydi. Ancaq bu söhbəti arvadlar, nədənsə, o cevizin bu dünyadan uçub getmiş bir dünya kölgəsinin yerindəki sehri çəkilmiş işığa və o işığın göydən yerə səpələyən – əndamı, əndazəsi tamam dəyişmiş – o Aya yaxşı-yaxşı baxandan sonra başladılar – guya o cevizin budağı-yarpağı-kölgəsi öz yerində olsaydı, o arvadlar Məşuqənin o uşağı doğmağının sirrini də heç vaxt açmayacaqdılar, o sirri, sirr olaraq, həmişəlik saxlayacaqdılar.

*SİRR AÇILDI.*

Nəsir müəllimin öz əli ilə gedər-gəlməzə göndərdiyi o cevizin yoxa çıxmış kölgəsinin boş yerində o gecə arvadlar Məşuqənin beş-altı il əvvəl doğduğu o uşağın barəsində ilk dəfə müzakirə açdılar. Rayonun yol idarəsində elə-belə adlarını yazdırıb, əslində cürbəcür şübhəli işlərlə məşğul olan və ciblərində həmişə bıçaq gəzdirən, biri subay, biri evli – iki əmioğlunun – Elmanın və Telmanın adını da o arvadlar o gecə ilk dəfə qorxub-çəkinmədən dillərinə gətirdilər. Məşuqənin o, bic-bicəngə əmoğluların hər ikisi ilə "çaşqa-loşqa" olduğunu və uşağın məsələsi gerçəkləşəndə Elmanla Telmanın o işi bıçaq zoruna Molla Məcnunun boynuna qoyub, aradan çıxdığını o gecə, Ayın o gur işığında arvadlar, çoxdan sübut olunmuş fakt kimi, bir ağızdan təsdiqlədilər. Gecələr o cevizin dibində mırt vurmaqda bəlkə hamıdan çox "stajı" olan – Molla Məcnunun qoca, qanuni arvadı Müşafərim də o əmioğluların gecə vaxtı əri ilə qapının ağzında pıçhapıç pıçıldaşmağını bir neçə dəfə gözüylə gördüyünü arvadlardan gizlətmədi. Muşafərim arvadların bircə o fikrilə qətiyyən razılaşmadı ki, guya Molla Məcnun, yaşı çox olduğuna görə uşaq əkə bilməz: "Əkər! Elə əkər!..– Bunu Müşafərim arvad, nədənsə, dili-dodağı təntiyə-təntiyə dedi. – Girinə keçsə, on beş yaşlı qızı da bir gecəyə boğaz

ulaşmasının dalınca Buzbulaq məktəbinin dil-ədəbiyyat müəllimi Lətif müəllimin kəndin lap təpəsindəki evinin eyvanından birdən-birə maqnitofon musiqisi ucalanda arvadlar lap əməllicə təəccübləndilər. Çünki Lətif müəllimin ikinci arvadı – bakılı qızı İradə hələ qışın ortalarında Buzbulaqdan həmişəlik yığışıb gedəndən sonra kəndin başının üstündə gecəli-gündüzlü toy havası çalan o maqnitofonu Lətif müəllim bu çağacan hələ bir dəfə də oxutmamışdı. Vur-tut üçcə ilin içində ikinci arvadı da fələyin badına verdiyinə görə qış uzunu bürüşmüş heyva kimi pəs dolanan Lətif müəllimin ancaq yazqabağı bir balaca qırışığı açılmışdı. O da nəyə görə olsa yaxşıdır? İradənin Bakıdan göndərdiyi məktuba görə! O məktubda İradə Lətif müəllimin haqqında xoruz səsi eşitməmiş gözəl-gözəl sözlər yazmışdı: *ALİ MƏXLUQ, NƏCİB İNSAN, NURLU SİMA* – nə bilim daha nə! Hətta İradə, keçmiş qaynanası – davakarlığına, ətiacılığına görə kənddə İTAĞIZ ləqəbi qazanmış Gülputadan da öz məktubunda gen-bol razılıq eləmişdi. Lətif müəllimin neçə vaxtdan bəri həmişə cibində gəzdirdiyi və hər yerdə hamıya oxuduğu o məktubun lap axırında ümumən buzbulaqlıların barəsində yazılan sözləri isə bu saat kənddə əzbərdən bilməyən az adam tapılardı, çünki özləri barədə buzbulaqlılar heç vaxt heç kəsdən belə söz eşitməmişdilər: *"QOY O UCA DAĞLAR DA BİLSİN Kİ, BUZBULAĞIN ŞAİR QƏLBLİ NƏCİB İNSANLARINI MƏN HEÇ VAXT UNUDA BİLMƏYƏCƏYƏM!"*

## IV

O cevizi kəsdiyinə görə hələ ki, Nəsir müəllimə güldən ağır söz deyən olmamışdı, amma sən bu mütrüf dünyanın işinə bax: o cevizin kölgəsi o küçənin üstündən həmişəlik yoxa çıxandan sonra Buzbulaqda dalbadal bütün sirlərin üstü açılırdı.

Hələ yazın ortalarında kənddə belə bir söhbət gəzməyə başladı ki, İradənin guya Bakıdan göndərdiyi o məktubu Lətif müəllimin şəxsən özü yazıb. Məlum oldu ki, o maqnitofonun səsini qaldırıb, kəndin başının üstündə gecə-gündüz toy havası çaldıranda Lətif müəllim öz şəhərli arvadıyla heç bir kef-zad da eləmirmiş, əksinə – o qərib, o yetim, o məzlum şəhərli qızını ayağının altına salıb heyvan kimi döyürmüş və o maqnitofonun səsini də elə ona görə o cür yuxarı qaldırırmış ki, o yazıq İradənin ah-naləsini kənddə eşidən olmasın... Lətif



müəllimin Ceyranın qızı Bətuləyə bir könüldən min könülə aşiq olduğunu və o məktub əhvalatını da elə o Bətulənin başını piyləmək üçün uydurduğunu kənddə danışmayan adam qalmadı, halbuki Lətif müəllimə ərə getməyə Ceyranın qızı Bətulənin başının qırmızı yaylığı da razıydı: nə olsun ki, Lətif müəllim üç ildə iki arvad alıb boşamışdı və nə olsun ki, Lətif müəllimin anasına *İTAĞIZ GÜLPUTA* deyirdilər – onun, yəni Lətif müəllimin elə bircə kəndin toylarında əzbərdən dediyi ibrətamiz şeirlər Buzbulağın bütün subay oğlanlarının bəlkə hamısına dəyərdi.

*BƏLİ, DÜNYANIN İŞİ XALİS MÖCÜZƏYMİŞ.*

Gecələr arvadların mırt vurmağa yığışdığı o yerin üstü açılandan sonra elə gün olmurdu ki, kənddə hər hansı bir adamın da hər hansı bir sirrinin üstü açılmasın: toy günü – toy eləyənin, yas günü yas eləyənin... Açılan sirlərin çoxusu "ər-arvad", "qadın-kişi" məsələlərinə aid olurdu, çünki Buzbulağın köhnə sirlərini bir-bir faş eləyənlər – kölgəsi qeybə çəkilmiş o cevizin dibinə hər gecə mırt vurmağa yığışan – həmin arvadlar idi. Ancaq bu işə "kənardan" əl uzadanların sayı da, deyəsən, gün-gündən çoxalırdı. Məsələn, Buzbulağın az qala yarım qəbiristanlıq ölüsünün üstündə qırx ildən bəri Quran oxuyan Molla Məcnunun o Quranı *YALANNAN* oxumağının sirrini hər halda o arvadlar açmamışdı. Bununla belə, bütün kənddə söz gəzirdi ki, Molla Məcnun o Quranın heç bircə hərfini də tanımır, heç onun qırx ildən bəri qoltuğunda gəzdirdiyi o "Quran"ın özü də əslində Quran-zad deyil, Abbasqulu Ağa Bakıxanovun əski əlifba ilə çap olunmuş "Gülüstani-İrəm" adlı kitabıdır. Hətta belə bir söhbət də gəzirdi ki, o kitabın dinəzada heç yerli dibli dəxli-zadı yoxdur, üstəlik o kitabı yazanın özü də dinsizin böyüyüdür və o, *"DİNSİZİN BÖYÜYÜ"* rus çarının ordusunda neçə il *PALKOVNİK* olub... Bir sözlə, yazın əvvəllərində Nuriyənin *"PEZELVATİV"*indən başlayan o söhbət – hələ yaz qurtarmamış artıq Abbasqulu Ağa Bakıxanovun həyat və yaradıcılığını da hərtərəfli əhatə eləyə bilmişdi.

## V

Bütün bu hengamədən təkcə "baiskarın" xəbəri yox idi. Bir vaxt ceviz ağacında xəyal elədiyi o cənnəti Nəsir müəllim hələ yazın ortalarında öz həyətində qismən yaratmışdı. Onun o həyətdə basdırdığı

şaftalı, ərik, alma, armud tinglərinin hamısı tutmuşdu, həyətin yoncası adam boyu qalxmışdı, mərslərdə yoncanın yan-yörəsində əkilmiş noxudun sapsarı, lobyanın ağappaq çiçəyi o yaşıl yoncanın fonunda adama uzaqdan-uzağa gəl-gəl deyirdi.

Şükür kişinin həyətini (*DƏDƏMİN CƏVİZİN KƏSƏN QOY ONUN ÇÖRƏYİN DƏ VERSİN* deyən – bir sürü külfət sahibi Raziyənin o həndəvərə yaxın düşməyəcəyini tam yəqin eləyəndən sonra) əsasən Süsənbər əkib-becərmişdi. Təsərrüfatçılıqda, işi səliqə-sahmanla görməkdə Süsənbərin özünün də nadir səriştəsi olduğuna baxmayaraq, elə Şükür kişinin həyətində də Nəsir müəllim az zəhmət çəkməmişdi: torpağın bel ağzı batmayan ən bərk yerlərini o belləmişdi, arxları o çəkmişdi, kartof, soğan, lobya əkilən yerlərə peyini o daşıyıb vermişdi. Nəsir müəllimin o həyətdə hələ bu il əkdiyi çiyələkdən gündə bir nimçə yeməyin hesabına indi Şükür kişinin yanaqları da qırmızılıqda xalis çiyələyə dönmüşdü.

İşin həddən çox olmağından, bütün günü belibükülü alaq eləməkdən, tərli-tərli su içməkdən, ya nədənsə yayın isti gecələrinin birində elə yatdığı yerdəcə Süsənbər birdən-birə sapsarı saraldı. Bu cür xəstəliyin adı söz yox ki, yalnız "sarılıq" ola bilərdi. Elə Nəsir müəllim də yüz faiz arxayın idi ki, arvadı sarılıq azarına tutulub. Amma Süsənbərin azarı sən demə sarılıq azarı deyilmiş. Gecə birdən-birə saralanda demə onun öd kisəsi yatdığı yerdəcə partlayıbmış. O partlamış öd kisəsilə Süsənbər düz on gün yorğan-döşəkdə əzab çəkdi. On birinci gün sübhtezdən Süsənbərin gözləri həmişəlik yumuldu. Və bu xəbəri eşidənlər bir ağızdan *SÜSƏNBƏRİ O CƏVİZİN AHI TUTDU*, – dedilər.

Meyiti – günortaya yaxın – Molla Məcnunun "təzə arvadı" Məşuqənin – iri qazanda çömçə-çömçə tökdüyü qaynar su ilə – köhnə, qanuni arvadı Müşafərim yudu. Axşamtərəfi Süsənbəri qəbrə qoydular... Və o qəbiristanlıqdan evə qayıdanda, elə həyətə girər-girməz, nəhayət, Nəsir müəllimə də məlum oldu ki, (Süsənbərin ölməyi öz yerində) elə dünyanın özündə də deyəsən nəsə dəyişib. Özü də pis dəyişib. Elə dəyişib ki, day onu əvvəlki halına salmaq heç cür mümkün olan şey deyil.

Qəbiristanlığa – Süsənbəri dəfn eləməyə gedən üç cüt, bir tək adamın da hamısı bir göz qırpımında yoxa çıxmışdı. Həyətdə – o Məşuqədən və Müşafərimdən savayı – insan naminə gözə dəyən bir də Şükür kişiydi. Məşuqə samovarın yanındaydı. Müşafərim xörək qazanının altındakı odu eşirdi; mərasimə yığışası adamlar üçün qurulmuş ikitərəfli uzunsov



oturacağın yanında Şükür kişi yerdə, döşəkçə üstündə əyləşib, yəqin ki, yeməyi çox yeyib köpdüyündən, möhkəm fısıldaya-fısıldaya çay içirdi. Bir də Molla Məcnun – ayağının biri eşikdə, biri içəridə – darvaza qapısının ağzında gözləri döyükə-döyükə qalmışdı.

Buzbulaq Nəsir müəllimin ehsanını *BAYKOT* eləmişdi – buna heç bir şəkk-şübhə ola bilməzdi. Ancaq bu amansız, bu allahsız qisas görəsən doğrudanmı Nəsir müəllimin o cevizi kəsməyinin indiyəcən gizli qalan qisasıydı?.. Nəsir müəllim buna həm inanırdı, həm inanmırdı, həm də bir qəribə vahimə içində gözlərini ora-bura gəzdirib, elə bil başının üstündə o cevizin kölgəsini axtarırdı. O kölgə oralarda, əlbəttə, yox idi. Amma ömründə heç bir cin-şəyatin əməlinə, özgə planetlərdən gələnlərə, o dünyadan təşrif gətirənlərə heç vaxt inanmayan Nəsir müəllim kimi ciddi bir adama da o anda, nədənsə, elə gəlirdi ki, o kölgə var, o kölgə bu dünyadan heç yerə getməyib. O kölgəni gözü ilə görməsə də, onun ağırlığını Nəsir müəllim ürəyində açıq-aşkar hiss eləyirdi. Və o kölgə doğrudan da ağır idi, çox ağır idi. Hər halda Nəsir müəllimdən ötrü o axşam bu dünyada o kölgədən ağır heç nə yox idi.

O gecəni Nəsir müəllim elə bil doğrudan da bir ağır kölgənin altında yatdı. Səhər duranda heç həyətə çıxmağı da gəlmirdi, çünki içi ət xörəyi ilə dolu ehsan qazanı elə oradaca – ocağın üstündə qalmışdı; nə samovara əl vuran olmuşdu, nə qənddanları, nəməkdanları stolların üstündən yığışdıran olmuşdu.

Mərhumun üçünə Nəsir müəllim xörək bişirtdirmədi. Özü samovarı salıb oturdu. Ancaq Nəsir müəllimin evinə o axşam da heç kəs ayaq basmadı.

Bir neçə gündən sonra (cümə axşamı) Süsənbərin yasına Çığnagüldən – avtobusda, yük, minik maşınlarında – xeyli adam tökülüşüb gəldi. O adamların uzaq, uca, tanış dağlardan gətirdiyi ab-hava Nəsir müəllimin əhvalını əvvəl-əvvəl az-maz dəyişsə də, Buzbulaq camaatının o qəfil qisasının ceviz kölgəsinə bənzəyən acı ağırlığı sonra onun ürəyinin başında elə qaldığı kimi də qaldı. Çığnagüllülərin qabağında Buzbulağın abırın örtmək üçün – "patriotluq" xatirinə yasa gələn beş-üç buzbulaqlının da duruşundan-oturuşundan o axşam Nəsir müəllimin heç xoşu gəlmədi, çünki onların hamısının sir-sifətindən elə bil zəhər yağırdı və o zəhərin nəyin zəhəri olduğunu anlamaqda Nəsir müəllim hələ də yaman çətinlik çəkirdi: yəni bu boyda kin-küdurət görəsən doğrudanmı yalnız o cevizin kəsilməyinə görəydi!..

Bundan bir az sonra – hələ yay qurtarar-qurtarmaz buzbulaqlılar, arvadlı-kişili, orda-burda dəstələşib, hər payız Buzbulağa gələn boz dolaşaların qızğın söhbətini başladılar və bütün kənd yekdilliklə bu qərara gəldi ki, daha o quşlar heç vaxt oralara gəlməyəcək, çünki hər payız Buzbulağa gələn və gündüzlər kəndin başının üstündə qatar-qatar uçuşan o quşların hamısı gecələr Şükür kişinin cevizinin başında yatırdı və indi o ceviz yox idi.

Hətta atasının ev-eşiyindən çoxdan ayağını kəsmiş Raziyə də – o dolaşa söhbəti ortaya çıxanda – üç-dörd dəfə o həndəvərdə göründü. Küçədə – bir vaxt ceviz ağacının budaqlarının sallandığı yerdə – əllərini göyə açıb, guya Allahın dərgahına o cevizin yoxluğunun qəmli hekayətini danışırdı. Ucadan ağı deyib, sanki ceviz ağacına yas saxlayırdı. O ağacı kəsənin bütün əhli-əcdadına qarğış tökürdü, lənət yağdırırdı... Bütün bu hengamədən bircə Şükür kişinin xəbəri yox idi. Süsənbər rəhmətə gedəndən sonra Şükür kişi bu dünyanın kələfinin ucunu deyəsən tamam itirmişdi. Gün doğandan gün batanacan ora-bura boylanıb, kim idisə, nə idisə – elə bir hey hər yerdə axtarırdı. Gah həyətdə xəyal kimi kərdi-külənin başına dolanırdı, gah çıxıb küçə qapısının qabağından məzlum-məzlum yola tamaşa eləyirdi; eyvanın bir küncündə atılıb qalmış hisli mis qazanın özündən də Şükür kişi (bəlkə gündə yüz dəfə o qazana yaxınlaşıb!) elə bil kimisə soruşmaq istəyirdi, xəbər almaq istəyirdi... Şükür kişinin axtardığı, söz yox ki, Süsənbər idi, ancaq qocanın yaddaşı o qədər zaylamışdı ki, o Süsənbəri haçan, harda, hətta yuxuda, ya gerçəklikdə gördüyünü də Şükür kişi büsbütün unutmuşdu...

Elə sözün hərfi mənasında da göydən düşən bu dolaşa söhbəti buzbulaqlıların Süsənbərin yasında çıxartdığı o hoqqadan hələ özünə gəlməmiş Nəsir müəllimə, nədənsə, hər şeydən çox yer elədi. Bu söhbəti eşitdiyi gündən, vur-tut bir günün içində, necə oldusa, Nəsir müəllimin ağzının suyu tamam çəkilib getdi, iştahası büsbütün yoxa çıxdı, boğazı quruduğundan, gecələr yatdığı yerdə boğulmağa, təngnəfəs olmağa başladı. Beləcə, bircə həftənin içində Nəsir müəllim arıqlayıb çöpə döndü. Və hələ payızın birinci yağışı yağmamış bir dəfə – axşamtərəfi – elə oturduğu yerdəcə birdən-birə başa düşdü ki, daha Buzbulaqda qala bilməyəcək. Elə o axşam köçüb Çığnagülə getməyi qərara almış Nəsir müəllim evin ən vacib əşyalarından bir neçə bağlama düzəldib hazırladı, sonra həmin bağlamaları bir-bir aparıb yolun ağzına yığdı ki, ordan da yavaş-yavaş daşıyıb maşın yoluna çıxartsın.



## VI

Ceyranın qızı Bətulənin eşqi ilə son zamanlar kənd içində daha çox avaralanan Lətif müəllim o gün axşamtərəfi yenə o həndəvərə canan pişvazına çıxanda, Nəsir müəllim yolun ağzına yığdığı şeyləri artıq ordan o tərəfə daşımağa başlamışdı. On-on beş iri bağlamaydı. Kiminsə rəhmə gəlib köməklik eləyəcəyindən çoxdan əlini üzmüş Nəsir müəllim əvvəl o bağlamaların birini aparıb müəyyən məsafədə qoyurdu, sonra qayıdıb o biri bağlamaların birini aparıb müəyyən məsafədə qoyurdu, sonra qayıdıb o biri bağlamanı götürürdü, bu minvalla Nəsir müəllim o şeyləri yol boyu düzə-düzə gedirdi. Əlacsızlıqdan yazıq Nəsir müəllim yolun da yaxınını qoyub, uzağını seçmişdi, çünki maşın yoluna kəsəsinə gedib çıxmaqdan ötrü mütləq çayxananın qabağından keçmək lazım idi və o çayxananın qabağındakı adamların üzünü görməmək üçün Nəsir müəllim bilə-bilə o uzaq yolu götürmüşdü.

– Nədi, köçməkdəndi, qolleqa?.. – Lətif müəllim qız kimi nazlana-nazlana şortu, şit səslə dilləndi. – Qorxma, tələsmə, qolleqa, rahat daşı – mən burda şeylərin yanında durmuşam. – Və Lətif müəllim eşqdən işım-işım işaran, qara muncuğa bənzər, xırdaca gözlərini Bətuləgilin küçənin o başındakı darvaza qapısına zillədi, üstəlik siqaretini də damağına qoyub, Nəsir müəllimin şeylərinin keşiyində dağ kimi dayandığını canı-dildən nümayiş etdirdi.

Çayxananın qabağında isə o dolaşaların söhbəti yenə bərk qızışmışdı. Axşamın sərin xoş havasında eşikdə ağac dibində oturub kamali-səliqə ilə çay içən yaşlı kişilər də, o kişilərdən azca aralıda nərdtaxtanın başına toplaşan cavan oğlanlar da o dolaşaların bir də Buzbulağa qayıtmayacağından yaman narahat idilər. Çayçının özü – yəni Genral Cəfər – Pesmis Qulu və poçt müdiri Allahqulu ilə mübahisə eləməkdən – boğazının sallaq hulqumundan tutmuş, qulağının dibinəcən payız çuğunduru kimi qıpqırmızı qızarmışdı. Pesmis Qulunun bayaqdan sübut elədiyi buydu ki, o cevizi kəsməklə Nəsir müəllim hər payız Buzbulağa gələn o quşları təkcə gecələmək yerindən məhrum eləməyib, həm də onları “alçaqcasına”, “vicdansızcasına” yurdsuz, vətənsiz qoyub.

– Bəli! Bəli! – Pesmis Qulu şəhadət barmağını, tapança kimi əvvəl Genral Cəfərin alnına, sonra poçt müdiri Allahqulunun gicgahına tuşladı. – Necə ki, təcavüzkar İsrail dövləti o yazıq Fələstin ərəblərini həmişəlik vətənsiz qoymaq istəyir! – Və elə bunuca deyib, öz fikrini

yeni siyasi dəlillərlə əsaslandırmağa hazırlaşırdı ki, necə oldusa, Pesmis Qulunun gözü birdən göyə sataşdı; gördü ki, göydə bir dünya dolaşa var və o dolaşalar, eynən o biri illərdə olduğu kimi, yenə qatar-qatar düzülüşüb, göy üzündə ləzzətlə uçuşurlar. Pesmis Qulu kepkasının uzun dimdiyini tez aşağı dartıb, gözünün lap üstünə basdı – guya onun o kepkanın dimdiyini gözünün üstünə basmağıyla o birilər o bir dünya quşu göyün üzündə görməyəcəkdilər.

Ancaq o quşları deyəsən o birilər də görmüşdü: ağac dibində oturub kamali-səliqə ilə çay içən yaşlı kişilər də, onlardan azca aralıda nərdtaxtanın başına yığışan cavan oğlanlar da...

O dolaşaları bircə Lətif müəllim görməmişdi, çünki çoxdan bəri gözlərini Bətulegilin darvaza qapısına zilləyib, Nəsir müəllimin şeylərinin yanında duran Lətif müəllimin hələ bir dəfə də göyə baxmağa vaxtı olmamışdı.

Və Lətif müəllim gözünü bircə saniyəliyə o qapıdan çəkən kimi bir də baxıb gördü ki, yanındakı şeylər azalmaqdansa artıb, çoxalıb. Gördü ki, Nəsir müəllim bayaq o tərəfə daşıdığı bağlamaları indi bir-bir qaytarıb təzədən bu tərəfə gətirir.

– Nooldu, qolleqa? – dedi. – Deyəsən, fikrin dəyişdi axı. Düz eləyirsən, vətən yaxşıdı... Sən bu millətin dediyinə çox da fikir vermə, qolleqa: nə bilim, dolaşa belə gəldi, sağsağan elə getdi...

Öz həmkarının dilindən bu sözləri eşidəndə Nəsir müəllim xeydi rahatlandı, yüngülləşdi. İşə bax: çoxdan üzü gülməyən Nəsir müəllimin o sözlərdən sonra, deyəsən, hətta bir müxtəsərcə dodağı da qaçdı. Və yolun ağzına yığdığı o bağlamaları Nəsir müəllim sevinə-sevinə öz qapısına tərəf daşımağa başladı.

## VII

Amma Allahın özü şahiddir ki, o dolaşaların qayıtmağından Nəsir müəllimin xəbəri yox idi...

*Oktyabr-noyabr, 1991*



# YƏMƏN

*...Dağdı, bağdı, çəməndi.*
*Hər şey həmən-həməndi.*
*Bu dünya bir Yəməndi,*
*Yəməndi, ay Səfalı!**

***Əvvəlinci fəsil***

## HƏSRƏTİN XƏSTƏLİYİ

Səfalı müəllimin həyatından nəsə yazmaq ilk dəfə iki-üç il bundan qabaq mənim ağlıma gəlmişdi. Bu qəribə adamın qəribə həyatını mən o vaxt çox götür-qoy eləmişdim. Onun başına gələnləri (şərq təşbehi ilə desəm) muncuq-muncuq sapa düzüb, bundan boyunbağı, yaxud təsbehvari bir şey düzəltmək istəmişdim. Ancaq o sap dönə-dönə qırılmışdı, muncuqlar ora-bura səpələnmişdi: bir ucu – Buzbulaq, bir ucu – Yəmən. Hələ Zuğulbanı, Buxaranı, Amerika Birləşmiş Ştatlarının cənubundakı – Uilyam Folknerin dünyaya gəldiyi – Missisipi ştatını demirəm...

Mən Səfalı müəllimlə, bir növ, həmişəlik xudahafizləşmişdim. Özüm də, düzünə qalsa, bundan bir elə peşman da deyildim. Bizim işdə belə şey tez-tez olur: aylarla, bəzən illərlə beynində dolandırdığın bir adam – sən yazı stolunun dalına keçəndə – bir də görürsən yoxmuş; ha əlləşirsən, onu tapıb yazıya gətirə bilmirsən. Mənə qalsa, Səfalı müəllimin də aqibəti çox güman ki, belə olacaqdı. Ancaq belə olmadı. Bu il iyul ayının 21-də (fikir verin: amerikalı Nil Armstronqun Ayda gəzdiyi gün) Bakıdakı Qoburnat bağı ilə üzüaşağı bulvara sarı getdiyim yerdə Səfalı müəllim birdən-birə təzədən yadıma düşdü. Özü də tək ona görə yox ki, otuz doqquz yaşlı amerikalı professorun bir vaxt gedib Ayda gəzməyi Səfalı müəllimin həyatında çox böyük hadisəydi, həm də ona görə ki, bu il, iyul ayının axırlarında Bakıda olan isti bəlkə heç ABŞ-ın cənubundakı Missisipi ştatının özündə də çoxdan olmamışdı və o isti Amerikanın böyük yazıçısı Uilyam Folkneri və

* El atası Əli Ziya bu qiymətli misraları bir zaman – kefinin saz vaxtı – uzaq Səna şəhərinin təyyarə vağzalında demişdi.

Buzbulaq kəndinin doxsan altı yaşlı sakini Xızır kişini, mənim əqidəmə görə, mütləq Səfalı müəllimin yadına salmalıydım.

Elə Səfalı müəllimin həyat tarixçəsini də o vaxt mən Folknerlə Xızır kişinin əhvalatından başlamaq fikrindəydim. Təsəvvür edəyin: Folkner və Xızır kişi – bədii əsər üçün bundan maraqlı başlanğıcı hardan tapmaq olardı?.. Həm real, həm də qeyri-adi. Qeyri-adiliyi öz-özünə məlumdur. Reallığı isə burasındaydı ki, bir gün (onda da isti yay günü idi) öz evində kresloda oturub, tərləyə-tərləyə çay içdiyi yerdə birdən Səfalı müəllimin gözü kitab rəfindən birbaş ona tərəf baxan bir adam sifətinə sataşmışdı. Sifət bir qalın kitabın üz qabığındaydı. Baxan – qaraqaş, qaragöz bir bığlı kişiydi. Yaşı qırx beş-əlli arasında olardı. Və qaramtıl çərçivəyə alınmış o şəklin yuxarısında iri ağ hərflərlə alt-alta: UİLYAM FOLKNER yazılmışdı.

Uilyam Folknerin böyük adam olduğunu Səfalı müəllim, söz yox idi ki, bilirdi. Bu məşhur yazıçının ədəbi fəaliyyətindən də Səfalı müəllimin az-çox xəbəri vardı. Ancaq o kitabı Səfalı müəllimin özü almamışdı. Qızı Rena (pasportda da Renaydı, Rəna deyildi) Leninqradda oxuduğu vaxt ordan alıb gətirmişdi. Folknerin o üstü şəkilli kitabı kitab rəfində o vaxt qoyulduğu kimi də qalmışdı. Yəni: kitabdan çox, şəkil kimi. (Kim bilir, bəlkə elə o Renanın özündən ötrü də o şəkildəki qaraqaş, qaragöz, qarabığ kişi böyük yazıçı Folknerdən savayı kiməsə, bir ayrı adama da oxşayırmış!)

Ancaq o isti yay günü təri dabanından çıxa-çıxa çay içib yanğısını söndürəndə Səfalı müəllim o şəkildə gördüyü adamı özgə heç kəsə yox, elə birbaşa dayısı Xızır kişiyə bənzətmişdi. Hələ "bənzətmişdi" sözü də bəlkə o söz deyil: o anda Səfalı müəllimə elə gəlmişdi ki, o şəkildəki adam Folkner yox, məhz Xızır kişidir. Həmin Xızır kişi: Buzbulaq kəndinin doxsan altı yaşlı sakini və Səfalı müəllimin dop-doğmaca dayısı.

Əsər üçün əla başlanğıcdır, elə deyilmi?.. Ancaq hadisənin reallığı məsələsi qorxuram kimdəsə yenə şübhə doğursun. Xüsusən: qırx beş-əlli yaş arasında olan "intilligentni" bir adamın doxsan altı yaşlı adi bir kəndliyə oxşamağı!.. Realdır, vallah, bu da yüz faiz realdır. Ona görə ki, Səfalı müəllim, dayısı Xızır kişini axırıncı dəfə min doqquz yüz otuz səkkizinci ildə görmüşdü. O vaxt Xızır kişi qırx beşlə əlli yaşın arasındaydı. İndiki doxsan altı yaşı isə Səfalı müəllimin özü cürbəcür üsullarla hesablamışdı. Əslində Xızır kişinin yaşı doxsan da ola bilərdi, hətta lap



doxsan doqquz da. Bunun məsələyə dəxli yoxdur. Söhbətimizin məğzi burasındadır ki, Bakının isti yay günlərinin birində belə bir qəribə əhvalat həqiqətən Səfalı müəllimin başına gəlmişdi və bu əhvalat hər hansı bir bədii əsər üçün kifayət qədər maraqlı başlanğıc ola bilərdi.

Bu yay (Armstronqun Aya uçduğu həmin gün) həmin o Qoburnat bağında Səfalı müəllim birdən-birə təzədən yadıma düşəndə mən o Folkner əhvalatını da, söz yox ki, xatırlamışdım və ötüb keçən iki illik fasilədən sonra o gülməli əhvalat indi mənə, nədənsə, daha çox ağlamalı görünmüşdü. Özü də ona görə yox ki, Xızır kişi, Folknerə baxmış, çox bədbəxt adam idi. Belə şeyi bilmək olmaz! Heç bunu da bilmək olmaz ki, Xızır kişi, ümumiyyətlə, bütün yer üzündə özünü hər hansı bir kişidən aşağı hesab eləyirdi, ya eləmirdi. Ancaq eyni göyün, eyni Allahın altında yaşayan bu iki insanın müqayisəsində nəsə ağlamalı bir şey mütləq vardı: heç olmasa ona görə ki, guya hamıya eyni gözlə baxan o Allahın altında Xızır kişi vur-tut on iki sot torpağın yiyəsiydi, həmin o Folkner isə yaşadığı ölkənin xəritəsində dörd min kvadrat kilometrlik bir sahəni rəngli karandaşla çevrəyə alıb altından bu sözləri yazıb, qol çəkmişdi.

*"UİLYAM FOLKNER: BU TORPAĞIN YEGANƏ VARİSİ VƏ SAHİBİ".*

Səfalı müəllim Folknerin tərcümeyi-halının bundan savayı da bəzi faktlarını elə o üstü şəkilli kitabdanca bilirdi. Dayısı Xızır kişinin barəsində isə Səfalı müəllimin indiki təsəvvürü ayda-ildə bir dəfə bazarda, yolda-zadda təsadüfən rast gəldiyi və dayanıb ayaqüstü kəlmə kəsdiyi adamların dediyinə, bir də onun – yəni Səfalı müəllimin özünün nəhayətsiz fantaziyasına əsaslanırdı. Məsələn: Səfalı müəllim bilirdi ki, dayısının arvadı Tərlan da hələ ölməyib, sağdır. Bilirdi ki, Xızır kişinin üç qızının hansı kimin oğluna ərə gedib, yeganə oğlu Səfər kimlərdən özünə arvad alıb... Bir inək, beş-on qoyun-keçi, beş-on da toyuq-cücə. Özü də bunlar, Xızır kişinin təsərrüfatında gərək ki, elə o vaxt da vardı. Ancaq o vaxt Xızır kişinin bir qara, qıvraq, qiyamət eşşəyi də vardı, Səfalı müəllimin xatirində o eşşəklə bağlı çox şey qalmışdı və indi real dünya ilə tamam üzülüşüb, öz keçmiş uşaqlıq xəyallarına bərk-bərk qapıldığı vaxtlarda hərdən Səfalı müəllimə elə gəlirdi ki, o eşşək o kənddə hələ də durur.

Səfalı müəllimin kənddə keçən uşaqlıq çağlarından mən bu kitabda sizə çox şey danışacağam. Mən sizi Xızır kişinin özüylə də, onun

– Səfalı müəllimin təsəvvüründə hələ də əvvəli, axırı görünməyən bir böyük aləm kimi qalmış – o on iki sot həyətyanı torpağıyla da, hətta lap inəyi, qoyunu, keçisiylə də mütləq tanış eləyəcəyəm. Ancaq Folknerlə Xızır kişinin əhvalatına bir də qayıtmayacağıma, düzü, özüm də bir o qədər arxayın deyiləm və bunu nəzərə alaraq bu söhbətə bəri başdan bir-iki söz də əlavə eləyib, mətləbi bitirmək istəyirəm.

Birinci sözüm odur ki, həmin o isti yay günü, oturub, çay içdiyi yerdə birdən başını qaldırıb, dayısı Xızır kişinin kitab rəfindən birbaş ona baxdığını görəndə Səfalı müəllim əvvəl bir növ, sevinən kimi olsa da, sonra möhkəm narahat olmuşdu; istiyə-zada məhəl qoymadan, özünü poliklinikaya salıb, ilk növbədə qan təzyiqini ölçdürmüşdü, çünki o kitab iyirmi ildən də çox ordaca durduğu halda Xızır kişinin Folknerə çevrilməyi cəmi-cümlətanı bir-iki saniyənin içində baş vermişdi və deməli, tibbi terminlə desək, anomaliya göz qabağındaydı. *"NOSTALGİYA!"* – Bu diaqnozu "Minzdravın" dördüncü baş idarəsinin ikinci poliklinikasında təzəlikcə peyda olub, az vaxtda "talkovıy vraç" adı qazanmış – danışığından, rəftarından əyalət adamına oxşayan – cavan bir həkim Səfalı müəllimə sevinc və təntənə içində böyük kəşf kimi elan eləmişdi. Ancaq Səfalı müəllim bunu həkimsiz də bilirdi. Üstəlik, onu da bilirdi ki, bu sözün əsl adı "nostalgiya" yox, "nostalgiyadır" – yəni vurğu ikinci hecada deyil, üçüncüdədir. Buna baxmayaraq, poliklinikadan qayıdan kimi Səfalı müəllim lüğət kitablarının birində o sözün mənasını axtarıb tapmışdı və hər şeydən əvvəl, o mənaya heyran qalmışdı: *"NOSTALGİYA* (yunanca nostos – qayıdış+alqos – ağrı, əzab) – vətən həsrəti". Bir sözlə, yurdun, vətənin həsrətindən yaranan ağrı və əzab! Səfalı müəllimə görə, burada heyrətamiz dərəcədə böyük məna vardı və bu məna lüğət kitabında çox dəqiq ifadə olunmuşdu. Ancaq görəsən nəydi bu: həsrət idi, yoxsa xəstəlik idi?.. Bəlkə həsrətin xəstəliyiydi? Kəməminə min şükür, Pərvərdigara, həsrətin də xəstəliyi olarmış!

Hər halda, lüğətdəki bu izahat o gün Səfalı müəllimə bəlkə heç vaxt oxumadığı ən gözəl, ən qəmli bir şerin təəssüratını bağışlamışdı. Həm də o izahat Səfalı müəllimi haradasa – ürəyinin bir yerində xeyli sevindirmişdi. Əvvəla, ona görə ki, Səfalı müəllimin xəstəliyi əgər vur-tut buydusa, bu "nostalgiya" deyilən şey lap xəstəlik olsa da, bu xəstəliyə Səfalı müəllim çoxdan öyrəşmişdi – yəni doğulduğu, böyüdüyü, ta bu şəhərə gələnəcən on yeddi-on səkkiz il suyunu içdiyi,



havasını udduğu yerin həsrəti Səfalı müəllimin ürəyində elə bu çağacan da ağrı kimi, əzab kimi dönə-dönə baş qaldırmışdı. İndi Uilyam Folknerin sifətində peyda olmuş Xızır kişi də, çöz yox, bu həsrətin belə bir qəribə təzahürüydü. Özü də, başqası yox, məhz Xızır kişi! Çünki Səfalı müəllimin kənddə keçən on yeddi-on səkkiz illik həyatı hamıdan və hər şeydən çox Xızır kişi ilə bağlı idi. *Onun həyətilə*, o həyətdəki ağac-budağı, kərdi-küləsilə... Atası lap cavan ikən ölmüş yetim Səfalı gözünü açandan, demək olar ki, bir növ dayısıgildə, dayısının yeganə əziz-xələf oğlu Səfərlə, onun bir cüt "qafiyə-qızı" Nazxanım və Qızxanımla bir yerdə böyümüşdü. Balaca Səfalı, dayoğlusu və dayısıqızıyla birgə, kəndin çayının qırağında Xızır kişinin qoyun-keçisini otarmışdı, inəyini naxıra qatmışdı, onun o qara, qıvraq eşşəyini minib, ləzzətlə yolaşağı, yolyuxarı çapmışdı... Və demək, o isti yay günü ömrün o unudulmaz çağlarının həsrəti yetmiş iki yaşlı Səfalı müəllimin gözləri qarşısında Xızır kişinin vücudunda, necə deyərlər, bir növ zühur eləmişdi. Bu da insan tənhalığının belə bir mənzərəsiydi. Bu dünyada kimsəsiz qocalanların kədərli aqibətinin bəlkə də adi bir ştrixiydi, cizgisiydi. Pensiyaya çıxandan və anası həştad səkkiz yaşlı Sərənin dalınca arvadı Zərnigarı da qəbrə qoyandan sonra Səfalı müəllim bu aqibəti, dinməz-söyləməz, bütün ağırlığıyla qəbul eləmişdi, çünki onun Rena ilə əlaqəsi çoxdan kəsilmişdi. Səfalı müəllimin Leninqradda oxuyan qızı, hələ institutu qurtarar-qurtarmaz, orda ona dərs deyən – təxminən atası yaşda bir gürcü familiyalı yəhudi professora ərə getmişdi və o vaxtdan Bakıya qayıtmamışdı...

Qızı ərə gedəndən sonra Səfalı müəllim bir dəfə Leninqradda olmuşdu. Onda Sərən arvad da hələ sağ idi. Renanı Sərən arvad bəlkə Zərnigarın özündən də çox istəyirdi. Ancaq ölüm yatağında qəsdən bir dəfə də nəvəsinin adını çəkmədi. Elə bir hey "Xızır! Xızır!" – deyib qardaşını çağırdı. Xızır isə, əlbəttə, yoxuydu. Xızır kişi Buzbulağın dağ-daşında, bağ-bağatında ədəb-ərkanla öz qoyun-keçisini otarırdı. Ancaq o kitab ordaydı. O kitab Sərən arvadın sağlığında da neçə il orda olmuşdu: qaraqaş, qaragöz, qarabığ kişi... Və əgər o şəkildəki adam Xızır kişiyə həqiqətən bu qədər oxşayırdısa, bunu bəs Sərən arvad niyə heç vaxt görməmişdi?.. Bir sözlə, Səfalı müəllimin təxminən əlli il bundan qabaq Buzbulaqda qoyub gəldiyi Xızır kişi şəkildəki o Folknerə bu və ya digər dərəcədə həqiqətən oxşasa da, hər halda, "həsrətin xəstəliyi" də burada, söz yox, öz işini görmüşdü.

Bu xəstəlikdən heç olmasa bir müddətliyə canını qurtarmaq üçün Səfalı müəllim, təxminən əlli illik fasilədən sonra, mütləq kəndə getməliydi. Gedib orda dayısıyla, dayıcanısıyla, Səfərlə, Nazxanım və Qızxanımla, indiki Buzbulaqla və (ən vacibi!) özünün uşaqlıq və ilk gənclik çağlarıyla görüşməliydi. Və o gün, yəni "Apollon – 11" kosmik gəmisinin Aya uçduğu 21 iyul tarixdə Qoburnat bağından sahil parkına çıxıb, orada gəzə-gəzə mən, xəyalımda, Səfalı müəllimlə birgə Buzbulağı da eninə-uzununa gəzib dolanmışdım. Və əgər mən bu yazını elə o gün yazmağa girişsəydim, onun birinci fəslini yəqin ki, elə bu yerdəcə – yəni Səfalı müəllimin kəndə səfərindən başlayacaqdım. Ancaq mənimki o gün də gətirmədi, çünki istiydi, çox istiydi, bürküdən-boğanaqdan adamın beyni qır qazanı kimi qaynayırdı.

...Bu günlərdə yenə sahil parkına gəzməyə çıxmışdım. Sentyabrın əvvəlləriydi. İstilər sınmışdı. Sahil parkının əsl gəzməli vaxtıydı. Ancaq arvadı Zərnigar rəhmətə gedəndən sonra az qala bütün gününü sahil parkında keçirən Səfalı müəllim o gün orada yox idi.

Görəsən, harda olardı?

Çox fikirləşəndən sonra bu qərara gəldim ki, yəqin Səfalı müəllim Zuğulbada olar: "Minzdrav"ın dördüncü baş idarəsinin sanatoriyasında, çünki arvadı Zərnigarın sağlığında Səfalı müəllim ilin bir-iki ayını həmişə həmin sanatoriyada keçirərdi.

Zuğulbaya gedəcəyi gün Səfalı müəllim lap tezdən durmuşdu.

Həyəcanlıydı. Bir növ sevincək kimiydi. Üç-dörd stəkan çayın hesabına bir loxma yağ-pendir tikəsini zorla yeyə bildi. Siqaretini də balkonda həris-həris çəkəndən sonra gördü ki, tezdir, lap tezdir. İndi yola çıxsa, ola bilər ki, metroda bir o qədər də əziyyət çəkməzdi, ancaq metronun lap axırıncı stansiyasındakı avtovub dayanacağında mütləq basırığa düşəcəkdi: camaatın işə gedən vaxtıydı.

Şey-şüyünü axşamdan yığıb hazırlamışdı. "Şey-şüy" deyəndə – bir iki dəst alt paltarıydı, bir cüt ehtiyat başmaqdı; sabın, üzqırxan və s. Bunları Səfalı müəllim balaca çamadana yığmışdı. Arvadı – rəhmətlik Zərnigarın sağlığında da həmişə Zuğulbaya apardıqları tok pilətəsini isə ayrıca zənbilə qoymuşdu. Daha doğrusu, "Vaskanın sumkası"na (pişik Vaskanın!). Sibir cinsindən olan bu qəribə heyvanat məxluqunu Zərnigara – ölümündən bir il qabaq, qızına baş çəkmək üçün birinci və axırıncı dəfə Leninqrada gedəndə Renanın həmin o gürcü familiyalı professoru hardansa alıb bağışlamışdı. Üç-dörd il dalbadal onlar hər il



Vaskanı da – o sumkada – özləriylə Zuğulbaya aparmışdılar və axırıncı dəfə Zuğulbadan qayıdanda Zərnigar pişikdən birdən-birə vaz keçmişdi. "Qoy qalsın burda, – demişdi. – Vallah, Səfalı, qorxuram bunun sir-sifətindən. Görmürsən – adama necə nifrətnən baxır! Elə bil dədəm borcludu bunun dədəsinə... Üz-gözündən allahlıq tökülür evini Allah yıxmışın!.."

Zərnigar doğru deyirdi. Adama o cür pis-pis baxmaq Vaskanın, necə deyərlər, arı deyil, adətiydi. Gözlərinin ifadəsində sanki anadangəlmə bir amiranəlik və yekəxanalıq vardı. Adama elə baxırdı ki, elə bil ağıl da bundaydı, şüur da, üstəlik – ən yüksək mədəniyyət də! İnsan isə başdan-binadan ona qulluq eləmək üçün yaranmışdı: gedib, iki saat növbədə durub ona dükandan süd almaq üçün, onun üç-dörd öynəlik xörəyini vaxtında və keyfiyyətli bişirib vermək üçün. Bir sözlə, Vaska demə, deynən bəy balası, anadangəlmə aristokrat. Pişikdəki bu "allahlıq iddiası" edə Səfalı müəllimin özünü də dönə-dönə cin atına mindirmişdi, hirslədib özündən çıxartmışdı. Ancaq bu işlər o zaman olmuşdu. Zərnigarın sağlığında. Son vaxtlar Vaskanın o xasiyyətləri üçün Səfalı müəllimin hərdən lap burnunun ucu göynəyirdi və indi, arvadının ölümündən sonra, ilk dəfə Zuğulbaya gedərkən, onun ürəyinin başında orada Vaskanı görməyin – sehrli-nisgilli – böyük ümidi dolanırdı.

Sumkayla çamadanın yanında vurnuxa-vurnuxa, bekarçılıqdan Səfalı müəllim Zuğulbaya apardığı şeyləri yenə bir-bir xəyalında götür-qoy elədi. Yaddan çıxmış bir şey olsaydı da, bunun əslində elə bir qorxusu-zadı yox idi. Zuğulbadan şəhərə qayıtmaq çətin iş deyildi: avtobusla vur-tut bir saatlıq yol idi. Ancaq bu dəfə Səfalı müəllim fikrində qoymuşdu ki, heç olmasa oktyabrın ortalarınacan şəhərdə görsənməsin, çünki Xızır kişinin Buzbulaqdakı nəvə-nəticəsinin içində xüsusən onun sonbeşiyi – müharibə başlanan il dünyaya gəlmiş – üçüncü qızı Bəsxanımın böyük oğlu Taryelin qəfildən Bakıda peyda olmağından, düzü, Səfalı müəllim yaman qorxurdu. Səfalı müəllimin yayda Buzbulaqda gördüyü həmin o Taryel bir neçə il idi ki, Moskvada yaşayırdı. Orda evlənmişdi və aldığı qız da guya general qızıydı. Bu yay Səfalı müəllim Buzbulaqda olanda Bəsxanımın gədəsi orada – beş-on günün içində – birdən görünüb, birdən də yoxa çıxmışdı. Özünün də Səfalı müəllimə heç bir pisliyi-zadı dəyməmişdi. Əksinə, az vaxtın içində ona gözləmədiyi hörməti göstərmişdi. Üzü qızıl suyuna

çəkilmiş dəmir qabda xarici çay (İngiltərədə doldurulmuş Çin çayı!) az qala dünya xəlq olandan, ildə azı bir dəfə Moskvaya yolu düşən Səfalı müəllimin ömründə görmədiyi cürbəcür Moskva konfetləri, qəribə peçenyelər... Taryelin lap birinci görüşdə bu şeylərin sırasında Səfalı müəllimə bağışladığı şotland viskisini isə indi Səfalı müəllim ya həkimlərin birinə, ya da rastına çıxacaq hər hansı bir əməlisaleh sovet adamına bağışlamaqdan ötrü çamadanda özü ilə Zuğulbaya aparırdı.

Ömründə birinci dəfə gördüyü bir adama bu cür bahalı hədiyyə bağışlayan otuz-otuz beş yaşlı cavan bir oğlandan elə təkcə bu hədiyyəyə görə də Səfalı müəllim, söz yox, şübhələnə bilərdi. Ancaq Taryelin hədsiz diribaşlığı deyəsən Səfalı müəllimi daha çox qorxutmuşdu. Kənddə olduğu bir neçə günün içində Taryel öz evlərinin damına boyaboy paslanmayan dəmir saldırmışdı. Çayın yatağına motor qoydurub, iyirmi-otuz metr hündürlüyündə uzun bir boru ilə babası Xızır kişinin həyətinə, bir barmaq nazikliyində olsa da, hər halda, həmişəlik su çıxarmışdı. Səfalı müəllimin illər uzunu heç kəsin oturmadığı dədə-baba yurdunda da Taryel özündən bir nişanə qoymuşdu: odunla qızdırılan dəmir bak, kran, duş – hamamvari bir şey. Əgər Səfalı müəllim razı olsaydı, Taryel onun dədə-babadan qalma torpaq damına şifer saldırmağa da hazır idi. Ancaq Səfalı müəllim belə şeyə razılıq verə bilməzdi, çünki Taryel bu boyda işə görə də ondan pul almaq fikrində deyildi, bu isə çox böyük xəcalətlik idi və bu boyda xəcalətliyin altından çıxmağa Səfalı müəllimin heç cür zoru çatmazdı. Üstəlik, o Taryelin Səfalı müəllimin Bakıdakı bu mənzili ilə bağlı, deyəsən, nəsə gizli bir planı vardı. Hər halda, bu mənzil o ütük, o fələk gədəni açıq-aşkar maraqlandırırdı; tez-tez evin yerini soruşurdu, otaqların sayını xəbər alırdı. Birbaşa dili ilə deməsə də, dolayısıyla dediyi buydu ki, indiyəcən qohum-əqrəbadan qaçdığın bəsdir, icazə ver, innən belə yaxın olaq, evinə gələk; qoca kişisən, ölməyinə bir şey qalmayıb, elə eləmə ki, öləndə evin itə-qurda qismət olsun... Taryel Səfalı müəllimdən telefon almışdı, adres götürmüşdü. Kişi sentyabrın ortalarında həmin o "general qızı" arvadıyla Bakıya, Səfalı müəllimə təşrif gətirməyə hazırlaşırdı. Səfalı müəllim bu təşrifin arxasında Taryelin mənzillə bağlı "uzaqvuran" planlarını da görürdü və indi yığışıb Zuğulbaya getməkdə Səfalı müəllimin bəlkə də əsas niyyəti o gədəni imkan daxilində bu evə buraxmamaqdı.

Buzbulaq və onun indiki sakinləri barədə hekayətimizin əsas səhifələri hələ qabaqdadır. İndilikdən isə bircə bunu deməyi lazım bilirəm



ki, iyunun on altısından, ta avqustun iyirmi altısınacan az qala iki ay yarımlıq kənd həyatından sonra bu geniş mənzilində bir müddət Səfalı müəllim – bəlkə də heç vaxt olmadığı qədərində – xoşbəxt və rahat yaşamışdı. Əvvəla, məişət rahatlığı: vanna, duş, istədiyin vaxt – isti su, soyuq su. İkincisi – bazar, dükan (ərzaq bolluğu sarıdan Bakı, Buzbulağa baxmış, cənnətin ən gözəl bir guşəsiydi, yer üzünün firavan bir məmləkətiydi!) Üçüncüsü isə, kəndə getmək Səfalı müəllimin canındakı – çox dərinə işləmiş – o nostalgiyanı tamam sağaltmasa da, hər halda, onun illər uzunu Səfalı müəllimə verdiyi arasıkəsilməz əzab-əziyyəti xeyli yüngülləşdirmişdi. Səfalı müəllim özünün şəhərli həyatının qədir-qiymətini elə bil indi-indi duyub, dərk eləməyə başlamışdı.

Bolluq və məişət rahatlığı sarıdan Səfalı müəllimin Zuğulbada da sən deyən çətinliyi olmayacaqdı. İkiotaqlı ayrıca mənzil – deyək ki, palata. İsti su, soyuq su, hər şey: sanatoriyanın yeməyindən də Səfalı müəllim bir o qədər narazı deyildi. Qaldı ki, ürəkistəyən çay məsələsi – onu da təşkil eləmək mümkün idi: "Vaskanın sumkasındakı" o tək plitəsini Səfalı müəllim elə bu məqsədlə Zuğulbaya aparırdı.

Bir-iki saatdan sonra Səfalı müəllim şeylərini pilləkənin başında – liftin qabağına qoyub, öz dördotaqlı mənzilinin qapısını kilidlədi və erməni – pilləkən qonşusu – Lora arvadın qapı zəngini basdı ki, aşağıda, darvaza girəcəyindəki poçt qutusunun açarını ona versin. İyunda, Buzbulağa gedəndə də o, poçtun açarını Lora arvada vermişdi, çünki Səfalı müəllim xeyli qəzet-jurnala abunəçiydi və bütün bu qəzet-jurnal o qutudan heç olmasa iki-üç gündən bir mütləq götürməliydi.

Səfalı müəllimin hara getdiyini qonşu qabaqcadan bilirdi. Və Səfalı müəllim qabaqcadan qonşudan onu da xahiş eləmişdi ki, gəlib soruşan-zad olsa, onun Zuğulbada olduğunu Lora arvad heç kəsə deməsin. Bunu Səfalı müəllim, ərayi-ehtiyat, qonşunun bir də yadına salmağı lazım bildi:

– Bir nəfər, – söz yox, Taryeli nəzərdə tuturdu, – bilirəm ki, gəlib axtaracaq məni. Deməyin Zuğulbada olmağımı. Naxal adamdı. Sizi çox dəng eləsə, deyin: Leninqrada gedib.

Bu dünyanın hər üzünü görmüş, səksəndən artıq yaşı olan çevik, dilli-dilavər Lora Azərbaycan dilini bəlkə Səfalı müəllimin özündən pis bilmədiyi halda, nədənsə, rusca cavab verdi:

– Çto vı? Çto vı? Ne bespokoytes. Ne skaju. Ni v koem sluçae...

Səfalı müəllim də ruscaya keçdi:

– Mne pridyotsya inoqda bespokoit vas po telefonu. (Yəni: hərdən sizə telefonla zəhmət verməli olacağam).

– Koneçno! Koneçno! Pozvonite, skolko xotite! V çyom mojet bıt razqovor? – Lora arvad sidqi-ürəkdən dedi və Səfalı müəllim ürəyində fikirləşdi ki, əgər Lora rus dilini yaxşı bilsəydi, gərək "v çem" deyəydi: o çem mojet bıt razqovor. Və bunu fikirləşə-fikirləşə də liftin düyməsini basdı.

– Xodyat sluxi, çto Qorbaçyova skoro snimut. (Yəni: şayiə gəzir ki, Qorbaçovu tezliklə işdən çıxaracaqlar). – Lora gözlənilmədən dedi.

– Neujeli?! – Səfalı müəllim hədsiz təəccüblə dilləndi və eyni vaxtda da Taryelin – heç vaxt üzünü görmədiyi – moskvalı qaynatasının general qiyafəsi, olduqca mücərrəd bir şəkildə, haradansa Səfalı müəllimin gözünün qabağına gəldi.

Zuğulbaya çatıb yerbəyer olandan sonra da – gunorta yeməyinin vaxtınacan – Səfalı müəllimin sərəncamanda hələ bir saatdan çox vaxt qalırdı və bu vaxt ərzində sanatoriyanın bütün gəzməli yerlərini gəzib-dolanmaq olardı.

Gəzintiyə Səfalı müəllim, bir-birindən müəyyən qədər aralıda, təxminən bir xətt üzrə tikilmiş – bir üzü dənizə baxan – üçmərtəbəli, dördmərtəbəli yaşayış korpuslarının elə həmin o dəniz tərəfindən də başlayası oldu, çünki bu korpusların hamısının balkonu da dəniz tərəfəydi və əgər Vaska sağıydısa, onun aşağı mərtəbədəki balkonlardan birində olmağına daha çox ehtimal vardı. Bundan əlavə Səfalı müəllim həm də çoxdan görmədiyi dənizə tamaşa eləmək istəyirdi. *Daha doğrusu, burdan* – bu sanatoriyanın ərazisindən görünən dənizə, çünki bu dəniz, əlbəttə, Bakının sahil parkından görünən mazutlu, hisli-paslı dəniz deyildi. Burada dənizin suyu hərdən göz yaşı kimi dumduru olurdu.

Dəniz indi də duruydu. Onun gün düşən yerləri büllur kimi par-par parıldayırdı. Hava da çox isti deyildi. Hər halda, Buzbulağın adamı isti bıçaq kimi kəsən qupquru yayından sonra Abşeronun günəşi Səfalı müəllimə olduqca mülayim və mehriban görünürdü.

Zuğulbanın əsas mövsümü iyul-avqust aylarıydı. Bu aylarda bura putyovka almaq da hər adamın işi deyildi. O iki ayı əsasən vəzifə sahibləri burada ailəlikcə dincəlməyə gəlirdi: bəzi nazirlər, bəzi rayon katibləri, vəzifəli intelligensiya... Bir də – vəzifəsi bir o qədər böyük olmasa da, böyük pulu olanlar... Və bu saat Səfalı müəllimə ləzzət verən bir də oydu ki, cəmiyyətin ən çox yeyən və ən çox zibil istehsal



eləyən bu azğın, ərköyün təbəqəsinin iki aylıq "səlib yürüşündən" sonra da təbiət öz yarasını sağalda bilmişdi. Zuğulba – həmin Zuğulbaydı. Dəniz – yerində... Kol-kos, gül-çiçək, ağac-budaq – hər şey yerindəydi. Hətta quşlar da: sərçə, şanapipik, Misir göyərçini... Orda-burda hərdən it, pişik də gözə dəyirdi. Ancaq Vaska yox idi. Sanatoriyada olacağı uzun müddətdə Səfalı müəllim buralarda o Vaskanı hələ çox axtaracaqdı.

Günorta yeməyindən sonra Səfalı müəllim bir saat-saat yarım yatmaq fikrindəydi. Durub, tok plitəsinin üstündə çayını qaynadacaqdı və bu cünün əsas işinə də çaydan sonra girişəcəkdi. Özünün buradakı ikiotaqlı mənzilində Səfalı müəllim hər şeyin yerini dəyişəcəkdi: çarpayısını o otaqdan bu otağa çəkəcəkdi, divanı itələyib, balkona açılan qapının lap yaxınlığına qoyacaqdı; televizoru soyuducunun, soyuducunu televizorun yerinə dartacaqdı və məhz bundan sonra Səfalı müəllim dünyanın ən çox yeyən və ən çox zibil ixrac eləyənlərindən birinin iki ay yaşadığı bu mənzildə özünü nisbətən rahat hiss edəcəkdi. Elə indiyəcən də o, həmişə belə eləmişdi, buna sanatoriyanın "xozyaykasını", süpürgəçisini də öyrəşdirmişdi, çünki Səfalı müəllimin buradakı həyatı dünyanın o çox yeyənlərinin həyatından nə iləsə mütləq fərqlənməliydi – bunsuz Səfalı müəllim özünə hörmətini itirərdi.

Vaxtdan düz on beş dəqiqə keçsə də, yeməkxananın qapısını hələ açmamışdılar və yeməyə gələnlərin hamısı – qapıdan bir qədər aralıda – qəzet köşkünün yanına toplaşmışdı. Burada dörd-beş nəfər Səfalı müəllimin tanıdığı adam var idi. Ancaq əksəriyyət təzə adam idi. Özü də hamısı bir yerdə – çox olsa, əlli-altmış adam olardı. Əsas sezon sovuşandan sonra – elə o biri illərdə də – burada Səfalı müəllim lap nadir hallarda bundan çox adam görmüşdü.

Beş yüzdən çox adam tutan böyük yeməkxanada Səfalı müəllimin özünə münasib bildiyi yerdə oturmağına heç kəs mane olmadı. Zalın baş tərəfində, şüşəbəndin içində bir yemək yeri də vardı. Xüsusi adamların yeriydi və orda yeyilən xörəyin, necə deyərlər "obşi katyol"a heç bir dəxli yox idi. Şüşəbənddə indi də beş-altı adam oturmuşdu. Özləri də, deyəsən, balıq kababı yeyirdilər. Şüşəbəndə tez-tez girib-çıxan ağ papaqlı, ağ xalatlı aşpazın şiş-şiş ora daşıdığı, hər halda uzaqdan-uzağa ancaq nərə balığının kababına oxşayırdı... Və öz borşunu, kotletini yeyib ayağa duranda şüşəbəndin o yanında oturanlardan birini *ƏLİ ZİYAYA* oxşadan Səfalı müəllim uzun müddət gözlərinə inana bilmədi.

Əli Ziya ömründə buralara gələn deyildi, çünki, deyilənə görə, Əli Ziyanın hətta Moskvada da ayrıca evi vardı. Mərdəkandakı bağı isə Abşeronun ən yaxşı bağlarından sayılırdı. Buna görə də, Səfalı müəllim fikirləşdi ki, Əli Ziya ya buralara elə-belə gəzməyə gəlib, ya da xaricdən-zaddan qonağı var: qonaqları Abşeron mənzərələri ilə tanış eləyəndən sonra indi bura yeməyə gətirib. Ancaq Əli Ziya ilə bir yerdə çörək yeyən o adamların xarici, yaxud yerli adam olduğunu dəqiqləşdirməkdən ötrü o tərəfə bir də baxmağı Səfalı müəllim şəninə sığışdırmadı. Yeməkxanadan böyük təşviş içində çıxdı və yatmağa gedə-gedə öz-özünə təlqin eləməyə çalışdı ki, guya bu gün, Zuğulba deyilən bu məkanda Əli Ziya adında bir adamı o, heç yerli-dibli görməyib.

Ancaq o adama Əli Ziya deməzdilər – əgər onu yaddan çıxarmaq bu qədər asan olsaydı. Hər halda, Əli Ziyanı bircə dəfə uzaqdan-uzağa görməyi Səfalı müəllimin o günkü gündüz yuxusundan məhrum olmağı üçün tamamilə kifayət elədi. O gün, günorta yeməyindən sonra, Səfalı müəllimin gözünə yuxu gəlmədi, çünki onun necə deyərlər, bütün şüurlu ömrü Əli Ziya ilə bağlı idi. Onlar "ictimai həyata" bir yerdə qədəm qoymuşdular. Burada illər boyu yan-yanaşı yerimişdilər. İndi bəlkə on beş ildən də bir az çox olardı ki, onların haçansa birlikdə qədəm qoyduqları o aləmdə Əli Ziya Səfalısız gəzirdi. Daha orada Səfalı müəllimi itirib-axtaran yox idi və işin birdən-birə bu yerə gəlib çıxmasında Səfalı müəllim həmin o Əli Ziyadan yaman şübhəliydi.

– Səfalı...

– Eşidirəm.

– Kəpbəlayı olmaq istəyirsən?

– Nədi?

– Həvəsin var, səni Məkkəyə aparım?

– Məkkəyə gedənlər bəyəm Kərbəlayı olur?

Telefonda pişik öskürməyinə oxşayan kəsik-kəsik səs gəldi: Əli Ziyanın belə qəribə gülməyi vardı; gülən də səsi heç vaxt öz səsinə oxşamırdı.

– Fələksən, Səfalı, uzun işsən, sənə heç vaxt kələk gəlmək olmur... Yaxşı, qoy olsun Hacı... Hacı olmağınan necədi aran?

– Pis olmaz əllidən sonra... Nədi ki? Deleqasiya gedir?

– Hələlik özümüzük. – Əli Ziya məmnuniyyətlə bəyan elədi. – bəlkə Kiyevdən də bir nəfər oldu. Yəmənə gedirik, çox umsuq olma.



Deyirlər, yaxındı Məkkəyə, Minaşa indicə baxıb kartada... Bilikli uşaqdı Minaşa. Bu balam çox hazırlıqlı baladı.

Söhbət Əli Ziyanın sonbeşiyi Minayədən gedirdi. Bunu Səfalı müəllim bilirdi. Ancaq o vaxt Səfalı müəllim heç ağlına da gətirməmişdi ki, bu Minaşa söhbətini salmaqda Əli Ziyanın məqsədi var: qızını Səfalı müəllimin rektor olduğu instituta qoymaq məqsədi. Və əgər Əli Ziyanın belə bir məqsədi olmasaydı, Səfalı müəllim Yəmən deyilən o xarabanı güman ki, heç vaxt görməyəcəkdi...

Amma gördü. Özü də həmin o Yəmənlə bir yerdə Səfalı müəllim bu dünyanın – o çağacan heç vaxt görmədiyi – bir təzə, təptəzə sifətini də gördü. Dünyanın o qansız sifəti barədə yəqin ki, bir iri roman da yazmaq olardı. Belə bir mövzu hətta Şekspirin də əlinə düşsəydi, bundan, inan ki, Hamletvari, Otellovari bir həngamə çıxarardı. Ancaq bu saat mənim nə həngamə çıxartmağa halım var, nə Şekspir olmağa həvəsim. Olanı olduğu kimi sizə nəql eləyəcəyəm: fəlsəfi nəticəni özünüz çıxardarsız. Bir sözlə:

### *İkinci fəsil*

## YƏMƏN

Təyyarə Moskvadan gecə çıxdı: saat on ikiyə beş-on dəqiqə qalırdı. Əli Ziyadan və Səfalı müəllimdən savayı Yəmənə gedən bir də bir eynəkli, arıq arvad idi: Polina Viktorovna – şərqşünas, elmlər doktoru. Özü də kiyevli deyildi, moskvalıydı, Lomonosov universitetinin professoruydu.

Simferopoldan sonra, bir də Qahirənin təyyarə vağzalında – hələ gecəykən – az-maz dayanıb, səhəri, sübh-tezdən, Səna şəhərinin aeroportunda açdılar. O aeroportdan Səfalı müəllimin yadında qalan bir bomboz çöl-biyaban idi; alçaq, çılpaq boz dağlar idi. Bir növ Abşeron mənzərəsi: təxminən Xızı, Dəvəci, Qobustan tərəflər... Orda-burda – dağların, təpələrin yan-yörəsində ara-sıra göylük, çəmənlik də gözə dəyirdi. Həl halda, həyat həqiqətinə həmişə sadiq olan Əli Ziya o səhər o aeroportda bədahətən dediyi o üç-dörd misrada da öz yaradıcılığının bu başlıca prinsipinə qətiyyən xələl gətirməmişdi.

Moskvada təyyarəyə minəndən ta Sənada təyyarədən düşənəcən Əli Ziya bir dəfə də başını qaldırmadan, yol boyu daş kimi yatmışdı:

Səfalı müəllimin fikrincə, o səhər o təyyarə vağzalında buna görə Əli Ziyanın kefi saz idi. İlk baxışda çox quru və qaraqabaq adam təsiri bağışlayan Polina Viktorovna bütün yol boyu kitab oxumuşdu, beş-on dəqiqə mürgüləmişdi, ya mürgüləməmişdi ancaq o da o təyyarə meydanında o səhər çox diriydi, gümrah idi, hər halda təyyarədəki qədər ciddi, təkəbbürlü görünmürdü. Səfalı müəllim isə təyyarədə, demək olar ki, heç gözünü də yummamışdı. Yol boyu gah göydəki ulduza baxmışdı, gah yerdəki kənd-şəhərlərin elektrik işığına tamaşa eləmişdi, gah da Əli Ziyaya, Polina Viktorovnaya altdan-altdan göz qoyub, birinin ləzzətlə yatmağına, o birinin ləzzətlə kitab oxumağına ürəyində həsəd aparmışdı. Buna görə, o səhər o təyyarə vağzalında öz nəzərində Səfalı müəllim təxminən büzüşmüş turş heyva kimi bir şey idi. Əli Ziya isə – onunla müqayisədə – ağacdan təzəcə dərilmiş alyanaq almaya bənzəyirdi. Məzələnirdi, ucadan deyib-gülürdü. Elə aeroportdaca qoşduğu o üç-dörd misralıq şeiri hədsiz sevinc və ləzzətlə az qala [illegible] (məsəl kimi) dönə-dönə, təkrar-təkrar oxuyurdu.

...Təyyarə vağzalında onları qarşılamaq üçün Sovet səfirliyindən adam göndərmişdilər. O adamın köməyi ilə bir-iki anket-kağız doldurub, rəsmiyyət məsələlərini həll eləyəndən sonra gömrük nəzarətindən də asanca keçib, səfirliyin "Volqa"sında şəhərə yollandılar. Ancaq o yol ya şəhərə həddən çox yaxın idi, ya da aeroportdan şəhərə gedəndə Səfalı müəllimin huşu başında olmamışdı. Hər halda, təyyarə vağzalından mehmanxanayacan o yolda baxılası, görüləsi bir şey olmuşdusa da, o şeydən Səfalı müəllimin yaddaşında bu saat, demək olar ki, heç nə qalmamışdı. Bir-iki torpaq dam, torpaq hasar. Bir-iki evin – kənd arvadlarının gecə köynəyinə bənzər – don geymiş arıq, çəlimsiz kişilər və o kişilərin hamısının böyrundən sallanan, bir suyumu orağa oxşayan, qılıncvari silah. Vəssalam, şüttəmam. Hətta az qalıram deyəm ki, elə o Səna şəhərinin özündən də (bütövlükdə) Səfalı müəllimin xatirində qalan bəzi-para bu sayaq əhəmiyyətsiz şeylər idi. Əlbəttə, o həyəti çıxmaq şərtilə. Yəni mehmanxananın həyətini. O nəydi. Pərvərdigara, o bir dünya Buzbulağı o Boz Yəmən göyünün

içində xeyli tamaşa eləyəndən sonra Səfalı müəllim yatağa uzandı. Amma, əttövbə, yuxu nə gəzirdi – Səfalı müəllimin bütün əzaları yatmaqdan, yuxulamaqdansa, elə bil get-gedə daha da ayılırdı, oyanırdı. Səfalı müəllim o yorğan-döşəkdə gözüyumulu uzanmaqda ikən o həyətdəki cəvizin yarpaqları sanki fasiləsiz olaraq, daha da yaşıllaşırdı, arxın suyu duruldugca durulurdu, səliqəylə cərgəyə düzülmüş körpəcə lobya kolları sanki, bağca uşaqları kimi, əl-ələ verib, o həyətdə sevinclə "Yallı" gedirdi. Və dəhşət burasındaydı ki, o cəviz yarpağı, heyva çiçəyi, o Buzbulaq divanı və Yəmən lobyası sanki bir ağızdan səs-səsə verib Səfalı müəllimi çağırırdı. Bir tanış uğultu və giziltiylə bu səs Səfalı müəllimin – beynindən dırnağınacan – bütün əzalarını dolanırdı və onu yatmağa qoymurdu.

Yatmaq məsələsinin mümkün olmayacağını özü üçün tam yəqin eləyəndən sonra Səfalı müəllim yerindən qalxıb, hirsli-hirsli paltarını geyindi. Qapını ehmalca açıb dəhlizə çıxdı. Əli Ziyanın və Polina Viktorovnanın qaldığı nömrələrin qapısı qabağından, az qala pəncələri üstündə, ehtiyatla keçib, üçüncü mərtəbədən yavaş-yavaş aşağı endi.

Foyedə, giriş qapısının yan tərəfində onları aeroportdan gətirən sürücü – rus balası kresloda əyləşib, mehmanxana nəzarətçisi – üz-gözündən nur tökülən qarayanız ərəb oğlanla vur-çatdasın domino oynayırdı; səfirliyin "Volqa"sı da eşikdə, qapının lap yaxınlığında, səkinin altında dayanmışdı.

Qapıdan çıxhaçıxda Səfalı müəllim bir anlıq ayaq saxlayıb, o sarısaç, sarıqaş rus balasının ərəbcə danışmasına hədsiz ləzzətlə qulaq asdı; ürəyində o oğlana nəsə xoş bir söz deməyə Səfalı müəllim əşhədi-ehtiyac hiss elədi, ancaq demədi, deməyə məqam tapmadı, çünki sürücünün başı bərk qarışıq idi, onun Səfalı müəllimi görməyə vaxtı yox idi.

Mehmanxananın binasından bayıra çıxanda Səfalı müəllimin ürəyinin başında – o sünbülsaç rus balasının o cür şirin-şirin ərəbcə danışmağının və o qarayanız ərəb oğlanın üz-gözündəki o nadir insan işığının böyük həzzi ilə yanaşı, bir qəribə, səbəbi məlum olmayan qorxu-təlaş da vardı. Bir müddət elə oradaca – mehmanxananın qapısı ağzında, "Volqa"nın yan-yörəsində hərləndi. Sonra baxıb gördü ki, bayaq yuxarıdan tamaşa elədiyi o həyət mehmanxananın həyəti deyil, dörd bir tərəfdən öz hasarı olan ayrıca yerdir, sahədir. Ancaq ora mehmanxananın həyətindən də yol vardı: adi faner taxtasından balaca,



açıq qapı idi. Və o qapını qorxa-qorxa aralayıb, o bağçaya girən kimi Səfalı müəllim nəinki öz qorxusunu, hətta inanan olsa, deyərdim ki, sovet vətəndaşı olduğunu da tərtəmiz yaddan çıxartdı.

Görəsən o nəydi, Allah: vəhy idi, ilham idi, oyanış idi, yoxsa haçansa özü də bilmədən ölmüş Səfalı müəllim o gün o bir parça "Yəmən Buzbulağı"nda təzədən dünyaya gəlmişdi. Bütün gecəni yatmadığına baxmayaraq, o bağçada Səfalı müəllim olduqca gümrah idi, yüngül idi, ona elə gəlirdi ki, istəsə o bağçadan quş kimi uçub, bir göz qırpımında Buzbulağa çata bilər, orada Xızır kişinin həyətində istədiyi ağacın başına, istədiyi yarpağın üstünə qona bilər. Səfalı müəllimin yaddaşı, huşu-başı o gün o bağçada birdən-birə elə bil neçə illərin qəflət yuxusundan oyanmışdı, onun yarıməsrlik həyatı, nə ki var, özündəydi, elə bil lap ovcunun içindəydi – o həyatın ən ləzzətli çağları, bir qəribə yaz havası kimi, ılıq-ılıq, isti-isti Səfalı müəllimin canında, qanında dolanırdı.

Allah-Təala izn verəndə, sən demə, insan hər şeyə sevinə bilərmiş. Məsələn, ərəbin rusla domino oynamağına, rusun ərəblə ərəbcə danışmağına, hətta – böyük ədib, böyük alim, böyük ictimai xadim Əli Ziyanın dünyanın min-min mehmanxanasının birində ən adi adamların biri kimi uzanıb yatmağına da... Ancaq o gün o bağçada Səfalı müəllimin ürəyini sevinc-fərəhlə dolduran bir nömrəli hiss-duyğu bu dünyanın bir ev qədər sadə və yığcam olmağıydı və o sadə və yığcam evdən o gün Səfalı müəllimin yaman xoşu gəlirdi. O gün o bağda gəzəndə ayağı altdakı torpaq Səfalı müəllim üçün elə bil torpaq deyildi – bütün ilmələri, naxışları tanış – bir kilimdi, xalçaydı və üstündə Xızır kişiylə Tərlan arvadın dəst-xətti aşkar bilinən o xalçada – foyedə domino oynayan o ərəb balasının üzünün işığından da nəsə var idi. O bağın cəvizinə, şaftalısına, heyvasına, lobyasına heyran-heyran tamaşa eləyən Səfalı müəllimin nəzər-diqqətini, hərdən, tanımadığı ot-alaf, kol-kos, mer-meyvə də cəzb eləyirdi və qəribə burasındadır ki, heç vaxt görmədiyi o kol-kos, ot-alaf da Səfalı müəllimə dəhşətli dərəcədə tanış gəlirdi. Bəlkə bunları da Səfalı müəllim bir vaxt haradasa görmüşdü. Bəlkə bunları haçansa bu dünyada Səfalı müəllimin özü yox, ulu nənə-babası görmüşdü və o kol-kosun, ot-alafın ona o qədər tanış gəlməyi insandakı gen yaddaşının əməliydi. Hər halda, o gün o bağda gəzdiyi vaxt Səfalı müəllimin nəzərində dünyanın indisi, keçmişi, gələcəyi – hamısı bir-birinin içindəydi və bu sadə, möcüzəli

balaca dünyanın... Hərfləri tanıyıb, beş-üç kitab oxuyan kimi, o saat başlayırsız dünyanı pay-puş eləməyə: bu – mənim payım, bu – sənin payın, bu xalq belə gəldi, o xalq elə getdi. Üç cüt, bir tək əhalisi olan bədbəxt bir milləti də bakılıya, qarabağlıya, naxçıvanlıya ayırmaqdan utanmırsız... Nə var, nə var şöhrət istəyirsiz, ad istəyirsiz. İstəyirsiz ki, adam olmamış, sizi də adam yerinə qoysunlar, başınıza and içsinlər, ətəyinizdə namaz qılsınlar. Çarığı ayağınızdan çıxaran kimi millət qəhrəmanı olmaq eşqinə düşürsüz... Paho atonnan, guya çox böyük imiş bu dünya. Bunun nəyi böyükdü ki, axşam o başından çıxırsan, səhər gəlib çatırsan bu başına. Bir dünyanın ki, Yəmənində də, Buzbulağındakı kimi, lobyanın dibinə söyüd çubuğu taxılır, day o dünyanın nəyi böyük oldu... Yox, böyük deyil bu dünya – damarında insan qanı axanlar üçün. Heyvan isə gərək göstərsin heyvanlığın: vursun, yıxsın, dağıtsın, parçalasın... Heyvan üçün nə fərqi var ki, dünya böyükdü, ya kiçikdi, təki onun qarnı tox olsun. Altında maşını olsun, döşündə nişanı olsun..."

O gün, o Yəmən bağında Səfalı müəllim dünya vətəndaşı olmağın külli imtiyaz və ixtiyarından istifadə eləyib, hətta Buxaraya də ötəri baş çəkməyə vaxt tapdı. Ora da – hansısa mədəni tədbirdə iştirak eləmək üçün – bir vaxt onlar Əli Ziya ilə birlikdə getmişdilər. Hələ iyun lap təzəcə girmişdi, ancaq o Buxara viranxanada istidən yer-göy alışıb-yanırdı. İclas zalında camaat bütün günü elə bil fin hamamında oturmuşdu. Amma axşamı çox yaxşı oldu: camaatı maşınlara mindirib, şəhərin kənarına apardılar. Tədbirdə iştirak eləyənlərə orada – təbiətin qoynunda əla qonaqlıq verdilər. Əslinə qalsa, bu dünyanı (Məğribdən-Məşriqəcən) ağzına götürmüş Buzbulaq mənzərələrinin birinci ən təsirli kopiyasını Səfalı müəllim elə o vaxt orda görmüşdü: çay qırağı, meyvə bağı, yaşıl yoncalıq. Özü də çay çaya, bağ bağa, yonca yoncaya nə qədər oxşayarmış!.. İş o yerə gəlib çıxmışdı ki, ləzzətli özbək plovunun altından və üstündən bir-iki badə "Moskovski" içəri ötürmüş Səfalı müəllim o çayın qırağındakı hansı kolusa oturub namaz qılan Xızır kişiyə oxşatmışdı. Təsəvvür eləyin: ay işığı, çay qırağı və o çayın qırağında oturub namaz qılan Xızır kişi! Ancaq o Xızır kişi həmin o Uilyam Folknerə oxşayan qırx beş-əlli yaşlı Xızır kişi deyildi. O Xızır kişi qocaydı, çox qocaydı – oradakı Xızır kişinin – ölüsü – üç yüz otuz bir-üç yüz otuz iki yaşı olardı. Elə Xızır kişinin o qədər qoca, o qədər ahıl olmağı da, görünür, Səfalı müəllimi yaman kövrəltmişdi, həyəcanlandırmışdı. Səfalı müəllim o çayın qırağında oturub, hönkür-hönkür ağlamışdı və indi bu Səna şəhərinin mehmanxanasında, üçüncü mərtəbədə öz nömrəsində uzanıb şirin-şirin yatan Əli Ziya o vaxt orada – Səfalı müəllimi kiritmək üçün – xeyli məhsuldar əmək və qiymətli vaxt sərf etməli olmuşdu.

*AMMA, EY DADİ-BİDAD, O GÜN O MEHMANXANADA, SƏN DEMƏ, ƏLİ ZİYA DA YATMAYIBMIŞ!..*

Yuxusuna açı bibər qarışmış Əli Ziya yerinin içində bir xeyli eşələnəndən sonra, öz sadə məntiqi ilə, nəhayət, belə bir qərara gəldi ki, mehmanxanada taxtabiti var. Durub, yorğan-döşəyi çox çək-çevir elədi, bir dənə də taxtabiti görmədi.. Ancaq o yorğan-döşəyin içində bir də uzanmağa, nədənsə, özündə zərrə qədər də istək-filan hiss eləmədi. Bir müddət otaqda fırfıra kimi fırlanandan sonra, pijamadaca, dəhlizə çıxdı və baxıb gördü ki, Səfalı müəllimin qaldığı nömrənin qapısı örtülü deyil, aralıdır.

Əli Ziya o aralıqdan başını ehmalca içəri soxdu və Səfalı müəllimi çarpayıda uzanan görmədi. İçəri girib, qapısı açıq vanna-tualet otağına da baxandan sonra əvvəl Əli Ziyanın beyninə belə bir sarsaq fikir yerləşdi ki, Səfalı ayrı heç yerdə deyil, o biri – qapısı örtülü nömrədədir və orada Səfalı Polina Viktorovna ilə keyf çəkir, eyş-işrət məsələlərinə baxır. Bu haqq-hesab, nümayəndə heyətinin başçısı kimi, Əli Ziyanın bir qədər "çestinə" toxunsa da, o özünü imkan daxilində tox tutmağı lazım bildi və bu məqsədlə Əli Ziya təcili surətdə öz nömrəsinə çəkilmək qərarına gəldi. Ancaq öz nömrəsinin hələ heç qapısına da çatmamış beyninə yerləşən başqa bir fikir Əli Ziyanın o alicənab niyyətini bircə saniyənin içində büsbütün alt-üst elədi. Əli Ziya qətiyyətlə Polina Viktorovnanın qapısına tərəf yeridi və o qapını, olduqca mədəni bir şəkildə, yavaşca taqqıldatdı. Qapı o saatca açıldı. Çimib qəşəngləşmiş Polina Viktorovna, boz xalatda, qapının ağzında göründü. Əli Ziya tam arxayın oldu ki, Səfalı Polina Viktorovnanın nömrəsində deyil və bayaq ağlına gələn o fikir indi güclü tok kimi beyninə vurub, Əli Ziyanın hətta sümüklərini də gizim-gizim gizildətdi.

– On sbejal! – Rəngi-ruhu tamam çəkilmiş Əli Ziya bu sözləri dili-dodağı əsə-əsə dedi və "Kto sbejal? Kuda sbejal? – deyə-deyə ortalıqda çaşıb qalmış Polina Viktorovnanı elə o vəziyyətdəcə qoyub, paltarını dəyişmək üçün, başıhavalı, öz nömrəsinə cumdu.

Paltarını dəyişib pilləkənləri az qala üç-üç tullana-tullana üçüncü mərtəbədən aşağı düşəndə, Səfalının qaçıb Amerikanın səfirliyinə

dürtülməyinə Əli Ziyanın zərrə qədər də şübhəsi yox idi və aşağıya o cür sürətlə hücum çəkməkdə onun butun niyyəti özünü bacardıqca tez sovet səfirliyinə yetirib, bu barədə səfirliyi vaxtında xəbərdar eləmək və nümayəndə heyətinin başçısı kimi, bu işin məsuliyyətinin heç olmasa müəyyən faizini öz üzərindən götürmək idi. Aşağıda soruşub biləndə ki, Səfalının mehmanxanadan çıxmağından heç şoferin də xəbəri olmayıb, Əli Ziya öz vəziyyətinin doğruluğuna bir az da möhkəm inandı. “Qaçıb əclaf. Xəlvətcə sürüşüb çıxıb aradan...” – Əli Ziya ürəyində dedi və şoferdən icazə almamış, özünü maşının içinə dürtdü.

– Davay... Payexali... Tuda... V posolstvo...– Əli Ziya əməlli-başlı sayıqlayırdı.

Və bir azdan Yəməndəki sovet səfirliyində – səfirin bircə öz telefonundan savayı – bütün telefonlar işə düşdü. Dedikləri də, hər yerdə, eyni söz idi: “U nix kto-to propal... U nix kto-to propal...” Kimisi ciddi deyirdi, kimisi irişə-irişə, gülə-gülə deyirdi – elə bil Əli Ziya ilə məzələnirdi. Elə səfirin özü də bir az keçəndən sonra) öz otağında Əli Ziyanı çox asudə qarşıladı.

– Kuda on sbejit, nikuda on ne sbejit. (Yəni hara qaçacaq, heç yana qaça bilməz.) – Səfir gülə-gülə və çox arxayıncasınaa dedi. – İdite, otdıxayte. Syuda privezut vas posle obeda. Vaş plan mı uje sostavili. Zavtra otpravlyayetesya v Xodeydu. Tam u nas sovmestnoye predpriyatie imeyetsya. S naşimi lyudmi povidayetesya, zaodno i v Krasnom more iskupayetes...

Səfirlə görüşəndən sonra Əli Ziyanın əhvalı xeyli düzəlmişdi. Ürəyi nisbətən sakitləşmişdi, rəngi-ruhu az-çox yerinə gəlmişdi. Bununla belə, Səfalının mehmanxanadan qaçmağı və ayrı heç yerdə yox, məhz Amerika səfirliyində özünə siyasi sığınacaq istəməyi barədə Əli Ziyanın qəti qənaəti yenə yüz faiz öz yerində qalırdı. Və səfirlikdən qayıdanbaş, hələ heç maşından da düşməmiş, Səfalının mehmanxananın qapısı qabağında məzlum-məzlum gəzişdiyini görəndə bunu Əli Ziya qüdrətli sovet kəşfiyyatının növbəti parlaq qələbəsi hesab elədi: yəni guya Səfalı o mehmanxanadan doğrudan qaçmışdı və indi onun o mehmanxananın qabağında məzlum-məzlum gəzinməyi, məhz həmin kəşfiyyat orqanları tərəfindən böyük məharətlə həyata keçirilən operativ əməliyyatın əyani nəticəsiydi.

– Səfalı?! Ay tifağı dağılmış, bə mən axı bayaqdan səni axtarıram! – Bu sözləri Əli Ziya beş yaşda tərk eləyib, sonra heç vaxt ayaq basmadığı Sabirabad ləhcəsində səsi titrəyə-titrəyə dedi. Bu da dünyanın belə bir möcüzəsiydi: işi çətinə düşəndə Əli Ziya həmişə öz kəndinin ləhcəsində danışırdı.

– Niyə axtarırsan ki, məni? – Buzbulağın, Buxaranın hesabına az vaxtda xeyli uşaqlaşmış Səfalı müəllim uşaq təbəssümü ilə gülümsəyərək, məzlum-məzlum dilləndi.

– Bə mən sənə deməmişdim ki, düşüb aşağıda görüşəcəyik?

– Xeyr, sən demişdin ki, iki saat yatacayıx. – Səfalı müəllim saatına baxdı. – Hələ heç bir saat da keçməyib, – dedi.

Əli Ziya dili-dodağı əsə-əsə:

– Bə sən...– demək istəyirdi ki, bəs sən Amerika səfirliyinə qaçmamışdın? – Bə sən bayaqdan hardaydın? – dedi.

– Odu e, orda. – Səfalı müəllim divarın o tərəfini göstərdi. – O bağda gəzişirdim özüm üçün.

– Bəs o arvad hanı – Polina Viktorovna? – Bunu Səfalıdan soruşmaqda, əlbəttə, Əli Ziya söz tapıb mövzunu dəyişmək üçün bir vaxt qazanmaq istəyirdi.

– Nə bilim hardadı?.. Yəqin nömrəsində oturub, bığına sığal çəkir. – Səfalı müəllim bərkdən gülə-gülə dedi. Ancaq o “bığ” söhbətini Səfalı müəllim Əli Ziyanı cinnəndirmək üçün edə orda birdən-birə özündən uydurmamışdı. O, hələ dünən – Moskvada təyyarəyə minəndə – fikir verib görmüşdü ki, Polina Viktorovnanın bığı var. “Bığ” deyəndə beş-on təkəm-seyrək tük idi. Özü də məzə burasındaydı ki, o tüklərin rəngi nə ağıydı, nə qaraydı – bir növ, bənövşəyi rəngə çalırdı. Hətta səhər, təyyarədən düşənə yaxın Səfalı müəllim Polina Viktorovnanın öz bənövşəyi bığlarını çeçələ barmağının ucuyla nəvazişlə sığalladığını da görmüşdü.

– Ələ salırsan məni?! – Səfalının arsız-arsız gülməyinin hesabına bir az da hövsələdən çıxmış Əli Ziya mır-mır mırıldandı. – Tez ol, cum çağır onu, deynən tez aşağı düşsün.

Səfalı müəllimin sir-sifətində o Buzbulaqdan, Buxaradan nə qalmışdı, bu yerdə hamısı çəkilib getdi. Düzdür, Əli Ziyadan nə desən gözləmək olardı, ancaq day bu yekəlikdə yox: Əli Ziya ona açıq-aşkar uşaq kimi iş buyururdu.

Yaxşı oldu ki, bu vaxt Polina Viktorovnanın özü tapılıb çıxdı. Sən demə, aşağıdaymış, foyedə kresloda əyləşib gözləyirmiş. Adını eşidib, ağ donda, çiynində də yekə bir ağ sumka, on beş yaşlı qız kimi

nazlana-nazlana qapının ağzında qeybdən zühur elədi. Əldəqayırma zərif qız səsilə (əlbəttə, rus dilində):

– Mən buradayam! – dedi.

Mehmanxananın birinci mərtəbəsindəki böyük, kimsəsiz restoranda o gün Əli Ziya heçdən çıxartdığı o oyunu Polina Viktorovnaya elə bir şəkildə, elə bir sir-sifətdə danışdı ki, durduğu yerdə nəsə xoşagəlməz və xatalı bir işə düşdüyünü Səfalı müəllim elə o söhbətin əsnasındaca açıq-aydın hiss eləyə bildi. Çörək Səfalı müəllimin boğazından keçmədi, çünki zahirən zarafata oxşayan o əhvalatın məğzində, mayasında – elə ilk baxışdan da – zarafat naminə heç nə yox idi. Burada bir qəribə (Şekspiranə!) murdarlıq, məkrlilik vardı.

Belə şeyi insan olsa-olsa yuxuda görə bilərdi, özü də adamı qara basanda... Axı hansı əsasla Əli Ziya Səfalı müəllimi siyasi cəhətdən bu dərəcədə şübhəli bir adam hesab etməliydi; o ki Əli Ziyanın yanında nə bir dəfə Sovet hökumətini pisləmişdi, nə də bir dəfə Amerikanı tərifləmişdi. Əksinə, hökumətin bədinə danışmaqda Əli Ziya Səfalı müəllimi həmişə üstələmişdi. Məsələn, elə dünən – onlar "Pekin" mehmanxanasından aeroporta gedəndə – taksi sürücüsü ilə ağız-ağıza verib, yol uzunu Leonid İliçin haqqında cürbəcür əttökən anektodlar danışan Əli Ziya deyildimi?.. Bəlkə Səfalı müəllimə nəsə bir pislik eləmək Əli Ziyanın çoxdan planındaymış, yoxsa o əhvalatı danışanda niyə onun ağız-burnu o cür əyilməliydi, gözləri niyə o cür pis-pis işıldamalıydı... O göz-qaşı, sir-sifəti indi də yadına salanda, nədənsə, Səfalı müəllimin, hər şeydən çox, bu dünyanın üzünə tüpürməyi gəlirdi, çünki o çağacan Səfalı müəllim bu dünyada heç vaxt o sir-sifətdə insan görməmişdi və o gün o restoranda ilk dəfə Əli Ziyada gördüyü o sifət sonralar Səfalı müəllimin nəzərində, görünür, həm də bu dünyanın öz sifətinə çevrilmişdi.

Əli Ziyanın gözlərinin içində gözgörə dumbul çalıb oynayan o qıllı, quyruqlu şeytana hədsiz təəccüblə baxa-baxa, elə o restorandaca o gün Səfalı müəllimin başında qəribə, qara-qura fikirlər dolandı və o vaxtacan heç vaxt ağlına gətirmədiyi o qara-qura fikirlərin bir qisminə Səfalı müəllim hətta az qala inandı da. Məsələn, Səfalı müəllim az qala inandı ki, Əli Ziyanın kollektivləşmədən bəhs eləyən "Şanlı Zəfər" və sənayeləşmə dövrünü əks etdirən "Sintetik kauçuk" romanlarına bir vaxt yazdığı məqalələrdə yəqin ki, tərif dozasını lazımi qədər nəzərə almayıb, ya da Əli Ziya özünün – kollektivləşmə dövrünün ifşasına və sənayeləşmə dövründə buraxılan ciddi nöqsanlara həsr etdiyi – "Sən hardasan, ana?" romanı barədə Səfalı müəllimin söz verib, yazmadığı məqaləyə görə bir vaxt ondan bərk inciyib və gözünün içindəki o şeytanı da elə o vaxtdan böyüdüb bəsləyə-bəsləyə, axırda gətirib Yəmənə çıxardıb... Əlbəttə, belə şeyləri yadda saxlayıb, sonra buna görə adamdan qisas almaq üçün gərək insanda dəvə kini olaydı, çünki Səfalı müəllimin o məqalələri yazmağı çoxdanın – hələ 40-cı, 50-ci illərin əhvalatıydı və Əli Ziyanın "Sən hardasan, ana?" romanı çapdan çıxanda, azı yeddi-səkkiz il idi ki, Səfalı müəllim yalnız ədəbiyyatşünaslığın fundamental məsələləri ilə məşğul olurdu, cari ədəbi prosesdə heç vaxt iştirak eləmirdi. "Qisas" məsələsi, hər halda, çox da ağlabatan məsələ deyildi, amma Əli Ziyanın o əməlinə ayrı bir ad tapıb qoymaq da, söz yox, hər adamın işi deyildi; belə yerdə Şekspirin özü də bəlkə ilişərdi, müşkülə-çətinə düşərdi.

Bir sözlə: faciəli komediya – özünün klassik formasında... Əli Ziyanın xalis iblisanə görkəmi hələ bir yana dursun, o pıspısaya oxşayan Polina Viktorovnanın özü də elə bil Səfalı müəllimi durduğu yerdə dəli eləmək niyyətindəydi. Özünü qız yerinə qoymuş qoca qəhbə!

Əli Ziyanın qabağında "şittənirdi", nazlanırdı, amma di gəl ki, Səfalı müəllimin üzünə baxanda it qızı o saat sir-sifətini turşudub, Şümürə, Yezidə dönürdü: elə bil bir saat o bağda gəzməyinən Səfalı müəllim sovet şərqşünaslığının beynəlxalq nailiyyətlərini azı bir əsr geri salmışdı. Hələ – səfirin o arsız-yersiz sualı: "A qde vaş stariçok... alkaqolik?" Səfir bu sualı verəndə Əli Ziya başının hərəkəti ilə Səfalı müəllimi göstərib, üstəlik göz-qaşını da oynada-oynada, içindəki şeytanı bir daha nümayiş elətdirmişdi. Halbuki "alkaqol" deyilən şey bəlkə beş il idi ki, Səfalı müəllimin dilinə dəyməmişdi – Buxarada içdiyi o bir-iki badə "Moskovski"dən sonra, gərək ki, bir də Leninqradda, Renanın uşağının ad günündə əlli qram "Göygöl" konyakı içmişdi.

Əsəbilikdən, dilxorçuluqdan o mehmanxanada gecəni də yata bilməyən Səfalı müəllim, yerinin içində xeyli eşələnəndən sonra, nəhayət, birdəfəlik ürəyini boşaltmaq qərarına gəldi. Yataqdan dik qalxıb, Əli Ziyanın qaldığı nömrəyə qətiyyətlə hücum çəkdi. Ancaq o nömrənin qapısını bir balaca aralayan kimi, içəridə nə görsə yaxşıdır: yarısı içilmiş *"GÖYGÖL"* konyakı!.. Ortalıqda, üstündə konyak şüşəsi olan

dairəvi stolun yanında Polina Viktorovna ikiəlli Əli Ziyanın boynuna sarılmışdı və Əli Ziya Polina Viktorovnanın dodaqlarını (bığqarısıq) ağzına salıb, ləzzətlə əmirdi. Bu mənzərəni görəndən sonra Səfalı müəllimin Polina Viktorovnanın bənövsəvi bığına münasibəti (müsbət mənada) xeyli dəyişdi. Ancaq gec idi, görünür, iş işdən keçmişdi. Bütün səfər boyu o qoca qəhbə – nümayişkaranə bir şəkildə – Səfalı müəllimi saymadı, adam yerinə qoymadı. Bunun səbəbini isə Səfalı müəllim yalnız o bənövşəyi bığda gördü. Səfalı müəllimin o bığdan xoşu gəlmədiyini elə bil zalım oğlunun qızı hələ lap əvvəldən – Moskvada təyyarəyə minəndə hiss eləmişdi və bunun qisasını Səfalı müəllimdən axıracan, yüz faiz aldı. Axı ayrı cür necə ola bilərdi – özgə nəyə görə o arvad Səfalı müəllimlə o cür qeyri-mədəni rəftar eləməliydi... Bəlkə Səfalı müəllimin Yəmən səfərinin o cür bemosrəf keçməyində o arvadın da rolu az olmamışdı. Əgər belə olmasaydı, Qırmızı dənizi xatırlayanda və Əli Ziyanın o dənizdə Polina Viktorovna ilə mazaqlaşmağını yadına salanda Səfalı müəllimin indi də ürəyi bu təhər bulanmazdı.

Ancaq, bu hələ harasıydı ki... Səfalı müəllimin görəcək günləri hələ, sən demə, qabaqdaymış... O, hələ Yəməndə ikən Nuhbala Nuhiyeviçin kəşfiyyatı Bakıda öz işini görmüşdü. Səfalı müəllim Bakıya qayıdanda isə onun Amerika Birləşmiş Ştatlarından siyasi sığınacaq qopartmaq barədəki uğursuz "təşəbbüsü" nəinki institutda hamıya məlum idi, hətta şəhərin bir sıra yasxana və çayxanalarında da bu mövzuda şıdırğı söhbət gedirdi. On ildən çox rektoru olduğu institutun qapıçısı, süpürgəçisi, müəllimi, tələbəsi elə bil Səfalı müəllimi indi-indi tanımağa başlayırdı: ona – marıt-marıt elə marıdıb baxırdılar ki, sanki bu adda, bu "vid-fason"da adamı ömürlərində birinci dəfə görürdülər. Səfalı müəllimin yanından yekəxana-yekəxana ötüb keçənlər də olurdu. Salam-kəlam günbəgün azalırdı. Özü də qəribə şey idi: daha Səfalı müəllimi aktivə, tədbirə-zada da çağırmırdılar.

Axırda Səfalı müəllim bu qərara gəldi ki, ərizəsini yazıb, üsulluca rektorluqdan çıxsın. Elə yuxarıdakılar da, sən demə, bunu gözləyirmiş. Vur-tut üççə ay əvvəl Mərkəzi Komitənin instruktorluğundan instituta prorektor göndərdikləri Nuhbala Nuhiyeviçi ikicə günün içində Səfalı müəllimin yerinə təyin elədilər. Beləliklə, Əli Ziyanın o Minaşa qızının instituta girmək məsələsində də daha Səfalı müəllimə heç bir ehtiyac qalmadı.



Amma onda Səfalı müəllimin pensiyaya çıxmağına hələ düz beş il qalırdı. Bu beş ili birtəhər yola vermək üçün, heç olmasa həftədə bir dəfə, Səfalı müəllim o institutun qapısından içəri girməliydi. Və o qapıdan bir də içəri girməmək üçün, o vaxt Səfalı müəllimə hətta Mozambikdə də siyasi sığınacaq versəydilər, bəlkə razı olardı, çünki on il əzab-əziyyətini çəkib, bir alababat təhsil ocağına oxşatdığı o institut, o Nuhbalanın vaxtında, Səfalı müəllimin gözünün qabağındaca dağılıb gedirdi. Nə dərs deyən, nə dərs oxuyan vardı. Dəhlizlərdə tələbələr siqaret çəkirdi, tum çırtdayırdı. İnstitutun binasında qızlar oğlanların boynuna sarılırdı – daha böyük-kicikdən utanan, çəkinən yox idi... Rektor da – öz işində: gəzməyində, kefində-dəsgahında. Nuhbalanın Pirşağıdakı bağının söhbəti institutda da dildə-ağızda gəzirdi. Deyilənə görə, hər il qəbul imtahanları başlananda Nuhbalanın dəllalları ora yığışırdı, o bağda əməlli-başlı bazar açılırdı, alver gedirdi. Bu barədə institut tələbələri hətta şeirvari bir şey də qoşmuşdular:

Yuxarıda gör Nuhbalanı,
Aşağıda gör Nuhbalanı.
İmtahan başlayanda
Pirşağıda gör Nuhbalanı.

...İndiyəcən yadında qalmış o "şeiri" yorğun yaddaşının içindən misra-misra keçirə-keçirə, nədənsə, eyni vaxtda Səfalı müəllim Əli Ziyanın – Qırmızı dənizdə – Polina Viktorovna ilə mazaqlaşdığı o əttökən səşini də gözünün qabağına gətirdi. Ağzının acısını tüpürmək üçün qalxıb balkona çıxdı. Və balkondan qayıdıb, içəridə pıqqapıq qaynayan çaydanı elə təzəcə tokdan çıxartmaq istəyirdi ki, birdən qapı döyüldü və o qapının dalından Əli Ziyanın səsi eşidildi:

– Səfalı, yatmamısan ki? Mənəm, Əlidi – köhnə dostun...

Bu səsi eşidən kimi Səfalı müəllimin ovqatı birdən-birə tamam dəyişdi. Və madam ki, ovqat dəyişdi, yəqin fəsil də dəyişsə yaxşıdır.

– Rəna qızım yenə ordadı – Leninqradda?.. Hərdən gedib baş çəkə bilirsənmi barı? Mənim də sənin yanında üzüm qaradı. Sərən xala rəhmətə gedəndə yoxdum burda. Zərnigar bacının da ölməyini gec eşitdim. İstəmədim sora gəlib dərdivi təzələyim. – Əli Ziya şalvarının, pencəyinin cibindən dəsmalını tapıb çıxartdı. Alnının tərini silib: – Balam, bu nə yaxşı çay oldu! – dedi. Sonra xeyli vaxt dinmədi. O vaxtacan dinmədi ki, gözlərindən laybalay yaş əmələ gəldi və əlindəki dəsmalla gözünün yaşını silə-silə axır ki, sözünə davam elədi: – Fərəh bacın da bildir getdi. Şam kimi əriyib söndü gözümün qabağında. Fərəhim də, sevincim də onnan qurtardı, Səfalı... Qızlarımdan şikayətim yoxdu. Qızlarım da, kürəkənlərim də yaxşı baxır mənə. Ancaq gədə yaman pis gədə çıxdı, Allah insafını kəssin onun. İçir. Bərk içir. Ayıq günü yoxdu.

Bu yerdə o Yəmən viranxana, necə oldusa, yenə Səfalı müəllimin gözünün qabağına gəldi: o gecə, o mehmanxana, o konyak şüşəsi; suyu duz qoxusu verən o bulanıq Qırmızı dəniz və o mehmanxanada, bircə gecənin içində (söz yox, Əli Ziyanın məhsuldar əməyi nəticəsində!) dəyişib, cavanca gəlinə dönmüş Polina Viktorovnanın o dənizdə Əli Ziya ilə duzsuz-duzsuz mazaqlaşmağı... Bir də – şam. Əriyə-əriyə sönməkdə olan nazik, kiçik bir şam: üz-gözündə həmişə yorğun təbəssüm gəzdirən – arıq, bəstəboy, xəstəhal Fərəh xanım... Ancaq, bu dünyanın işlərinə yenə mat-məəttəl qalmış Səfalı müəllim bu şeyləri gərək yadına salmayaydı – onda bəlkə Əli Ziya da o Yəmən söhbətini salmazdı və öz köhnə dostuna hələ lap təzəcə quşu qonmağa başlayan Səfalı müəllim o quşu havaya uçurmazdı.

– Amma, Səfalı, yaxşı qurtardıq ha, o vaxt... O Yəmən haqq-hesabını deyirəm. Otuz yeddinci il olsaydı, o hərəkətivə görə səni tutardılar. – Əli Ziya, hər iki əli şalvar ciblərində, otaqda gəzinə-gəzinə dedi.

– Hansı hərəkətimə görə?... – Özününcə səsindən qopan naləli bir sızıltı uzun müddət Səfalı müəllimin qulaqlarında cingildədi və sonra – o cingilti çəkilib getdikcə – elə bil dünya yavaş-yavaş kiçilməyə, balacalaşmağa başladı. Bə o balacalaşmış dünyada birdən-birə Vaskanın yeri göründü: o Vaska elə bil haradasa – ağlar səslə – yazıq-yazıq miyovuldadı; bu saat durub sanatoriyanı qarış-qarış gəzməyə və o Vaskanı tapmağa ürəyində Səfalı müəllim, bir Allah bilir ki, birdən-birə nə boyda ehtiyac hiss elədi.



– Qaçmasan da, hər halda, ürəyindən keçmişdi də, Səfalı!.. Mən ölüm keçmişdi, Səfalı, ya keçməmişdi? – Əli Ziyanın gülməyi yenə pişik öskürməyinə oxşayırdı.

Səfalı müəllim heç nə demədi. Sevindi ki, sabah Əli Ziya gedir və eyni vaxtda çoxdankı vacib bir məsələni də özü üçün ürəyində birdəfəlik həll elədi: əgər o dünyada görüşəsi olsalar, bu adama Səfalı müəllim heç bir sual-zad verməyəcəkdi.

– İnstitutda dərsdən-zaddan deyirsənmi barı? – Əli Ziya bu dəfə tamam başqa səslə dilləndi: ortada nəsə pərtlik əmələ gəldiyini, deyəsən, hiss eləmişdi, başa düşmüşdü ki, o söhbəti salmaqda düz iş görməyib.

– Demirəm. – Səfalı müəllim Əli Ziyanın üzünə qorxa-qorxa baxdı, çünki bu adamın gözündə bir vaxt gördüyü şeytanı bir də görmək istəmirdi. – O Nuhbala olan yerdə dərs deməyin nə mənası var?

– Nə Nuhbala? – Əli Ziya divanda oturub, peşmanlamış çaşqın gözlərilə məsum-məsum Səfalı müəllimə baxdı. – O Nuhbalanın o vaxt Heydər aşın bişirdi də, bə bilmədin?

– Yoox!.. – Səfalı müəllim böyük təəccüblə dedi və bu dəfə Əli Ziyanın sifətinə qorxusuz-hürküsüz baxdı: elə bil bircə bu xəbərə görə o, Əli Ziyaya yenə hər şeyi bağışlamağa hazırlaşırdı. – Bəs indi kimdi Nuhbalanın yerində? – Səfalı müəllimin birdən-birə gözləri işıqlanmışdı. Sanki bir zaman rektoru olduğu instituta – bu qədər vaxt keçəndən sonra – onun təzədən quşu qonmuşdu.

– Doğrudan bilmirsən?

– Vallah, xəbərim yoxdu.

– Ə, sən lap yuxudaymışsan ki, ay Səfalı!.. – Əli Ziya əldəqayırma ərk ilə ucadan dedi. – İndi Şahbaladı da orda – bizim Rasimin kiçik əmisi. Özü də havaxdandı gör: az qalır on il ola.

Bu yerdə Səfalı müəllim dərin xəyala getdi. Nuhbaladan sonra o instituta Şahbalanın rektor qoyulmağında elə bir təəccüblü şey yox idi, amma qafiyə prinsipinin, rəhbərlik tərəfindən kadrseçmə məsələlərinə də bu cür məqsədyönlü bir şəkildə tətbiq edilməsi Səfalı müəllimin nəzərində bir qədər təzə məsələyə oxşayırdı: yuxarıda oturan yoldaşlar Yazıçılar İttifaqının rəhbərliyi ilə, görünür, son zamanlar daha sıx əlaqə yarada bilmişdi.

– O Şahbala qabaqlar harda işləyirdi ki? – Bayaqkı o maraq işığı gözlərindən tamam çəkilib gedəndən sonra Səfalı müəllim könülsüz xəbər aldı.

– Necə yəni harda işləyirdi?! *KEQEBEDƏ* svyaz işlərinə baxırdı da, nə tez yadından çıxdı?.. Sən Şahbalanı lap əla tanıyırsan: bir dəfə bizə, Şamaxı yolunun üstündə, bir yaxşı qonaqlıq da vermişdi – Üzeyirin kababxanasında.

Səfalı müəllim yaddaşını çox eşələdi, amma orda nə Şahbalanın sifətini tapa bildi, nə də Üzeyirin kababxanasını; bu dünyada xəyalına gətirə bildiyi bircə "Şamaxı perevalı" deyilən yer oldu ki, ordan da Səfalı müəllim – maşınla – ömründə bir, ya iki dəfə keçmişdi.

– Yaxşıdı ki! – dedi. – Keqebedəndisə, demək lap düzəlib işlər.

– Olmuya şikayətlisən Keqebedən! Hi! Hi! Hi!.. – Bu gülmək deyildi, vallah, yenə xalis pişik öskürməyiydi.

– Yox, niyə ki...– Səfalı müəllim başını qaldırdı, amma Əli Ziyanın üzünə baxmağa cəsarət eləmədi, çünki o "şeytan" məsələsi yenə reallaşırdı, deyəsən.

– Deyirəm, bəlkə sən də Keqebeyə kinayə eləyirsən... Keqebeni elə salmaq çox dəbdədi bu sahat.

Səfalı müəllim dinmədi. Əli Ziya divandan qalxıb, ortalıqdakı stolun həndəvərində yenə cövlan eləməyə başladı və bir xeyli cövlan eləyəndən sonra təzədən divanda əyləşib, heç gözlənilmədən soruşdu:

– Qonşun durur?.. O alagöz erməni qızı?.. Amma, Səfalı, nə cavanlığı vardı o arvadın!..

Əli Ziyanın pis-pis gülməyi yenə əsəblərinə toxunsa da, Səfalı müəllim zarafata zarafatla cavab verməyi lazım bildi:

– Elə indi də pis deyil. – dedi və Polina Viktorovnanın bənövşəyi bığı, nədənsə, Səfalı müəllimin yenə yadına düşdü.

– Bu erməni məsələsindən ağlın nə kəsir, ay Səfalı? – Bunu Səfalı müəllimdən elə bil Əli Ziyanın özü yox, gözlərinin içində peyda olmuş o qoca şeytan xəbər aldı.

– Erməninin hansı məsələsindən? – Səfalı müəllim olduqca sərt və soyuq bir səslə soruşdu və elə bil o Vaskanın səsi də bu dəfə Səfalı müəllimin qulağına haradansa, olduqca soyuq bir yerdən gəldi; Səfalı müəllim üşüdüyünü birdən hiss eləyib, pencəyini əyninə geydi.

– Qarabağ məsələsi də. Dağlıq Qarabağın məsələsi... Yenə əl çəkmir köpəyuşağı. Bütün dünyanı qaldırıblar bizim əleyhimizə.

– Əl çəkmirlər, verin də. Nə var orda – bir ovuc torpaqdı. – Bunu Səfalı müəllim – Əli Ziyanı cırnatmaq üçün – qəsdən belə dedi, çünki Polina Viktorovnanın bənövşəyi bığı yenə Səfalı müəllimi yaman hövsələdən çıxarmışdı.

Əli Ziya tağı ölmüş toxumluq xiyara oxşayan bürüşmüş, saralmış boynunu xeyli qabağa uzatdı.

– Bu sözündən xoşum gəlmədi, Səfalı! – dedi. – Bilirəm, zarafat eləyirsən. Amma bu zarafatı day heç yerdə eləmə. Elə o Marqaret Tetçer də bu sahat bunu deyir, çünki nənəsi erməniydi. Buşun da bir tərəfi erməniydi. O nadan Saxarov da ki, özün bilirsən, Əlixanyanın qızını alıb. Bu, həmin Əlixanyandı ki, Səfalı, Vrangelin ordusunda komsomola on il divan tutub... Qarabağın bir qarışını da erməniyə vermək olmaz, çünki Qarabağı versən, Naxçıvanı da istəyəcək, sonra deyəcək, Bakı da mənimdi, özünün də adı Bakı deyil, Bakuravandı. Gəncə Kanxakdı, deyəcək, o da mənimdi. Qazax Qatsaxdı. Nə bilim, Ordubad Urduvardı. Salyanın da ki, heç söhbəti ola bilməz: axırı "yan"nan qurtarır. Onda bəs bizə nə qalır? Kaspi dənizinin dibi qalır... Erməniyə, Səfalı, heç vaxt üz vermək olmaz. Olduqca nainsaf millətdi bu!

Səfalı müəllim birdən vəcdə gəldi:

– Bəli, biz suveren respublikayıq! – dedi. – Suvenir respublikası deyilik! – Elə də ilhamla dedi ki, elə bil ömrün pioner çağları birdən yadına düşmüşdü. Əli Ziyanın – ermənin nainsaf millət olmağı barədəki – orijinal fikri ilə də, Səfalı müəllim sidqi-ürəkdən razılaşdı, çünki quru tutdan araq çəkən bir qoca Qərçivan ermənisi o nainsaflığı (cavanlıqda) bir dəfə Səfalı müəllimin şəxsən öz başına gətirmişdi: Qərçivanın kolxoz bazarında o erməni Səfalının Buzbulaqdan min müsibətlə o bazara aparıb çıxartdığı yarım kisə əla tut qurusunu cəmi-cümlətanı yeddi kilo çürük kartofa dəyişmişdi və o çağacan söyüş söyməklə bir o qədər də arası olmayan Səfalı, qayıdanbaş – Qərçivandan ta Buzbulağacan – ürəyində yol uzunu o qoca ermənin dədəsinin goru ilə məşğul olmuşdu. Bununla belə, indi, Səfalı müəllimə qalsa, bu erməni söhbətini elə burda da yığışdırardı. Amma, sən demə, Əli Ziyanın bu mövzuda deməyə hələ çox sözü varmış.

– Alçaqlar, xəbis köpəyuşağı! Dünyanı qatıb-qarışdırmaq köhnə peşəsidi bunların... O ərazi söhbətini salmaq bu sahat kimə lazımıydı? Yaşayaydız da, kim sizə mane olurdu!.. Tullanıb, meymun kimi düşdülər ortaya, çünki qudurtmuşdu bunları Sovet hökuməti. Elə bilirdilər halvadı Qarabağ, qamarlayıb ötürəcəklər içəri. Bu da bunların qədim

mədəniyyəti... Özlərinin bir qara qəpiklik ağlı yoxdu, bizi də durduğumuz yerdə işə saldılar. Nə evdə oturmaq olur, nə bağda oturmaq olur. Bir dəstə gədə-güdə hər gün camaatı yığıb tökür o Domsovetin qabağına. Bağır ki, bağırasan. Nə ağsaqqal tanıyırlar, nə hökuməti hökumət yerinə qoyurlar. Bir adam da yoxdu ki, çıxıb ağzını yuma bunların. – Əli Ziya dəsmalını çıxarıb bir müddət cani-dildən ağzının köpüyünü təmizləməklə məşğul oldu. – Çox pis işlər ola bilər, Səfalı! Səni bilmirəm, şəxsən mən o Domsovetin qabağından çox narahatam. Qorxuram, Leninin heykəlini uçurdalar – böyük bədbəxtlik ola!

– Leninin heykəli olmayan yerlərdə bəyəm bədbəxtçilikdi? – Səfalı müəllim hirsli-hirsli dedi: görünür, o araqçəkən qoca ermənininin çürük kartofu onun gənclik xatirələrini hələ də təhqir eləməkdə idi.

Səfalı müəllimin bu yersiz sualından Əli Ziya əməlli-başlı incidi.

– Mənnən söz güləşdirmə! – dedi. – Sən bilirsən, mən nə deyirəm.

Səfalı müəllim istədi desin ki, ay Əli, vallah-billah, mən bilmirəm, sən nə deyirsən, amma dinmədi, deyəsən qorxdu Əli Ziyadan, ya da təzəcə ağlına gələn fikir Səfalı müəllimin danışmaq qabiliyyətinə mənfi təsir göstərdi. Onun ağlına yerləşən təzə fikir isə, əlbəttə, bir o qədər də dərin fikir deyildi. Səfalı müəllim birdən-birə belə qərara gəlmişdi ki, adına "Sovet hökuməti" deyilən şey – elə bu Əli Ziyanın özüdür – çayı nəlbəkiyə töküb, eynən Xızır kişi kimi, üfürə-üfürə içəndə nə olar!.. Və bu yerdə əgər o Nuhbala da birdən yadına düşməsəydi, o fikir ağlına gələndən sonra Səfalı müəllim bəlkə lap axıracan ağzına su alıb oturacaqdı. Amma o Nuhbala yenə korladı işləri. Daha doğrusu, o Nuhbalanın – komsomoldan başlanan – tərcümeyi-halına az-çox bələd olmağı birdən-birə Səfalı müəllimi hövsələdən çıxarda bildi və bunun axır nəticəsi o oldu ki, heç bir mətləbə-zada dəxli olmadan (və Əli Ziyanın heç cür gözləmədiyi bir məqamda!) Səfalı müəllim komsomola qarşı kəskin hücuma keçdi:

– Qorbaçovun ağlı olsa, elə birinci o komsomolu ləğv eləyər, – dedi və bunu deyəndə Səfalı müəllim Əli Ziyanın ağzının qırağındakı ağ köpüyə elə zənd ilə baxdı ki, elə bil o köpük bu dünyada adına "komsomol" deyilən şeyin varlığına dəlalət eləyən yeganə əşyayi-dəlil idi. – Əvvəla, nədi axı o komsomol? Həyatda faydalı əməyin heç bir növü ilə məşğul olmaq istəməyən bic-vələdüznaların ümid, pənah yeridi: anasının südündən kəsilən kimi pul, şöhrət, vəzifə, müftə qazanc eşqinə düşən yüz cür lotu-potunun. Bağında bazar, kabinetində



fahişəxana açanların yetmiş yeddi faizi elə o komsomolda yetişir. Əyilməyin, yaltaqlanmağın, ona-buna qulluq göstərməyin, cibə girməyin, satmağın və satılmağın orta təhsilini orda alır o lotular. İndi, baxaq-görək, ordan ali təhsil almağa kimlər gedir, yəni ordan o yana – daha yuxarılara kimlər dırmaşa bilir?.. Əlbəttə, o dərsi yaxşı oxuyanlar, o "orta təhsili" "beş" qiymətlə başa vuranlar – yəni o vələdüznaların da ən vələdüznaları, həmin o... svyaz elmini daha yaxşı öyrənib mənimsəyənlər. – (Deyəsən, Səfalı müəllim, yavaş-yavaş Nuhbaladan Şahbalaya keçirdi). – Bəli, budur sənin komsomolun!.. O Əlixanyan da elə düz eləyib – gedib qoşulub Vrangelin dəstəsinə, lap əla iş görüb, erməni olanda nə olar... Elə o komsomolun şanlı əməllərinin nəticəsidir ki, bu boyda suveren respublikada suvenir qıtlığından xalq az qalır Marksın saqqalının tükün yolsun... Bəli, hörmətli dep...

Səfalı müəllim az qala "hörmətli deputat yoldaşlar!" – deyəcəkdi, çünki bərk qızışmışdı. Hələ Nuhbala bir tərəfə, elə o Şahbalanın özünün də məhz "komsomol kadrosu" olduğunu öz aləmində tam yəqinləşdirəndən sonra institutda rektor işlədiyi illərin niskili Səfalı müəllimin ürəyində birdən-birə yaman qövr eləmişdi; o illəri bir də geri qaytarmaq, o institutda bir də rektor olmaq ümidi ürəkdə təzədən baş qaldırmışdı və elə o ümidin qanadları üstündə də, deyəsən, xəyal Səfalı müəllimi aparıb Ali Sovetin sessiyasına çıxartmışdı... O xəyaldan Səfalı müəllim yaxşı ki, tez ayıldı. Ayılan kimi qarşısındakı divanın üstündə Əli Ziyanın oturduğu yerə baxdı. Ancaq Əli Ziya orda yox idi. Əli Ziya tamam əks tərəfdə – astananın ağzında – pencəyinin yaxasını gen-gen açıb, əlləri ciblərində heykəl kimi dayanmışdı və tağı ölmüş xiyara oxşayan bürüşmüş, saralmış boynunu qabağa uzadıb, deyəsən, Səfalı müəllimə nəsə deməyə hazırlaşırdı.

– Maşallah! Maşallah! – dedi. – Malades, yaman nitq irad elədin, professor! Balam, səndə natiqlik istedadı varmış ki! Biz bunu bəs niyə indiyəcən bilməmişik... Yaxşı döşədin... kolxozun cəmdəyinə. – (Əli Ziya Allah bilir nəyə görə "komsomol" əvəzinə "kolxoz" dedi). – Marksın saqqalını da tamam bihörmət elədin. – Əli Ziya əlini üzünə çəkdi: güya haçansa onun da saqqalı olmuşdu. – İndi gör nə deyirəm sənə. Diqqətli ol, yaxşı eşit: səndən ektremist olmaz, Səfalı, ağlıvı başıva yığ! Kolxoza qarşı... – (yenə kolxoz!) – o cür hücum eləyəndə sən gərək biləsən ki, Qorbaçov da kolxoz şəraitində yetişib, bunu bilmədən komsomolu... – (indi də komsomol) – tənqid eləmək ən azı

siyasi sərsəmlikdir, hələ mən siyasi avantüra demirəm. – Dilini çıxarıb, ağzının köpüyünü yalaya-yalaya Əli Ziya bir müddət fikirləşdi. – Bu cür çirkin, dumanlı fikirlər elə əvvəllər də vardı səndə. "Şanlı zəfərə" yazdığın məqalə yadındamı? O məqalədə sən feodalizmin ən tipik qalığı – uzunqulağı sosializmin böyük nailiyyəti – traktordan üstün tutmağa açıq-aşkar cəhd göstərmişdin!.. Göstərmişdin, bəli, göstərmişdin. Ancaq o vaxt mən bu fikirdəydim ki, səni itirmək lazım deyil, səni tərbiyə eləmək, düz yola qaytarmaq lazımdır. Buna görə də, mən səni amerikan posolluğundan geri qaytardım o vaxt. Heyfim gəldi sənə. İstəmədim ki, gedib kapitalizm rəzalətinin içində çürüyəsən. Mən yenə ümid eləmək istəyirəm ki, sən bu erməniporəstliyindən... – (indi də erməniporəstlik! Allah, özün kömək ol!) – gec-tez əl çəkəcəksən. Yenidənqurma tərəfdarlarının sırasında özüvə layiqli yer tutacaqsan. Hələlik xudahafiz! – Əli Ziya əllərini şalvarının ciblərindən çıxarıb, pencəyini düymələdi. – Axşam stalovada, ujin eləyəndə, tərbiyəvi söhbətimizi davam etdirərik.

Əli Ziya o astananın ağzından birdən-birə elə bil qeybə çəkildi. Bir müddət Səfalı müəllim elə o astanayaca məzlum-məzlum baxa-baxa qaldı. Sonra durub balkondan dənizə baxdı. Gün təzəcə çəkilib getmişdi. Hava dumduruydu. Dəniz göyüzünə, göyüzü dənizə bənzəyirdi. Bir sözlə, dünya yerindəydi.

...O axşam Səfalı müəllim yeməkxanaya çörək yeməyə getmədi. Yalnız Əli Ziyanın havası otaqdan nisbətən çəkilib gedəndən sonra o, bir qədər özünə gələ bildi. Ayağa durub, "köhnə dostun" çay içdiyi fincan-nəlbəkini isti suda sabunla üç-dörd dəfə yumaqla ürəyinin qurdunu öldürdü. Ancaq ogünkü şam yeməyindən Səfalı müəllim ona görə vaz keçmədi ki, Əli Ziyanın mübarək üzünü bir də görməkdən qorxurdu. Dəhşət burasındaydı ki, özünün haçansa, haradasa, bir vaxt Amerikanın hansı səfirliyindənsə siyasi sığınacaq istəməyinə Səfalı müəllimin özü də, deyəsən, yavaş-yavaş inanmağa başlayırdı!.. Elə bir əhvalat bəlkə doğrudan da olmuşdu, ancaq Yəməndə yox, haradasa başqa bir vilayətdə. Və yaxud o əhvalat elə oradaca – Sənə şəhərindəki o dördmərtəbəli mehmanxanada baş vermişdi – ancaq o mehmanxananın nə içində, nə çölündə – haradasa o dördmərtəbəli binanın, tutalım, beşinci mərtəbəsində! Səfalı müəllim, nəhayət, inanmağa başlayırdı ki, dördmərtəbəli evin beşinci mərtəbəsi də ola bilər və o mərtəbədə nə əhvalat desən baş verə bilər: Amerika səfirliyindən



siyasi sığınacaq istəməkdən tutmuş, erməniporəstliyəcən... Buna görə də, Səfalı müəllim gedib o yeməkxanada çörək yeməkdənsə, bir yaxşı duş qəbul eləyib, Əli Ziyadan tamam təmizlənmək istəyirdi. Amma, sən demə, o arada isti su vaxt tapıb kəsilibmiş.

Duş qəbul eləməkdən əli üzülən Səfalı müəllim balkonda yerini rahatlayıb – dənizin təmiz havasından bol-bol uda-uda – kəsilmiş o isti suyu Buzbulağın isti xatirələri ilə əvəz eləmək qərarına gəldi. Və əsərimizin baş qəhrəmanı o balkondan birbaş Buzbulağa baxmaqda ikən, biz də fürsətdən istifadə eləyib, öz gülməli hekayətimizin yeni fəsli üçün ad tapdıq, mövzu fikirləşdik.

Deməli –

## *Dördüncü fəsil*

## BUZBULAQ, XIZIR KİŞİ, DE QOLL, NİL ARMSTRONQ VƏ SAİR

Bir vaxt Xızır kişini ARAN deyilən yerə yola saldığı həmin o dəmiryol vağzalında Səfalı müəllim qatardan düşəndə günortaya hələ bir-iki saat qalsa da, günün istisi adamı bıçaq kimi kəsirdi.

Təsadüfən rastına çıxan bir cavan oğlanın "Moskviç"ində – beş manata – gedib Buzbulağa çatdı. Buzbulaq, vağzala baxmış, xeyli sərin idi. Ancaq küçə-bacada uşaq-muşaqdan savayı heç kəs gözə dəymirdi. Və elə o uşaqların – arxadan, qabaqdan – səsli-küylü müşayiətilə Səfalı müəllim – öz dədə-baba evinin hələ heç astanasına da ayaq basmamış – gedib Xızır kişinin qapısına yetişdi.

Qapı aralı olsa da, onu Səfalı müəllim ədəb xatirinə taqqıldatmağı lazım bildi və nəticədə bir dəstə Buzbulaq uşağının yekdil "urra"sını, alqışını qazandı. Və hələ o uşaqların səsi kəsilməmiş Xızır kişinin həyətdən səsi gəldi:

– Kimsən, a bala? Keç gəl, qapı açıqdı. – Və bu səsi eşidən kimi uşaqlar – sanki öz missiyalarını bitmiş hesab eləyib, – pərən-pərən dağılışıb getdilər.

Həyətdə Tərlan arvad ocağın qırağında əyləşib, bir iri teştin içində günəbaxan tumu qovururdu; Xızır kişi arvadından bir azca aralıda quru odunun üstündə oturmuşdu.

– Ə, Tərlan, olmuya bu, bizim Səfalıdı?.. Odu.. Bə belə niyə, bacıoğlu? Adam dayısını belə axtarar? – Xızır kişi bu sözləri elə bir şəkildə dedi ki, elə bil onlar vur-tut bir həftə bundan qabaq, Buzbulağın hansı döngəsindəsə xudahafizləşib, biri-birindən ayrılmışdılar və bu bir həftədə Səfalı müəllim bir azca səhlənkarlıq eləyib, dayısına baş çəkməyi unutmuşdu.

Xızır kişi sirimsəmiş vəl taxtasına oxşayan iri, qupquru əli ilə Səfalı müəllimin xırdaca, pambıq kimi yumşaq əlini sıxdı. Oturduğu yerdəcə bir qədər qurcalanıb, yerini rahatlamaqla – Tərlan arvad da Səfalı müəllimin gəlişinə öz hörmətini, ehtiramını bildirdi.

– Gətir o dabretqanı qoy bacoğlun otursun. – Tərlan arvad Xızır kişiyə dedi. – Yazıqdı, o boyda yol gəlib Bakıdan... Bu sahat dururam salım simavarı. Qurtarıram, az qalıb, heyifdi, ocağın odu sönməsin. Xızır kişi içəridən kətil gətirənəcən Tərlan arvad ocağın külünü eşələdi və sonra qovurduğu günəbaxan tumunu cani-dildən qarışdıra-qarışdıra elə qədim, elə tanış bir ərklə dilləndi ki, Səfalı müəllimin ürəyi yerindən oynadı: – Bu Qoqan, dədəsiz qalmış, çox zülm eləyir bizə, ay Səfalı!.. Day xirtdəyə yığılmışıq bu gədənin əlinnən!

– Taxsır özündədi bunun! – Xızır kişi kətili gətirə-gətirə uzaqdan-uzağa deyindi. – Uşaq pul istiyir ver də, üç manatın maliyyəti nədi... Yox, gərək hər kəs öz zəhmətiynən pul qazansın – sənin bu daycanın da, bacoğlu, belə mollalıq eləyir. Oturub, iki günnən bir, əl-ayağın yandırır o ocaqda – nə var-nə var o Qoqan, it südü əmmiş aparıb küçədə satacaq o simiçkanı, üç manat pul əyəsi olacaq. Uşaq da uşaq ola yenə dərd yarıdı. Bəladı, tövqi-lənətdi başdan ayağa. Hələ on beş yaşı yoxdu, bunun indidən papros pulun yetirmək olmur. Gündə iki baçka çəkir köpəyoğlu. Özü də bahalısından.

– Bacarırsan, tərgitdir də. – Tərlan arvad böyük əzab-əziyyətlə yerindən dura-dura dedi. – Day, bala, dayında da o vaxtkı dayılıq qalmayıb. Qocalıb dayın. Haphaplıyıb. Day bunun sözünə-zadına da baxan yoxdu. Mən də ki, neynim axı: görürəm uşaq daraşıb çəkir o zəhrimarı, deyirəm qoy bunun azdan-çoxdan zəhmətin də görsün. Bilsin ki, pulu ağacdan dərmirlər mev yarpağı kimi... Səhər-səhər bir sahat dil tökmüşəm, axırda dinə-imana gəlib. Sarı düyəmiz bildirdən qısırıydı, aparıb Qoturdərədə kələ versin. İndi, bir hovurdan qayıdıb gələn kimi, yapışacaq xirtdəyimnən: "Nənə, pul. Nənə, pul!" O da – pul. Qoy aparsın satsın, nə istəyirsən getsin alsın. Günəbaxandı da, öz əlimizin məhsuludu, gedib bazardan tutub pul verib almamışıq ki...



Bel-buxunu tamam bükülmüş Tərlan arvad əl-ayağını az qala yerlə sürüyə-sürüyə samovar salmağa gedirdi. Həyətin qabağında köhnə kətilin üstündə oturmuş yorğun-yuxulu Səfalı müəllim elə bil nə Buzbulaqdaydı, nə dayısı Xızır kişinin – o çağacan bəlkə min dəfə yuxuda gördüyü – həyətindəydi; sanki Səfalı müəllim Qatarda hələ də yol gəlirdi, hətta o "qatar" hərdən yavaş-yavaş silkələnirdi də. Və "qatar" hərdən yavaş-yavaş silkələnəndə həyətin lap o başındakı daş hasar, o hasardan bəridəki ağac-budaq, o ağac-budağın yerdəki bozumtul kölgəsi və o kölgədə eşələnən toyuq-cücə də elə bil yavaş-yavaş silkələnirdi. Ancaq o toyuq-cücə Tərlan arvadın haçansa bu həyətdə bəslədiyi rəngbərəng, növbənöv toyuq-cücədən deyildi, hamısı ağ rəngdə, hamısı eyni cinsdən inqubator toyuq-cücəsiydi.

– Eşitdin də: deyir, zəhmətə öyrədirəm uşağı. – Xızır kişi xırıltılı-xışıltılı səslə qocafəndi gülürdü. – Bu cüvəllağının dədəsi guya zəhmətnən bu dünyada çox şey qazanmışdı... Rayonda iyirmi ildən çox milsənerlik eləyib, hökumətin tapançasın gəzdirdi g...tünün üstündə, axırda da elə o tapancaynan vurub meyidin sərdilər yerə. Raykomun lap qabağında, yolun ağzında, gecəynən düz ürəyindən vurmuşdular. Heç o vuranı da tapmadılar. Qocalığında yorğalıq eləyib, əlli səkkiz yaşda bir uşaq əyəsi olmuşdu, o da belə – üç-dörd yaşından yetim olub qaldı... O dədəsi ölmüşün də, bacoğlu, bu arvadı bu arvadı çox cavanıydı özündən. Əvvəlki iki arvadından olmadı uşağı, ona görə getdi bunu aldı. Bu da əri ölənnən heç bir il də keçmədi ki, uşağı gətirib atdı bizim üstümüzə, qoşuldu birinə, heç bilmədik hansı cəhənnəmə çıxdı getdi. İndi, az qalır on il olsun, mənnən daycanın əsir-yesir olmuşuq bu gədənin əlində... Adı da, nə bilim, "importnu" addı – Doquldu, Diquldu-nədi, xırda vaxtından Qoqan demişik, dilimiz öyrəşib... Dədəsi ölmüş şaddığına şitdik elədi o vaxt. Elə bil ad-zad qəhətiydi uşağa qoymağa. Dedim, bala, ad tapmırsan odu ey – baban Həmzənin adın hələ heç kəs qoymuyub uşağına. Qayıdasan ki, sən bilmirsən, dədə. Bu ad yaxşı addı. Firəngistanın padşahının adıdı. Başladı ki, bəs çox böyük padşah olub o padşah. Bu dünyada çox yaxşı işlər görüb. O adı, dedi, qoyaq uşağımıza, o kişinin də dünyada adı qalsın... İndi biləsən daycanın nə çəkir bu "ağıllı" firəng padşahının əlinnən. Yazığın san-

dığında-zadında da bir şey qoymuyub, hamısını oğurlayıb, aparıb satıb. Dədəsi, goru çatdamış, bilsəydi ki, bu gədə bizim başımıza bu oyunu açacaq, heç bəlkə yaşının o vaxtında "gədəyə" zəhmət verib, arvadnan o işə qol qoymazdı...

– Hələ sənə deməmişəm, Xızır! – Tərlan arvad tüstüsü təzəcə qalxan samovarın yanından bəyan elədi. – Axşam baxmışdım: toyuq damında on bir dənə yumurta vardı. Səhər baxıram: biri də yoxdu. Ya götürüb hikkəsindən – sındırıb çiy-çiy içib hamısın, ya da aparıb satıb bir adama, papros alıb.

...De-Qoll... Doqul. Diqul... Qoqan, Qoqan, Qoqan... Ağacların kölgəsi yenə yerin üstündə ara-sıra yırğalanırdı və orada – o kölgəlikdə eşələnən toyuq-cücə də – o kölgə ilə birgə hərdən tərpənirdi, yırğalanırdı. Görəsən, o toyuqlar niyə qaqqıldamırdı, Pərvərdigara! O toyuq-cücədən niyə heç bir səs-səmir gəlmirdi? Axı bir vaxt bircə o qara toyuğun qaqqıltısı bu həyətin cansız daş-torpağını da dindirib, dilləndirərdi. O toyuqların eşələndiyi yerdə, bir-birindən azca aralı bitmiş iki əriyin gömgöy budaqları arasından bir dağın qırmızımtıl təpəsi elə bil qorxa-qorxa hərdən Səfalı müəllimə baxırdı. Bəlkə qorxan dağ deyildi. Bəlkə Səfalı müəllimin özü o dağdan qorxurdu. Qorxurdu ki, o dağ dilə gəlib, ona – heç vaxt eşitmək istəmədiyi – dəhşətli sözlər deyə bilər... Məsələn, deyər ki, nahaq gəlmisən, Səfalı müəllim, sənin axtardığın o Buzbulaq yoxdur buralarda. O Buzbulaq, deyər, yerli-dibli yoxdur bu dünyada. Bəsdir özündən dünya uydurduğun.

Dağ deyər ki, o qara toyuq da yalandır, guya onun haçansa bu həyətdə oxuduğu, adını "bərəkət himni" qoyduğun o qaqqıltı da boş xülyadır, əfsanədir – elə himn bu dünyada heç vaxt olmayıb və ola da bilməzdi. Qaldı ki, o qara eşşək – o da, söz yox, o qara toyuğun gic-gic sərsəmləməyidir... Deyər, vallah, nə desən deyər, çünki dağ danışanda pıs olur!..

Səfalı müəllimi deyəsən, hava vurmuşdu, yoxsa bir gecəlik qatar yolunun yorğunluğu insanı bu qədər keyləşdirə bilməzdi. Əgər halı özündə olsaydı, bu həyətlə Yəməndəki o bağlı həyət arasında nəsə bir uyğunluq axtarıb tapmaq Səfalı müəllim üçün bəlkə bir o qədər də çətin olmazdı. Buxarada, çay qırağında, bir vaxt namaz üstə gördüyü (ömründə bir dəfə namaz qılmamış!) o üç yüz otuz üç yaşlı Xızır kişini indiki bu Xızır kişiyə heç olmasa az-maz bənzətməyə də onda Səfalı müəllimin bəlkə zoru çatardı və o qırmızımtıl dağ da yəqin ki, ağzını



Allah yoluna qoyub, o sözləri o cür qırmızı-qırmızı Səfalı müəllimin qabırğasına döşəməzdi.

Yalnız ikinci çaydan sonra Səfalı müəllim güc-bəla dərk eləyə bildi ki, haçansa raykomun qabağında, yolun ağzında, gecəynən tapança ilə vurulan onun yaşıdı, uşaqlıq yoldaşı Səfərdir və bu səhər toyuq damından yumurta çırpışdırıb, indi Qoturdərədə sarı düyəni kəllə cütləşdirməklə məşğul olan Qoqan adlı o mürəkkəb şəxsiyyət isə həmin o ölən Səfərin yetim qalmış övladıdır. Bir azdan (üçüncü çaydan sonra) Səfalı müəllim hətta o dərəcədə ayıldı ki, dayısının Səfərdən danışa-danışa bayaqdan Səfərin adını bir dəfə də çəkməməyində – azı üç yüz otuz üç yaşlı – qoca və qədim bir məna tapdı: demək, Xızır kişi bu saat tamam arxayın idi ki, oğlu Səfər haradasa haqq dünyadadır, özü də bu dünyadakından çox-çox rahat, çox-çox sakit bir güzəran içindədir və onun adını çəkib, ruhunu narahat etmək, hər halda, bir o qədər də kişilikdən deyil...

Hələ dördüncü çayı içməyə başlamamış, Səfalı müəllim bu qərara gəldi ki, o Qoqan bic-vələdüznanın lap yekəsidir. Ancaq o sandıq və yumurta əhvalatlarıyla bu adam Səfalı müəllimə bir o qədər də orijinal şəxsiyyət təsiri bağışlamadı. Daha doğrusu, Buzbulağın əlli illik həyatının ən əlamətdar hadisəsi kimi, o Qoqan Səfalı müəllimi bir o qədər də qane eləmədi. Uşağa "importnu" ad qoymaq isə buralarda elə əlli il qabaq da dəb idi: Marks, Engels, Telman, Voroşil, nə bilim, Kolxoz, Oktyabr, Noyabr, Aqreqat, Deleqat, Deputat – hətta, Molotov-Koqanoviç mənasında, Molkoqan adında bir tipin bu kəndin küçələrində bir vaxt aşıq oynamağı da indiyəcən Səfalı müəllimin yadında idi. Ancaq Səfərin öz uşağına De Qoll adı qoymağı, nədənsə, Səfalı müəllimə bir az qəribə gəldi. Bir də – o tapança, o milsənerlik. Səfalı müəllim nə qədər çalışdısa, Səfəri milsəner formasında heç cür təsəvvürünə gətirə bilmədi. Və bu vaxt birdən-birə yadına düşən köhnə bir yuxusu Səfalı müəllimi yenə bu dünyanın işlərinə büsbütün mat-məəttəl qoydu. Özü də o yuxunu Səfalı müəllim elə o Yəməndə görmüşdü, ancaq Səna yox, Hodeyda şəhərində. Əli Ziyanın Polina Viktorovna ilə Qırmızı dənizdə mazaqlaşa-mazaqlaşa çimdiyi o günün gecəsi Hodeyda şəhərinin hamam kimi isti mehmanxana nömrəsində yuxuda Səfalı müəllim bir qəribə kənd həyəti görmüşdü. Yay idi, hava da bərk isti idi və istidən sapsarı saralmış hansı otluqdasa, isti otun üstündə, onlar Səfərlə dava-şavasız, dostcasına güləşirdilər. Sonra, necə oldusa, sözləri

çəp gəldi, Səfər əlini harasa uzatdı və bu vaxt Səfərin əlində bir qəribə qara tapança peyda oldu. Və bərkdən gülə-gülə Səfər o tapançanın çaxmağını çəkdi. Güllə Səfalının ürəyinə dəydi. Səfalı müəllim ürəyindən isti qan axdığını hiss elədi, ancaq buna zərrəcən də kədərlənmədi, əksinə sevindi, ürəkdolusu sevindi, çünki onun yıxıldığı yerdəki ölü, sarı otlar birdən-birə tər-təzə sapsarı gül-çiçəyə çevrilmişdi və bu dünyada ömrü boyu bərəkət himni oxuyan o qara toyuq da sapsarı gül-çiçəyin arasında Səfalı müəllimlə yan-yanaşı uzanmışdı. Və indi Səfalı müəllim bu dünyanın işlərinə necə mat-məəttəl qalmayaydı ki, Səfərin milsəner olduğunu, tapança gəzdirdiyini o, heç vaxt, heç kəsdən eşitməmişdi!.. Bəlkə o Səfəri – o raykomun qabağında – Səfalı müəllim Hodeydada o yuxunu görəndə vurmuşdular: həmin gecə, həmin anda, həmin dəqiqədə... Bəlkə Səfalı müəllimi o isti mehmanxana nömrəsində gecənin bir aləmi birdən diksindirib yuxudan oyadan – elə o raykomun qabağında açılan tapançanın səsi idi: fərq bunda olmuşdu ki, o tapançanı Səfər atmamışdı, Səfərə atmışdılar. Fərq bir də bunda olmuşdu ki, o güllə Səfalı müəllimin yox, onun dayısı oğlu, uşaqlıq yoldaşı Səfərin ürəyinə dəymişdi... Səfalı müəllim Tərlan arvadın dördüncü stəkan çayı haçan verəcəyini gözləyə-gözləyə, oturub heyrət içində fikirləşirdi və (yəqin ki, köhnə tənqidçilik azarı tutduğundan) ürəyinin bir yerində ona sevinirdi ki, nə yaxşı bu mövzu indiyənəcən heç bir Azərbaycan sovet yazıçısının ağlına gəlməyib, çünki, Səfalı müəllimin əqidəsinə görə, belə bir mövzu hətta lap hər hansı bir üçüncü dərəcəli Əli Ziyanın da əlinə düşsəydi, bundan iri bir roman yazıb, adını da ya (Bakı tənqidçiləri rahat tərifləsin deyə) lap qısa: "Tapança", ya da (Moskva nasirlərinin gözünə lazımi dozada xalqilik

illərdə bir çaxırıçən mal doxturuna qoşulub vurdu getdi Çuxakəndə. O vaxtdan day buralara da heç gəlib-eləmir. Burda qalan bir Bəsxanımdı, onun da o Taryel gədəsi xarab çıxdı, getdi Mosqovada urus qızı aldı. İndi o urus qızından bir qəşəng oğlu da var deyillər. Amma o Taryel köpəyoğlunu adamın heç söyməyə dili də gəlmir ki, söyəsən ürəyin soyuya. Çox möhrüban uşaqdı, Səfalı. Olduqca qohumcanını baladı. Eşitsə ki, sən burdasan, inan ki, Mosqovdan vurub gələr.

Xızır kişi başını aşağı salıb oturmuşdu. Səfalı müəllimin aralıda, eyvanın direyinə söykəli qoyulmuş çamadanına arabir tərs-tərs baxa-baxa elə bil ürəyində nəyisə cani-dildən götür-qoy eləyirdi.

– Çox qalmağa gəlmisən? – Xızır kişi gözlərini çamadana zilləyib Səfalı müəllimdən xəbər aldı.

– Hə, fikrim var qalım bir az.

– Burda qalacaqsan, yoxsa öz evinizdə?

– Mən bilən öz evimizdə qalsam yaxşı olar.

– Özün bil. Bura da öz evindi, özgə evi deyil. Ancaq o gədə qoymaz səni burda rahat oturasan. Nəyin var, oğurlayıb aparıb satar, ara yerdə xəcalətdə qoyar bizi.

– Hə, elər, elər. O bəzzatdan nə desən çıxar! – Bunu da Tərlan arvad dedi.

Xızır kişi bir müddət də fikrə getdi.

– Qoy görək qızlardan kimi tapırıq – getsin bir az təmizlik eləsin oralarda. Bəsxanımın özü gedəmməz, çünki qarnında qırıjası var, elə iş görmək olmaz ona. Daycanını da görürsən – küçə qapısınacan ayağın zornan sürüyür. Qab-qacaq, çölmək, çaydan-zad da olmalıdı orda – əgər o Qoqan tülüng oğlu tülünə aparıb onu da satmayıbsa. Bu saat

Vəziyyət bir gör nə yerdəydi ki, Xızır kişinin o sözlərinin müqabilində o anda Səfalı müəllim nəinki iki kəlmə mərifətli söz tapıb deyə bilmədi, hətta onun, üç stəkan çaydan sonra da quruyub qaxa dönmüş dodaqlarının arasından elə biməzmun və bivec bir söz tapılıb çıxdı ki, eşidən olsa, bəlkə Səfalı müəllimi dəli hesab eləyərdi:

– Folkner!.. Folkner!.. Uilyam Folkner!..

Amma Səfalı müəllimin bu sözlərini, deyəsən, özündən savayı heç kəs eşitməmişdi. Buna Səfalı müəllim çox sevindi və elə bu sevincin hesabına da bir qədər özünə gələ bildi.

– Yox, – dedi, – gətirməmişəm. Burdan alaram, nə olar. Buralarda da kostyum olur da yəqin.

– Olur, niyə olmur. Amma neynirəm sənin burdan aldığın qasdumu. Ordan gətirsəydin, o olardı qasdum. Bilinərdi ki, dayını adam yerinə qoymusan. – Xızır kişi kətilin yerini dəyişib, bayaqdan üzbəüz oturduğu çamadana indi arxasını çevirdi. Tərlan arvad aralıda, toyuqların yanındaydı. Amma qulağı, sən demə burdaymış.

– A kişi, sən qasdumu neynirsən? Güvələrin payı azdı-nədi? Taryelin bildir Mosqovadan alıb gətirdiyi qasdum o sandıqda qəttəzə durur hələ.

Bəyəm söhbət qastum söhbətidi? Mən şüyümündən yana deyirəm.

Səfalı müəllim bayaqkı o bimezmun sözü az qala bir də deyəcəkdi, amma demədi. Bu hində, nədənsə, o üstü şəkilli kitab – Bakıdan üzü bəri – Səfalı müəllimin gözünün qabağına gəldi və şəkildəki qaraqaş, qaragöz, qarabığ kişini xəyalında bir də yaxşı-yaxşı canlandırandan sonra Səfalı müəllim ömründə birinci dəfə belə bir (olduqca mübahisəli!) fikirlə razılaşmağa məcbur oldu ki, yəqin o Folknerin özü də bu dünyanın son dərəcə "naxal" adamlarından biriymiş.

Səfalı müəllimin çamadanına öz antaqonist münasibətini heç cür dəyişmək istəməyən Xızır kişi mısmırığını sallayıb oturmuşdu. Tərlan arvad o tərəfdə – ərik ağaclarının dibində, toyuqların yanındaydı. Ancaq Səfalı müəllim o tərəfə baxmaq istəmirdi, çünki o qırmızımtıl dağ da o tərəfdən, o iki ərik ağacının arasından görünürdü və guya o tərəfə baxsaydı, o dağ Səfalı müəllimə yenə nəsə xoşagəlməz bir şey deyə bilərdi.

– Yazıq bacımı da, demək orda basdırdın – Bakının kafirlərinin arasında. – Xızır kişi xeyli mısıb oturandan sonra, nəhayət, başını qaldırdı.

– Yox, kafirlərin niyə? Müsəlman qobiristanlığında basdırmışam. – Səfalı müəllim uşaq kimi sevinə-sevinə dedi.



– Kafır bəyəm tək urusdan, ermənidən olur? Kafırlıq millətə-zada baxmır, bacoğlu, insanın xislətində olur kafirliq. O bakıdakıların dillərin qanmaq olmur. O tırvızordan biri də bizdədi. Axşamlar baxıram hərdənbir. Qansertdərin-zadın başa düşürəm, ancaq dediklərindən heç bir mətləb qanammıram. O Iranın, Türkiyənin radyoda dediyindən yenə adam azdan-çoxdan bir şey qana bilir... Mən o Qobıçovı da lap yaxşı başa düşürəm, nə olar urusca danışanda.

Xızır kişi axırıncı sözdən sonra yerindən dik ayağa qalxdı, yenə üzünü Səfalı müəllimin çamadanına sarı tutdu. Ancaq bu baxmaq o baxmaqdan deyildi. Xızır kişinin o çamadana budəfəki baxmağı açıq-aşkar o deməkdi ki, söhbət bitdi, çamadanını götürüb gedə bilərsən və istəyir əlli il yox, lap yüz əlli ildən sonra gəlsəydin, mən sənnən bundan artıq danışası deyildim. Onun sorakı sözləri də Səfalı müəllimin o çamadan barədəki müşahidəsinin dürüst olduğunu təsdiq elədi:

– Qoqan gələn kimi gətirəcək yorğan-döşəyi. Eyvanda lastraduşka (raskladuşka!) var. Üstünə keçi dərisi salmışam, yorğun olsan, uzan dincəl. Qoqan bir qab qatıq da gətirər – günorta çörəyinən yeyərsən. Axşam xörəyimiz olsa, sənə də pay göndərəcəyəm...

O çamadanla dayısıgildən öz dədə-baba evinəcən necə gedib çıxmağı Səfalı müəllimin bir o qədər də yaxşı yadında qalmamışdı. Amma halqasına əl boyda dağdağan çubuğu taxılmış o qapını açıb, öz dədə-baba evinin həyətinə girəndə xiyabanda gördüyü yanmış, saralmış ot, innən belə yetmiş iki il də yaşasa, yəqin ki, Səfalı müəllimin heç vaxt yadından çıxmayacaqdı. Axı o ot eynilə həmin ot idi, Pərvərdigara! O yuxuda o Səfərlə Səfalı müəllim niyə məhz bu otun üstündə güləşmişdi... Bir də – o Qoqan – De Qoll... O Qoqan Səfalı müəllimin təsəvvüründə bəlkə o Taryelin özündən də diri qalmışdı, canlı qalmışdı... Səfalı müəllim o həyətə girəndən beş-on dəqiqə keçməmiş qaça-qaça özünü yetirdi. Şala bükülü yorğan-döşəyi eyvanın qabağına tullayıb, özünü xiyarlığa verdi. Qoyun-qoltuğunu xiyarla doldurub, xiyarın bir yekəsini də əlində gəvələyə-gəvələyə Səfalı müəllimə yaxınlaşdı.

– Dayı nə olar, on manat ver də... Gedib dükandan babama piçenni alacağam. – Elə də ərklə dedi ki, elə bil zalımın balası gözünü açandan Səfalı müəllimi bu həyətdə görmüşdü. Pulu qoparandan sonra da bicliyindən-kələyindən qalmadı: – Qorxma, dayı borcunnan çıxacağam – dağa getsəm, sənə kəklik yumurtası gətirəcəyəm.

Buzbulağa gəldiyi günün elə birinci gecəsi Səfalı müəllim anası Sərən arvadı yuxuda gördü. Özü də Buzbulaqda yox, Buzovnada. Məsələ beləydi ki, instituta girəndən sonra Səfalı müəllim, hələ sentyabr ayından, Bakıda özünə bir münasib iş axtarmağa başlamışdı və o işi tələbə yoldaşlarından birinin köməyilə Buzovna stansiyasında elektrik qatarlarına bilet satan kassada tapmışdı. Axşam saat 5-dən gecə saat 12-yəcən kassada oturub, həm biletini satırdı, həm də rahatca dərslərini hazırlayırdı. Hətta kefinə düşəndə, hərdən yarım saatlığa, bir saatlığa kassanı bağlayıb, plyaj yolunun ağzındakı restoranın bufetində işləyən Sima ilə mırt vurmağa da gedirdi. Qızın əsl adı Səmayə idi, ancaq özü öz adını Sima qoymuşdu, elə o ad Səmayəyə yaraşırdı da. Səfalı müəllimin Səmayədən yaman xoşu gəlirdi. Elə qızın da, deyəsən, Səfalı müəllimə meyli vardı. Bir dəfə sözləşdilər ki, şəhərdə Sabunçu vağzalının qabağında görüşsünlər; əvvəla, ora xatircəmlik idi – şəhərdə onları kim tanıyırdı. İkincisi də, Sima şəhərdə yaşayırdı, hər gün elektriçka ilə Buzovnaya gedib-gəlirdi... Ancaq Sima o görüşə gəlmədi. Simanı o vağzalın qabağında düz üç saat gözləyəndən sonra Səfalı müəllim elektriçkaya minib, suyu süzülə-süzülə Buzovnaya qayıtdı. Bununla da məsələ qurtardı. Düzdür, lap evlənəndən sonra da o Simanı görəndə həmişə Səfalı müəllimin ürəyi əsirdi, amma yəqin ki, belə olmağı yaxşıydı: bufet, restoran adamından Səfalı müəllimə arvad çıxmazdı.

O kassada işə düzələndən sonra gecələr Səfalı müəllim elə o kassadaca gündüz növbəsində işləyən buzovnalı Əzizağa kişinin evində qalırdı. Maaşı pis deyildi – o vaxtın pulu ilə ayda nağd min yüz manat pul alırdı. Bundan savayı, o kassadan da Səfalı müəllimin əlinə, beşdən-üçdən, hər gün əlavə pul gəlirdi. Və Səfalı müəllim hər şeyi ölçüb-biçib axırda belə qərar qəbul elədi ki, Sərən arvadın Buzbulaqda qalmağına daha heç bir ehtiyac yoxdur, onun – öz oğlu dura-dura – gedib qardaş qoltuğuna sığınmağı heç insafdan da deyil. Üstəlik, Əzizağa kişi də bu işi yüz faiz bəyənirdi, hətta Səfalı müəllimin tək qaldığı balaca otağı, anası gələndən sonra, daha böyük bir otaqla dəyişməyə hazır idi. Bir sözlə, instituta girdiyi həmin o birinci il, hələ heç qış da düşməmiş, Səfalı müəllim gedib Sərən arvadı Buzbulaqdan gətirdi. Sərən arvad, lap az vaxtda Əzizağa kişinin özü ilə də, arvadı Mələkxanım, qızları Heyransa və Zərnigarla da dil tapdı, qaynayıb-qarışdı. Və bundan bir müddət keçəndən sonra Buzovnanın yarısı Sərən arvadın birçəyinə and içməyə başladı.



Ancaq məsələnin belə bir pürsüklü tərəfi də vardı: Əzizağa kişi Zərnigardan qabaq böyük qızı Heyransanı ərə vermək istəyirdi. Xasiyyətdə, sir-sifətdə Heyransa bəlkə Zərnigarın özündən də üstün idi, qəşəng idi, amma heyif ki, şikəst idi. Qolunun biri o birindən xeyli balacaydı. Daha doğrusu, Heyransanın bir əli elə bil biləkdə yox, dirsəkdə bitmişdi.

Zərnigarla evlənmək məsələsini öz aləmində çoxdan həll eləyib qurtarmış olsa da, Əzizağanın, Mələkxanımın xatirinə, bir də o şikəst Heyransanın ürəyini sındırmamaq üçün, Səfalı müəllimə qalsa, bəlkə bu variantla da razılaşardı. Amma Sərən arvad bərk dayandı: "O Heyransa da, – dedi, – özü kimi şikəstdən-zaddan birin tapıb gedər. Qız alırıq, bütövünü alaq da, neynirik qol yarım qızı... Hələ şikəstliyi bir yana, əmcəyinin altında kəklik yumurtası boyda yekə bir ziyili də var: qara, tüklü, nataraz bir şeydi – hamamda öz gözümnən görmüşəm.

Və Səfalı müəllimin bu gecə Buzbulaqda gördüyü yuxunun, Qoqanın dediyi, həmin o "kəklik yumurtası" əhvalatıyla – lap uzaqdan-uzağa olsa da – elə bil nəsə bir əlaqəsi vardı. Daha doğrusu, Heyransa əhvalatıyla, çünki Səfalı müəllimin yuxuda gördüyü buydu ki, Əzizağa kişiylə Mələkxanım sözü bir yerə qoyub, toy gecəsi Zərnigarın yerinə, Heyransanı gətirib bəylə gəlinin otağına salmışdılar. Bir qolunu çarğatının altında bərk-bərk gizlədə-gizlədə Heyransa otağın ortasında dayanıb, məzlum-məzlum Səfalı müəllimə baxırdı və Səfalı müəllim bilmirdi ki, neynəsin: durub bu saat bəy otağından çıxıb getsin, qalıb səhərin açılmağını gözləsin, yoxsa Zərnigarın yerinə Heyransanı arvadlığa götürüb, birdəfəlik öz taleyi ilə razılaşsın... Və belə bir çıxılmaz vəziyyətdə Sərən arvad Səfalı müəllimin dadına çatdı: əvvəl, Zərnigarı itələyə-itələyə içəri saldı, sonra Heyransanın qolundan yapışıb, eşiyə çıxartdı; Xızır kişinin səsinə oxşayan qart səslə: "Mən o Qorbıçovu lap yaxşı başa düşürəm, – dedi. – Ancaq bu kafir müsəlmanın heç bir işindən baş açammıram..." Və bərkdən qapını çırpıb getdi.

Səfalı müəllim diksinib, yuxudan ayıldı. Gördü ki, hər yan süd kimi ay işığıdır. Gördü ki, Qoqanın gətirdiyi kiloluq qatıq bankası döşəmənin bir yerində böyrü üstə yıxılıb və açıq pəncərənin qabağında – o bankanın yerində bir qara pişik oturub, öz əməlinə görə böyük xəcalət hissi keçirir.

Ayılandan sonra Səfalı müəllim səhərəcən yata bilmədi. Bir tərəfdən – dünyanı ağzına götürmüş ağappaq ay işığı, bir tərəfdən də – bu

dünyada heç kəsə bənzəməyən Sərən arvadın parlaq siması, surəti. Sərən arvadın heç vaxt yaddan çıxmayası sözü də, əməli də çox idi. Ancaq onun bir əməli də çox idi. Ancaq onun bir əməli lap tarixə yazılmalı şey idi: Şüvəlanda, Əttağanın qəbrinin qabağında atəşin nitq irad eləməyi... Söhbət köhnənin söhbətiydi. Səfalı müəllimin Bakıda hökumətdən ev alıb, Büzovnadan ailəlikcə şəhərə köçdüyü vaxtdan beş-altı il keçmişdi, ya keçməmişdi. Rena da hələ uşaq idi, məktəbdə oxuyurdu. Bazar günlərinin birində yığışıb hamılıqla Buzovnaya Əziz-ağa kişiyə qonaq getmişdilər. Qayıdan baş hardansa Zərnigarın ağlına yerləşdi ki, oralarda bir doyunca gəzib-dolanıb sonra şəhərə dönsünlər. Dənizin qırağıyla gəzə-gəzə axırda gedib Şüvəlanda Əttağanın qəbrinin üstünə çıxdılar. Qəbrin başına xeyli arvad toplaşmışdı. Gəlib-gedənə Əttağanın başdaşını öpdürüb, özlərinə nəzir yığırdılar. İş elə gətirmişdi ki, o başdaşını Rena da öpməli idi. Ancaq hələ qız təzəcə əyilib, ağzını o daşa vurmaq istəyirdi ki, Sərən arvad əlini daşın üstünə qoydu və Rena daşın əvəzinə nənəsinin əlini öpəsi oldu. Və o arvadlara da elə bil bu lazım idi. Hamısı ağız-ağıza verib, Sərən arvadı dinsizlikdə, babılıqda ittiham eləməyə başladılar. Və gözünə döndüyüm Sərən arvad birdən-birə coşdu, nə coşdu: "Matuşqalar! Donuz əti yeyənlər! Siz nə qanırsız imam nədi, peyğəmdər nədi. Yığışıb burda molla bazarı açmısız – heç arvaddan da molla olar?.. Peyğəmbər sümüksüz balığı haram buyurub, amma siz yeyirsiz, tıxırsız onu. Hələ üstündən utanmaz-utanmaz barmağınızı da yalayırsız. Mənim uşağım niyə öpməlidi o daşı – ona gündə yüz adamın ağzı dəyir. İstəyirsiz uşaq öpsün onu, sonra gedib sarılıq azarı tutub yorğan-döşəyə düşsün?.. Bəs bunun dərsin kim oxuyacaq? O gün həndəsədən "üç" veriblər, oturub ağlayıb səhərəcən. Siz heç bilirsiz – həndəsə nədi?.. Qəzet-kitab oxumursuz, barı o radyoya qulaq asın. O radyoda heç bir dəfə deyən olub ki, gedin qəbiristanlığın daşların öpün, sonra da qarınağrısına düşüb iyləndirin şəhərin havasın? Harda deyiblər belə şeyi?.. Özünüzün bir cüllüt ağlıca ağlız yoxdu, di gəl ki, dərs verməк istəyirsiz ağıllılara. Tfu, molla tör-töküntüsü!.. Bunnarın vid-fasonuna bax: siz heç adama da oxşamırsız, ay yazıqlar, çaqqala, safsara oxşuyursuz!.." – Bir sözlə, Sərən arvad o arvadlara elə bir "həndəsə" dərsi verdi ki, yazıqların düz on dəqiqə gözü bərələ qaldı.

Sərən arvadın dünyada iki şeydən xoşu gəlmirdi: bir molladan, bir də Sovet hökumətindən. Elə öləndə də sözünün üstündə bərk durdu: –



Yasıma molla-zad gətirmiyəsən. – dedi. – Ölümü də aparıb Buzovnada Əzizağaynan Mələkxanımın yanında basdırarsan. Yaxşı camahatdı buzovnalılar, əsl insan elə onnardı. *NÖŞÜN Kİ*... (ömründə, Buzbulaq ləhcəsindən savayı heç bir danışığı adam danışığı saymayan Sərən arvad buzovnalıların hər kəlməbaşı işlətdiyi o "nöşün ki"ni söz yox, özünün Buzovna camaatına olan dərin hörmət və ehtiramına "əşyayi-dəlil" olaraq – ölüm ayağında – dilinə (gətirmişdi).– Nöşün ki, onlar (yəni buzovnalılar) bu hökumətin qayda-qanununa tabi olmur...

Buzbulaqda olduğu o ayyarımda Səfalı müəllim çox yuxular görüb, bu dünyanın çox işlərini ürəyində dönə-dönə götür-qoy eləmişdi; sanki hələ heç başlamamış qurtarmaqda olan yetmiş iki illik bir ömrün acısından da, şirinindən də – həmin o ayyarım vaxtın payına düşəcək qədərində – bol-bol dadmışdı. Və axırda belə bir qərara gəlmişdi ki, uşaqlığı və cavanlığın ilk dövrünü nəzərə almasan, ötüb keçən ömürdən insanın yadında demək olar ki, heç nə qalmır. Qalanda da, elə şey qalır ki, onun bir rişəsi – tilişkəsi haradasa yenə uşaqlığın üstünə gedib çıxır. Məsələn, amerikalı professor Nil Armstronqun Aya uçmağı. Bu hadisə Səfalı müəllimin yetmiş iki illik həyatında ona görə əlamətdar hadisələrdən biriydi ki, o Ayın barəsində Sərən arvad bir vaxt Səfalı müəllimə dünyanın ən gözəl nağıllarını danışmışdı. Səfalının – bəlkə lap ana südü əmdiyi vaxtlardan – Sərən arvadın dilindən eşitdiyi o nağıllarda Ay bir gözəl-göyçək oğlan, Günəş mələk kimi bir qız idi və yer üzündə – otdan, yoncadan tutmuş, uca çinar ağaclarınacan – nə varsa, hamısı o iki aşiq və məşuqun sevgisindən yaranmışdı. Sapsarı günəbaxan onların ilk övladıydı – ona görə həmişə göyə baxırdı. Qıpqırmızı dağ laləsi də göydəki o sevgidən doğulmuşdu və o qıpqırmızı dağ laləsi ona görə həmişə gecə yumulub, səhər açılırdı ki, onun Günəş anası ona yalnız səhərlər döşündən süd verirdi... Sonra Səfalı süddən kəsilmişdi. Böyüyüb məktəbə getmişdi və söz yox, bilmişdi ki, Ay oğlan deyil. Ancaq onun bir vaxt ana südü ilə bir yerdə əmdiyi o nağılların havası, rəngi, işığı bu dünyadan necə çəkilib gedə bilərdi, hara çəkilib gedə bilərdi?.. Və Səfalının – o sapsarı günəbaxanla, o qıpqırmızı dağ laləsilə eyni vaxtda bu dunyanın havasından, rəngindən, işığından süd əmən əfsanəli-nağıllı xəyalı sonralar o Ay-Oğlanı bir laləli-günəbaxanlı Ay-Dünyaya çevirmişdi. Və beləcə illər uzunu dünyanın ən duru çayları Ayın səthindən axmışdı, otun ən yaşılı, ağacın ən ucası orda bitmişdi, insanın ən yaxşısı o yaşıl çəmənlərdə, o uca

ağacların altında gəzib dolanmışdı; Ayın masmavi sularında bir vaxtı Səfalı müəllimin gəmiləri üzmüşdü.

Və həmin o "Apollon-11" kosmik gəmisinin aya uçduğu günü yada salanda indi Səfalı müəllimin hər şeydən çox özünə acığı tuturdu, çünki o gün, yəni 21 iyul 1969-cu il tarixdə o zaman Baksovet tərəfdə yaşayan Səfalı müəllim evdən çıxıb, o Qoburnat bağı ilə üzüaşağı dəniz sahilinə – gəzməyə üz qoymasaydı, bəlkə o dəhşəti də heç vaxt öz gözüylə görməyəcəkdi və əgər onu öz gözüylə görməsəydi, bəlkə o sarsıntı da Səfalı müəllimin ömrünün, necə deyərlər, qıraq-bucağından sakitcə sürüşüb xata-bəlasız ötüb keçəcəkdi. Əlbəttə, bir şeyin barəsində min dəfə, milyon dəfə oxumaq, ya eşitmək onu bircə dəfə gözlə görməyin yerini verməz. Və o gün o Qoburnat bağında, İçərişəhərin qala divarının dibindəki çayxananın iri ekranlı, rəngli televizorunda Ayda qapqara tozdan savayı heç nə olmadığını Səfalı müəllim öz gözlərilə görmüşdü. Nil Armstronq skafandrda, o tozun-torpağın içində eşələnirdi. "Apollon-11" yuxarıda, onun başının üstündə vertolyot kimi fırlanırdı. Səfalı müəllim o qara toza baxırdı və anası Sərən arvadın, Buzbulaqda, odun sobasının "durbalarından" hər yaz çırpıb tökdüyü qapqara qurum Səfalı müəllimin gözünün qabağına gəlirdi: Elə bil lap Nuh əyyamından bəri buzbulaqlıların qış uzunu yandırdıqları bütün sobaların qurumunu aparıb, hər yaz Ayın üstünə boşaltmışdılar...

O gündən etibarən, dünya Səfalı müəllimin nəzərində qabaqkı sirrini-sehrini yavaş-yavaş itirməyə başlamışdı. Bu dünya yaman yoxsullaşmışdı, yazıqlaşmışdı, üstəlik, o dünyaya olan ümidin də elə bil rəngi solmuşdu, işığı yoxa çıxmışdı. Gecələr Azərbaycan filologiyasının yolunda göz yağı əridib, gündüzlər gedib institutda rektorluq eləmək də bu hadisədən sonra Səfalı müəllimin nəzərində mənasız bir şeyə çevrilmişdi. Bundan sonra Səfalı müəllimdə nəinki səmanın sonsuz zənginliyinə və qalaktikanın sehrli gözəlliyinə, hətta yalan olmasa deyərdim ki, Sərən arvadın müdrikliyinə və zərnigarın yaxşı ana olmağına da əvvəlki inam qalmamışdı... Sonra: Yəməndəki o əhvalat, Nuhbala, Renanın Leninqradda o gürcü familiyalı qoca yəhudiyə ərə getməyi... Bütün bunlar, Səfalı müəllimin təsəvvüründə, eyni bir zəncirin müxtəlif halqalarıydı və o zəncirin bir ucu birbaş gedib düz o 21 iyul gününə birləşirdi. Hər dəfə göyə baxıb Ayı görəndə – o qara tozdan, qara qurumdan savayı – Səfalı müəllim Əli Ziyanın gözündəki o şeytanı, o şeytana papış tikən Nuhbalanı və gözünün ağı-qarası



yeganə övladı Renanı yada salmağa çoxdan vərdiş eləmişdi. Buzbulaqda isə elə ki Ay çıxdı, onu görmək üçün göyə baxmağa ehtiyac yox idi. Orada, evdə-eşikdə, hər yerdə Ay özü adamı axtarıb-tapırdı. Ağacı, dağı-daşı göydən yerə, yerdən göyə sözə-söhbətə çağırırdı. Ay işığının lap coşub-daşdığı gecələrdə hətta quşlar da yuvalarında rahat yata bilmirdi. Elə öz həyətindəki qoz ağacının baş budağında yuvası olan qoca qarğanın ah-naləsi belə vaxtlarda, neçə dəfə Səfalı müəllimi diksindirib, gecənin şirin yuxusundan ayıltmışdı...

Amma, bir tərəfdən baxanda, o Buzbulaqda Səfalı müəllim çox rahat idi. Onun bu kənddəki rahatlığını beş-on gün həmin o Taryel pozmuşdu. Bir dəfə Xızır kişi gecə "tırvizorda" SSRİ xalq deputatı şeyxülislam Allahşükür Paşazadənin islam fundamentalizmi barədə imperialist dairələrin uydurduğu şayiələrin ifşasına həsr olunmuş çıxışına qulaq asıb, sübh tezdən – hələ heç xoruzlar banlamamış – Səfalı müəllimin başının üstünü kəsdirib, respublika hökumətinin acınacaqlı vəziyyəti barədə söylədiyi atəşin nitq ilə onu, yəni Səfalı müəllimi bir qədər narahat eləmişdi. Bir də, yeni-yeni iqtisadi tələblər irəli sürməklə, Səfalı müəllimi rəhmsizcəsinə tam müflisləşdirmək məqsədi güdən o bic-vələdüzna Qoqan hərdən tətil elan edib, həyəti suvarmağa gəlməyəndə və Səfalı müəllimin özü, beli çiyninə qoyub, o suyu həyətə bağlamağa gedəndə, küçədə, kəndin arvadları arabir Səfalı müəllimə divan tutmuşdu: "O belin sapından elə niyə yapışmısan, Səfalı müəllim, deyirsən birdən əlivi dişləyər?" "O panamanı niyə başından çıxartmırsan, olmuya qorxursan gün düşər üzüvə?" "Şalvarını yaxşı düymələ, Səfalı müəllim, bülbülü qəfəsdən uçurdarsan..." – Belə vaxtlarda o arvadlar Səfalı müəllimdən nəinki əlli il Bakıda yaşamağının və institutlda on il rektor, iyirmi il professor olmağının, hətta məşhur ədib və böyük ictimai xadim Əli Ziya ilə haçansa dost olmağının, onunla bir təyyarədə uçub, bir mehmanxanada qalmağının, onunla bir təyyarədə uçub, bir mehmanxanada qalmağının, artıqlamasıyla, açığını çıxardılar. Ancaq belə şey həftədə-on beşdə bir dəfə olurdu: o su – dədə-baba qanunu ilə o həyətin payına düşəndə. Qalan vaxtlar Səfalı müəllimə heç kəs dəyib-toxunmurdu; gündüz həyətdə dümələnib, qəzetdən-kitabdan oxuyub, vaxtını keçirirdi. Gecələr eyvanda oturub, Aya-ulduza tamaşa eləyirdi. Ürəyi bərk darıxanda isə Səfalı müəllim həmin o amerikalı professor Nil Armstronqla şirin söhbətə girişirdi.

– Axşamınız xeyir, cənab professor!

– Axşamınız xeyir! Buyurun, professor, eşidirəm. – (Səfalı müəllimin də professor olduğunu Nil Armstronq bilirdi).

– Səhhətiniz necədi, Nil? Siz Aydan qayıdandan sonra Amerikada vəziyyət necədi?

– Normal! Normal! – yenə Nil Armstronq yumşaq kresloda oturmuşdu, ayaqlarının hər ikisini qaldırıb stolun üstünə qoymuşdu və o Nil Armstronqun qabağında yenə viski şüşəsi vardı.

– Nil! Cənab Nil! Hörmətli Nil! Axı mən o Ayın o gündə olmağına hələ də inanammıram!

– İnanın, inanın, yoldaş Səfalı! Ayda həyat yoxdur. Ayda toz-torpaqdan savayı heç nə yoxdur!

– Yəni heç bir ot-zad da yoxdur: yoncadan, yarpızdan, bənövşədən?

– Yoxdur, professor, heç qıyağotu da yoxdur.

– Bəs deyirlər orda dağlar var?

– Var. Dağ çoxdur. Ayın səthi əsasən dağlardan ibarətdir.

– O qədər dağ ola, üstündə bir dənə də lalə bitməyə – belə şey heç mümkündürmü, Nil?

Nil Armstronq viski qədəhini dodağına toxundurub, yerə qoydu.

– Olur, – dedi. – Belə də olur. Siz bir vaxt dördmərtəbəli mehmanxana binasının beşinci mərtəbəsinin olmağına da şübhə eləyirdiniz. Sonra gördünüzmü, varmış o mərtəbə?!

– Gördüm... – Səfalı müəllim az qala ağlaya-ağlaya dedi. – Yaman gördüm, Nil. Elə şeyi bir də görməyi Allah heç düşmənimə də göstərməsin.

Səfalı müəllimin ah-zarından Nil Armstronqun xoşu gəlmədi.

– Mən burda bədbinliyə qapılmağa heç bir əsas görmürəm, yoldaş Səfalı, – dedi. – Həyatda hər şeyi görmək lazımdır. Cənabınıza ərz olsun ki, mən özüm Nyu-Yorkda Beynəlxalq Ticarət Mərkəzinin yerləşdiyi yüz on mərtəbəli binanın yüz on birinci mərtəbəsində olmuşam, hətta orda bir neçə dəfə cənab Rokfellərlə bilyard da oynamışam.

– Olar, olar. – Səfalı müəllim səsi titrəyə-titrəyə dedi. – Ayda gəzib-dolanan bir adam üçün yüz on birinci mərtəbədə bilyard oynamaq nə çətin işdi ki... Ordan, Nil, Yer necə görünür?

– Hardan? Yüz on birinci mərtəbədən?

– Yox, Aydan, Ay planetindən.



– Bağışlayın. – Ayaqları yenə stolun üstündə olsa da, cənab Nil əsl professor nəzakətilə dilləndi. – Aydan yerə baxmağa bir o qədər də imkan olmadı. Vaxt dar idi. Ancaq Aya səfərimdən üç il əvvəl “Cemini-8” adlı dranduletdə Yerətrafı orbitdə başmaq seyri elədiyim vaxt ordan yerə çox baxmışam. Xüsusən sizin ölkə o vaxt kosmosdan çox gözəl görünürdü.

– Havaxt? 66-da?! – Səfalı müəllim hədsiz maraq içində xəbər aldı, çünki onun Yəmən səfəri də, deyəsən, o dövrə təsadüf eləyirdi. – Görəsən, bizim ölkə ordan – o kosmosdan indi baxsan necə görünər?

– Pis! Çox pis! – Əhvalı birdən pozulmuş Nil ayağının birini stolun üstündən götürüb yerə qoydu və eyni vaxtda həm fars, həm ingilis, həm rus dilində ucadan əlavə elədi: – Bəd! Bəd! Plaxoy! Otşen plaxoy!

– Niyə, Nil? Bu ölkə niyə birdən-birə bu günə düşdü? Siz bilərsiz, siz belə şeyləri yaxşı bilərsiz, çünki necə olsa, başqa planetdə olmusuz.

– Bunu bilmək üçün, professor, başqa planetdə olmağa ehtiyac yoxdur! – Bu dəfə Nil çox sərt cavab verdi, üstəlik, bayaq yerə qoduğu qıçını qaldırıb təzədən stolun üstünə aşırdı: kapitalist damarı tutanda o, həmişə belə eləyirdi. – Sizin ölkədə hakimiyyət başına yeni tipli rəhbər gəlib və bu rəhbər əvvəlki rəhbərlərdən çox-çox uzaqgörən olduğu üçün ölkədə belə bir vəziyyətin yaranmağı tamamilə təbiidir.

Səfalı müəllim küsülü uşaq kimi doluxsunub, pərt halda başını aşağı saldı, çünki yeni rəhbərliyin məhz uzaqgörənliyi barədə dünya ictimaiyyətinin yekdil rəyi Səfalı müəllimin heç ürəyindən deyildi.

– Uzaqgörənlik, demək, buymuş: yüzminlərlə günahsız insanın göz yaşı – ağsaqqal kişilərin, ağbirçək arvadların, körpə balaların ahnaləsi! Talanlar, yanğınlar, qətllər – iyirminci yüzilliyin axırında tonqallı, qanlı-qırğınlı orta əsr inkivizisiyası!..Yox, Nil, bu məsələdə mən sizinlə heç cür razılaşa bilməyəcəyəm. Vur-tut beşcə ilin içində ölkədə hər şeyin qiymətini azı on dəfə qaldırıb, təkcə insanın dəyərini bu qədər ucuzlaşdıran o yeni tipli siyasətin uzaqgörənliyinə inanmağa şəxsən mənim halım yoxdur, Nil!.. Bu cür komsomol uzaqgörənliyini biz elə əvvəllər də çox görmüşük.

Astronavt çaşmışdı. Səfalı müəllimin bu atəşin, alovlu sözlərini eşidəndən sonra, deyəsən, Nil uzaqgörənlik və humanizm barədə əvvəlki dünyagörüşünü dəyişməyə hazırlaşırdı. Xeyli fikirləşəndən sonra:

– Mən sizinlə tam şərikəm, – dedi. – Sizin indiki rəhbərliyin uzaqgörənliyinin bir tərəfi, söz yox, pioner-komsomol hərəkatına bağlıdır.

Buna görə də, Amerikadakı mühacirlərin böyük əksəriyyəti onun reformalarına hələ də ciddi şübhə ilə yanaşır. Hətta, o saqqallı Soljenitsının özü də. Rusiyanın işıqlı gələcəyinə ümid bəsləyən ən ağıllı adamların doxsan faizi bu saat dərin depressiya içindədir. Marqaret Tetçerin kosmetik proqnozlarına çox da əhəmiyyət verməyin.

Səfalı müəllim əməlli-başlı sevindi, çünki məşhur astronavtın komsomol barədə dedikləri onun da yüz faiz ürəyindən idi.

– Düz buyurursunuz. Mən o Nuhb... komsomolu lap yaxşı tanıyıram. Bunların bircə məqsədi var, Nil: adamın dünən kim olmağı bu gün yadından çıxsın. Adı, familiyası, dədəsinin adı, hətta hansı azuqəylə qidalanmağı da. Məsələn, bax elə o Brejnevin vaxtında donmuş əti dükandan alan yox idi. Mal əti – iki manata, qoyun əti – bir manat doxsan qəpiyə. İndi kimin yadındadı ki, bizim Sovet dükanında da bir vaxt belə-belə maraqlı işlər olub. Bəlkə beş-on veteranın yadında qalmış olar. İndi, bu yeni tipli rəhbərin iş başına gəlməyinin hələ heç beş ili tamam olmayıb, məsələn, sosiskanın nə rəngdə olmağı yavaş-yavaş camaatın yadından çıxır. Bu gün-sabah, çox mümkündü ki, məsələn, pendirin, balığın, çiyələk mürəbbəsinin və badımcan kürüsünün rəngi də xalqın yaddaşından tamamilə silinib getsin... Bir zamanlar bizim ölkədə adamlar bir-birinə salam verəndə heç vaxt qabaqcadan millətini soruşmazdı, inanırsınızmı, Nil? İndi kimin yadındadı bu? Əlbəttə, yenə bəlkə beş-on nəfər veteranın yadındadır. Mən, inanıram, Nil. İnanıram ki, bu ölkə həmişə belə qalmayacaq. Vaxt gələcək, o dükanlarda yenə sosiska, pendir, çiyələk mürəbbəsi və badımcan kürüsü satacaqlar. İnsan insana salam verəndə qabaqcadan millətini soruşmayacaq: eynən durğunluq dövründə olduğu kimi!.. Ancaq o sosiskanı və salamı kimin ayağına yazacaqlar, hansı müdrik və uzaqgörən siyasətin parlaq qələbəsi sayacaqlar? Əlbəttə, Qorbaçovun və Perestroykanın. Evi yanan, özü yanan, dədəsinin goru yanan, körpəcə balası gözünün qabağında doğram-doğram doğranan, vətənindən, yurdundan-yuvasından həmişəlik didərgin düşən o yüz minləri heç kəs heç kəsdən soruşmayacaq, Nil!.. Budur, Nil, yaddaş oyunu! İndi, bildinizmi, komsomol uzaqgörənliyi nə deməkdir?

– Oruell! Corc Oruell! – Yumşaq kreslodan ayağa qalxıb, birdənbirə belə haray-həşir salmaqda, deyəsən amerikalı professor Səfalı müəllimin ikinci monoloqundan da çox razı qalmışdı. – Lenin! Nep!.. Mədəni inqilab! Kolxoz! Sosiska! Nuhbala! Sumqayıt!.. – Nil Armstronq viski qoymadı, viskini son damcıyacan içib, ivansayağı əlinin dalı ilə ağzını sildi. Sonra yerinə əyləşib, üz-gözünü elə mənalı-mənalı turşutdu ki, elə bil indicə, Sinsinnatti universitetindəki mindən çox tələbənin, hamısına bir yerdə, mühazirə oxuyacaqdı.

Ancaq Səfalı müəllim öz həmkarına o mühazirəni oxumağa imkan vermədi.

– Cənab Nil! Hörmətli professor! – dedi. – Sizdən acizanə surətdə xahiş edirəm: o Sumqayıt sözünü bir də heç yerdə deməyin. Sosiskanı deyin, Nuhbalanı deyin, ancaq o sözü, nə olar, bir də dilinizə gətirməyin.

Bu yerdə Nil Armstronq göy gözlərilə Səfalı müəllimə elə pis-pis baxdı ki, elə bil keçmiş əyyamlarda Vaska Zəmigara baxırdı.

– Siz bununla nə demək istəyirsiz, yoldaş Səfalı?

– Vallah, billah, cənab Nil, mən heç bir şey demək istəmirəm. Bu barədə sizə yalnız məsul yoldaşlar obyektiv fikir deyə bilər. Ancaq bizim olduqca vicdanlı yoldaşlardan biri o sözü eşidəndə yaman əsəbilik keçirir. Əvvəllər "Gəncə" adı gələndə yazıq həmişə qarın ağrısına düşərdi, indi Sumqayıt sözünü eşidəndə, nədənsə sarılıq azarına tutulur. Yoldaşın səhhətini qorumaq lazımdır, çünki ölkəyə çox lazımlı adamdır. Xalqlar dostluğu mövzusunda bir sıra fundamental məqalələrin müəllifidi. Əslikökü komsomoldandı. Ancaq kino sahəsində də ciddi xidmətləri var.

Nil Armstronq:

– Mən o adamı lap yaxşı tanıyıram. – dedi. – Papuaslardandı!

– Papuas?! – Səfalı müəllim eşitdiyinə inana bilmədi. – Siz, professor, yəqin ki, populist demək istəyirdiniz.

Səfalı müəllim böyük astronavtla mübahisəyə girişmək istəmədi. Bir müddət müsahibəni dayandırıb, xəyalında – papuasların qədim məskəni Melaneziyadan tutmuş, bizim yeni sosialist qəsəbəsi Şüvəlanacan – dünyanın yarıdan çoxunu gəzib dolanandan sonra onun (yəni Səfalı müəllimin) üz-gözünə elə bil günəşin lap gur yerindən bir dünya işıq gəldi:

– Nil!.. Deyirəm: o Sərən arvad kaş ki, sağ olaydı, Nil!.. Papuaslı-populistli – bunların hamısını bir böyük qəbiristanlığa yığaydı və sümüksüz balıq tıxan bu bisavad matuşqalara bir yaxşı həndəsə dərsi keçəydi!..

Dünyanın hər işindən xəbəri olan zarafatcıl, hazırcavab Nil Armstronq Səfalı müəllimin nə demək istədiyini bu dəfə də çox gözəl başa düşdü.

– Yez! Yez! – dedi. – Sərən arvad!.. Karoş!.. Otşen, otşen karoş!..

Burada, sözsüz ki, söhbəti bitirmək olardı. Ancaq gecədən hələ çox qalırdı. Buna görə də Səfalı müəllim müsahibənin mövzusunu

– Bir necə söz də Əli Ziya barədə, Nil. O toxumun bioloji və psixoloji mahiyyəti barədə nə deyə bilərsiniz?

– Yaxşı toxum deyil! – Nil Armstronq başını dolandırıb yan-yörəsinə baxdı: elə bil tüpürməyə yer axtarırdı. Sonra, olduqca müəmmalı bir səslə: – Bu söhbət yalnız ikimizin arasında qalmalıdır! – dedi. – Mən o vaxt Ayda olanda, ayaqüstü, Marsla Yupiterə da baş çəkdim. O toxum orda da var. Marsda nisbətən azdır, ancaq Yupiterdə...

– Allah! Allah! – Səfalı müəllimin ah-zarı, deyəsən, təzədən başlanırdı.

Nil Armstronq bunu vaxtında görüb, o ah-zarın qabağını almağa çalışdı.

– Ancaq bizim Şimali Amerikada o toxumdan bu saat bir dənə də yoxdur. Axırıncısı Qes Xoll idi, onu da bu yaxınlarda pensiyaya göndərdik... Bəlkə başqa sualınız da var, professor?

– Var! Var!.. – Səfalı müəllim birdən-birə yaman mandraja düşdü, yəqin elə bildi ki, müsahibi durub getməyə hazırlaşır. Ancaq, əslinə qalsa, astronavtdan soruşmağa elə bir vacib şey qalmamışdı; Səfalı

müəllim Səfalı müəllim olmazdı – əgər o yaş əski və kakaşka söhbətilə Nil Armstronqun yaxasından əl çəksəydi; hərlədib-fırladıb yenə

– Nil! Cənab Nil! Bəlkə siz təsadüfən Ayın pis yerinə düşmüsüz. Bəlkə Ayda ayrı yerlər də var: laləli, günəbaxanlı, bənövşəli yerlər?..

Böyük astronavtın hər biri göy üzünün bir parlaq ulduzuna bənzəyən mavi gözlərində yenə kainatın tanış, təmiz, sehrli təbəssümü peyda oldu.

Nil Armstronq:

– Var! – dedi. – Var!.. Kainatın ən duru çayları, çeşmələri Ayın səthində axır... Ancaq, nə etməli, yoldaş Səfalı, biz bu real həqiqəti hələlik dünya ictimaiyyətindən gizlətməyə məcburuq. Prezidentimizin məsləhəti belədir... Oruell! Sərən arvad!.. Toxum məsələsi, aydındırmı, professor?

– Aydındır. Elə aydındır!.. – Səfalı müəllim nəhayət rahatlandı, dərindən nəfəs aldı, çünki Ayın toz yığnağı olmağı onu heç cür qane eləmirdi; dünya vətəndaşı Səfalı müəllim istəirdi ki, Ayda da çaylar axsın, gəmilər üzsün, orda da günəbaxan, lalə, bənövşə bitsin. İstəyirdi ki, Ayda da həyat olsun, insan olsun və o insan Yerdəki insandan xoşbəxt yaşasın...

"Bu badələri içək Səfibalanın sağlığına!" "Mən onu, deyib, çox istəyirəm, ancaq o, (yeni Səfalı müəllim) tərs adamdır, eqoistdir, fatalistdir, maksimalistdir, idealistdir – məni başa düşmək istəmir..." Və o sağlığı deyəndən sonra Əli Ziya guya o badəni son damcısınacan içib və oturub hönkür-hönkür ağlayıb...

...Bəli, bu dünyada belə-belə qəribə işlər çox olur. Sən hələ təsadüfə bax ki, elə mən də, bulvarda, Səfalı müəllimə məhz o vədələrdə rast gəldim. Əli Ziyanın o "tost" əhvalatını təzəcə eşidən Səfalı müəllim o gün elə bir halda idi ki, atalar demişkən, bıçaq vursan, qanı çıxmazdı. Səfalı müəllimin o halı mənə də böyük təsir elədi. Gecəni o qədər pis yatdım ki, səhər duranda hekayətimizin yeni fəsli üçün ad tapmağa da heyim olmadı. Bu da işdir: öz dərdin dura-dura özgənin dərdin, çəkəsən?

Nə isə...

## *Beşinci fəsil*

## ADSIZ FƏSİL

Zuğulbaya gəldiyi gündən düz bir həftə keçəndən sonra, axşamtərəfi, Səfalı müəllim yeməkxananın qabağındakı avtomat telefondan qonşusu Loraya zəng elədi və aldığı ilk xəbərdən o qədər sarsıldı ki, qonşunun – səsi titrəyə-titrəyə – şəhərdə baş verən digər hadisələr barədə dediklərinə bir o qədər də həvəs göstərə bilmədi.

*TARYEL* gəlmişdi. Bakıdaydı. Lora arvad Səfalı müəllimin Leninqrada, qızının yanına getdiyini o Taryelə azı on dəfə desə də, o gədə, o qapıdan yenə əl çəkmirdi. Gündə düz üç dəfə – səhər, günorta və axşam – Loranın qapısının zəngini basırdı, Səfalı müəllimin Leninqraddan gəlib-gəlmədiyini soruşurdu.

– Oy, oy, kakoy ujas, Safalı!.. Gəlin, qalmayın orda, şəhər dağılır. Çto zdes tvoritsya, Safalı!.. Ujas! Ujas! O, boje, kakoy ujas! – Telefon dəstəyinin içində Loranın ah-naləsi ərşə qalxmışdı. Ancaq bu ah-nalənin səbəbini Səfalı müəllim bir o qədər də yaxşı dərk eləyə bilmirdi, çünki o, Zuğulbaya gəlməmişdən də Bakıda, Domsovetin yanında hər gün mitinq olurdu, indi, vur-tut bir həftənin içində, görəsən, şəhərdə təzə nə hadisə baş vermişdi.



– Nə olub axı, Lora? Şəhərdə nə olub ki?.. Bəlkə heykəli uçurdublar? – Səfalı müəllimin zəngin fantaziyası bu dəfə, nədənsə, Əli Ziyanın Domsovetin qabağındakı o heykəlindən o yana getmədi.

– Yox, Şaumyan ordadı hələ. Yerindədi. Ancaq, deyirlər, dünən aparıb bir yeko it bağlayıblar ora. Pamyatnikin pryamo ayağına. Ax, svoloçi, kakiye eti svoloçi naşi yerevanskiye natsionalistı! Oni, oni vo vsem vinovatı...

– Onu demirəm, Lora. O biri heykəli deyirəm: Domsavetin yanındakını. – Nədənsə, Səfalı müəllim telefonda rəhbərin adını çəkmək istəmirdi.

Və yəqin buna görə Lora arvad onun sualına səhih cavab verə bilmədi.

– Hansı? Yox... Bilmirəm. Eşitməmişəm... Heykəl-pamyatnik k çyortu, Safalı, jivıx lyudey jalko.

– Eto verno. No Lora ne nado nervniçat. Hər şey yaxşı olacaq, qorxmayın... – Səfalı müəllim səmimi inamla dedi. – A etot, kak yeqo... arvadın da gətirib?

– Yox. Görməmişəm. Deyəsən gətirməyib.

Səfalı müəllim hələ telefonun dəstəyini yerinə asmamış, ürəyində qəti qərar çıxartdı ki, yaxın vaxtlarda Zuğulbadan heç yana getməyəcək və yenə, azı bir həftə, hətta şəhərə zəng-zad da eləməyəcək, çünki Taryelin Bakıda peyda olmağı bir yana dursun, Loranın səsindəki o ah-nalədə də Səfalı müəllimi Bakıya çəkəsi heç bir maqnit-filan yox idi.

Ancaq bundan üç-dörd gün keçəndən sonra Zuğulbada bərk xəzri qalxdı. Buludu, tozu, dənizi, ağac-budağı beşcə dəqiqənin içində bir-birinə qatıb-qarışdırdı. Və elə o beşcə dəqiqənin içində – Səfalı müəllimin də tarazlığı pozuldu, əhvalı yaman qarışdı; o küləkdə, tufanda Səfalı müəllim özünü güc-bəla avtomat telefona yetirib, əlləri əsə-əsə Lora arvadın nömrəsini yığdı.

– Alyo! Kto eta?.. Qavari da, çevo malçiş!

Səs kişi səsiydi, arvad səsi deyildi. Və demək olmaz ki, bu səs Səfalı müəllim üçün Lora arvadın səsindən çox yad idi, ancaq cəsarətlə demək olar ki, hər halda dünyanın ən doğma səsi də deyildi: *TARYEL!..*

Səfalı müəllim dəstəyi asdı. Ancaq ağlına heç bir pis fikir gətirmədi. Düşündü ki, yəqin Taryel, az bir vaxtın içində, operativcəsinə öz

işini görə bilib: Loranın dilini tapıb, qılığına girib, onun cürbəcür ləziz xörəklərinin də dadını-tamını biləndən sonra Lora arvadın yanında lövbər salıb – Səfalı müəllimin Leninqraddan qayıtmasını gözləyə-gözləyə – orada kefini çəkib, könlü istəyəndə arabir telefona da cavab verir. Hətta Səfalı müəllim bir də zəng eləsə, dəstəyi mütləq Loranın özü götürəcək. Amma Səfalı müəllim bir də zəng eləmədi. Havaya baxdı, dənizə baxdı, göydəki tozqarışıq buluda baxdı və birdən bu qərara gəldi ki, daha Zuğulbada qalmağın heç bir mənası yoxdur. Özünü otağa salıb tələm-tələsik şey-şüyünü yığışdırdı və o küləkdə-qiyamətdə birbaş avtobus dayanacağına tərəf yürüş elədi.

Səfalı müəllim evinə çox gec çatdı: saat on ikiyə qalırdı... Liftdən çıxanda əvvəl Loranın qapısının zəngini basdı. (Bilirdi ki, Lora tez yatan deyil). Lora arvaddan heç bir səs-səmir çıxmadı. Səfalı müəllim öz mənzilinin qapısını açdı və dəhlizin işığını yandıran kimi, elə oradaca – qapının ağzında donub qaldı.

Dəhlizdə – telefon aparatının yanında – bir qalaq qəzet-jurnal! Biri açıq, biri bağlı – iki konvert. Bunları bura kim gətirib qoymuşdu, axı Zuğulbaya gedəndə o, qonşuya yalnız poçt qutusunun açarını vermişdi...

Səfalı müəllim, heyrət içində, otaqları bir-bir gözdən keçirdi: heç yerdə heç bir dəyişiklik gözünə dəymədi. Bayıra çıxıb, Loranın qapısının zəngini basdı, yenə heç bir səs-səmir eşidilmədi... Səfalı müəllim qayıdıb, qəzet-jurnal qalağının üstündəki konvertlərə baxdı: bağlı konvert Leninqraddan – Rənadan gəlmişdi; açıq konvertin üstündə, bənövşəyi mürəkkəblə: "Uvajayemomu Safalı-muallimu ot Lorı" sözləri yazılmışdı, konvertin içində qoşa, kərpici dəftər vərağı görünürdü. Və Səfalı müəllim o vərağı konvertin içindən elə təzəcə çıxartmaq istəyirdi ki, kimsə bayırdan qapıya açar saldı. Qapı açıldı və Taryel içəri girdi.

– Gəlmisən, dayı? Sı piriyezdom! – Taryel dodaqlarını qabağa uzatdı, ancaq dayısının üzündən yox, başının tən ortasındakı, yumurta sarısı boyda, yeganə daz yerdən öpəsi oldu, çünki Taryel Səfalı müəllimdən çox hündür idi, bir də o, ağzını qabağa uzadanda, Səfalı müəllim lazımi çəldlik göstərib, başını aşağı əyə bilmişdi.

– Sən hardan tapmısan mənim qapımın açarını? – Qəzet-jurnalı bağrına basıb, telefonun yanında durmuş Səfalı müəllim bu sözləri elə təngiyə-təngiyə dedi ki, elə bil hər sözü deyəndə bir pudluq daş qaldırırdı.



– Qayıtdırdım da, dayı, açar qayıtdırmağa nə var? Zamoku dəyişdirmədim. Dedim, birdən gələrsən, evdə olmaram, qapıda avara qalarsan. – Taryel altdan-altdan Səfalı müəllimin üzünə baxdı və orada nə gördüsə, başını aşağı salıb, bir müddət fikirləşməli oldu. – Nədi ki, dayı? Düz hərəkət eləməmişəm? Bilirsən, qorxdum e, dayı. Ağlıma pis şey gəldi. Dedim, birdən, Allah göstərməsin, Leninqraddan qayıdıb, naxoşlayıb-eləyərsən, bilən olmaz... Ara yerdə millətimiz biyabır olar. Özün bilirsən ki, belə şey üçün bu sahat düşmənimiz milyon verər. Nədi, nədi, bir evdən iylənmiş qoca ölüsündən-zaddan tapıb, bütün dünya mətbuatında car çəksinlər ki, Azərbaycan milləti tamam qoxuyub çıxır sıradan!..

– İndi xatircəm oldun ki, ölməmişəm? – Səfalı müəllim, deyəsən, məsələni kəskin qoymağa hazırlaşırdı.

– Bə nə?.. Bilirsən, dayı, necə sevindim o gün: içəri girib, görəndə ki, sən Leninqraddasan.

Səfalı müəllim:

– Çox sağ ol, – dedi. – İndi zəhmət olmasa, o açarı qaytar ver özümə.

– Neynirsən? Səndə var da, açar! – Taryelin iri gözləri heyrətdən bərələ qalmışdı.

Dəhlizdən otağa keçib, Nuh əyyamından qalma, köhnə divanın üstündə oturdular.

– Buranı aldım da, dayı, məni təbrik eləyə bilərsən! – Taryel Lora arvadla Səfalı müəllimin mənzillərini biri-birindən ayıran şərikli divarı göstərdi. – Qonşun lap razı getdi, qorxma. Moskvaya getdi. Bir qoca bacısı var orda – həştad beş yaşında. Deyir: o da tək arvaddı, bir yerdə, deyir, yaxşı olacaq bizim üçün. Biletin-zadın da özüm təşkil elədim, bu sahat Moskvaya üç yüz manata bilet tapılmır. – Taryel pencəyinin döş cibindən bir uzunsov kağız çıxartdı. – Budu e, orderi, dayı! Bu gün RİK-in sədri şəxsən öz əliynən yazıb verib. Öz adımadı. Tərlan nənəmnən De Qollun da adın bura yızdırdım ki, sora millətimizi sevməyənlər işin içindən iş çıxartmasınlar.

– Əcəb! Əcəb!.. Eşq olsun millətini sevənlərə! – Səfalı müəllim sidqi-ürəkdən dedi, ancaq məlum olmadı ki, o bu sözləri, konkret olaraq, kimin ünvanına deyir: De Qollun, Tərlan arvadın, yoxsa o orderi yazanların.

Əlindəki orderə bir müddət məhəbbətlə baxandan sonra Taryel orderi qatlayıb cibinə qoydu. Gözucu Səfalı müəllimə nəzər yetirdi və

yenə məhəbbət dolu gözlərilə, indi də qarşıdakı divara tamaşa eləməyə başladı.

– Deyirəm: bu divarı da bu günlərdə, bir sinif kimi ləğv eləyək getsin, necə deyirsən, dayı? Yaxşı olar da genişlik olar... Genişlik yaxşı şeydi, düz demirəm, dayı?

– Bəli! Bəli! Elədir ki, var! Genişlik yaxşı şeydi. Lap əla şeydi genişlik! – Deyəsən, bunu da Səfalı müəllim dedi, amma öz səsilə yox! Bu sözləri Səfalı müəllim Taryelin, Qoqanın, Tərlan arvadın, ya da (lap uzağı!) Əli Ziyanın səsilə dedi, – çünki o orderi Taryelin əlində görəndən sonra Səfalı müəllimin özü olmağı və öz səsilə danışmağı, sadəcə, mümkün olan şey deyildi və Səfalı müəllimin bu dünyada yaşadığı o yetmiş iki il də – belə şeydən sonra – heç cür insan ömrü sayıla bilməzdi.

Taryel ayağa durdu:

– Gedim sənə yemək gətirim, dayı! Hər şey var xaladelnikdə. Nə istəyirsən, gedim gətirim. – Görünür, Səfalı müəllimin genişlik barədə

– Ala, apar. Mənə lazım olmadı. Verərsən o bığlı bəylərdən birinə.

– Saqqallı bəylərə versəm olmaz? – Sən demə, Taryeldə də yumor varmış.

– Bığlıya ver! – Səfalı müəllim ciddi, amiranə səslə dedi. – Saqqallı nə qanır viski nədi? – Və Taryelin arxasınca qapını bərk-bərk bağlayandan sonra olduqca mücərrəd bir söyüş söydü: – Kirlikir!..

Səfalı müəllim qayıdıb divanda əyləşdi. Əvvəlcə Loranın məktubunu oxumaq istəyirdi, ancaq, nədənsə, onu bir tərəfə qoyub, Leninqraddan gələn bağlı konverti açdı.

Məktubu Rəna, kiçik qızının dilindən, rusca yazmışdı: "Деда, милый мой дедушка, ласточка моя незабвенная! Ты уже совсем забыл про меня, даже писем не пишешь. Ты же обещал летом приезжать к нам, а поехал в какую-то деревню. Я очень соскучилась по тебе. Мама Рена тоже очень скучает. А наш папочка недавно ездил в Лондон. Он привез тебе очень хорошую электро-

как-будто ничего не случилось. Даже улыбку подходящую себе подобрал, как американские президенты. О, ужас, Сафалы, что и говорит, так мог поступить с людьми только ставропольский мужик. А ваш племянник, дорогой Сафалы, оказался не таким уж злодеем, каким я его себе представляла. За мои две комнаты он дал мне целое состояние, целых семь тысяч денег. Эти деньги мне на всю жизнь хватит. Он и билет мне достал на самолет. Даже контейнер заказал, чтобы я могла отправить в Москву кое-что из своих вещей. Вашим племянником я осталась очень довольной, дай бог ему здоровья. А вашу почту он вам передаст. Извините, что я вас не могла дождаться. Прощщайте, дорогой, глубокоуважаемый Сафалы. Сейчас поздняя ночь, а завтра ранним утром я уезжаю. Спасибо вам за все.

*Лора, ваша соседка".*

Səfalı müəllim vərəqi cırıb tullamadı, onu soliqə ilə büküb, həmişəlik saxlamağı lazım bildi, çünki iyirmi ilin qonşuluğundan Səfalı müəllimə qalan vur-tut o ikicə kərpici dəftər vərəqiydi.

O gecə Səfalı müəllim üçün çox müsibət bir gecə oldu və ömrünün ən dəhşətli yuxusunu da Səfalı müəllim elə o gecə gördü: Ayın səthində – suyu qurumuş dəniz yatağına bənzər – qaramtıl, bozumtul çökək bir yer. Orda-burda – tozdan, qurumdan ibarət qapqara dağlar, təpələr... Və qocalmış, düşgünləşmiş, saçını-saqqalını uzadıb, keşişə-dərvişə dönmüş Nil Armstronq – həm əl arabasına, həm uşaq kolyaskasına oxşayan – Sovet "Lunaxod"unda harasa ölü daşıyırdı. Astronavt hərdən yorulub oturudu. Ayın qapqara tozuna bulaşmış nimdaş şalvar və pencəyinin hər cibindən bir şüşə "Ağdam" şərabı çıxarıb və hər şüşədən düz bir qurtum içib, təzədən işə başlayırdı, çünki suyu qurumuş dəniz yatağına oxşayan o çökəklikdə ölü çox idi, o ölülər Nil Armstronqun sanki gözünə durmuşdu və elə bil onların hamısını daşıyıb qurtarmağın onsuz da mümkün olmayacağını bildiyindən, Nil Armstronq o cür düşkün və ümidsiz görünürdü.

Belə bir müsibəti yuxuda görəndən sonra yəqin ki, hər bir adam bu dünyanın gələcəyi barədə çox bədbin fikirlərə düşə bilərdi. Ancaq (Allah ona qəni-qəni rəhmət eləsin!) Sərən arvad bu dəfə də Səfalı müəllimin yaman dadına çatdı. "Oğul, – dedi, – yuxuda uzun saç-saqqal xeyir-bərəkətdi... Olüm – rahatlıqdır, xoşbaxtlıqdır. Yuxusunda ölü görənin ömrü on il uzanır, – dedi, – oğul!" Və gecənin məchul bir vədəsi soyuq tər içində yuxudan oyanan Səfalı müəllim anasının



səsini eşidib az-maz özünə gəlsə də, o dəhşətli mənzərəni, xüsusən üstündə qapqara hərflərlə "SSSR" yazılmış – əl arabasına və uşaq kolyaskasına oxşayan – o Ayda gəzən Sovet aparatının rəmzi yozumunu da heç cür qulaqardına vura bilmədi. Kim bilir, bəlkə belə bir müsibət də bir vaxt dünyanın başına gələcəkdi: quru dəniz yatağı və saysız-hesabsız insan cəsədi!.. Səfalı müəllim buna inanmaq istəmirdi. Ancaq özünün əvvəllər də heç cür inanmaq istəmədiyi çox şeylərin sonralar həqiqətən baş verdiyini yadına saldıqca, o yuxunun qarası böyük sürətlə Səfalı müəllimin bütün əzalarına yayılmağa başlayırdı, onun əli-ayağı get-gedə yerdən-göydən tamam üzülürdü.

Dünyanın bəzi-para işlərini qabaqcadan görmək, öz-özlüyündə, bəlkə də elə bir böyük qəbahət deyildi. Ancaq baxır – harda, haçan və hansı məmləkətdə... O kolxoz hengaməsi hələ lap təzə-təzə başlayanda, o hengamənin indisini məgər Xızır kişi görmürdümü? Görürdü, lap əla görürdü. Nəyə görə Sərən arvadın Sovet hökumətinin heç bir işindən gözü su içmirdi – söz yox, ona görə ki, o da qabağı görürdü; bilirdi ki, elə dinsiz hökumətin axırı gec-tez mollaların parlaq qələbəsi ilə qurtara bilər... Amma Xızır kişiyə və Sərən arvada bu dünyada qulaq asan kim idi və Səfalı müəllimin indicə yuxuda gördüyü o müsibət kimin nə vecinəydi...

O yuxunun qara-qurasını otaqdan qovub çıxartmaq üçün Səfalı müəllim durub işığı yandırmaq istədi. Durdu, amma işığı yandırmadı; fikirləşdi ki, birdən Taryel işığı görüb gələ bilər.

Ehmalca qapını açıb balkona çıxdı. Qəribəydi: külək tamam kəsmişdi. Hava lap təzə-təzə işıqlanmaq üzrəydi. Şəhərin üstündə gecəylə gündüzün qarışığından ibarət – çənə, sisə bənzər – boz, ölü bir hava dayanmışdı.

Evi Domsovetə çox yaxın olsa da, Səfalı müəllimin balkonundan Domsovet görünmürdü. Ancaq o Domsovetin qarşısındakı böyük meydandan arabir ah kimi, nalə kimi göyə ucalan insan nəfəsini Səfalı müəllim açıq-aşkar eşidirdi. O, hələ Zuğulbaya getməmişdən, o adamlar ordaydılar; gündüzlər mitinq keçirdikləri o meydanın gecələr, mərdmərdanə, keşiyini çəkirdilər... Ürəyi azadlıq eşqilə çırpınan vətən balaları... İndi, səhərə yaxın o adamların yorğunluqdan, yuxusuzluqdan – elə bil nəinki ucadan şüar deməyə, heç astadan danışmağa da heyi qalmamışdı. Onların yalnız nəfəsi eşidilirdi. O nəfəs gecəylə gündüzün qarışığından ibarət – çənə, sisə bənzər – ölü havanı hərdən

elə bil tərpədirdi, titrədirdi, havadan vahimə iyi gəlirdi. Balkondan qayıdanda, otağın alaqaranlığında, Səfalı müəllimin gözü kitab rəfindəki o üstüşəkilli kitaba sataşdı və dayanıb şəkildəki qaraqaş, qaragöz kişiyə xeyli baxandan sonra Səfalı müəllim axırda bu qərara gəldi ki, dünyanın böyük yazıçısı Uilyam Folkner buzbulaqlı Xızır kişiyə nə qədər oxşayırsa, eynən bir o qədər də buzovnalı Əzizağa kişiyə oxşayır. Bu yerdə Səfalı müəllimin, nədənsə, söyüş söyməyi gəldi.

– Kirlikir! Kirlikir! – deyə, bu mücərrəd sözlə Səfalı müəllim bu gün ikinci dəfə ürəyinin qəzəbini birtəhər soyuda bildi. Sonra əlini uzadıb o kitabı qətiyyətlə rəfdən götürdü. Çünki indicə – lap birdənbirə Səfalı müəllim bu qərara gəlmişdi ki, haçansa Rənanın Leninqraddan gətirdiyi o kitabı, elə günü bu gün mütləq Leninqrada göndərmək lazımdır.

### *Altıncı – axırıncı fəsil*

### VASKANIN TAPILMAĞI

Ancaq o gün kitabı Leninqrada göndərmək üçün Səfalı müəllim poçta getmədi. Özü də ona görə yox ki, o kitab evdə Rənadan necə olsa bir yadigardı, xatirəydi və yaxud Səfalı müəllimin gözü o kitaba elə öyrəşmişdi ki, ondan həmişəlik ayrılmaq indi ona çətin gəlirdi... Ona görə ki, Ay və Nil Armstronq barədə o musibət yuxunu gördüyü – elə həmin gecənin səhəri – hava bir balaca işıqlanan kimi, Səfalı müəllimin ağlına birdən-birə bir təzə fikir gəlmişdi və o fikri həyata keçirməmiş, Səfalı müəllim bu dünyada heç bir iş görmək niyyətində deyildi.

... Şəhər dağılırdı. Hər yerdə tətil idi. Bakı camaatı nə ki var, Domsovetin qabağına yığılıb, orada səhərdən axşamacan mitinq keçirirdi... Domsovet Butır türməsinə oxşayırdı. Mərkəzi Komitə Ağdam bazarına, Nazirlər Soveti Şəki hamamına bənzəyirdi. Baksovet Smolnıya çevrilmişdi. Və Smolnıya çevrilmiş həmin o Baksovetinsə uzun, alaqaranlıq dəhlizlərində Səfalı müəllim neçə vaxtdan bəriydi ki, əsir-yesir idi.

Məsul yoldaşlardan biri zəngi basıb, katibəsini çağırdı.



– Priyomnuda çox adam var? – dedi.

– Yox. Elə o kişidi. O DƏLİ KİŞİ. Dördotaqlı evini birotaqlıya dəyişdirmək istəyən.

Məsul yoldaş dərindən ah çəkdi:

– Eh, dünya, dünya! – dedi. – Çarxın dönsün, a fələk! – Və yumruğunu var gücü ilə stola endirib, yanıqlı-yanıqlı əlavə elədi: – Dəli bizik, malışka, o kişi dəli deyil. Heç bilirsən nə kişidi o! Mənə institutda dərs deyib o kişi. Yaxşı ki, bilmir, indi yadından çıxmışam. Eto velikiy uçyonıy. Samorodok. Sovest natsii!.. Dördotaqlı kvartiranı birotaqlya dəyişməyə nə var. Özü də mərkəzdə, şəhərin prestijni yerində. Başqası olsa bir saata dəyişər o evi, hələ yüz min də nağd pul alıb qoyar cibinə. Ancaq o kişi, görürsən, elə eləmək istəmir. İstəyir hər şey hökumətin qanunuynan olsun. Po zakonu, po sovesti, po spravedlivosti, tı eto ponimayeş? Net, koneçno ne ponimayeş. Nu i ne nado! – Həyəcanlanmış məsul yoldaş cani-dildən alnını ovxaladı. – Sluşay, bilirsən də, bu bazar harda yığışırıq?.. Pirşağıda. Nuhbala Nuhiyeviçin daçasında. Kajetsya, ya tebe uje ob etom qovoril.

– Net. Vı mne niçeqo ne qovorili.

– Görürsən də, malışka, yavaş-yavaş skleroz oluruq bu mitinqlərin, piketlərin, zabastovkaların əlindən... Demek: özün, Seva, Roza, bir də – Aynurkaya bu sahat zəng eləyərsən, nəm-nüm eləsə, Tomanı götür. İki nəfər bəylərdən olacaq, bir nəfər də Moskvadandı. Molodoy mayor, vılitıy krasavets. Beləsini Aynurka görməyib şeç vaxt. Oranın adamıdı. Moskvadakı dənizqırağının. Ploşad Dzerjinskoqo, yasno, malışka? Rus deyil, müsəlmanın lap xalisindəndi. Adı da – TARYEL. Şota Rustaveli: "Vityaz v tiqrovoy şkure". Dərsin məktəbdə oxumusan. Test eqo oçen vliyatelnıy general... Cavan, sütül oğlandı, malışka, amma jukdu: dollara tuqrik deyir! – Məsul yoldaş əlini pencəyinin döş cibinə saldı: elə bil cibindən nəsə çıxarıb göstərmək istəyirdi. Ancaq heç nə çıxartmadı; əlini tez cibindən çəkib, məsuliyyətli başını qaşıdı.

– Tuqrik! Oy kak interesno! Vıydu, seyças je Aynurke pozvonyu. – Katibə sürətlə qapıya tərəf addımladı.

– Podojdi. – Məsul yoldaş dedi. – Ya tebya proşu, malışka, ora gələndə o finski dezodorantı sürtmə canıva. Ondan Vyetnam mazının iyi gəlir. Məndə allergiya verir o zəhrimar. – Və dayanıb, bir qədər fikirləşəndən sonra, qəmli-qüssəli bir səslə, lap astadan əlavə elədi: – O kişi

gör ordadırsa, deynən qəbul qurtarıb bu gün. Sabah gəlməz inşallah. Əgər sabah da gəlsə, deyərsən mən yoxam burda. Moskvadayam, xaricdəyəm, cəhənnəmdəyəm, bir sözlə, burda yoxam...

Ancaq Səfalı müəllim orda yox idi. Məsul yoldaşın qəbuluna düşməkdən bu gün də ümidini itirmiş Səfalı müəllim Qoburnat bağı ilə üzüaşağı yavaş-yavaş bulvara tərəf gedirdi.

Hava nə bir o qədər tutqun, nə də sən deyən açıq idi. Zavodların, fabriklərin heç biri işləmədiyinə görə, havadan dənizin duzlu suyunun turşməzə iyi gəlirdi.

Yenidənqurma əhval-ruhiyyəsi Qoburnat bağında da hər addımda hiss olunurdu. Müqəddəs azadlıq ehtiyacından və Əbdürrəhman Vəzirovu döymək arzusundan gözlərinin içi də, çölü də alışıb-yanan bir dəstə vətənpərvər qadın – yolun o tərəfi ilə növbəti piket əməliyyatı keçirmək üçün – Mərkəzi Komitənin binasına tərəf gedirdi... İyirmi beş-otuz yaş arasında, otuz-qırx nəfər – peysərini balta kəsməyən qolu-zorba cavan oğlan hədsiz sevinc və fərəh içində Qoburnat bağındakı iri-iri daş fiqurları itələyib ağzı üstə yerə yıxmaqla məşğul idi. Bağın lap aşağı tərəfində bir bölük qələm, fırça və mizrab ustası yuxarıdakı iki budağı olduqca xoşagəlməz bir şəkildə çarpazlaşıb, xaçabənzər fiqur əmələ gətirmiş dekorativ palıd ağacını Azərbaycan Yazıçılar İttifaqının Rəyasət Heyəti və Respublika Mədəniyyət Nazirliyi Kollegiyasının bu yaxınlarda qəbul elədiyi birgə qərara əsasən – dibindən kəsməyə girişmişdi.

Bulvara çıxıb, bakılıların "Venesiya" dediyi kanalın yanına çatan kimi, Səfalı müəllim xeyli rahatlanıb dərindən nəfəs aldı. Qəribə şey idi: Dənizkənarı parkda, demək olar ki, adam yox idi. "Venesiyanın" qabağındakı ağac-budaqlı xiyabanın o başında skamyada bir qoca arvad tək-tənha oturmuşdu: çorab toxuyurdumu, şəkil çəkirdimi – hər halda əli işdə idi. Səfalı müəllim o arvadın oturduğu tərəfə bir də baxdı və bir müddət gözlərinə inanmadı, çünki arvadın oturduğu o skamyanın üstündə bir pişik də oturmuşdu və o VASKAYA yaman oxşayırdı.

Birdən-birə təşvişə düşmüş Səfalı müəllim, ürəyinin döyüntüsünü aşkar eşidə-eşidə, asta-asta o skamyaya tərəf getdi və o skamyada oturan arvadı o saatca tanıdı SİMA – SƏMAYƏ!.. Allah, Allah, o Səmayə elə bil heç dəyişib eləməmişdi.

– Salam! Siz!.. – Səfalı müəllim xeyli əzab-əziyyətdən sonra birtəhər, bu ikicə sözü deyə bildi.



İşə bax Səmayə də onu tanımışdı:

– Səfalı! Oy, skolko let, skolko zim!.. Gördüz, mən Sizi nə tez tanıdım, Səfalı?!

– Əvvəlcə mən Sizi tanıdım. – Səfalı müəllim gülümsədi və gözucu pişiyə baxdı. – Sizinkidi? Nə yaxşı pişikdi. – Səfalı müəllim əlini uzadıb, pişiyin başını sığallamaq istədi: – Vaska, xoroşiy moy Vaska! – deyə o, az qala nalə çəkdi. Ancaq pişik büzüşüb, yumrulanıb, dişlərini qıcırdadıb, Səfalı müəllimə bir üz göstərdi ki, Səfalı müəllim öz əməlinə peşman oldu. Ustəlik, bütün bu nanəcib hərəkətlərindən sonra Vaska uz-gözünü turşudub, bir uzun-uzadı: – Myau! – da dedi. Yəni: rədd ol, mən səni yaxşı tanıyıram. Əgər sən pişik qədri bilən olsaydın, o vaxt məni o Zuğulba viranxanada Allahın umuduna atıb getməzdin.

– Vaska! Kak tebe ne stıdno! – Sima pişiyin əvəzinə xəcalət çəkə-çəkə acıqlı səslə dedi. Və tez də səsini yumşaldıb əlavə elədi: – Bir gör haçandan biz bir-birimizi görməmişik.

– Bir dəfə görüşmüşük. On-on beş il bundan qabaq. "Nizami" kinoteatrının qabağında – yadınızdadı? Siz onda da gərək ki, Buzovnada işləyirdiz.

– Yox, mən o vaxt Zuğulbada işləyirdim. "Minzdrav"ın sanatoriyasında.

– Hə, maraqlıdı. Demək, "Minzdrav"ın sanatoriyasında... – Səfalı müəllim qorxa-qorxa Vaskaya baxdı. – Dörd-beş il əvvəl... Hə, o illərdə mən olmamışam orda... Amma pişiyiniz, deyəsən qocadı axı.

– Hə, qocadı. Lap kaftarlayıb. – Səmayə əlini pişiyin başına çəkdi. – Başı batmış öləcək bu gün-sabah.

Vaska Səmayəyə nifrətlə baxıb, hirsli-hirsli:

– Myau! – dedi. Yəni: özün öl, mənim hələ ölmək fikrim yoxdur.

– Mən də pensiyadayam – Səfalı müəllim səsi titrəyə-titrəyə dedi.

– Övladdan-uşaqdan, nəvədən-zaddan da yəqin varınızdı. – Bunu Sima olduqca yanıqlı-yanıqlı dedi və onun o zamandan bəri sanki heç dəyişməmiş iri, mehriban gözləri bu yerdə birdən-birə elə bil yaşardı da.

Səfalı müəllim:

– Var. – dedi. – Bir qızım var, iki də nəvəm var. Ancaq mənnən olmurlar. Leninqradda olurlar.

Və o Leninqrad sözünü eşidəndə elə bil Vaskanın başına bir qazan qaynar su tökdülər. Əvvəl, Səfalı müəllimə baxa-baxa dişlərini qıcır-

dadıb, mır-mır mırıldadı. Sonra, lap özündən çıxıb, skamyanı canidildən cırmaqlamağa başladı.

Səmayə toxuduğu – corab ya nəydisə – büküb millə, yumaqla bir yerdə sumkasına qoydu.

– Mən də o vaxt oğlanları o qədər [illegible]

mənə bu qaldı axırda, – Səmayə Vaskanı göstərdi və pişiyin hirslənib, lap əndazədən çıxdığını görüb, möhkəm təəccübləndi. – Buy, buna nə oldu birdən-birə. Nu, Vaska, nu, perestan!.. Bu da bu gün özünə təzə xasiyyət tapdı deyəsən.

Vaskanın necə kinli məxluq olduğunu elə əvvəldən də bilən Səfalı müəllimə pişiyin o hərəkətlərinin səbəbi, əlbəttə, məlum idi. Buna görə də, Səfalı müəllimin Sima ilə tələm-tələsik xudahafizləşməkdən başqa əlacı qalmadı. Üreyi Vaskadan və Səmayədən heç ayrılmaq istəməsə də, Səfalı müəllimin özü o həndəvərdən bacardıqca tez uzaqlaşmağa məcbur oldu. Xiyabandan sürətlə aralandı və dənizin lap kənarı ilə, üzüaşağı, öz evinə tərəf yol başladı.

Gedə-gedə Səfalı müəllim fikirləşirdi ki, əgər bir də cavan olsaydı, Zərnigarı yox, Səmayəni alardı... Fikirləşirdi ki, nə yaxşı, inqilabi yenidənqurma hərəkatına hamı birdən qoşulmayıb, hələ adamların içində pişik saxlayanı, yun corab toxuyanı, qağayıya dən vereni və kol dalında [illegible]

Səfalı müəllim yavaş-yavaş evinə yaxınlaşdıqca Domsovetin yanındakı meydanın gurultusu get-gedə güclənirdi, gurlaşırdı. Ancaq o səs Səfalı müəllimə qətiyyən mane olmurdu. Səfalı müəllimin rahat, asudə fikirləşməyinə olsa-olsa arabir Əli Ziyanın səsi mane olurdu: sürtülmüş, zəifləşmiş – yağlı-yapışqanlı bir səs...

Və o səslə Əli Ziya o dörd misra şeri – yaxındanmı, uzaqdanmı – haradansa – yenə asta-asta, yastı-yastı Səfalı müəllimin qulağına döşəyirdi:

Dağdı, bağdı, çəməndi –
Hər şey həmən-həməndi.
Bu dünya bir Yəməndi,

## HASARIN O TAYINDA

(epiloq yerinə)

Bir vaxt dünyada özgə heç nə yox idi: bir ev vardı, bir ağaclı-budaqlı həyət vardı; dağlar idi, Günəş idi; bir mən idim, bir nənəm idi; bir də bir inəyimiz vardı ki, o da atam kimi səhər tezdən çıxıb gedərdi və axşam qaş qaralanda evimizə qayıdardı.

Qalan şeylər bizim hasardan o yanda idi. Hasardan o yanda başqa evlər vardı, başqa ağaclar vardı, başqa adamlar vardı. Yekə uşaqlar vardı: balaca uşaqları döyürdülər. Qorxulu itlər vardı: balaca uşaqları tuturdular, hasardan o yanda toy olurdu: adamlar çalırdılar, oynayırdılar. Hasardan o yanda yas olurdu: adamlar ağı deyib ağlaşırdılar...

Bir mən idim, bir nənəm idi, bir də atamla inəyimiz axşamdan-axşama evimizə qayıdırdı. Bir də "o dünya" deyilən bir yer vardı və hər cümə axşamları gecələr biz yatandan sonra mənim babam da oradan gəlirdi. Cümə axşamları nənəm evimizi tərtəmiz silib-süpürürdü. Babamdan qalan qara, yun xurcunu eşikdə çırpıb, evdəki mıxdan asırdı. Nənəm çırağımızın işığını azaldıb, atamdan xəlvət, dəhlizdə səhərəcən yana-yana qoyurdu. Bunu görəndə atam həmişə deyinirdi, çünki neft baha idi, onu rayondan gətirmək çətin idi, bir də atam o dünyaya inanmırdı və bunu, indi, siz də bilirsiniz ki, mənim atam heç Allaha da inanmırdı.

Atam balaca otağımızda öz taxta çarpayısının üstündə tək yatırdı. Biz bu yanda, böyük otaqda yatırdıq və hər cümə axşamları çıraq dəhlizdə, atamdan xəlvət, qorxa-qorxa yanırdı. Belə gecələrdə mən də qorxurdum. Babamdan qorxurdum, halbuki, nənəmin dediyinə görə, mənim babam heç qorxulu adam deyildi. O heç vaxt bir kəsi qorxutmamışdı, "bir kəsin toyuğuna kış deməmişdi"; indi də o bizi qorxutmağa gəlmirdi; evimizə baş çəkməyə gəlirdi; gəlirdi ki, görsün necə dolanırıq; neftimiz varmı, çörəyimiz varmı?.. Bundan əlavə, babam bir şeyi bilməyə gəlirdi: Allahın yolundan çıxmamışıq ki? Və atam Allahın yolundan çıxdığına görə hər dəfə namazını qurtarandan sonra nənəm üzünü göyə tutub xeyli vaxt Allaha yalvarırdı; yalvarırdı ki, atamın günahından keçsin. Nənəm mənə Qurandan sözlər öyrədirdi: bu da atamın günahını yumaq üçün idi. O sözləri deyəndən sonra mən də atam üçün Allaha yalvarırdım: – İlahi, sən adilsən, bağışla



mənim atamı. Görürsən ki, yorğundur, nadandır, buyruq quludur – bağışla, rəhmin gəlsin!

Nənəmin dediyinə görə, Allah mənim sözümü hamıdan tez eşidirdi, çünki mən balaca idim, günahsız idim, hələ çiynimdəku mələklər alnıma heç bir günah yazmamışdılar və Allah atamın günahından mütləq keçəcəkdi, çünki atam haram yemirdi, çörəyini əziyyətlə qazanırdı. Amma elə adamlar da vardı ki, Allah onları heç vaxt bağışlamayacaqdı: oğrular, əyrilər, naşükürlər, məscidin divarında pis-pis sözlər yazanlar, çeşmənin gözündə pinti paltar yuyanlar... Ancaq bütün bu adamlar o vaxt uzaqda idi, çox uzaqda – hasarın o tayında...

Hasarın o tayında məktəb deyilən yer vardı – orada tez-tez zəng çalınırdı. Hasarın o tayında dükan vardı – o dükanın qabağında adamlar neftdən ötrü savaşırdılar. Hasarın o tayında çox şeylər vardı, hamısı da – uzaqda, çox uzaqda...

Bir mən idim, bir də nənəm idi. Nə o məndən sən deyən ağıllı idi, nə mən ondan o qədər avam idim. Söhbətimiz tuturdu. Xasiyyətimiz düz gəlirdi. Gündüzlər ağacların başında sərçələr civildəşəndə, sağsağanlar qırıldaşanda onların öz aralarında danışmağına mən də inanırdım, nənəm də. Axşamlar dağların dalında gün batırdı; Günəşin haradasa yatmağa getdiyinə hər ikimiz eyni dərəcədə inanırdıq. Bizim armud ağacında yuva tikmiş sağsağanın balalarını nənəm də tanıyırdı, mən də. Axşamlar evimizə soxulan kor yarasalardan nənəm də qorxurdu, mən də qorxurdum... Bircə o yanda – hasarın o tayında nənəm böyük olurdu, nənəm təəccüblü olurdu: orada nənəm hamını tanıyırdı, mən heç kəsi tanımırdım; orada nənəm heç kəsdən qorxmurdu, mən hamıdan qorxurdum.

Bir nənəm idi, bir mən idim, bir də atamla inəyimiz hər axşam qayıdıb evimizə gəlirdi. Sərçələr, sağsağanlar öz dillərində danışırdılar. Günəş dağların dalında yatmağa gedirdi. Haradasa uzaqlarda – bizim hasarın dalında yad adamlar yaşayırdı, qorxunc itlər hürürdü. Haradasa hər gün zəng çalınırdı. Haradasa dükanın qabağında adamlar neftdən ötrü dolaşırdılar. Bizim evdə neft də vardı, çörək də vardı və bunları görmək üçün hər cümə axşamı babam "o dünyadan" gəlirdi. Hər cümə axşamı çıraq dəhlizdə qorxa-qorxa yanırdı. Babamın mıxdan asılmış qara xurcunu cümə axşamları daha qara olurdu, daha qorxunc olurdu. Bir də babamın bir qara təsbehi vardı. Nənəmin bir gümüş maqqacı vardı. Bir də, o vaxtlar Sədəf adlı bir qız vardı və o qız, hər üç-dörd gündən bir, gəlib o gümüş maqqacla nənəmin gözünün içindən tük çıxarırdı.

Nənəmin gümüş maqqacı günlərin bir günündə həyətdə, alma ağacının dibində, otun arasına düşüb itdi. Mən çox axtardım, tapa bilmədim. Sonra Sədəf bacı gəlib axtardı, o da tapmadı. Qonşumuz Şayəstə xala da bir gün gəlib almanın dibində xeyli eşələndi, yenə maqqac tapılmadı. Sonra nənəm öldü, aparıb basdırdılar. "Həmişəlik getdi, – dedilər, – daha heç vaxt gəlməyəcək". Nənəm həmişəlik getdi, ancaq babam yenə də gəlirdi. İndi bibim tez-tez bizə baş çəkirdi. Nənəmin yerinə evi süpürürdü, xurcunu silkirdi, çırağı yandırırdı. Yenə sərçələr, sağsağanlar öz dillərində danışırdılar, yenə Günəş dağların dalında yatmağa gedirdi... Sonra, bir gün Şayəstə xala bizə gəldi və onda məlum oldu ki, heç nənəm də dünyadan həmişəlik getməyib.

Şayəstə xala həyətdə divara söykənib oturmuşdu. Bibim sacda çörək bişirirdi. O yanda almanın dibində, nənəmin maqqacı itən yerdə otların üstündə bir yekə kəpənək uçurdu, mən onu tutmaq istəyirdim və birdən Şayəstə xala ucadan dilləndi:

– Ora bax, Mədinə! Ora bax! Əsmətdi, vallah, Əsmətdi!.. Tutma, oğlum, qoy uçsun, nənəndi, bala, maqqacını axtarmağa gəlib!..

Əvvəl mən qorxumdan otların arasında donub qaldım: birdən daş kimi ağırlaşdım, birdən qov kimi yüngülləşdim. Sonra başımı qaldırıb baxdım: heç nə əvvəlkinə oxşamırdı, hər şey rəngini dəyişmişdi. Nə bibim əvvəlki bibim idi, nə həyət əvvəlki həyət idi. O yanda Günəş dağların dalında yatmağa gedirdi, mən ömrümdə elə Günəş görməmişdim. Mən dünyanı heç vaxt o rəngdə görməmişdim: nə dağları, nə otları, nə ağacları...

Nənəm kəpənək idi, otların üstündə uçurdu. Uzaqda uçanda qovub almanın dibinə gətirmək istəyirdim, *deyirdim: bəlkə yadından çıxıb*, bəlkə maqqacın yerini unudub. Bəzən nənəm tək gəlmirdi, yoldaşları ilə gəlirdi, mən kəpənəklərin heç birinə əl vurmurdum; onlarla birgə maqqac axtarırdım... Biri vardı, biri yoxdu, dilbilən sərçələr, sağsağanlar vardı, danışan ulduzlar vardı... Hasarın o tayında yenə qorxunc itlər hürürdü. Yad adamlar neftdən ötrü dalaşırdılar. Yenə bizim evimizdə neft də vardı, çörək də vardı və bunları görmək üçün yenə babam *gecələr "o dünyadan" gəlirdi...*

Gecələrin birində yenə babam gəldi. Onda müharibə idi: nə atam vardı, neftimiz, nə də çörəyimiz vardı. O gecə babam gələndə mən qorxmadım, sevindim. "Baba, dedim, çörəyimiz yoxdur, çörək gətirmisənmi?" Babam əlini xurcunun içinə saldı (həmin xurcun idi.



Mıxdan asılan qara xurcun). Bir gözünə baxdı, çörək tapmadı. O biri gözünü axtardı, orada da çörək yox idi. Sonra babam xurcunu silkdi: nənəmin gümüş maqqacı yerə düşdü. Sonra xurcun bir nəhəng kor yarasa olub evdə uçmağa başladı, yarasanın hər qanadı bir xurcun tayı boyda idi...

Nənəmin günlərlə axtardığı maqqac, (nə qədər qəribə olsa da) mən bu yuxunu görəndən sonra tapıldı; maqqac doğrudan da orada idi, xurcunun içində idi. Mən maqqacı aparıb alma ağacının budaqları arasına qoydum və nənəm də yenə kəpənək olub gəldi, almanın dövrəsində uçdu. Ancaq, nədənsə, babam bu yuxudan sonra daha heç vaxt gəlmədi. Həmin yarasa gəldi – o nəhəng yarasa: xurcun kimi qara, hər qanadı bir xurcun tayı boyda...

Günlərin bir günü mən həyətimizin qapısını açıb, hasarın o tayındakı sirli aləmə ilk dəfə nənəmsiz ayaq qoydum. Ancaq çox gedə bilmədim, qaça-qaça geri qayıtdım. Qayıdıb öz həyətimizdə, öz ağaclarımızın arasında gəzə-gəzə mən ilk dəfə nənəmsiz gördüyüm evləri, adamları xəyalımda dolandırdım, ağacları bizim həyətdəki ağaclara oxşatmaq istədim, ancaq o ağaclar bizim həyətdəki ağaclara oxşamaq istəmədilər.

Günlərin başqa bir günü o yad ağaclar bizim həyətdəki ağaclara oxşadılar. Onlara baxa-baxa mən ürəklənib çeşmənin yanınacan getdim. Orada məscidin qabağına toplaşmış adamlara baxdım: adamlar yenə də yad idilər, amma əvvəlki kimi qorxulu deyildilər. Əgər Kor İslam deyilən adam orada olmasaydı, bəlkə mən lap o adamların yanına gedə bilərdim. Ancaq Kor İslam deyilən adam orada idi. Kor İslam həmişə orada olurdu; arxasını məscidin divarına söykəyib daşın üstündə otururdu.

Kor İslamın başına həmişə uşaqlar toplaşırdılar. "İslam dayı, mən kiməm?" – deyirdilər. İslam dayı o uşaqların hamısını tanıyırdı, əvvəl öz adlarını deyirdi, sonra atalarının adını söyləyirdi.

Günlərin bir günü mən də İslam dayıya yaxınlaşdım.

– *İslam dayı, mən kiməm? – dedim.*

İslam dayı təəccübləndi, hətta bir az duruxdu da. Sonra əlimi əlinə aldı. Əlini əlimə sürtdü. Barmaqlarımı saydı, dirsəyimi ovxaladı. Sonra İslam dayı kösöv kimi qara gözlərini çeşməyə zilləyib, harasa, – yalnız özünün gördüyü yerə baxdı. Yenə duruxdu, yenə təəccübləndi, çünki

onun baxdığı və yalnız korların gördüyü o yerdə də hələ mənim adım yox idi, çünki mən hələ heç kəs deyildim.

Sonra mən özüm öz adımı İslam dayıya dedim:

– Sadıq – Nəcəfin oğlu.

Sonra məscidin qabağında neçə-neçə adlar içində hər gün mənim də adım səsləndi:

– Sadıq, Nəcəfin oğlu.

Sonra:

– Sadıq – qəşəng bala!

– Sadıq – igid oğlan!

– Mənim Sadıq oğlum!

Bu isə artıq o vaxtlar idi ki, mən dükandan çay almağa gedə bilirdim, çeşmədən su gətirə bilirdim. Mən İslam dayıya çay alırdım, su gətirirdim və buna görə İslam dayı mənim adımı daha bərkdən deyirdi, daha mehriban çağırırdı...

İslam dayının həyətində bir qəşəng cövüz ağacı vardı. O həmin vaxtlar idi ki, hələ də dünyada yad adamlar vardı və yad kişilər o cövüz ağacının dibində sirli-sirli sözlər danışırdılar. Çeşmədən qayıdan qoca arvadlar vedrələri, güyümləri o ağacın dibində yerə qoyub, üzlərini göyə tutub, qəribə sözlər deyirdilər: "Kəreminə min şükür, ilahi, öz, şikəst bəndəni naümid qoymamısan". "Sən elə yetimlərin, şikəstlərin Allahısan, mənim yetimim üçün də bir ruzu qapısı aç".

Arvadlar bu qəribə sözləri ona görə deyirdilər ki, İslam dayının qoz ağacı dolu idi, doluluqdan az qala budaqları sınırdı. Elə illər də olurdu ki, ağacda cövüz olmurdu, ancaq vaxt elə o vaxt idi və yenə arvadlar cövüzün dibində qəribə sözlər deyirdilər: "Allahın da gözü yumulubdur. Kor olub, Allah da kor olub. Taxtın-tacın dağılsın, ay Allah, sən də məzlumların qənimisən..."

İslam dayının cövüz ağacının söhbəti yaz açılandan başlardı, bir də payızda, cövüzlər silkiləndə, qurtarardı. O həmin vaxtlar idi ki, İslam dayının cövüzü silkiləndə küçə adamlar dolardı – hamı töküllüşüb köməyə gələrdi. Cövüzləri hamıdan yaxşı silkən və toylarda hamıdan yaxşı oynayan uzun Kamal hüştürək çala-çala ağacın başına dırmaşardı. Cövüzün budaqları üstündə də Kamal toylardakı kimi oynayardı, atılıb-düşərdi və onun qaldırıb-saldığı ağır zolanın altından küçəyə, dolu kimi, cövüz yağardı.



Gün əyilənəcən qızlar, arvadlar həyətdən, küçədən, arxların içindən, otların arasından tələsə-tələsə cövüz yığardılar, çünki evdə də iş vardı, arvadlar çay qoymalı idilər, xörək bişirməli idilər. Gün əyiləndə arvadlar çay qoymağa, xörək bişirməyə gedərdilər və yenə o həmin vaxtlar idi ki, qaş qaralanacan, qaranlıq düşənəcən biz İslam dayıdan əl çəkməzdik:

– Mən kiməm, İslam dayı?

– Mən kiməm, İslam dayı?

Sonra mən birinci sinif şagirdi oldum. Ancaq sərçələr, sağsağanlar yenə də öz dillərində danışırdılar. Yenə Günəş dağların dalında yatmağa gedirdi və yenə dünyada sirli sözlər vardı, yad adamlar vardı.

Sonra necə oldusa, İslam dayının qulaqları da tutuldu, ancaq bizim balaca əllərimiz onun yadından çıxmadı. Biz əlimizi qabağa uzatdıq. O, əlini əlimizə sürtdü. Barmaqlarımızı saydı, dirsəklərimizi ovxaladı, kim olmadımızı həmişə bildi:

– Sadıq, Nəcəfin oğlu!..

Sonra:

– Sadıq igid oğlan!

– Sadıq mənim balam!

Sonra, cövüz ağacının dibində sirli-sirli danışan arvadlar da mənim kim olmağımı bildilər:

– Sadıq, Nəcəfin oğlu.

. . . . . . . . . . . . . . . . . . . . . . .

– Nəcəfin oğlu Sadıq dərslərindən "beş" alır.

– Nəcəfin oğlu Sadıq üzüyola uşaqdır, Allah canına dəyməsin.

– Mən qızımı Nəcəfin oğlu Sadığa verəcəyəm. Sadıq ağıllı baladır.

– Ədə, ey, Nəcəfin oğlu Sadıq, bizim itə sənmi daş atmısan?

Və sairə və ilaxır.

Bir gün dərs vaxtı məni də, beş-altı nəfər adamla birgə sinifdən çıxarıb, məktəbin eyvanına gətirdilər: biz komsomola keçmək üçün rayon mərkəzinə gedəcəkdik. Komsomola keçməyə gedənlərin içində məndən başqa üç nəfər də vardı: Azər, Rahib, bir də Salatın; bir də Mənzər adlı bir qız idi...

O gün məktəbin eyvanında bizi əsasən üst-başımıza baxmaq üçün yığmışdılar. Mənzər hamıdan qəşəng geyinmişdi, çünki onun atası

kolxoz sədri idi. Qalan uşaqların da üst-başı təmiz idi; dırnaqlarımızı da tutmuşduq, qulağımızın içini də yumuşduq; hamımızın öz ayağımıza görə pis-yaxşı ayaqqabımız da vardı. Bircə Salatının başmağı öz ayağına görə deyildi; o, yekə qaloş geymişdi – köhnə, cırıq; qaloş yuyulmuşdu, ancaq onun üstündə qartmaq bağlamış çirki tamam təmizləmək mümkün olan iş deyildi.

Salatının qaloşuna baxdılar. Salatın tutuldu, doluxsundu və elə tutuldu, elə doluxsundu ki, onu bizim sıradan çıxara bilmədilər. Biz piyada rayon mərkəzinə yola düşdük; şehli-sərinli bir payız günü idi. O şehli-sərinli payız günü Mənzər dediyim qız yolda istilənib pencəyini əynindən çıxardı və necə oldusa, mən o pencəyi əynimə geyən kimi hava dəyişdi, payızın şehi-sərini bir andaca çəkilib getdi. Soyuq dağlar, soyuq qayalar bir andaca qızdılar, isindilər; dağların, qayaların üstündəki sarı işıq da birdən qırmızıya çaldı. Niyə birdən belə oldu – bilmirəm. Bəlkə bərk üşümüşdüm. Bəlkə pencəyin astarı ipək idi, yumşaq idi və mən ömrümdə belə ipəklik, belə *yumşaqlıq* görməmişdim... Sonra mənə elə gəldi ki, Mənzərin özü də belə yumşaqdır, belə ipəkdir: əli, ayağı, hər yeri... Bu görünməmiş qız yumşaqlığı və ipəkliyi sanki o pencəkdən mənim canıma hopdu. Rayona çatanda mən pencəyi çıxarıb Mənzərə verdim, ancaq o yumşaqlığı və ipəkliyi heç vaxt canımdan çıxara bilmədim...

Rayonda Salatının qaloşuna fikir verən olmadı. Əksinə oldu – birinci onun biletini verdilər. Təkcə Rahibə bilet vermədilər, çünki Rahibin atası o vaxt türmədə idi.

Qayıdanbaş Rahib kolxozun yol üstdəki cövüz ağaclarına dırmaşdı, bağlara girib heyva yığdı, şaftalı yığdı; axı o, komsomolçu deyildi. Və məhz komsomolçu olduğumuza görə o gün biz ağzımız sulana-sulana Rahibə baxdıq, o "oğurluq" heyvadan, "oğurluq" şaftalıdan yemədik.

Qayıdanbaş Mənzər pencəyini əynindən çıxarmadı. Ancaq dağlar, qayalar yenə isti idilər. Dağların, qayaların üstündə yenə qırmızıya çalan işıq vardı, ipəklik və yumşaqlıq vardı...

Bir gecə, kino qurtarandan sonra, biz gözlədik, adamlar dağılışdı və mən Rahibin çiyninə çıxıb, Mənzərlə öz adımı çayxananın yanındakı çinarın gövdəsinə yazdım (orada belə adlar çox idi).



Bir gün Mənzərin atası o yazını gördü. Çayxananın qabağında mənə bir şillə çəkdi. Sonra qulağımdan tutub, ağacın dibinə gətirdi və mən o yazını öz əlimlə pozdum.

Bir dəfə, kinodan sonra, biz yenə qaldıq. Mən çinarın lap nazik bir budağına dırmaşdım. Ay işığı idi. Yaz idi və mən çıxan budağın başında yuva tikmiş qarğanın, yəqin ki, ətcə balaları vardı. Qarğa yuvadan çıxdı. Qarıldadı, qışqırıq saldı, qanadlarını üzümə, başıma çırpdı, ancaq mən axıracan tab gətirib, o sözləri çinarın budağına yazdım: "Sadıq+Mənzər".

Mənim budəfəki yazım yarpaqların arasında payızacan gizli qaldı. Yarpaqlar töküləndə yazı aşkara çıxdı və sədrin qorxusundan daha mən çayxananın ətrafında hərlənə bilmədim. Bir dəfə kolxoz bağında cövüz ağacında Mənzərin atasının girinə keçdim. O məni ağacdan düşürüb sürüyə-sürüyə çinarın dibinə gətirdi, oradakı adamların yanından söyə-söyə keçirdi, darta-darta idarəyə apardı və mən yalnız idarədə bildim ki, bütün bunlar o yazıya görədir!

İdarədə Mənzərin atası məni döymədi, qorxutmaq istədi, əlini telefona atıb: "Milsəner çağıraram", – dedi, ancaq "milsəner" də çağırmadı. Sonra o məni divanın üstündə oturtdu, özü də yanımda əyləşdi. Daha sədr məni nə qorxutdu, nə hədələdi; o mənimlə lap astadan danışmağa başladı, hətta bir növ yalvardı da. Dedi: "Yazmağa qızmı *qəhətdi, a bala*? Elə *biri* doxtur Əbilin qızı! Niyə kolxoz sədrinin qızını yazırsan, öz direktorunun o qəşəng qızını yazmırsan... Çayçı Qurbanın qızı indidən tutluqlarda it kimi kürsəkdədir, – dedi. – Öz gözümlə on dəfə görmüşəm. Onu yaz. Yaz deyim kişi oğlusan. Yaz, sonra get nə yığırsan yığ – o kolxoz bağları, o da sən. Heç utanmırsan camaatın içində məni rüsvay eləyirsən?! Düşmənlərimi üstümə güldürürsən?! Axı, *sənin dədən mənim dostum idi*. Elə özün də dostumsan mənim..."

Misir müəllimin qızı sənin qızından gözəl deyil, sədr, dünyada ipək kimi yumşaq dağlar var, qayalar var...

Mən kövrəlib, sədrin kabinetindən ağlaya-ağlaya çıxdım. O özü kabinetdə qaldı. Mən çıxanda bayaqkı adamlar yenə çinarın dibində idilər: doxdur Əbil, məktəb direktoru, çayçı Qurban, Misir müəllim. Hamısı da ayaq üstdə dayanıb idarə səmtə baxırdılar. Cır-cır Abbas üzünü idarəyə tərəf tutub əl-qolunu ölçə-ölçə danışırdı. O birilər qulaq asırdılar: xəlvətcə, xısın-xısın gülüşürdülər.

Bircə Aslan baba çinardan azca aralıda gözünü yerə dikib əyləşmişdi, çəliyin yerə dirəyib fırladırdı və arabir narazı halda başını yırğalayırdı. Abbas kişi coşmuşdu. Səsini başına atmışdı. Abbas kişinin belə coşmaqları çox olurdu:

– Kəndxudalar cəllad idi, hı, hı, cəllad idi! Yüzbaşılar baş kəsirdilər. Oho, qan apardı, qoymayın! Mollaları qovun, çıxarın – sizə quş başı gətirmişik – alın, ciblərinizi doldurun. Ədalət adına – zəlalət! Səadət adına – məlalət. Zindani-məşəqqət. Cövlani-rəzalət... Baxın, həzz alın, sərməst olun: saldat balalarını dövrət idarələrində döyürlər. Döyürlər tifil balaları, günahsız balaları!.. Döyün, vurun, basın, kəsin, çünki dövran sizindir, çünki mayanız zaydır, zatınız qırıqdır.

Cır-cır Abbas farsca şeir dedi:

"Xaşt kəcra çun nəhəd memar kəc,

Ta Süreyya mirəvəd divar kəc!"

– Yəni bir binanın ki, özülü əyri qoyula, o bina lap Marsa da gedib çatsa, divarı əyri qalar.

Sonra o, birdən Aslan kişinin üstünə yeridi.

– Dövlət idarələrində saldat balalarını döyürlər!

Sonra Abbas kişi üzünü dağlara çevirdi:

– Tifil balaları bir ovuc cövüz üstdə döyürlər!

Abbas kişi bu sözləri çox təkrar elədi – nə olsun ki, idarədə sədr mənə heç çırtma da vurmamışdı; Cır-cır Abbas da belə adam idi, belə olmasaydı, ona "cır-cır" deməzdilər ki...

Həmin gecə mən o yazını çinarın budağından pozmaq istədim; çıxıb budaqların arasında durdum. Düzü, qorxdum, uzağa gedə bilmədim, çünki budaq çox nazik budaq idi və aradan cəmisi bir yay, bir payız keçsə də, mənim nə çəkim əvvəlki çəki idi, nə də əvvəlki cəsarətim vardı...

Həmin axşam bütün kəndə səs yayıldı:

– Qolxoz sədri, Nəcəfin oğlu Sadığı döyüb!

Sonra çinar budağı, mənim yazım və qarğanın yuvası ilə birgə, yoxa çıxdı: budaq telefon məftillərinə toxunurmuş, – dedilər...

Sonra arvadlar çeşmənin qırağında pıçıldaşdılar:

– Nəcəfin oğlu Sadıq sədrin qızına vurulub...

Sonra:

– Nəcəfin oğlu Sadıq qızıl medal alıb.

– Nəcəfin oğlu Sadıq Bakıya gedir.

– Nəcəfin oğlu Sadıq Bakıdan gəlib.



– Ba, Sadıqdı ki bu! Gəlmisən, Sadıq? Həmişəlik gəlmisən?

Qəribə hafizəsi varmış İslam dayının – elə bil gözləri əlindədir. Elə bil qoluma nişan vurub – havaxt gəlirəm, tanıyır. O, əlimi uzun müddət əlindən buraxmır. Biz xeyli vaxt əlimizlə danışırıq. Mən əlimlə İslam dayıya cavab verirəm – deyirəm: həmişəlik gəlməmişəm.

Mən hər dəfə gələndə çeşmənin qırağında İslam dayıya bu cavabı verirəm. Ancaq İslam dayı o sualdan heç vaxt əl çəkmir. İslam dayıya elə gəlir ki, bu çeşmənin qırağında böyüyənlər bu yerlərdən həmişəlik gedə bilməzlər – haçansa qayıdıb gəlməlidirlər...

Çeşmənin qırağında bir vaxt burada böyüyənlərin söhbəti gedir:

– Muxtarın oğlu Kamalı Moskvada görən olub. Deyirlər alverdə əli bərk gətirib. Cibindən bir dəstə iyirmibeşlik çıxarıb. Bu qədər də, deyib, kassaya qoymuşam.

– Yaqubun oğlu Rahibin deyirlər, Amerika qəzetində adı çıxıb. Atomdan, deyirlər, kitab yazıb. Malades! Amma, deyir Kazımın oğlu Qafarı müəllimlikdən qovublar. Tələbələrdən, deyir, pul alırmış. Boynu sınsın, kəndin adın batırdı.

– Həsəncanın oğlu Səlman da yaman bic tərpəndi ha! Özü getdi adam oldu. Qardaşlarını da bir-bir çəkdi apardı. İndi, deyir, Sumqayıtda bəy kimi dolanırlar.

Yenə İslam dayı çeşmənin qırağında, məscidin divarına söykənib oturur. Yenə onun kösöv kimi qara gözləri çeşməyə tərəf zillənir və haradasa, hansı bir uşaqsa, yəqin ki, İslam dayının qorxusundan küçəyə çıxa bilmir.

Haradasa, hansı bir uşaqsa, yəqin ki, dərslərindən "beş" alır; bəlkə adı Sadıqdır, bəlkə – Əlidir, Əhməddir.

– Əlinin oğlu Əhməd dərslərindən "beş" alır.

– Əlinin oğlu Əhməd üzüyola uşaqdır, Allah canına dəyməsin.

– Mən qızımı Əlinin oğlu Əhmədə verəcəyəm, Əhməd ağıllı baladır...

İslam dayı məscidin divarına söykənib oturur; yalnız özünün gördüyü yerə baxır, özünün görə bildiyi şeyləri görür. Yenə axşam çağları çeşmənin qırağında uşaqlar qaçışır. Axşamçağı geyinib-kecinib o çeşmənin yanından keçən Buzbulaq qızları – gəlinləri, siz heç bilirsizmi, necə qəşəng olurlar, necə qəribə olurlar: elə bil onlar da harasa, yalnız özlərinin görə bildikləri yerə baxırlar.

İslam dayı gözünü çeşməyə tərəf zilləyib durur. Doğrudanmı, o heç nə görmür? Görəsən, mümkündürmü insan olsun, heç nə görməsin?

Kim bilir, bəlkə İslam dayı görür. İslam dayının baxdığı o yerdə, bəlkə, sərçələr, sağsağanlar hələ də öz dillərində danışırlar, orada Günəş bəlkə hələ də dağların dalında yatmağa gedir... Bəlkə orda gündüzdür. Axşamçağıdır və otların üstündə bir kəpənək uçur, kəpənək maqqac axtarır... Bəlkə, axşamdır, cümə axşamıdır və haradasa qorxa-qorxa bir çıraq yanır. Çıraq "o dünyadan" gələnlərin yolunu gözləyir?.. Kim bilir, İslam dayının baxdığı o yerdə bəlkə heç nə yoxdur – bir qara zülmətdən savayı.

Ancaq İslam dayı baxır, ola bilməz ki, insan olsun, heç nə görməsin. Ola bilməz ki, o çıraq həmişəlik sönsün, mənə elə gəlir ki, ola bilməz!.. Və hərdən mənə də elə gəlir ki, bu çeşmənin qırağında böyüyənlər buradan həmişəlik gedə bilməzlər, bir vaxt mütləq qayıdacaqlar...





# KİÇİK QARDAŞ

## I

Yəqin, Samurun bəxti orda gətirməmişdi ki, qardaşı Haşım ondan böyük idi, çox böyük idi. Samur məktəbə gedəndə Haşım o məktəbin direktoru idi. Haşım o məktəbdə Samura beş-altı il dərs demişdi: evdə dərs, çöldə dərs... Üstəlik, Haşımın beyninə möhkəm yerləşmişdi ki, Samur oxuyan deyil. Haşım qət eləmişdi ki, məhz onun direktor olmağının sayəsində o məktəbdə müəllimlər Samura yaxşı qiymətlər yazırlar, amma, əslində, belə deyildi. Bunu onların anası Şövkət arvad hamıdan yaxşı bilirdi. Şövkət arvadın sağlığında, Haşım hər dəfə Samuru danlayanda, evdə bu barədə mütləq söhbət olurdu. Ana Samurun tərəfini saxlayırdı. Böyük oğluna: "Samur səndən ağıllıdır – deyirdi. – Bunun ürəyi səninkindən safdır"...

Şövkət arvad rəhmətə gedəndən sonra da qardaşlar iki il bir yerdə yaşadılar. Onda Haşım məktəb direktoru deyildi, kənd kosetinin sədri idi. Onda Samur da uşaq deyildi, yekə oğlan idi, səkkizinci sinfə keçmişdi. Qardaşı məktəbin direktoru olmasa da, yenə Samur əvvəlki qiymətlərini alırdı, amma Haşım Samuru yenə danlayırdı, indi daha tez-tez danlayırdı... Görünür, Samurun bəxti bir də orda gətirməmişdi ki, qardaşı Haşımın övladı olmurdu və onun arvadı Nübar cavan idi, çox cavan idi...

Bir axşam, çaydan-çörəkdən sonra, Haşım ayrılmaq söhbəti saldı. Dedi: ev sənin, eşik sənin, mən sabah Nubargilə köçürəm... Dedi: hələ ki, evlənməmisən, arvadım paltarını da yuyacaq, xörəyini də bişirəcək... Dedi: qurtardıq, daha mən sənə heç bir öyüd-nəsihət verməyəcəyəm, kefin necə istəyir elə də yaşa... Dedi: Hələ ki, əlin bir yerə çatmayıb, mən sənə həm qardaşam, həm atayam... Çörəyini də verəcəyəm, dedi, paltarını da alacağam... Papiros çəkirsən, dedi, bilirəm, ancaq onu bil ki, mən sənin papirosuna pul verməyə borclu deyiləm. Bir də onu bil ki, səndən adam olmayacaq, səndən heç vaxt adam olmayacaq, – dedi...

Onlar bu söhbəti eləyəndə qış idi. Bayırda şaxta vardı, qar vardı. Və bu söhbətdən sonra o qarlı-şaxtalı gecədə Samur çıxıb həyətdə oturub uzun müddət fikirləşdi ki, görən qardaşı ondan ayrılmağa niyə birdən-

birə belə tələsir? Görən qışın bu soyuq vaxtında, bu qarda-qırğında Haşım niyə köçüb gedir, heç olmasa yazın açılmağını niyə gözləmir?.. O gün o həyətdə, o qarlı-şaxtalı gecədə Samur fkirləşdi ki, bəlkə onun özü bu evdən çıxıb getsin – elə bu saat, bu dəqiqə çıxıb getsin. Samur hara gedəcəyini də fikirləşdi, necə gedəcəyini də fikirləşdi. O, bircə Haşımın bu tələsik köçhaköçünün səbəbini ağlına gətirə bilmədi. Bu səbəbi Samur bəlkə heç vaxt ağlına gətirməyəcəkdi, bunu Samura dedilər, buna Samuru inandırdılar. Dedilər ki, qardaşın Nubarı qısqanır sənə. Haşım xəbisdi, dedilər, qəlbiqaradır. Və Nubar Samur üçün xörək bişirməyə gələndə, paltar yumağa gələndə Haşımın da hər dəfə onun dalınca düşüb bu evə gəlməyinin səbəbini kiçik qardaş yalnız bundan sonra başa düşdü. Samur bu barədə Haşıma heç nə demədi, çünki o hirsi, o hiddəti ifadə eləmək üçün söz az idi, söz heç nə idi, əgər ixtiyar özündə olsaydı, buna görə Samur Haşımı öldürərdi...

Bir dəfə, bircə dəfə onlar toqquşmaq dərəcəsinə gəldilər: Nubar evi yığışdırırdı. Haşım eyvanın məhəccərinə söykənib dayanmışdı, Samur yolun qarını kürəyirdi və Haşımın acığına qəsdən hüştürək çalırdı. Samur ona görə hüştürək çalırdı ki, Haşım hirslənsin, bir söz desin, ancaq böyük qardaş nə hirslənirdi, nə də bir söz deyirdi, məhəccərə söykənib lal-dinməz dayanmışdı və aşağıda cani-dildən hüştürək çalan Samur Haşımı o eyvandan götürüb kəlləsi üstə aşağı tullamağı, bir Allah bilir ki, nə qədər və necə arzu eləyirdi. Samur hüştürək çalırdı, qar kürəyirdi və eyni vaxtda da xəyalında qardaşını o eyvandan götürüb dalbadal yerə çırpırdı; Samurun xəyalında Haşımın başı əzilirdi, qolu-qıçı qırılırdı; Haşım it kimi zingildəyirdi və bu xəyali zingiltiyə qulaq asmaq Samura ləzzət verirdi... Böyük qardaşı olan yerdə o, ömründə hüştürək çalmamışdı. O heç vaxt Haşımın yanında papiros çəkməmişdi. O gün ilk dəfə Samur, qarı kürəyib qurtarandan sonra, gəlib eyvanda, qardaşının lap böyründəcə məhəccərə söykənib papiros yandırdı. O papirosun tüstüsü Haşımın nəfəsinə dəydi, Haşım öskürdü, ancaq yenə dinmədi, Samura heç nə demədi – ya qardaşının niyyətini başa düşmüşdü, ya da o gecə dediyi sözün üstündə Haşım axıracan möhkəm durmaq fikrində idi: "Qurtardıq, daha mən sənə heç bir öyüd-nəsihət verməyəcəyəm..." Nubar ev-eşiyi silib-süpürüb sahmana salandan sonra o gün də onlar həmişəki kimi dinməz-söyləməz çıxıb getdilər. O gün Samur hirsindən nə gündüz soba qaladı, nə axşam



çıraq yandırdı; səhərisi Nubarı küçədə yaxalayıb dedi ki, bundan sonra onun evinə onlar bir də gəlməsinlər, ancaq elə həmin günün axşamı evə qayıdanda Samur Haşımı eyvanda gördü; Haşım orda hirsli-hirsli var-gəl eləyirdi: – Burda mənim ata-anamın ruhu var, – deyirdi. – Sən bunu bilməlisən. Nə qədər ki, mən sağam, gərək bu evdə çıraq yansın, qazan qaynasın. Gərək burda hər şey yerində olsun, çünki bir övlad kimi bu, mənim borcumdur... Bir də mən ölüm qabağında o arvada söz vermişəm. Demişəm ki, əlin çörəyə çatanacan baxacam sənə, səni acsusuz qoymayacağam. Az qalıb, məktəbi qurtararsan, baxarıq. Kişi olsan, gərək özün özünü dolandırasan...

Sözünü deyib qurtarandan sonra da Haşım o axşam o eyvanda bir müddət var-gəl elədi, ancaq o axşam Samur qardaşına heç nə demədi, çünki daha söz deməyə Samurun heç bir həvəsi yox idi, çünki Samurda ogünkü hirsdən, ogünkü hiddətdən heç bir əsər-əlamət də qalmamışdı; elə bil Samur haçansa Haşımı bir dəfə doğrudan da bu eyvandan aşağı tullamışdı və indi bunu bir də eləməyə onun nə istəyi, nə ehtiyacı vardı...

Haşım köçüb gedəndən sonra Samur təklikdə-tənhalıqda, xüsusən gecə vaxtları, hərdən darıxırdı, sıxılırdı. Hərdən yatdığı yerdə Samuru qara basırdı və bunun dərdindən Samur çox vaxt çırağı səhərəcən yana-yana qoyurdu. Heç onu qara basmayanda da, gecələr çıraq işığında bəzən otağın hər yerində Samur anasının gözlərini görürdü: bir cüt göz eyni vaxtda min yerdən mehribanca Samurun üzünə baxırdı və onda Samur yorğanı başına çəkib, için-için ağlayırdı. Belə vaxtlarda, yalnız belə vaxtlarda hərdən Haşım da onun nəzərində birdənbirə doğmalaşırdı, əzizləşirdi; anasının gözlərinə baxa-baxa Samur hərdən Haşımın da gözlərini görürdü; Haşımın gözləri hərdən anasının gözlərinə yaman oxşayırdı – belə vaxtlarda Samurun Haşıma bərk yazığı gəlirdi və onda Samur, anasını unudub, Haşımı haçansa eyvandan başıüstə yerə salmağına ağlayırdı... Amma bütün bunlar yaxşı ki, yalnız gecədən-gecəyə baş verirdi. O, gündüzlər yenə azad olurdu, xoşbəxt olurdu və papirosunu damağına qoyub, hüştürək çala-çala məktəbə gedəndə Samur bu azadlığı – xoşbəxtliyi kənddə yol boyu nümayiş etdirirdi.

## II

Haşım sözünün üstündə axıracan möhkəm durdu. Hətta Samur məktəbi qurtarıb, instituta girmək üçün Bakıya gedəndə də böyük qardaş Samura heç bir öyüd-nəsihət vermədi. O, Samurun cibinə bolluca pul qoyub:

– Get, – dedi, – get baxtını sına, amma mən heç inanmıram ki, sən o instituta girə biləsən.

Ancaq instituta girmək, sən demə, ondan-bundan arayış almaqdan, gedib yayın istisində rayon mərkəzində şəkil çəkdirməkdən, məktəbin, bir ayağı kənddə, bir ayağı Bakıda alış-verişdə olan, direktorunu tapıb, attestata qol qoydurmaqdan qat-qat asan imiş. Samur nə imtahan verəndə bir damcı təlaş keçirdi, nə də qəbul kağızını alıb cibinə qoyanda zərrəcə sevinə bildi. O kağız cibində, Samur institutdan birbaş bazara yollandı, çünki Samurun bu şəhərdə tanıdığı yeganə adam (məktəbi Samurdan bir il qabaq qurtarıb, indi Bakı bazarlarından birində alver eləyən Ələkbər) o bazarda idi; onlar o bazarda, Samurun Bakıya gəldiyi birinci gündəncə tapışmışdılar, bir yerdə qalırdılar və qaldıqları evin yaxınlığındakı pivəxanada hər axşam adama bir krujka pivə içib, kəndqaydası saat doqquzda-onda gedib yıxılıb yatırdılar. O gün Ələkbər bazarda Samurun qəbul kağızına çox baxdı; axşamüstü həmin o pivəxanada da, Samur Ələkbərin təkidi ilə o kağızı bir neçə dəfə cibindən çıxarmalı oldu. Samurun qəbul kağızına Ələkbər işıqda, qaranlıqda, bu üzdən, o üzdən – hər tərəfdən dönə-dönə baxdı. O kağız elə bil qəbul kağızı deyildi, pul idi və Ələkbər o pulun qəlp olub-olmadığını yoxlayırdı...

Üç-dörd gün də Ələkbərin yanında yaşayandan sonra Samur instituta gedib, yataqxanada qalmaq üçün yer istədi, kağız istədi və o kağızı da Samura asanca yazıb verdilər. Həmin kağızla Samur yataqxanada asanca da yer alacağını zənn eləyirdi, bunun ayrı cür ola biləcəyi Samurun heç ağlına da gəlmirdi, ancaq yataqxananın komendantı Samuru başqa bir kağız dalınca yolladı – hamam kağızı, sanitar kağızı – guya bunsuz mümkün deyildi. O kağızın verildiyi yeri axtarıb tapanacan Samur, günortanın dəhşətli istisində, şəhəri ayaqdan saldı. O kağızın verildiyi yeri Samur axır ki, axtarıb tapa bildi, ancaq oradan kağız almaq Samurun işi deyildi, görünür, o yataqxanada yaşamaq Samurun alnına yazılmamışdı.



Bir yanıq iyi verən sarımtıl binanın qabağında insan qarışqa kimi qaynaşırdı. Bir tərəfdə qızlar cərgəyə düzülmüşdü, bir tərəfdə oğlanlar növbəyə dayanmışdı, həm də, işin tərsliyindən, Samur ora çatanda o hamama, hələlik, yalnız "fezo" uşaqlarını buraxırdılar və təkcə "fezo" uşaqlarının o hamamda çimib-çıxmağından ötrü, Samurun, təsəvvürüncə, bəlkə bir il vaxt keçməli idi.

Samur soruşub öyrəndi ki, belə hamamın biri də dəmiryol vağzalındadır və bir azdan oradakı hamamın qabağında da Samur təxminən eyni mənzərəni gördü; onda Samurun ağlına gəldi ki, qayıdıb, komendanta pul verib canını bu müsibətdən qurtarsın, çünki bayaq yataqxanada yer almağa gedəndə o, kiminsə komendanta xəlvətcə pul verib içəri keçdiyini görmüşdü. Onda komendanta pul verməyə Samurun cəsarəti çatmamışdı, ancaq neyləmək olardı, ayrı əlac yox idi, – Samur hardan biləydi ki, o "fezo" uşaqlarının o hamamdan çimib-çıxmağından ötrü bir il lazım deyil, cəmisi bir saat vaxt lazımdır və indi o, təzədən yataqxanaya qayıdıb komendanta pul verməyə gedəndə, o uşaqlar artıq çimmişdilər də, çıxmışdılar da və bu saat cərgəyə düzülüb, təmizlik-sağlamlıq haqqında mahnı oxuya-oxuya öz yataqxanalarına gedirdilər... Komendantın, sirimsəmiş çay daşına oxşayan sərt və kosa sifəti vardı, gözləri xırdaca, yupyumru gözmuncuğuna oxşayırdı və vurtut gözmuncuğu boyda olan bu iki bapbalaca insan gözündə birdənbirə üzə çıxmış əclaflığa-əzazilliyə Samur böyük təəccüblə baxırdı:

– Ə, sən bayaq o oğlandan pul almadın?

– Çıx bayıra, zırrama oğlu zırrama. Səni bu saat şil-küt eləyərəm!..

Bu çığır-bağırdan sonra Samur vağzaldakı hamama bir də qayıtmalı oldu və axşamtərəfi, saat ona az-maz işləyəndə Samur o hamamın qapısından içəri girə bildi.

O, bir uzun dəhliz gördü, orada, maykası-trusiki əlində, bir hisli bacanın qabağında dal-dala düzülmüş xeyli çılpaq adam gördü – bu adamların mayka-trusikini haradasa bacanın o biri tərəfində deyəsən dərmanlayırdılar, ya da oda tutub qarsıdırdılar – paltar yanığının dərmanqarışıq iyi gəlirdi; haradasa bir arvad hirsli-hirsli deyinirdi, yəqin ki, kiminsə kirli maykasını söyürdü, kiminsə cırıq trusikini lənətləyirdi, çünki o arvadın səsi o dərman iyli bacanın dalından gəlirdi və bütün mayka-trusikləri dərmanlayan da yəqin ki, o arvad idi. O arvad orda qışqırırdı, bu yanda bacanın başına doluşanlar gülürdülər, o arva-

dın səsini yamsılayırdılar – arvad hirslənib daha ucadan qışqırırdı və Samurun təsəvvüründə o arvad bacanın dalındaca yavaş-yavaş Buzbulaq məktəbinin süpürgəçisi Zərövşənə çevrilirdi, çünki göz açıb o məktəbi görəndən bəri Samur o Zərövşəni də həmişə, uşaqlar gülüşəndə, hirslənən görmüşdü. Fərq bircə burasındaydı ki, bu uşaqlar yekəydilər, üstəlik, bu uşaqlar lüt idilər, hamısı lüt idilər və buradakı Zərövşənin halı daha pis olmalıydı, çünki ona lüt adamlar gülürdülər... Lüt adamlar mayka-trusiklərini bir bacadan təhvil verib, o biri bacadan təhvil alırdılar. Lüt adamlar haradasa suyu şappıldada-şappıldada çimirdilər. Lüt adamlar sevinirdilər və Samur bu sevincdən heç nə anlaya bilmirdi. Samur bu adamların qabağında soyunmaq istəmirdi, o bacanın qabağında dayanmaq istəmirdi, o, buradan mümkün qədər tez qaçıb-qurtarmaq istəyirdi, ancaq qaçmırdı, dayanmışdı, elə bil tilsimə düşmüşdü və bu tilsimli, bu qəribə halında Samur yenə o məktəbi görürdü; dəhlizin divarı dalında suyu şappıldada-şappıldada çimənlər o məktəbin uşaqları idilər – səs onların səsi idi – o divarın dalında çığırışanları, o suyu şappıldadanları Samur görmürdü və Samura elə gəlirdi ki, haradasa indicə zəng çalınıb, tənəffüs indicə başlanıb...Samura elə gəlirdi ki, hardasa isti yağış yağır.

Samur o hamamdan çıxanda hava nisbətən sərinləşmişdi, şəhər nisbətən sakit idi, amma o yağış hardasa hələ də yağırdı. O yağışın ölü şırıltısını indi Samur elə bil yuxuda eşidirdi. O yuxuda Samur bir də komendantın səsini eşidirdi və o səs də indi ölü idi – Samuru nə qorxudurdu, nə hürküdürdü – onun canındakı küt ağrını bir azca sızıldadıb ötüşürdü, – əriyib, o yağışın ölü şırıltısına qarışırdı. Bu da belə bir yuxu idi...

Şəhərin harasında olduğunu Samur bilmirdi. Axşamın hansı vədəsi idi – Samurun xəbəri yox idi. Samur bircə onu bilirdi ki, Ələkbərlə pivə içdikləri vaxtdan çox keçib. Bilirdi ki, Ələkbər yatıb, çoxdan yatıb. Ələkbərin yanına daha qayıtmayacağını da bəlkə Samur bilirdi. Ancaq Samurun vağzal tərəfdəki pivə köşkündən, onun yerindən-yurdundan xəbəri yox idi və ora Samur necə gedib çıxmışdı – bunu bir Allah bilirdi...

Gecənin naməlum bir vədəsində, o pivə köşkünün qabağında Samur elə bil yuxudan ayıldı. O yağış da orda kəsdi – ölü yağış, ölü yağış şırıltısı... Və gecənin o naməlum vədəsində o pivə köşkünün qabağında Samur birdən özünə gəlib, qabağındakı pivə şüşələrinə bir müddət heyrətlə tamaşa elədi: beş şüşə pivə idi, biri boş idi, dördü dolu idi və bu qədər pivəni Samur heç vaxt bir oturuma içməmişdi. Və pivə deyilən şey Samura heç vaxt bu qədər ləzzət verməmişdi. Ağzında – içdiyi pivənin dadı, ürəyində – dolu şüşələrin sevinci... O hamamdan, komendantdan, o ölü yağışdan sonra hələ göydə o Ay nə idi – Allah bilirdi və o yanda Ayın işığında qara relslər vağzal boyu yatışmışdılar... Pivə satan öz ağappaq maykasında eşikdə, kətil üstdə oturub çay içirdi: nə yaxşı ki, pivə satanın maykası ağ idi və nə yaxşı ki, Samur o hamamda soyunmamışdı, çimməmişdi... nə yaxşı ki, bu pivə köşkündə Samurdan, dükançıdan və dəmiryolçu paltarı geymiş iki nəfərdən savayı ayrı adam yox idi və nə yaxşı ki, o iki nəfər yavaş danışırdı, ucadan bağırmırdı... Nə yaxşı ki, Samur o pivədən beş şüşə almışdı, az almamışdı...

Göyün bir tərəfi ağ idi – Ayın rəngində idi. Vağzalın bir tərəfi boş idi – o boşluqda qara relslər baş-başa verib yatışmışdılar. Qara relslər Ay işığında işara-işara dincəlirdi. Gün ərzində günəşin istisindən və adamların tapdağından cana doymuş yollar da dincəlirdi – yollar boş idi. Vağzalın yan-yörəsindəki dükanların da hamısı bağlı idi. Gecənin o naməlum vədəsində, elə bil özündən də xəbərsiz, gedib üstünə çıxdığı o pivə köşkünün dəmiryolçu paltarı geymiş o iki nəfərə görə açıq olduğunu Samur bilmirdi. Ancaq o bilirdi ki, gecdir. Bilirdi ki, şəhər yatır. Və gecənin belə bir vədəsində gözdən-könüldən uzaq bir pivə köşkünün qabağında beş şüşə pivəni yan-yana düzüb, qorxusuz-hürküsüz dayanmağı Samura hər şeydən çox ləzzət verirdi, çünki belə şey heç bir buzbulaqlının işi deyildi, çünki burda çoxdan bəri alver eləyən Ələkbərin özü də, gecə vaxtı, qaldığı məhəllədən bir addım o yana keçə bilmirdi. Və o Ələkbər pivəni də yəqin ki, qorxusundan bir parç alırdı, çünki bura Bakı idi və bütün buzbulaqlıların fikrincə, Bakıda ehtiyatlı olmaq lazım idi...

Amma Samur qorxmurdu, qətiyyən qorxmurdu. Sərinləyə-sərinləyə, dincələ-dincələ həmin o buzbulaqlıların gözü ilə Samur hərdən öz-özünə də uzaqdan-uzağa nəzər salırdı və bəlkə ömründə birinci dəfəydi ki, o özünü belə güclü görürdü, belə sərbəst görürdü... Amma yox, birinci dəfə deyildi: bir gecə Buzbulaq çayının dəhnədən, dəyirman arxından da bir xeyli o yanında, çayın bir sıldırım qayadan

şırhaşır töküldüyü yerdə, Ay işığında tək-tənha çimən də o idi, Samur idi...

Onda Samur səkkizdə oxuyurdu, Ələkbər doqquzuncu sinifdə idi. Və o Ələkbər indi yəqin ki, yeddi yuxunun içindəydi və Ələkbərin yatdığı otaq isti idi, yaman isti idi...Vağzalın o tərəfi də möhkəm isti olmalı idi, çünki orda qatarlar dayanmışdı, orda gur işıq yanırdı. Samur o səmtə baxmaq istəmirdi, göyə baxırdı, Aya baxırdı, ayın-göyün ağlığına baxırdı, çünki o ağlıqda bir az sərinlik də vardı...

O ağlıqda bir qəribə aydınlıq da vardı. Və öz beş şüşə pivəsinin hələ bircəsini içib, dünyaya heyran-heyran tamaşa eləyəndə Samurun şüurunda da bir qəribə aydınlıq vardı. Elə bil haçansa itmiş Samur gecənin o naməlum vədəsində o pivə köşkünün qabağında birdən-birə təzədən tapılmışdı. O, bu böyük şəhərə niyə gəldiyini unutmuşdu, gecəni harda yatacağını bilmirdi... Samur idi, bir xəlvət pivə köşkü idi, bir də göyün tən ortasında dayanmış o Ay idi ki, o gecə yer üzündə Samurun ondan tanış, ondan yaxın heç kəsi, heç nəyi yox idi. Bir də hardasa Buzbulaq deyilən bir yer vardı, orada da Ay çıxmışdı və o Ayın süd kimi işığı nə ki var, Buzbulağın torpaq damlarının üstündə idi. Yumşaq, yastı, hamar damlar Ay işığında ağappaq ağarırdı. Və nə yaxşı ki, pivə satanın maykası da ağ idi, təmiz idi. Və nə yaxşı ki, Samur o hamamda soyunmamışdı, çimməmişdi...

Göyün tən ortasında dayanmış Ayın dövrəsində ağ buluddan bir müxtəsər rəng var idi, haşiyə var idi; və o buluda baxıb sərinləyə-sərinləyə, hardasa Ay işığında bir ağ yuxu içində şirin-şirin yatan Buzbulağa tamaşa elədikcə, Bakıda Ələkbərin qaldığı otaq Samura xalis cəhənnəm kimi görünürdü. Samur o otağı yadına salmaq istəmirdi. Ordakı döşəkağıların üstündə quruyub qat bağlamış qırmızı taxtabiti qanı hər yadına düşdukcə Samurun əti çimçəşirdi, ürəyi bulanırdı. Bir də o komendant yada düşəndən-düşənə Samur buna oxşar hiss keçirirdi...

O komendantı Samur bir də heç vaxt görməyəcəkdi, – buna söz ola bilməzdi. Ancaq Ələkbəri görəcəkdi, mütləq görəcəkdi. Ya bir-iki aydan, ya da lap bir-iki həftədən sonra Ələkbər pullu oğlan olduğuna görə Buzbulağın küçələrində tamam başqa cür gəzəcəkdi və Buzbulağın ərlik qızları Ələkbərə tamam başqa cür baxacaqdılar. Və bir gecə Buzbulaq qocalarından biri o qızlardan birinin evində əyləşib çay



içə-içə Ələkbəri tərifləyəcəkdi: işbiləndi, diribaşdı, ruzuludu... – deyəcəkdi. – Şəhər görüb, dünya görüb, hər uşaq-muşağa tay deyil... – Qoca cavabını alıb gedəcəkdi və Buzbulaqda bir qız o gecə sevincindən səhərəcən yatmayacaqdı. Və dünyanın işinə bax: gecənin bu cəhənnəm istisində, bir kirli yorğan-döşəyin içində bu saat tər töküb iylənə-iylənə yatan Ələkbərə görə yuxusuz qaldığını o qız heç vaxt bilməyəcəkdi...

Bakıda olduğu dörd-beş həftə ərzində o gecə birinci gecəydi ki, Samur tam sərbəst idi, rahat idi; pivəni tələsmədən içirdi, çünki pivə içə-içə söhbət eləyən dəmiryolçü paltarı geymiş o iki nəfər də tələsmirdi; pivə satanın özü də tələsmirdi: öz ağappaq maykasında o, bir alçaq kətil üstündə oturub, armudu stəkanda qurtum-qurtum çay içirdi... Və görən bu nə sirr idi ki, o gecə vağzal yanındakı pivə köşkündə o pivəni içdikcə Samur nə ağırlaşırdı, nə sərxoş olurdu, əksinə ayılırdı, yüngülləşirdi. O gecə birinci dəfə idi ki, Samur Buzbulağı bütöv görürdü, nə ki var görürdü: hündür ağaclarını da, alçaq kollarını da... Daşını-qayasını, çayını-çeşməsini... Ağacların başındakı Ay işığını, ağacların dibindəki qaranlığı... Kimin hansı damda, kimin hansı eyvanda, kimin hansı ağacın dibində yatdığını Samur görürdü. Yayın bu vaxtında Buzbulaqda örtülü yerdə yatan olsa-olsa Haşım ola bilərdi və o gecə vağzal yanındakı pivə köşkünün qabağından, Haşımın bir enli çarpayıda arvadı Nubarla dal-dala necə uzandığını da Samur görürdü...

Dəmiryolçu paltarı geymiş o iki nəfərin o pivə köşkündən nə vaxt getdiyini Samur görmədi. Bir vaxt Samur gördü ki, pivə satan onun qabağındakı boş şüşələri yığışdırır. O şüşələri yığışdıra-yığışdıra o ağ maykalı kişinin mehribanca gülümsəməyini də Samur gördü və ayrı heç nə görmədi.

## III

Ertəsi gün, səhər çağı Buzbulaqdan on beş-iyirmi kilometr aralıdakı stansiyada Samur qatardan düşdü. Maşına minib Buzbulağa getməyə pulu yox idi (olan-qalan pulunu provadnikə vermişdi). İstəsəydi, üstüaçıq maşınların birində Buzbulağa pulsuz da gedə bilərdi, ancaq pulsuz olmağını heç kəsə bildirmək istəmədi. Stansiyadan paypiyada Buzbulağa yola düşdü. Kəsə yolla, kolun-kosun, daşın-çınqılın arası

ilə, gün başına döyə-döyə, bir xeyli gedəndən sonra Samur Buzbulaq kolxozunun sahəsinə yetişdi. Bağların yay meyvəsi qurtarmışdı, payız meyvəsi hələ yetişməmişdi. Buna baxmayaraq, ağacların birində Samur bir neçə ərik tapdı. Bir-iki kal alma, bir-iki kal armud, kal şaftalı... Və kolxoz bostanının hovuzunda, soyunub ləzzətlə çiməndən sonra o özünü böyürtkən kollarının ən sıx yerinə verib doyunca böyürtkən yedi. Sonra Samur arx qırağında, axar su kənarında, bir ağacın sərin kölgəsində uzanıb xeyli yatdı və axşam qaş qaralanda yuxudan ayılıb evə getdi.

...Samur Haşımla görüşmək istəmirdi. Amma Haşım Samurun qayıtdığını sən demə bilmişdi. Küçə qapısından eyvanın yanınacan uzanan enli xiyabanla o, asta-asta, sallana-sallana, boylanıb ətrafındakı ağacların budaqlarına baxa-baxa gəlirdi. Və böyük qardaş gəlib eyvana yetişənəcən Samur institut barədə Haşıma nə deyəcəyini düşünüb qət eləyə bildi.

– İşığı niyə yandırmırsan?

– Nə bilim... İndi gəlmişəm.

– Yalan demə, indi gəlməmisən. – Haşım qolundakı saata baxdı. – Çoxdan burdasan. – Və işığı yandırıb, Samurun gözünü açandan bəri bu eyvanda gördüyü, dairəvi stolun yuxarı başında əyləşdi.

– Niyə gəlmisən? Pulun qurtarıb?

– Yox, kəsildim... Pulum qurtarmayıb...

– Yaxşı. Lotuluq eləmə... Bilirəm, kəsilməmisən.

Samur qətiyyətlə:

– Kəsilmişəm! – dedi, çünki Haşımdan can qurtarmaq üçün ayrı yol yox idi. Çünki dərslərin başlanmağına hələ bir həftə qalırdı – Haşım onu Bakıya təzədən qaytara bilərdi.

Haşım bir qədər əsəbiləşdi.

– Ciddi adam olmaq istəmirsən də, zor deyil ki! İstəmirsən, vəssalam! Heyvərəlik elə bil boyuna biçilib.

Samur heç nə demədi. Bir müddət Haşım da susdu. Biri həyətə, biri tavana – hərəsi bir tərəfə baxdı. Haşım ayağa qalxdı.

– Dur gedək, çörək yeyək... Orda söhbət eləyərik.

– Mən çörək yemişəm.

– Dur, yaxşı. Naz eləmə... Nubar badımcan dolması bişirib.

– Yox, getmirəm. Çörək yemişəm.



– Harda yemisən?

Samur çaşdı, çünki onun çörək yeməyə doğrudan da iştahı yox idi və bir yerdə çörək yeməyi də Samurun yadına gəlmirdi.

– Səhər tezdən stansiyada qatardan düşmüsən. Bütün günü kolxoz massivində avaralanmısan. Nə olub axı? Azarın nədir? Bu zəhrimarı de, biz də bilək də!..

Samur susurdu. Dünəndən, srağagündən bəri bir dəfə də yadına düşməyən qəbul kağızının cibində olub-olmamağı onu birdən-birə bərk narahat eləmişdi: ya o kağız cibində ola-ola qardaşına yalan demək Samura çətin gəlirdi, ya da Samur Haşımın birdən əlini uzadıb o kağızı onun cibindən çıxaracağından qorxurdu. Hər halda o kağızı Samur çoxdan cırıb atmalı idi. Atmağı yadına gəlmirdi, əlini cibinə salmağa da qorxurdu. Beləcə axmaq və mənasız bir qorxunun içində Samur çaşıb qalmışdı.

Və Haşım nə fikirləşdisə təzədən oturdu.

– Mənə xəbər veriblər ki, sən instituta girmisən.

– Kim xəbər verib?

– Bunu sənin bilməyin yəni çox vacibdir?

Sükut. Sonra Haşım eyvanda ayaq üstdə gəzinirdi.

– Qəribə adamsan! Vallah, çox qəribə adamsan!.. Hansı məssəbə qulluq elədiyini bilmək mümkün deyil. Burdan vurub Bakıya gedirsən – orda da, o küt ağlın adi bir şeyi kəsmir: gedib julikin, alverçinin birinin yanında qalırsan. Qalmağa ayrı bir yer yox idi? Yoxsa mən sənə ev tutmağa pul verməmişdim?.. Görürsən də, belə adamsan! Qardaşlığın bir yana, bir qara qəpiklik insanlığın da yoxdur! Axı sən bilməliydin ki, sənə orda qalmaq olmaz! Axı sən bilməlisən ki, mənim də dostum var, düşmənim var. Eşidən-bilən nə deyər: kənd soveti sədrinin qardaşı gedib, alverçinin birinin qoltuğuna qısılıb. Sənin üçün ayıbdı axı.

– Qoltuğuna niyə? Mən də öz pulumu verirdim də.

– O pulu ayrı yerdə verəmməzdin?

– Harda? Mən orda kimi tanıyıram ki?

Haşım məhəccərə söykənib harasa baxmağa başladı. Haşımın üzü o tərəfə idi, ancaq Samur əlini cibinə salıb, o kağızın orda olub-olmamağını yoxlamağa yenə cəsarət eləmədi.

– Yaxşı. Bunlar öz yerində. De görüm, instituta girmisən, ya girməmisən?

sabına qalxa bilmişdi. Sonra isə başqa səslər: masabəyinin səsi, klarnet səsi, oxuyanın səsi, çongəl-bıçaq səsi... Özünün dörd-beş saatlıq toy məclisindən Kərimin yadında qalan cürbəcür qarmaqarışıq səslər idi və bu qarmaqarışıq səslərin içində az-çox aydın eşidilən də yenə Nağının səsi idi.

"Ə, sən ölmüsən ki"...

"Birin vur".

"Birin də... Qorxma, düzələcəksən".

Və o iki qədəh arağı xəlvətcə içəndən sonra bir müddət Kərim doğrudan da özünə gəldi. Elə bil bu vaxtacan onu bir qalın ip ilə Validəyə sarımışdılar. Sanki o ipi açdılar, Kərimi azad elədilər və özü ilə Validə arasında hər hansı bir məsafə olduğunu da Kərim yalnız bu vaxt duya bildi. Və bu məsafə olduğuna görə də elə bil Kərimin nəzərində dünya xeyli genişləndi. Haradasa Kərimdən ötrü qəribə bir ay çıxdı, o ayın işığında bir cüt rels par-par parıldadı. O ayın işığında bir dərə ağappaq ağardı: haçansa şəhərə gələndə bir gecə Kərim o dərənin ətəyində qatara minmişdi.

Haçansa dünyanın bir yerində Kərim bir dərə ay işığı qoyub gəlmişdi. Və görən, o ay işığı Kərimin yadına niyə məhz indi düşmüşdü?..

Və öz toyunda xəlvətcə içdiyi o arağın aləmində, oturduğu yerdəcə Kərim o dərənin ağlığına sarı neçə saat yol getmişdi. Orada Kərim təzədən qatara minmişdi, təzədən Bakıya gəlmişdi və budəfəki gəlişdə Kərim bu şəhərdə tamam ayrı bir ömür başlamaq istəmişdi. Amma başlamaq nədir, ömür, sən demə, qurtarıbmış. Bunu Kərim bu dəfə başqa pilləkənlərin üstündə – toydan, sonra – Validə ilə Nağı ilə və Nağının arvadı Tahirə ilə bu təzə mikrorayondakı beton binanın ikinci mərtəbəsinə – öz birotaqlı mənzilinə qalxanda bütün aydınlığı ilə, hiss eləmişdi. O pilləkənləri qalxanda Kərim Validəni Nağının, Tahirənin yanında qoyub, bir azdan öz evindən baş götürüb qaçacağını, əlbəttə, ağlına gətirməmişdi. Ancaq o beton binanın ikinci mərtəbəsində, o birotaqlı mənzildə Validə ilə tək qalmağın dəhşəti Kərimi, elə o "SƏADƏT SARAYI"ndaca, toy qurtarar-qurtarmaz, birdən-birə yaxalamışdı. Və sonra, vidalaşmaq məqamında Nağının – "təzə gəlinin bir stəkan çayını içək" – deyib, onunla bir azca da vaxt keçirməyə razılaşmağına Kərim bir Allah bilir ki, nə qədər sevinmişdi.



Nağı sərxoş idi. Nağı üçün vaxtı harada keçirməyin onsuz da fərqi yox idi. Kərimdən ötrü isə bu gün, səhər açılandan bəri, vaxt elə bil ölmüşdü. Bu gecə başına nəsə bir iş gələcəyi səhər açılandan bəri Kərimin ürəyinə dammışdı və Nağını evə dəvət eləyəndə də onun fikri-zikri bu gecəni birtəhər yola verib, səhəri açmaq idi, çünki Validə ilə bir damın altında tək qalmaq qorxusunun səhər açılana kimi çəkilib-gedəcəyinə Kərimin ürəyində ümid vardı. Gecə isə qurtarana heç oxşamırdı. Bu gecə elə bil ki, heç vaxt qurtarmayacaqdı.

Ayın dumduru işığında bu təzə şəhər küçəsi belə uzun, belə geniş, belə sakit və kimsəsi olmasaydı, bəlkə Kərim ayaq saxlayıb, barı bir anlığa nəfəsini dərərdi və dayanıb bircə anlığa nəfəsini dərsəydi, bəlkə ağlı da bir az yerinə gələrdi, beyni-başı azca durulardı, hara getməyi, niyə getməyi cəhənnəm, onu, durduğu yerdəcə, birdən-birə bu qədər amansızcasına tərk eləmiş real dünyanın heç olmasa belə adi bir həqiqətinisə də dərk eləyərdi ki, bu küçənin haradasa qurtarmağı var.

Bu küçə isə elə bil heç vaxt qurtarmayacaqdı, çünki Kərim real aləmdə deyildi. Və burası əgər doğrudan da beləydisə, deməli, bu küçənin heç əvvəli də yox idi. Nə əvvəli, nə axırı – bir sözlə, küçə yox idi... Küçə yox idi, amma Kərim vardı. Bu küçəsiz, bölgüsüz dünyada Kərimdən savayı bir də bir ay işığı vardı. Və Kərim də bu saat elə bil yol üstə yerimirdi, işıq üstə yeriyirdi.

Kərim arxasına baxmadan gedirdi. O binada, o toy məclisində, o enli pilləkənlərin üstündə onu birdən yaxalayan o ölümün-əzabın küt ağrısı da indi köhnəlib, bayatıyıb, tamam kirimişdi. Hər halda indi Kərim rahat idi, bayaqkından çox-çox rahat idi.

O gedirdi, ancaq ayaqları elə bil yerə dəymirdi. Hərdən Kərim ayaqlarını toy evindəki o pilləkənlərin üstünə təzədən qoyduğunu zənn eləyirdi: bir dəhşətli sızıltı o pilləkənlərdəncə elə bil yenə tok kimi Kərimin canına keçirdi; damarlarını soyudub, sümüklərini sızıldadıb ötüşürdü və ayağı altındakı asfalt yola xeyli baxandan sonra Kərim, indi o pilləkənlərin üstündə olmadığına özünü handan-hana inandıra bilirdi.

Bəli, Kərimin başına bu gün bir iş gəlməli idi; bunu Kərim səhər tezdən, yuxudan ayılan kimi hiss eləmişdi. Bu səhər yuxudan ayılanda Kərimin canından bir dəhşətli sızıltı keçmişdi. Kərim onda da sarsılmışdı, onda da keyimişdi, ancaq bu sızıltının-sarsıntının sonra onu bir

də yaxalayacağını səhər Kərim ağlına gətirməmişdi. Gətirsəydi elə səhər-səhər durub, baş alıb çıxıb gedərdi. Onda heç o toy da baş tutmazdı, bu anlaşılmaz müsibətin özü də gəlib bu həddə yetişməzdi. Və onda Validə üçün də, bəlkə nisbətən asan olardı: ya fikirləşərdi ki, Kərim onu istəməyib, ya elə zənn eləyərdi ki, Kərimin başında bir iş var... bir-iki gün əzab çəkərdi, hər şey sovuşub gedərdi. Bu belə olsa, Kərimin öz ömrünü haçansa təzədən başlayacağına bəlkə doğrudan da bir ümid yeri qalardı.

İndi isə ümid bircə ay işığına idi, ayrı şeyə ümid yox idi. Ay işığı Kərimin ayağının altında idi, ay işığı Kərimin ürəyinin içində idi. Haradasa ay işığında bir cüt rels par-par parıldayırdı, haradasa ay işığında bir dərə ağappaq ağarırdı. Və Kərim pay-piyada, o dərənin ətəyində təzədən qatara minməyə gedirdi.

Bir vaxt orda ilk dəfə qatara minəndə Kərimin hələ heç on yeddi yaşı da tamam olmamışdı. İndi Kərimin otuz altı yaşı vardı. Deməli, o vaxtdan on doqquz il keçirdi. Bu on doqquz ilin beş ilini Kərim institutda oxumuşdu, səkkiz ilini dissertasiyaya sərf eləmişdi. Kərim altı il mənzil növbəsində durmuşdu və bunları ondan ötrü eləmişdi ki, evlənib özünə həyat qursun, övlad-uşaq yiyəsi olsun. Bəlkə lap on doqquz il qabaq – ay işığında ağappaq ağaran həmin o dərənin ətəyindəki xırdaca stansiyada, o qatara da Kərim elə bundan ötrü minmişdi. Minmişdi ki, gəlib bu böyük şəhərdə institut qurtarsın, dissertasiya müdafiə eləyib, bir tikə çörəyə çatsın, ev alıb, özünə ailə qursun.

Və bəlkə bundan ötrü on doqquz il çox idi, həddindən çox idi və Kərimin bu on doqquz ildə elədiyini bəlkə on ildə də eləmək olardı. Amma məsələ bunda deyildi. Məsələ burasında idi ki, bu on doqquz ildə əldə elədiyi hər şey Kərimdən ötrü bu səhər birdən-birə öz mənasını büsbütün itirmişdi. O maaş da, o mənzil də, o elmi ad da... Və bu on doqquz ildə heç nə qazanmadığını fikirləşəndə bu səhər birdən-birə Kərimin elə bil başının tükləri də üşümüşdü. Çünki bütün bunlar, sən demə, indiki Kərimə lazım deyilmiş, haçansa bir dərənin ətəyində qatara minən o on yeddi yaşlı Kərimə lazım imiş... O Kərim isə daha yox idi.

"Birin vur".
"Birin də..."



Və o toyda, o vurhavurda o bir dərə ay işığı bircə Allah bilir ki, hardan peyda olmuşdu. O işıq, on doqquz ilin arxasından elə bil Kərimi yavaşca səsləmişdi. Səsləyib yerindən oynatmışdı, səsləyib ağıldan eləmişdi. Və indi Kərimi evindən-eşiyindən eləyib, bu çölün düzünə salan da elə bil o sehrli səs idi. İşıq səsi, ilahi, işıq səsi...

Və o səsin sehrli aləmində Kərim, pay-piyada, haçansa bir dərənin ağlığında minib şəhərə gəldiyi bir qatara təzədən minməyə gedirdi. Bayaq toyda, öz xəyalında da Kərim eynən bu yolu getmişdi. Və bayaq onun xəyalında getdiyi o yol ilə indi ayağı ilə getdiyi bu yolun, Kərimdən ötrü, hələ ki, heç bir fərqi-zadı da yox idi və guya Kərim o işığa çatmayınca, o işıq o dərənin ətəyindən heç cür çəkilib gedə bilməzdi.

Kərim gedirdi. Havadan ay işığının metal qarışıq iyi gəlirdi və Kərimin ağzında da elə bil – ay işığının metalla qarışığından ibarət – bir qəribə tam vardı. Bu tamı Kərim get-gedə daha aşkar hiss eləyirdi. Bu tamın köməyi ilə Kərim nəyisə yadına salmağa çalışırdı, amma olmurdu, heç cür baş tutmurdu – yadına salmaq istədiyi o şey onun ağlına-şüuruna azca yaxınlaşan kimi, Kərimin ağzındakı o tam hər dəfə çəkilib-gedirdi.

"Birin vur".
"Birin də..."

Və kim bilir, bəlkə o tam Kərimin öz toyunda içdiyi o iki qədəh arağın tamı idi? Sonra evdə (Validə çay dəmləmək üçün mətbəxə gedəndə) onlar Nağı ilə adama bir stəkan da şampan içmişdilər. Şampan Nağının kefini durultmuşdu. Nağı "Həyat gözəldir!" – deyib səsi gəldikcə qışqırmışdı, bir küncdə dinməz-söyləməz oturub, yorğun-yorğun əsnəyən arvadının kefini açmaq üçün cürbəcür hoqqalar çıxartmağa başlamışdı. Və nədənsə, məhz bu məqamda Kərimin öz köhnə dostuna yaman yazığı gəlmişdi. O məqamda Kərim də var səsi ilə qışqırıb nəsə demək istəmişdi. Amma Kərim qışqırmamışdı. Bayırdakı ay işığı yenə Kərimi xəlvətcə səsləmişdi. Kərim o səsi eşidib balkona çıxmışdı və vur-tut beş-on dəqiqə əvvəl, o balkondan necə enməyi də bu saat Kərimin yadında deyildi.

Sonra Kərim o qəribə tamı ağzında elə aşkar hiss elədi ki, hətta bir anlığa dayandı da. Bayaqdan bəri yadına salmaq istədiyi o şey bu dəfə Kərimin elə bil lap damağına toxundu, dilinə dəydi. Amma dünyanın

ayında-ağlığında axtardığı o ümidin nə ümid olduğunu Kərim bu dəfə də dərk eləyə bilmədi. Və Kərimin ağzında, çox keçməmiş, bayaq Nağı ilə içdiyi şampanın soyuq tamından savayı heç nə qalmadı. Kərim üşüdüyünü hiss elədi.

## II

Payızın ortaları idi. Və bu payız elə əvvəlindəncə Kərimə bir qəribə narahatlıq gətirmişdi.

Validəni Kərim beş-altı il idi ki, tanıyırdı. Beş-altı il idi ki, eyni bir idarədə onlar – bir-birindən vur-tut bircə divar aralıda – işləyirdilər. Validə Kərimdən üç-dörd yaş kiçik idi. İndiyəcən ərdə-zadda da olmamışdı. Ya rastına münasib bir adam çıxmamışdı, ya da, Kərim kimi, ümidini hər gün sabaha bağlayıb, axırda ümidin də dadını itirmişdi. Və məhz buna görə də elə bil onlar bir-birlərini əlbəəl başa düşmüşdülər. Bir gün Kərim işdən sonra Validəni aparıb evlərinə ötürmüşdü. O biri gün onlar bir yerdə kinoya getmişdilər. Üçüncü gün, yenə kinoya getdikləri yerdə, Validə dinməz-söyləməz univermağa burulmuşdu və Validənin o univermağa nədən ötrü girdiyini Kərim o biri görüşdə bilmişdi: o gün onlar univermaqdan pərdəlik parça almışdılar – halbuki Kərim evindəki pəncərələrin pərdəsiz olduğunu Validəyə heç vaxt deməmişdi.

Görüşlərinin birində onlar bir mağazada xeyli vaxt nişan üzüyü növbəsində durmuşdular. Görüşlərinin birində Validə Kərimi evlərinə aparıb öz ata-anası ilə tanış eləmişdi. Görüşlərinin birində Validə dinməz-söyləməz şəhərin atelyelərindən birinin qapısını açmışdı. Və Validənin o vaxt sifariş elədiyi kostyumda indi Kərim baş alıb, dünyadan gedirdi.

Görən Kərim dünyadan hara gedirdi: axı o dərənin özü də dünyada idi. Yoxsa Kərim o dərənin başındakı kəndi tanımırdı, – Kərimi bu şəhərə çəkib-gətirən elə o kəndin darısqallığı deyildimi? Və indi Kərimi çağırıb aparan o genişlik, o dağda-dərədə görən havaxt peyda olmuşdu, hardan peyda olmuşdu, – ordan keçən bütün qatarların izincə bir vaxt dünyanın bu tərəfindəki genişliyə məlul-məlul baxan Kərim deyildisə, bəs kim idi?..

Bəli, genişlik bu saat, yalnız orda idi. Bu saat dünya orda idi. Ay orda idi, ulduz orda idi. Və bu saat Kərimin özünə gəlməyindən ötrü də ayrı heç nə lazım deyildi: o aya, o ulduza bircə dəfə baxmaq lazım



idi, o dərənin havasından bircə udum udmaq lazım idi... Bəs Kərimin ağzındakı o tam nə idi – ay işığı ilə metal qarışığının tamı?.. Bəlkə bir vaxt, ay işığı boyunca, o dərənin ətəyi ilə uzanıb gedən polad relslərin iyi indi, on doqquz illik məsafədən, Kərimin burnuna dəyirdi, damağına toxunurdu. Bəlkə haradasa, bu həndəvərdə metal vardı, yaxud metal iyi verən zavod vardı. Amma yox, o iy bu həndəvərdə ola bilməzdi. O iy haradasa bir ayrı dünyada olmalı idi. O "ayrı" dünya isə, deyəsən, lap yaxında idi. Və sirli, ovsunlu bir səs Kərimi maqnit kimi elə bil birbaş ora çəkirdi, ora aparırdı: işıq səsi, ilahi, işıq səsi!..

Və bir azdan – bir uzun daş hasarın boyunca – suyun, palçığın içində üst-üstə qalanmış dəmir tığlarını görəndə özünün harada olduğunu Kərim nəhayət ki, dərk eləyə bildi. Bura da şəhərin ucqar yeri idi. Buradakı binalar da nisbətən təzə salınmışdı. Ancaq binalar hələ xeyli aralıda idi. Və beş-altı il əvvəl, gecələrin birində həmin binaların arasında o, Nağı ilə birgə, Toğrulun mənzilini axtaranda bu dəmir-dümür qəbirstanlığını Kərim möhkəm yadında saxlamışdı. Buranı Kərim öz kəndli instinkti ilə əlbəəl nişanlamışdı, çünki qabaqdakı binaların hamısı bir-birinin tam eyni idi və bir şey nişanlamasan, ordan geri qayıdanda yolu çətin ki, tapmaq olaydı. Üstəlik, o gecə o binaların arasında onlar, taksi sürücüsünə az qala bir saat zülm eləyib, naümid geri qayıdanda Toğrulun mənzilinin yeri də Nağının yadına məhz bu dəmir-dümürü görəndə düşmüşdü. Taksini buradaca saxlatmışdılar. Düşüb piyada getmişdilər və bu dəfə Toğrulun mənzilini rahatca tapmışdılar. Və sonralar o mənzilə Nağısız gələndə də Kərim taksidən həmişə burda düşmüşdü...

Çarpayı dəmirindən tutmuş, vertolyot pərinəcən – metalın hansı növündən desən burada tapmaq olardı. Metal suyun-palçığın içində pas atıb iylənmişdi. Ayın işığı metalın, suyun, palçığın üstündə yenə eynən ovaxtkı mənzərəni yaratmışdı və hələ pas atmamış metal hissələri Ayın ağ şirəsini elə bil duru yerindən somururdu... o yanda binalar görsənirdi. Binaların beton divarlarını Ay bir azca yumuşdu, bir azca təzələmişdi. Orda baxan pəncərələrinsə üzünə sanki bir müxtəsərcə metal tozu səpmişdilər.

Bəli, Kərim harda olduğunu nəhayət ki, dərk eləmişdi, amma bura necə gəlib-çıxdığını heç cür dərk eləyə bilmirdi. Onun yaşadığı mikro-

rayondan görən, bura dümdüz yolmu var idi, yoxsa bayaqdan bəri Kərim doğrudan da bir sehrli işıq ustdə yerimişdi ki, o işığın yeganə mənzilbaşı yalnız bura idi, bu metal qəbiristanlığı idi. Hər halda, o düz yoldan hardasa buruldugunu Kərim xatırlamırdı. Və dəhşət burasında idi ki, indi, geri qayıdası olsa, öz evinə gedən yolu Kərim çətin ki, tapa biləydi.

*Ancaq Kərim geri qayıtmaq istəmirdi. Haçansa, beş-altı ilə əvvəl* burada taksidən düşüb, bu dəmir yığnağını, öz kəndli instinkti ilə, əlbəəl nişanlayanda da burdan Kərim geri qayıtmaq istəməmişdi. Onda Kərim ürəyində dönə-dönə Allaha yalvarmışdı ki, o evlərin arasında Nağı Toğrulun mənzilini tapa bilsin, burdan onlar naümid geri qayıtmasınlar, çünki bu yolun ayrıcında o vaxt Kərim ilə Nağının yanında iki nəfər qız da vardı.

O qızların hər ikisi ilə onlar elə həmin gecə şəhərin mərkəzində tanış olmuşdular. Qızlar dayanıb taksi gözləyirdi, Nağı ilə Kərim isə restorandan təzəcə çıxmışdılar. İçmişdilər, ancaq o qədər də sərxoş deyildilər. Və Kərim də, Nağı da o gecə, nədənsə, yaman xoşbəxt idi. Tanışlıq qızları aparıb evlərinə ötürməkdən başlanmışdı. Danışıb gülə-gülə onlar bir xeyli piyada getmişdilər. Hardasa boş taksiyə rast gəlmişdilər. Və o *taksini şəhərin içində o baş-bu başa dolandırıb qızları xeyli əyləndirəndən* sonra Nağı birdən-birə cürətlənib, maşını şəhərin mərkəzindən birbaş bu təzə rayona sürdürmüşdü. Əvvəl qızlar bir az nəm-nüm eləmişdilər. Yol boyu sirli-sirli *bir-birlərinin üzünə baxmışdılar. Bir*-birinin eyni olan binaların arasında, o taksidə Nağı korhavasına Toğrulun mənzilini axtaranda qızlar sevinmişdi, gülüşmüşdü. Amma burda taksidən düşəndə heç o qızlar da deyəsən geri qayıtmaq istəmirdilər.

Toğrul Nağının da, Kərimin də tələbəlik dostu idi. Toğrulgilin şəhərdəki mənzilində Kərim çox olmuşdu. Amma Toğrulun haradasa təzə mənzil almağından Kərimin xəbəri yox idi. Bunu Kərim o gecə bilmişdi. O gecə, ömründə ilk dəfə, Kərim bu dünyada ehtiyacdan savayı bir ayrı şeyə də xidmət eləyən yurd görmüşdü, mənzil görmüşdü. O mənzilin pərdəsiz pəncərəsindən otağa düşən ay işığını o gecə Kərim bir *qızın öpüşlərinə qatıb, səhərəcən icdikcə içmişdi.* Və Kərimin ürəyi də elə bil yavaş-yavaş əriyib, o öpüşə, o işığa, o qıza, o gecəyə qarışmışdı. O gecə indi görən hardaydı?.. Və o gecə bir də heç *vaxt olmayacaqdısa, bu dünyada yaşamağa dəyərdimi?*

"Nağı, Nağı, Nağı"... – dedi.



Və Kərimin ürəyinə isti gəldi, işıq gəldi. Boğazına qəhər gəldi, çünki Nağı Kərim üçün doğrudan da dost olmuşdu, həqiqi dost. O gecə Kərimin xatirinə Nağı qızın yaxşısından keçmişdi, yerin rahatından keçmişdi. O gecə Nağı Kərimi otaqda qoyub, özü (o biri qızla) mətbəxə çəkilmişdi, halbuki hər şey əksinə də ola bilərdi. Və o gecə bir *yana dursun, Nağısız bu dünyada Kərim kitab-dəftərdən savayı indi*yəcən nə görmüşdü?.. Nağı onun çox nazına dözmüşdü, çox əziyyətini çəkmişdi. Və onların arasında hərdən soyuqluq olmuşdusa, o da ancaq Kərimin qəddarlığından *olmuşdu, Nağıda qəddarlıq deyilən şey yox idi.*

Nağı beş-altı il idi, necə deyərlər, həyatın axınına qarışıb gedirdi. Bundan ötrü Nağını qınamağa dəyərdimi? O öz hazır namizədlik dissertasiyasını bir tərəfə tullayıb, nə vaxtdan bəri idi ki, ona-buna dissertasiya yazırdı. Hər şeydən xırtdəyəcən doyub, bircə alimliyi çatışmayanlar bağlı qapıların dalında Nağını həftələrlə gecəli-gündüzlü işlədirdilər və hər dəfə bu cür işdən sonra Nağı həftələrlə gecəli-gündüzlü içirdi. Belə vaxtlar, onlar bir-birlərini axtarıb tapanda, yaxud bir yerdə təsadüfən rastlaşanda Nağı Kərimə də hər dəfə mütləq içki təklif eləyirdi və Kərimin içmək istəmədiyinə Nağı heç *cür inana bilmirdi. Bu içmək söhbətindən* sonra hədsiz təəccüb ilə Nağı hər dəfə uzun müddət Kərimin üzünə baxırdı. Amma Kərimi heç vaxt məcburən içməyə aparmırdı. Kərimin öyüd-nəsihətlərinə da *Nağı – eynən belə bir təəccüb içində – dinməz-söyləməz qulaq asırdı.* Və gülümsəyirdi, sakitcə, mehribanca gülümsəyirdi. Kərimin bu öyüd-nəsihəti bəlkə doğrudan da gülməli idi...

Və bəlkə ürəyinin bir yerində Kərim öz dostuna bir azca da *paxıllıq* eləyirdi. Nağının qarışıb getdiyi axın bəlkə Kərimi də özünə çəkirdi. Bəlkə Kərimi özünə çəkən Nağıdakı insani cazibə idi... Son beş-altı ildə Kərim bu cazibədən istər-istəməz aralı düşmüşdü, çünki ayrı cür mümkün deyildi. Bunsuz Kərim nə o dissertasiyanı yazıb qurtara bilərdi, nə onu müdafiə eləyib çulunu bir yerə çıxarda bilərdi. Üstolik, burası da vardı ki, o dissertasiyada Kərim özünün Nağı ilə neçə illik dostluğuna zərrə qədər də xəyanət eləməmişdi. Əksinə, bu dostluğa, yoldaşlığa bir növ öz sədaqətini göstərmək istəmişdi. Çünki Kərimin namizədlik işi, elmi iş olmaqdan əlavə, həm də haradasa bir növ onların neçə illər bo*yunca ikilikdə elədikləri söhbətin davamı idi;* buradakı fikirlərə onlar haçansa ikilikdə inanmışdılar, buradakı həqiqət bir vaxt onların hər

ikisinin həqiqəti olmuşdu. Və bu həqiqətdən uzaqlaşmaq Kərimin nəzərində, hər şeydən əvvəl, ömrü uduzmaq demək idi. Çünki Kərimdən ötrü dünyada ayrı həqiqət yox idi. Və Kərimdən ötrü dünyada ayrı dost da yox idi. Buna görə də, Nağı həyatın, necə deyərlər, axınına qoşulanda, özünə ayrı dostlar tapıb, tamam ayrı cür yaşamağa başlayanda Kərim sınmışdı, sarsılmışdı. Onda Kərim heç ağlına da gətirməmişdi ki, onun üçün hələ də qüvvədə qalan həqiqət Nağıdan ötrü köhnələ bilər. Bunu Kərim bu səhər birdən-birə dərk eləmişdi. Başılovlu evdən çıxıb, gedib Nağını yuxudan oyatmışdı. Və Nağı sevinmişdi, Kərimin gəlişinə də sevinmişdi, toyuna da sevinmişdi. Nağı yorğan-döşəkdən sıçrayıb Kərimi duz kimi yalamağa başlamışdı, halbuki üç-dörd il idi ki, onlar nəinki bir-birlərini itirib-axtarmamışdılar, hətta bir yerdə təsadüfən rastlaşanda da ayaqüstü əl tutub, hal soruşub ayrılmışdılar...

"Nağı, Nağı, Nağı..." – dedi.

Və irəlidəki binalara sarı Kərim elə getdi, elə getdi ki, guya orda – Toğrulun mənzilində Nağı o vaxtdan bəri oturub Kərimin yolunu gözləyirdi.

Guya o qız hələ də orda idi. Guya ay işığı, orda, hələ də içməli idi. Və o vaxtdan indiyəcən ötüb-keçən o beş-altı il də guya il deyildi, vaxt deyildi, Kərimi o işıqdan ayıran yol idi, məsafə idi və bu beş-altı ildə gecəli-gündüzlü getdiyi bir yolun mənzilbaşına Kərim guya indi, nəhayət ki, gəlib yetişmişdi.

Və dünyanın işinə bax ki, bu balkon doğrudan da Toğrulun balkonu idi. Bu mənzildə hələ də heç kəs yaşamırdı. Mənzilin boş olmağı balkonun suvağının tökülməyindən, bir də pəncərə şüşələrinin üstündəki qalın tozdan bilinirdi. Və o vaxtdan beş-altı il keçdiyinə Kərim necə inanaydı ki, açar da qapının sol yanında, çərçivənin böyründən qopmuş kərpic qırığının dalında – həmişəki yerində idi...

Kərim qapını açıb içəri girdi. İşığı yandırmamış birbaş divanın üstünə cumdu. Sonra işığı yandırdı. Eynən o vaxtkı otaq idi: bir köhnə, örtüyü əprimiş divan, bir-iki köhnə stul. Ortadakı dördkünc stolun üstündə açıq konserv qabları vardı, konyak, çaxır şüşələri vardı...

Kərim qayıdıb işığı söndürdü. Üzüqoylu divana uzandı. Stolun üstündəki dörd badəni indi Kərim baxmadan da görürdü. O badələrdə görəsən kim çaxır içmişdi? Görən, burda kim olmuşdu: Nağımı, Toğrulun özümü, yoxsa Kərimin tanımadığı adamlar da indi bura ayaq



açmışdılar. Və görən, o badələrdə kimin çaxır içməyinin Kərimə nə dəxli vardı. Bu nə idi, bu necə qısqanclıq idi – o iki qızdan savayı bu dünyada məgər qızmı yox idi?!

O qızlar, o gecənin səhəri Kərimi, Nağını elə buradaca qoyub, tezdən çıxıb getmişdilər. Kərim ilə Nağının onları yola salmağına qızlar razı olmamışdı. Və o səhər nə Nağı, nə də Kərim o qızları aparıb yola salmağa sən deyən cəhd eləməmişdi. Çünki onlar axşamüstü həmin o taksi dayanacağında yenə görüşəcəkdilər. Amma o görüş baş tutmamışdı: o qızlar gəlməmişdilər. O gecə Nağıdan ayrılan kimi Kərim özünü bu mənzilə yetirmişdi və bu divanın qabağında Kərim o gecə ilk dəfə hönkür-hönkür ağlamışdı. Sonra neçə gün dalbadal o, bu mənzildə tək-tənha o qızın yolunu gözləmişdi. Və bu əhvalatı Kərim bir dəfə, içki havasına, Nağıya da danışmışdı. Bu əhvalatı Nağıya danışanda da Kərim köyrəlib, doluxsunub, birdən-birə hönkürmüşdü. Nağı isə nə gülmüşdü, nə də o qızı Kərimin gözündən sala biləcək bir söz demişdi. Əksinə, o vaxt Nağı o qızların heç birinin "o yolun yolçusu" olmadığına Kərimi sakitcə inandırmağa başlamışdı. Sən demə, o gecə bir qəribə təsadüf imiş. O gecənin təsadüf olmağına o vaxt Kərim inanmışdı. Və indi beş-altı il keçəndən sonra da, o gecənin təsadüf olduğuna inanmağa Kərimin, bircə Allah bilir ki, nə qədər ehtiyacı vardı...

Kərim üzüqoylu divana uzanmışdı, ancaq bir dumduru ay işığını o, xəyalında hələ də görürdü. Bir də Kərim xəyalında o dörd badəni görürdü. Və o işıq o dörd badəni elə bil Kərimin gözləri qabağındaca yavaş-yavaş əridirdi, udurdu – Kərim yuxlayırdı.

## III

Haradasa bir tanış dərədə, bir ağappaq işıq dumanının üstündə Kərim rahatca oturmuşdu. Bir kimsəsiz çöl-biyaban idi. Bir ağımtıl-gümüşü rəng idi və o ağımtıl-gümüşü aləmin dumduru aynasında indi Kərimin gözünə cürbəcür əfsanəvi kölgələr görsənirdi: dağ kölgəsi, ağac kölgəsi, kol-kosun kölgəsi...

Və indi Kərimin burnuna haradansa, şehqarışıq, südqarışıq körpə ot iyi deyirdi. Amma o düzdə-dərədə bir dənə də ot yox idi, yaxud ot o dərəni doldurmuş ağappaq işıq dumanının altında qalmışdı – Kərim o otu görə bilmirdi.

O ağappaq işıq dumanında Kərim dünyanın ən tanış ağaclarının ayaq üstdə dayanmış kölgəsini görürdü. Bir tanış dağ. Bir neçə tanış kol-kos. Ancaq o dağ da, o kol-kos da, o tanış ağaclar kimi, Kərimin gözləri qarşısındakı düz dolusu, dərə dolusu işıq dumanının üstündə yalnız kölgə idilər, görnük idilər; ya o ağ dumanın ağlasığmaz gözəlliyinin daha qabarıq görünməyindən ötrü dayanmışdılar, ya Kərimin haçansa bu dünyada öz dağları, öz ağacları, öz kolu-kosu olduğunu yada salmaq istəyirdilər, yaxud bura nə düz idi, nə dərəydi, bir ayrı planet idi ki, Kərimin haçansa gördüyü dağın, düzün, dərənin bura, bir müxtəsərcə, şəkli düşmüşdü.

Və görən bu nə sirr idi ki, dərənin başındakı o kənd Kərimin yuxusuna da ağ donda, ağ işıqda gəlmişdi. Və Kərimin, haçansa, hər daşını, hər kolunu-kosunu tanıdığı o kəndi, indi ay o dərənin başında, elə bil, Kərimdən ötrü, öz ağ qanı ilə təzədən rəsm eləmişdi: ev-ev, küçə, küçə, parça-parça işıq rəsmləri...

O işığın bir parçasının üstündə bir axşam Kərim nənəsinin əlindən yapışıb bir məsciddə çıraq yandırmağa getmişdi ki, müharibə tez qurtarsın və təkcə Kərimin atası yox, o kənddən müharibəyə gedənlərin hamısı müharibədən sağ-salamat qayıtsınlar.

Bir gecə Kərimin nənəsi o Aya yalvarmışdı ki, o zalım Hitlerin də ürəyinə bir zərrə mərhəmət işığı salsın və başqa bir gecə yazıq qarı yenə Aya üz tutub, o işıqdan bir zərrə də kolxoz sədri Səməndərlə kolxoz qaravulçusu Heybətin payına istəmişdi, çünki kolxoz sədri Səməndər, onların bir vaxt çıraq yandırıb qoyduqları o məscidin qapısını çıxartdırıb, kolxozun tövləsinə saldırmışdı və kolxoz qaravulçusu Heybət bir ətək alçadan ötrü kor Qıztamamın yetim nəvəsi Laləzarın donunu cırıq-cırıq eləyib, qızın abrını-ismətini çölə tökmüşdü...

O işığın bir parçasının üstünə bir gecə bir qara tabut qoyub, bir səhər Kərimin nənəsini o tabutda qəbiristanlığa aparmışdılar... O işığın bir parçasının üstündə bir vaxt, kinodan sonra, bir kəndin ən gözəl qızı yerimişdi... Və o işığın bir parçasının üstündə Kərim indi rahatca əyləşmişdi. Bir azdan durub gedəcəkdi...

Kərim hara gedəcəyini bilmirdi. Bircə onu bilirdi ki, mütləq getməlidir. Ancaq Kərim hələ ki, heç yana getmək istəmirdi. Hələ Kərim dincəlmək istəyirdi. Bu kimsəsiz, səssiz-səmirsiz dərədə, bu ağappaq işıq dumanının üstündə Kərimin, hələ gün çıxanacan, dincəlməyə



vaxtı vardı. Və bəlkə buna görə bu qəribə yuxuda Kərim günəşin çıxmağından yaman qorxurdu.

Kərim günəşin çıxmağından ona görə qorxurdu ki, günəş o ağappaq dumanı dağıda bilərdi, o tanış kölgələri yer üzündən itirə bilərdi.

Gün çıxıb, o aləmin südqarışıq, şehli nəfəsini uda bilərdi. İlanı-ilbizi oyada bilərdi. Bülbülləri, cırcıramaları oxuda bilərdi.

Günün işığında orda-burda kol-kol, topa-topa qızılgüllər aça bilərdi. Məhəbbət, fars dilində, yenə şeir ilə öz şirin-şəkər dastanını başlayırdı. Ənnik-kirşan qoxusu dünyanı doldurardı.

Gün çıxsaydı, ağaclar meyvə gətirərdi. Dağlar baldırğanını, kollar böyürtkənini doğub dünyaya tökərdi. Kərim nə böyürtkən, nə baldırğan istəyirdi: daha onun dünya malında gözü yox idi.

Gün çıxsa, vaxt oyanardı: dərs vaxtı, biçin vaxtı, xırman vaxtı... Bir də Səməndər sədr olduğu o vaxtlar ki, bu dərənin hər daşında-çınqılında neçə-neçə yalın ayağın al-qırmızı qanı vardı.

Gün çıxsa, o daşlar da ayıla bilərdilər. Əvvəl səssizcə sızıldayıb, sonra elə hönkür-hönkür ağlaşardılar ki, – heç orada, bir ağ bulud topasına bənzəyən o dağın arxasında, kolxoz idarəsinin qabağındakı uzun dirəyin başında cani-dildən marş çalan o radionun səsi də bu səsi batıra bilməzdi. O daşlar hələ ki, susurdu. Səməndərin sədr olduğu o vaxtlar da – öz biçini, bostanı xırmanı ilə birgə – sanki haradasa dünyanın gün düşən, taxıl yetişən, səsli-küylü, bostanlı-xırmanlı uzaq bir guşəsində idi. Orada istidən qarsımış yollar vardı. O yollarda isti-isti daşlar vardı və bir uzun dirək başında bir ağzı aralı dəmir parçası da vardı ki, öz güclü, gur səsi ilə bir dəstə ayaqyalın adamı, analı-balalı, harasa tələsdirirdi. O radio bir də oradakı vaxtı tələsdirirdi. Burada isə vaxt yox idi. Nə taxılı biçiləsi zəmi, nə taxılı döyüləsi xırman, nə isti, nə soyuq vardı. Və bəlkə buna görə də bu yerlər Kərimin nəzərində bir azca da başqa planetlərə oxşayırdı...

Bu qəribə yuxuda Kərim bu tanış düzü-dərəni, hələ gün düşməmiş, mütləq ötüb keçməli idi. Bəs niyə getmirdi, nəyi gözləyirdi?.. Bəlkə Kərimi bu yerlərin havası tutmuşdu – keyitmişdi, məst eləmişdi, haldan-halətdən salmışdı. Bəlkə vaxt olmayan yerdə hərəkət də ola bilməzdi. Və bəlkə bura doğrudan da bir ayrı planet idi ki, onun hərəkət qanunları Kərimə məlum deyildi.

Və Kərim birdən-birə, görəsən, bu süstlüyün-sakitliyin ölümə yamanca oxşadığınımı hiss elədi, yoxsa bu gözlənilməz rahatlığın, hod-

dindən çox olduğuna qəflətən şübhələndiyinə görə diksindi. Və birdən gözlərini açıb, burada, bu otağın alatoranlığında da bir tanış kölgə görəndə Kərim bir müddət gözlərinə inanmadı. Bu kölgənin təzəcə yuxuda gördüyü o tanış ağacların kölgəsindən Kərim uzun müddət ayıra bilmədi. Otaqdakı kölgə isə, doğrudan da, Nağının kölgəsi idi. Nağı otaqda ehtiyatla gəzinirdi – elə bil Kərimin yuxudan ayılmağını gözləyirdi.

## IV

Kərimin yuxudan ayıldığını görəndə Nağı heç nə demədi; kirimişcə işığı yandırdı, kirmişcə stola yaxınlaşdı. Stolun üstündəki içki şüşələrinin içindən Nağı bir ağzı açılmamış çaxır şüşəsi tapdı. Şüşənin tıxacını dişi ilə qoparıb yerə saldı. Şüşəni başına çəkib, o çaxırdan, nəfəsi təngiyənəcən, qurtaqurt içdi. Bundan sonra xeyli vaxt Nağı dinməz-söyləməz o şüşənin dibində qalan çaxıra tamaşa elədi. Gözünü şüşədən ayırıb *Kərimin üzünə baxdı*. Və Nağı Kərimin üzünə baxıb, aşkar müqəssircəsinə:

– Sənə olmaz, – dedi. – İçki səni xarab eləyir.

Kərim bir söz demədi, çünki bu qəribə gecədən o, hələ də heç nə başa düşmürdü. Kərimə elə gəlirdi ki, onun yatdığı vaxt ərzində dünya yerini dəyişib: elə bil bu çağacan bu otaq indikindən bir xeyli ucada olmuşdu; bu divanı elə bil hansı ucalıqdansa götürüb, yerin lap tərkinə qoymuşdular; o stol da, o stolun üstündəki badələr də, şüşələr də, hətta Nağının özü də elə bil bir naməlum ucalıqdan indicə yerə enmişdi. Sanki dünya birdən-birə *haradansa bir* xeyli aşağı düşmüşdü və dünyanın bu sirrindən Kərim heç cür baş çıxara bilmirdi.

– Hələ düzəlməmisən?

Kərim Nağıya nəsə dedi, ancaq səsi çıxmadı, çünki Kərimin səsi də elə bil haradasa aşağıdaydı, bir naməlum dərinlikdəydi – öz səsini oradan qaldırmağa Kərimin gücü çatmadı.

Nağı çaxır şüşəsini götürüb dodağına yaxınlaşdırdı, amma içmədi.

– *Əntiqə* yatmışdın! – dedi. – Lap dovşan balası kimi. Oyatmağa ürəyim gəlmədi. Ə, sən öl, sən dovşana oxşayırsan, Kərim. Vijdan haqqı, oxşayırsan... Ə, sən *niyə dovşana oxşayırsan, Kərim?*

Nağı şüşəni ağzına dirəyib, bir-iki qurtum da çaxır içdi, sonra şüşə əlində, əyilib-qalxıb ləzzətlə gülməyə başladı. Və elə bil Nağının içdiyi çaxırdanmı, onun gülməyindənmi, ya nədənsə Kərimin canına bir balaca güc gəldi, qüvvə gəldi.

– Çox yatmışam?

– Məndən soruşursan? – Nağı gülməyini qurtarıb, çaxırdan bir-iki qurtum da içdi. Şüşəni yerə qoyub, siqaret yandırdı. – Bura nəyinən gəlmisən ki?

– Bilmirəm.

– Yəni elə dəm idin?

*Kərim mat-məəttəl* Nağının üzünə baxdı.

– Yox, – dedi, – dəm deyildim.

– Taksiynən gəldin?

– Yox.

– Bə nəyinən?

– Heç nəyinən.

Deyəsən Nağı təzədən gülməyə hazırlaşırdı, ancaq gülmədi. Şübhəli-şübhəli Kərimin üzünə baxdı.

– Olmaya dəmsən hələ?

Kərim bir söz demədi, çünki bu "dəmlik" məsələsindən də o hələ ki, heç nə qana bilmirdi.

Nağı təzəcə yandırdığı siqareti konserv qabının içində sıxcalayıb söndürdü.

– Mən gərək o arağı sənə içirtməyəydim, – dedi və bir azca duruxub, sonra gözlənilmədən elə bil bir növ əsəbiləşən kimi oldu. – Ə, birdən ağlına ayrı şey-zad gətirərsən ha... Elə bilərsən ki, səni qəsdən içirtmişəm...

Və Kərim Nağının üzünə baxmadan:

– Yox, əşi, nə danışırsan? – dedi. Sonra başını qaldırıb Nağının üzünə baxdı.

Amma Kərim Nağının üzünə gərək baxmayaydı. Nağının sifətində birdən-birə peyda olmuş eybəcər işartını gərək Kərim görməyəydi, çünki o eybəcər işartı Kərimə bu dünyanın özü qədər tanış idi. Və bu qədər tanış olan bir dünyada Nağını bir əlçatmaz mərtəbəyə qaldırıb, bir məchul ucalıqda axtarmağa, bu səhər açılandan bəri, Kərimi görən nə vadar eləmişdi?.. Və görən *Nağının üzündəki o işartı necə işartı idi* ki, Kərimi, bu səhər açılandan bəri, əhatə eləyən o dumanlı qəribəliyi də dunyanın üzündən bircə anın içində tamam itirə bilmişdi...

Elə bil birdən-birə Kərim, bayaqdan üstündə əyləşdiyi divandan da iyrənib, cəld ayağa qalxdı. Bu saat o, nədənsə, Nağıya bir ağır söz demək istəyirdi. Yaxınlaşıb hirsli-hirsli:

– Bu zəhrimarı az iç! – dedi.

Və Nağı ağzına dirədiyi şüşəni, nə qədər qəribə olsa da, qaytarıb stolun üstünə qoydu.

- Ə, yenə nə tez qudurdun? – dedi. – Axı sənin idbar səsin indicə o dünyadan gəlirdi.

Nağı qolunu uzadıb Kərimin boynunu qucaqlamaq istədi. Kərim geri çəkildi. Və özü ilə Nağının arasındakı bircə addımlıq məsafədə Kərim onları bir-birindən həmişəlik ayırmış beş-altı ilin sonsuz uzaqlığını gördü.

– Nə bildin ki, mən burdayam?

– Mən sənin dabbaqda gönünə bələdəm. – Nağı şüşəni qamarlayıb, qalan çaxırın hamısını birnəfəsə içdi. – İndi neynəyək deyirsən?

– Gedək.

– Bəs indi nə deyəcəksən ona?

– Kimə?

– Arvadına da!

– Heç nə.

– Necə yəni "heç nə". Bir şey tapıb deməlisən axı.

– Nə deyim?

– Deyərsən ki, bir yaxın qohumun var, mütləq toya gəlməliydi. Gəlməyib, sən də fikirləşmisən ki, yəqin kişinin başında bir iş var. Birdən beyninə yerləşib ki, taksiyə minib özünü mütləq Buzovnaya yetirməlisən.

– Buzovnaya niyə?

– Ə, sən nə qanmaz adamsan. Buzovna olmasın, Məştağa olsun. Bu qaçmağın bir yeri olmalıdı ya yox? – Nağı qapıya tərəf yeridi – Açar hardadı?

– Açar?.. Bilmirəm... Yəqin ki, qapının üstündə olar.

Nağı işığı söndürdü. Qapını bağlayıb, açarı yerinə qoydu.

– Hə, indi o qalır ki, sənin o vicdansız qohumuna gərək bir ad da fikirləşək. Adı da tutaq ki, Ağakərimdi. Necədi, beyninə batır?

– Yox!

– Qoy olsun Ağahüseyn.



– Yox.

– Deyirsən "ağa"sız olsun?

– Yox.

Qabağa düşüb pilləkənlərlə üzüaşağı tez-tez getdiyi yerdə Nağı birdən-birə ayaq saxladı.

– Bəs nə təhər olsun?

– Heç nə təhər. Mən ona yalan deməyəcəyəm!

– Bah atonnan! Ə, sən nə əclaf adamsan!

Və nədənsə birdən-birə Kərim yaman coşdu:

– Deyəcəyəm: dəli olmuşdum. Başıma hava gəlmişdi. Ancaq mən ona yalan deməyəcəyəm. Mən ona heç vaxt yalan deməyəcəyəm. Nağı. Desəm kişi deyiləm!

Nağı dinmədi. Və əvvəli-axırı görünməyən bu dəhşətli gecənin ölü sakitliyində uzun müddət Kərim, indicə, öz səsindəncə qopan qəhərin cingiltisini eşitdi.

– Deməli, yalan deməyəcəksən? – Və bu dəfə Nağının səsi də elə bil qəhərli idi. Yaxud o qəhər Kərimin qulağında öz səsinin cingiltisindən qalmışdı. Yaxud qəhər – onların yaxınlaşmaqda olduqları o dəmir qəbiristanlığının metal iyi verən havasındaydı...

– Yox, Nağı, yalan deməyəcəyəm.

– Sən bayaq əməlli-başlı adamıdın.

– Havaxt?

– Dəm olanda. Dəmliyin gedən kimi yenə əclaflığın tutdu.

Bayaq onu öz evindən birbaş bura gətirən o düz yolu görmək ümidi ilə Kərim boylanıb yan-yörəyə xəlvətcə göz gəzdirdi. Ancaq o yol yox idi. O yol doğrudan da elə bil bu dünyada yalnız bir müddətliyə mövcud olub, sonra həmişəlik yoxa çıxmışdı. Sanki o yol doğrudan da Aydan düşmüşdü, işıqdan yaranmışdı... Sanki o yolun üstündə insan, ömründə tək bircə dəfə yeriyə bilərdi... Bakının ən ucqar yerlərinin arası ilə haradansa lap uzaqlardan baş alıb gələn bu yol isə buradan dümdüz şəhərin mərkəzinə tərəf gedirdi. Ay batmışdı, amma səhərin açılmağına hələ çox qalırdı. Və yolun heç bir yerində hələ ki, maşın əlaməti görsənmirdi.

- Burdan bizim evəcən görəsən nə qədər yol olar?

Nağı yol qırağındakı bir daşın üstündə əyləşmişdi:

– Nə bilim, – dedi, – sən yaxşı bilərsən.

– Sən öl, lap mat qalmalı işdi...

– Deyəsən, maşın gəlir. – dedi. – Əl çək, sən canın. Nağı, mənim

– Axı mən bu yolu bayaq piyada gəlmişdim.

Nağı gözlərini yoldan ayırmadan:

– Yuxuda gəlmiş olarsan. – dedi. – Elə dovşana oxşamağın da yəqin bundan imiş, çünki yatıb ayılan kimi yenə əclafa dönmüsən.

– Deməli, əclaf olmamaq üçün mən gərək mütləq yalançı olam?

Nağı durub yavaş-yavaş Kərimə yaxınlaşdı. Qolunu Kərimin boynuna dolayıb, sıxdı, sıxdı, sıxdı. Sonra qollarını yanına salıb, bir müddət yorğun-yorğun, yazıq-yazıq dayanıb, bir sürtülmüş, sirimsəmiş səs ilə:

– Mən səndən, əclaf, qorxuram! – dedi. – Bu dünyada heç nədən qorxum-zadım yoxdu. Amma səndən qorxuram, əclaf!

Bu anda Kərim heç nə demək istəmirdi. Bu anda Kərim Nağının insan olduğuna, sözsüz, səssiz-səmirsiz ölənəcən şübhə eləmək istəyirdi. Ancaq bir söz demək lazım idi. Sükutu pozmaq lazım idi, çünki bu sükutu özbaşına buraxsan, sonra birdən-birə partlayıb, mütləq bir xəta çıxarda bilərdi.

– Məndən niyə qorxursan ki?

– Ona görə ki, sən əclafdan baş çıxara bilmirəm. Bu dərəcədə avam olasan, özün də bu dərəcədə ayıq olasan. Avam olanda səni qanfet kimi yeməyim gəlir. Ayıq olanda boğmağım gəlir. Bax belə! Nağı yenə qolunu Kərimin boynuna keçirdi, amma bu dəfə bərk sıxmadı. İndi də Nağının niyyəti – deyəsən, Kərimi öpmək idi.

Kərim onun qolunu ehtiyatla boynundan aralayıb, vəziyyətdən çıxmaq xatirinə, könülsüz, Nağının üzündən öpdü.

– Di yaxşı əl çək, adamsan.

– Yalan deyirsən. Mən adam deyiləm. Özün də bilirsən ki, mən adam deyiləm. Bayaqdan fikirləşdiyin də budur!

– Yaxşı sən Allah, əl çək, Nağı. Mən nə haydayam, sən nə haydasan. Sən öl, ölməyim gəlir bu saat.

– Yalan deyirsən. Ölməyin-zadın gəlmir. Bir azca gicləşmişdin, indi ayılmısan, dirilmisən. Bu saat sənin dərdin-sərin bircə budur ki, özünü tez evə yetirəsən. Gedib arvadından üzr istəyib, bu ipləmə Nağının əlindən də birdəfəlik canını qurtarasan. Ancaq, bura bax,

qohumum-zadım yoxdu.

Nağı keçib, yolun tən ortasında dayanıb, hələ o başda görsənən maşına qabaqcadan əl qaldırdı. Maşın tamam yaxınlaşıb, onların lap yanına çatanda da Nağı yoldan çıxmadı. Və o maşın Nağının lap böyründəcə ötüşüb, yolun qırağı ilə sürətlə burulub gedəndən sonra Nağı bir yağlı söyüş söyüb, nəhayət ki, yoldan qırağa çıxdı.

– Ə, vicdansız, yəni bu dünyada bircə dəfə də bir iş mən deyən kimi ola bilməz? Axı niyə bu dünya həmişə sən deyən kimi olmalıdır? Niyə, əclaf? Sən məndən artıq kişisən? Yoxsa sən dünyaya Allahın yanından gəlmisən?

Kərim qorxa-qorxa Nağının gözlərinə baxdı, çünki Nağının gözlərini o, heç vaxt bu ölçüdə, bu əndazədə görməmişdi. Onun gözlərinin qarası elə bil ağından aralanmışdı, uzaqdaşmışdı və bir qəribə sürətlə hələ də durmadan uzaqlaşmaqda idi.

– Yaxşı, qoy sən deyən olsun. Deyərəm, Buzovnaya getmişdim. Qohumum filankəsin evinə. Lap olsun Ağahüseyn. Day nə istəyirsən məndən?

Nağı nisbətən toxtadı. Hətta elə bil sevindi də.

– Sən bunu yəni bir az qabaqdan desəydin ölərdin? Əclafsan da, əclafın yekəsisən. Tərsliyin tutanda çaqqala dönürsən.

Nağının gözlərinin qarası yerinə gəlmişdi və o eybəcər parıltı yenə Nağının gözlərində hardansa peyda olmuşdu. Bir də bu dünyada bir tərtəmiz, bir dumduru ay işığı vardı. Və Nağının gözlərinə baxanda o işıq birdən-birə Kərimin xəyalına gəlməsəydi, onların bu söhbəti bəlkə burada da həmişəlik qurtara bilərdi. Çünki maşın gəlirdi, maşın lap yaxında idi və get-gedə sürətini azaltdığından, bu maşın dayanana oxşayırdı. Və maşın gəlib yetişənəcən Kərim Nağını təzədən hirsləndirməyə ürəyində bir dəhşətli ehtiyac hiss elədi:

– İndi ki, belə oldu, sözümü geri götürürəm. Sən yıxılıb bax burdaca bu saat gəbərsən də, mən o yalanı deməyəcəyəm, Nağı.

Nağı möhkəm çaşdı, amma özünü o yerə qoymaq istəmədi.

– Cəhənnəmə de! Sənin o yalanı deməyin elə bilirsən mənim üçün

Son sözləri deyə-deyə Kərim azca aralıda dayanmış üstüörtülü yük maşınının qabağına qaçdı. Nağı yolun qırağında dayanmışdı, elə bil tərpənmək fikri yox idi.

– Getmirsən?

– Rədd ol!

– Gəl, yaxşı, ağ eləmə!

Nağı tərəddüd içində maşına yaxınlaşdı. Keçib arxa tərəfdə dinməz-söyləməz oturdular.

– Deməli, yalan deməyəcəksən?

– Deməyəcəyəm.

– Malades də, oğulsan, öz əqidəndə axıracan qaldın.

– Bəsdi, Nağı, qurtaraq bu söhbəti.

– Mən sənin bu murdar əqidəbazlığından iyrənirəm, Kərim.

– Hə, elədi. Bayaqdan o yalanı mənə dedirtməklə də qarnının azarı bu idi. Ancaq iyrənmirsən, qorxursan, Nağı. Bayaq dediyin düz idi.

– Sən həmişə əqidəbaz olmusan, bilirsən də?

– Bilirəm. Ancaq hərdən gicləməyim də olub. Bayaq özün dedin.

Nağı maşının aşağı yanında, kabinanın dal tərəfində, küncə qısılıb oturmuşdu. Büzüşmüşdü, balacalaşmışdı. Kabina ilə kuzovun arasındakı şüşədən düşən zəif işıqda, onun onsuz da qara sifəti, həmişəkindən də xeyli qara görsənirdi. Və görən, bu nə sirr idi ki, Nağının sir-sifəti Kərimin nəzərində yenə dəyişdi, doğmalaşdı. Bu adama Kərimin axı nəyə görə yazığı gəlməli idi – o ki azca əvvəl Nağının insan olduğuna ölənəcən şübhə eləməyə hazır idi.

Əgər Nağı bircə kəlmə xoş söz desəydi, indi Kərim Nağı ilə sevinə-sevinə barışardı. Ancaq Nağı o xoş sözü demədi.

– Bu öküz əqidəsiynən, tutaq ki, bir mərtəbə də dırmaşıb, doktor oldun, bəs sonra neyləyəcəksən?

Kərim:

– Sənin kimi məsləksizin hesabına doktor olanların anasını ağladacağam! – dedi. Və son bir neçə il ərzində məhz indi, ilk dəfə o, elmlər doktoru olmağa ürəyində bir isti həvəs duydu, ehtiyac hiss elədi.

Nağı yerində qurcalanıb, yönünü Kərim tərəfə döndərdi.

– Bəli! – dedi. – Xalis öküz əqidəsi! Day bunun bundan o yanı yoxdu... Nədi? Nə dişlərini ağardırsan?

– Neynim, gülməlidi də... Bilsəydim ki, məndən nə istəyirsən, yenə dərd yarı idi.



– İstəyirəm ki, adam olasan.

– Baş üstə!

Nağının sir-sifəti bir azca işıqlandı. Və bu işığı bir müddət Nağı sanki bilə-bilə üzündə saxladı ki, daha Kərim bir söz deməsin, söhbət buradaca qurtarsın və bu gecə onlar, lap həmişəlik ayrılası olsalar belə, gələcəkdə bir də görüşməyə barı bir balaca ümid yeri qalsın.

Və irəlidəki o məchul ümidə yorğun-yorğun, yuxulu-yuxulu baxa-baxa da onlar Kərimin evinin qabağına çatanacan dinməz-söyləməz oturdular. Kərim maşından düşdü, Nağı maşında qaldı.

– Tahirəyə de aşağı düşsün, – dedi və başını hirsli-hirsli silkələyib, Kərimi bərk-bərk hədələdi ki: yəni sən get, maşının pulunu mən verəcəyəm.

## V

Sonra isə nə Nağı, na Tahirə vardı. O qəribə gecə də bu dünyanın üzündən qəflətən yoxa çıxmışdı.

Gün düşmüşdü. Həmişəki qırmızı günəş idi: pəncərənin yaşıl pərdəsini tel-tel, ilmə-ilmə yalayıb-çözəyirdi.

Kərim təzəcə oyanmışdı.

Validə Kərimin böyründə qısılıb yatırdı.

Kərim o yalanı Validəyə deməmişdi. Ancaq pəncərənin yaşıl pərdəsini tel-tel, ilmə-ilmə yalayıb-çözəyən o günəşin işığında (nə qədər qəribə olsa da) bu saat Kərimə elə gəlirdi ki, dünyanın Buzovnamı, Məşdağamı hansı bir yerindəsə onun doğrudan da bir yaxın qohumu yaşayır. Və əgər ötən gecə o qohumun başında bir iş olmasaydı, heç o həngamə də bəlkə Kərimin başına gəlməyəcəkdi.

## MAY GÜNÜ

*T.G.Kalyaginaya*

Dərənin döşündə evlər arı pətəkləri kimi yan-yana düzülmüşdü. Damlarda müxtəsərcə qar vardı. Ordan-burdan tüstü qalxırdı, bir də orda-burda itlər hürüşürdü.

Mərdan kənddən xeyli aralıda – bayaqdan oxuyub, hüştürək çalıb, daşına-torpağına qan uddurduğu dağın kəlləsində dayandı. Kəndə baxdı. Bacısı Səfurənin damından qalxan tüstünü tüstülərin içində çox asanlıqla ayıra bildi, ancaq axşamın düşdüyünə görə sevindiklərindən-mi, qorxduqlarındanmı, nədənsə, səs-səsə verib, can-dildən hürüşən itlərin səsi içində öz itinin səsini eşidə bilmədi. Qanı qaraldı. Üzüaşağı – kəndə sarı gedə-gedə Mərdan ürəyində iti məzəmmət elədi, çünki ay yarım idi ki, Mərdan kənddə yox idi və onun fikrincə, məhz bu ayyarımda it daha bərkdən hürməli idi, hürüb kənddəki itlərin səsini batırmalı idi və o vicdansız Səttar oğlu Məhəmməd bu səsi hər axşam eşitməli idi; bilməli idi ki, Mərdan sağ-salamatdır, Mərdan yaşayır və Mərdanın əvvl-axır bu kəndə qayıdacağını həmin Səttar oğlu Məhəmməd hər gün, hər dəqiqə bilməli idi... Bu "məsul" iş isə məhz köpəyin boynuna düşürdü və Mərdanın fikrincə, itin buna mütləq qanacağı çatmalı idi...

Ancaq it hürmürdü. İtin bu dönüklüyü nə qədər qanını qaraltsa da, kəndə yaxınlaşıb, dərədəki pətək-pətək evləri yaxından görəndə Mərdanın ürəyi tab gətirmədi. Sevindiyindən qışqırmaq istədi, ancaq qışqırmadı. İstədi ki, ucadan bir fit versin, ancaq fit də vermədi. Bunların hamısının əvəzində Mərdan haçansa quraşdırdığı, klubun divarına, kolxoz tövləsinin dirəyinə, məscid qapısının tğına yazıb, aləmə car elədiyi şeiri ilhamla, avazla dedi:

Ana yurdum, doğma kəndim Buzbulaq,
Çöllərində bitər yarpız, quzqulaq.
Bu diyarda heyf ki var bir dənə də uzunqulaq,
İsmi olsun Səttar oğlu Məhəmməd.

Ferma müdiri Məhəmmədin evi kəndin lap yuxarı başında idi. Ordan da tüstü qalxırdı. Şeiri deyib qurtaran kimi Mərdanın qanı qaraldı.



Özü də ona görə yox ki, nifrət elədiyi, görmək istəmədiyi bir adamın evini görmüşdü, adını yadına salmışdı. Ona görə ki, nifrət elədiyi, görmək istədiyi bu adamın adını (nə qədər təəccüblü olsa da) Mərdan öz itinə qoymuşdu. İt isə hürmürdü ki hürmürdü...

Evinin həyət qapısını Mərdan birdən açmadı. Əvvəl qapının halqasını lap ehmalca çıqqıldatdı. Çıqqıldatdı ki, görsün it həyətdə barı sayıqmı oturub. Ancaq itdən səs-səmir gəlmədi. Bu dəfə Mərdan yavaşca qapıya toxundu. Qapı çırıldadı: yenə də nə səs, nə hənirti. Və birdən-birə Mərdan qapıya elə bir təpik qoydu ki, qapı az qaldı çərçivəsindən oynasın; həyətə girdi, dörd tərəfə boylandı: itin bu həndəvərdə heç izi-tozu da yox idi.

– Məhəmməd! Qaplan! Qaplan! Ay it, ham-ham-ham...

Mərdan hirsindən it kimi hürdü və yalnız bu vaxt haradasa bir küçük zingildədi. Səs deyəsən eyvanın altından gəlirdi – otun arasından (Mərdanın bacısı oğlu Fərrux yayda həyətin otunu biçib, qurudub ora yığmışdı).

Axşamın ala-toranında, eyvan altının qaranlıq bir küncündə otun arasına qısılıb, zəiflikdən hürməyə belə gücü çatmayan iti görəndə Mərdan gözlərinə inanmadı (boynuna zəncir salmışdılar, zənciri eyvanın dirəyinə bağlamışdılar). "Qaplan" da, "Məhəmməd" də bu idi, ancaq itdən bir dəri, bir də sümük qalmışdı.

– Sənsən? Sənmisən, ay it?!

Əvvəl Mərdan qəzəbindən əlini gəmirdi, dodaqlarını çeynədi, dişlərini qıcırdatdı, sonra özü öz alnına elə bir yumruq ilişdirdi ki, bir anlığa gözləri qaraldı və həmin anda da Mərdanın gözlərindən giləgilə yaş töküldü...

Sonra zənciri açdı, iti qucağına alıb işığa çıxartdı. Eyvanın qabağındakı hinin qapısına bir güclü təpik vurub, oradakı toyuqları cikkildətdi. Toyuqlar yerlərində idilər, deməli, elə bu axşam Fərrux burada olmuşdu (toyuqları hinə salmışdı, hinin qapısını bağlamışdı). Həyətin səliqə-səhmanı da yerbəyerində idi, deməli, Səfurə də gəlib-gedirdi... Bəs bu zalımlar bu iti niyə bu günə salmışdılar?.. Mərdan, it qucağında, əyilib çərçivənin altındakı deşikdən evin açarını çıxartdı. Qapını açıb dəhlizə girdi. İti dəhlizdə yerə qoymaq istədi. Qoymadı. Yer nəm idi. "Olmaz, – dedi, – üşüyürsən, donursan, yazıq heyvan... Ə, sən lap acizinavaranın biriymişsən ki, Məhəmməd! Mən səni belə bilməzdim.

Ayyarım nədir ki, cəmi ay yarım. Ay yarım başını saxlaya bilməmisən. Bəs onda mən yazıq neyləyim? On ildir ki, atasız-anasız bu dünyada baş girləyirəm... Zəncirləmişdilər deyirsən? Nə olsun ki, zəncirləmişdilər, qoymayaydın zəncirləsinlər, möhkəm duraydın... Allahın Fərruxuycan da ağlın olmayıb. Aldadıb səni – zənciri boynuna keçirib... Yaxşı, Fərrux, yaxşı, padles, sənnən mənimki sonraya qalsın!" Evin içi də tərtəmiz silinib-süpürülmüşdü, üstəlik, sobanı da qurmuşdular, yandırmışdılar, altında odun vardı. Mərdan iti sobanın qabağına salınmış köhnə palaz parçasının üstünə qoydu. İşığı yandırdı, ancaq tez də söndürdü, çünki evə gələndə onu yolda-rizdə heç kəs görməmişdi və burası Mərdanın lap ürəyindən olmuşdu: hər halda, bir gecəlik də olsa, o, bacısının danlağını eşitməyəcəkdi, sorğu-sualına cavab verməli olmayacaqdı. Bayaq kəndə girəndə Mərdanın birinci arzusu bu gecə danlaqsız, sorğu-sualsız yatmaq idi. İndi bu məsələ Mərdanı o qədər də qorxutmurdu. Mərdanı qorxudan Fərrux idi: "Birdən, – dedi, – işığı görüb cumarsan, padles. Öldürrəm, qana bataram..."

Və itə baxdıqca Mərdan yalnız Fərruxu görürdü, zənciri görürdü. Bacısı oğlunu döymək üçün Mərdanın əli gicişirdi, ürəyi əsirdi. Ancaq bu gün yox. Bu gün Mərdanın əlindən xata çıxa bilərdi. Buna görə sobanı da yandırmadı, bir köhnə pencək tapıb itin üstünə saldı. İt vurnuxdu, narahat oldu, ancaq pencəyin altından çıxmağa gücü çatmadı. Mərdanın özü pencəyi itin üstündən götürdü. "Özün bilərsən, – dedi, – mən səni məcbur-zad eləmirəm. Ancaq incimə məndən, hələ peçi yandıra bilməyəcəyəm. O padles hələ yatmayıb, tüstü çıxsa, cumub gələ bilər... Yemək istəyirsən? Nə istəyirsən?.. Qoy baxım görüm nə var".

Mərdanın bütün azuqəsi dəhlizdəki böyük divar şkafının müxtəlif gözlərində idi: yuxarı gözdə bir dəstə quru lavaş, o biri gözlərdə küpədə duzlu suya qoyulmuş pendir, ərinmiş yağ, Səfurənin bişirdiyi mürəbbələr... Burada ayyarım əvvəl nə vardısa, hamısı yerində idi. Mərdan bir parça lavaş isladıb yağa batırdı. Əlindəcə itin ağzına tutdu. İt yemədi. Yazıq-yazıq zingildədi. Sonra yağlı çörəyi burnunun ucu ilə sürüşdürüb, bilə-bilə yerə saldı və hədsiz-hüdudsuz bir acgözlüklə Mərdanın quruca əlini yalamağa başladı. İt yalayırdı və sevinclə zingildəyirdi. Və bu sevincək zingilti ilə itin nə dediyini Mərdan aydın başa düşürdü. Həm də Mərdan tam əmin idi ki, it bayaqdan eyni sözü deyir, eyni şeyi soruşur. Və məhz sorğu-sualdan zəhləsi getdiyi üçün Mərdan itə cavab vermirdi. Nəhayət, dözmədi: "Harda olacağam –



dedi, – cəhənnəmdə-gorda idim. Öz giciliyimdən gedib türməyə düşmüşdüm... Bu zəhrimarı niyə yemirsən? Ölmək istəyirsən? Nə olar, özün bilərsən. Ancaq az zarı, az çərənlə, bəsdir, baş-beynim getdi..."

O, yalanmış yaş əlini palaz parçasına silib, özünü tappıltı ilə çarpayının üstünə atdı. Çarpayı cırıldadı, xeyli vaxt cırıldadı və qəribə burasındadır ki, çarpayının cırıltısı kəsiləndə, itin səsi də eşidilməz oldu. Otaqda sükut qaldı. Soyuq. Qaranlıq. Bir it və bir adam.

Papiros çəkə-çəkə və bir dünya zülmətin içində yeganə işartı kimi qalmış dördgöz pəncərə şüşəsinin soyuq bozartısına baxa-baxa Mərdan səbirlə axşamın sovuşmasını gözlədi. Gözlədi ki, camaat yatsın, durub işığı yandırsın, sobanı qalasın, bir ovuc un götürüb it üçün yal düzəltsin.

Mərdanın ürəyinə dammışdı ki, it öləcək, onun əvvəlki gur, sağlam səsi bu həyətdə bir də heç vaxt eşidilməyəcək və o səsin həmişəlik kəsiləcəyini fikirləşdikcə Mərdan dəhşətə gəlirdi. O səsdə çox şey vardı, bunu təkcə Mərdan bilirdi. Küçədə, çöldə, çayxananın qabağında – kəndin harasında olsa, Mərdan o səsi eşidəndə sevinirdi, ürəklənirdi, çox vaxt evə də onu elə o səs çəkib gətirirdi. O səsdə o qədər ümid, o qədər inam vardı ki... Bir də mehribanlıq, heç vaxt azalmayan, heç nədən dəyişməyən mehribanlıq... Bir də o səs ömrünün ən xoşbəxt bir gününü Mərdanın yadına salırdı: məktəbin həyətini, Zəhranı, bir vaxt məktəb həyətində açmış yasəməni... O gün Qaplan bapbalaca bir küçük idi. O gün Qaplan heç hürə də bilmirdi. Ancaq elə ki böyüdü, elə ki hürməyə başladı, özünün ümid dolu, sevinc dolu səsi ilə it o günəşli-yasəmənli yaz gününü Mərdanın yadına salmağa başladı. May günü idi. Məktəbin həyətində tar-kamança çalırdılar... Zəhranı da oynamağa çağırırdılar. Zəhra oynamadı. Mərdanın üzünə baxıb utana-utana qırağa çəkildi. Üç il sərasər onlar yalnız baxışmışdılar, ancaq Mərdan belə baxış görməmişdi. O baxış elə bil ürəyə düşüb ömürlük qalmaq üçün idi, ürəyi ömür boyu isitmək, ağrıtmaq üçün idi... O istini, işığı Mərdan bütün günü ürəyində gəzdirdi. Günorta onuncu sinfin şagirdlərindən beş-altı nəfər bir yerə yığışıb, dükandan çaxır aldılar, evdən pendir-çörək götürüb meşəyə getdilər. O gün meşədə sevincdən necə nərə çəkməyi Mərdanın yadında idi, həm də nəinki yadında, içində idi, qulağında idi... Oxuya-oxuya, sevinə-sevinə onlar gedib qonşu kəndə çıxdılar. O gün Qaplanı da Mərdan qonşu kənddəki

bir qoca bostançıdan aldı. Bir cüt təptəzə çəkməsinin bahasına aldı və oradan Buzbulağa ayaqyalın qayıtdı.

O təptəzə çəkmələrə görə Səfurə onu danlamaya bilməzdi. Danladı. Çox danladı. Ancaq, qəribədir, sanki ordan məhz ayaqyalın gəldiyinə görə o qəribə may gününü Mərdanın ayaqları da xatırlayırdı. Çəkmələrini tərəddüdsüz çıxarıb, bostançıya verəndən sonra Mərdan elə bil tikanlı, daşlı-kəsəkli yollarla gəlməmişdi, sanki o, işıqdan, ümiddən, sevincdən yoğrulmuş yumşaq bir boşluğun üstündə yerimişdi və bu saat çarpayıda uzanıb barmaqlarını tərpətdikcə o isti və yumşaq boşluqda Mərdan sanki təzədən yeriyirdi... Qucağında küçük, – yumru, yumşaq it balası...

Küçük yaman tez böyüdü. Üçcə ayın içində lap yekəcə bir it oldu: gur səsli, enli pəncəli; baxışından, yerişindən, az qala tükündən də sevinc, xoşbəxtlik yağan bir məxluq. Onu Mərdan heç vaxt bağlı saxlamamışdı, çünki buna ehtiyac yox idi. Çünki Qaplan özbaşına heç vaxt heç yerə getmirdi. Mərdanın özü ilə bir yerə çıxanda da ömründə bir kəsə hürdüyü olmamışdı. Qaplanın adamlarla rəftarında ağlasığmaz dərəcədə qəribə şeylər vardı: qadınlara yerli-dibli dəyib-toxunmurdu. Oğlan uşaqlarının qorxmayanlarını elə bil bir baxışdan tanıyırdı; onlarla oynayırdı. Qorxaq oğlan uşaqlarını saymırdı, adam yerinə qoymurdu. Balaca, heybət qızları açıq-aşkar dolayırdı, onları görəndə başını yana döndərib hic-hic quyruğunu tərpədirdi və Qaplanın bu məzəli "teatrına" hər baxanda Mərdan elə ucadan gülürdü ki, bəlkə bütün kənddə onun səsini eşitməyən adam qalmırdı. Mərdana ayrı cür it lazım deyildi, çünki onun malı-davarı yox idi, böyük təsərrüfatı yox idi. Ancaq Qaplanı kənd arasına çıxarıb, kəndin ən güclü itləri ilə boğuşdurmaq Mərdana arabir lazım olurdu və bu işdə öz yiyəsini Qaplan heç vaxt pərt eləmirdi. Kənardan olduqca aciz, olduqca sakit və bir az da gülməli görünən bu itin kənddəki itlərin hamısından güclü olmağı Mərdana hədsiz dərəcədə ləzzət verirdi. Nə olsun ki, Mərdanın iti Buzbulaqda ən müftəxor it hesab olunurdu: "Mal güdmür", "həyət gözləmir", "havayı çörək yeyir" deyirdilər. Təxminən buna oxşar sözləri elə Mərdanın özü barəsində də deyənlər vardı, çünki Mərdan məktəbi qurtarıb, oxumağa getməmişdi və neçə vaxt idi ki, bir işdən-gücdən də yapışmırdı. Ancaq Mərdan heç cür ağlına gətirmirdi ki, günlərin bir günü bacısı Səfurə, Zəhranın sözünü almaq üçün, Səttar



oğlu Məhəmmədin qapısına elçi gedəndə, məhz bu it söhbəti ilə Məhəmməd Səfurəni geri qaytaracaq: "Mən it otarana, it oynadana vermək üçün qız böyütməmişəm", – deyəcək.. Və tək qalmış yetim qardaşını evləndirib, öz ata ocağının işığını həmişəlik yandırmağı çoxdan arzulayan Səfurə o qapıdan suyu süzülə-süzülə qayıdacaqdı.

Bu əhvalat Mərdanı, əlbəttə, dilxor elədi, ancaq elə həmin gün axşamçağı qızı görüb, onunla çay kənarında xeyli pıçıldaşandan sonra Mərdanın ürəyi yerinə gəldi. Daha o, hardan biləydi ki, Məhəmməd gecələrin birində qızı kənddən səssiz-səmirsiz itirəcək, əl altdan ər tapıb, kəbin kəsdirib, aparıb rayondakı bir çəkməçinin evinə qoyacaq... Bunu eşidəndə qan Mərdanın beyninə vurdu. Məhəmmədi təklikdə görsəydi, bəlkə də əlindən xata çıxacaqdı. Yaxşı oldu ki, çayxanada gördü. Əvvəl onlar göz-gözə durub, xeyli vaxt dinməz-söyləməz baxışdılar. Sonra Mərdan Məhəmmədin üzünə tüpürdü. Lomba ilə tüpürdü. Və: "Mən kişi deyiləm, əgər sənin adını itimə qoymasam!" – dedi. Özü də lap yəqin ki, əlacsızlıqdan, ayrı söz tapmadığından dedi. Dedi, boynuna düşdü, çünki dediyindən dönmək Mərdanın işi deyildi.

O gündən Qaplanın adı "Məhəmməd" oldu.

– Məhəmməd, ay it, bu yana gəl...

– Məhəmməd, ay it, o yana get...

Özü də lap ucadan, hamıya eşitdirmək üçün.

Bunu Mərdan camaat arasında, hətta Məhəmmədin lap öz yanında deməkdən də çəkinmədi:

– O qoyunun bağırsağını bura ver, a kişi, təmizləmə, eləcə ver, Məhəmmədə yedirdəcəyəm...

Bunun üstündə Səfurə Mərdanı məzəmmət elədi: "Ayıbdır, günahdır, peyğəmbərin adını itə qoymusan". Sonra Səfurə də səsini kəsdi. İt özü də öz təzə adına öyrəşdi, üstəlik həmin o dörd sətirlik şeir də klubun divarında, kolxoz tövləsinin dirəyində, məscid qapısının tağında peyda olandan sonra, Mərdanın ferma müdiri Məhəmmədə sataşmağı kənddə adi bir şeyə çevrildi. Məhəmməd içindən qovruldu, ancaq səsini çıxara bilmədi. Əgər Mərdan günlərin bir günü rayona getməsəydi, gedib orda araq içməsəydi, yaxud Zəhraya birdən-birə müştəri çıxmış o çəkməçi vicdansıza heç olmasa içməmişdən rast gəlsəydi, bəlkə hər şey elə beləcə də sovuşub keçəcəkdi. Əslində heç içəndən sonra da Mərdanın çəkməçi ilə yumruq davası eləmək fikri yox idi. Sataşıb keçmək istəyirdi. Zalım oğlu dilini dinc qoymadı. Özü

də Mərdanın bir yumruğundan tir-tap yerə sərilib, huşunu itirib, o saatca "xəstəxanalıq" oldu. Mərdanı oradanca gətirib həbsxanaya saldılar. O özü öz günahını hamıdan yaxşı bilirdi. Bilirdi ki, nahaq yerə həbsxanaya düşməyib, cəzasını çəkməkdən qorxmurdu, ancaq Səfurənin danlağından qorxdu, bərk qorxdu və yalnız bu qorxunun ucbatından, həbsxanada yatdığı ayyarımda Mərdan iki ayağını bir başmağa dirəyib, bacısının görüşünə çıxmadı. Hətta gətirdiyi payı da Səfurə həbsxananın qapısından hər dəfə qaytarmalı oldu.

Pəncərə şüşəsindəki soyuq bozartıya baxa-baxa Mərdan fikirləşirdi ki, lap yaxın vaxtlarda bir iş tapıb, mütləq işləməlidir, ev-eşiyə, həyət-bacaya özü baxmalıdır, lazım gəlsə lap evlənməli, Səfurəni iki evin qəhrini çəkməkdən qurtarmalı və onun neçə illik xəcalətindən də yavaş-yavaş çıxmalıdır... Fikirləşirdi ki, it sağalsa daha onu "Məhəmməd" çağırmayacaqdır, üstəlik bir yol tapıb, Səttar oğlu Məhəmmədlə mütləq barışacaqdır. Qız getmişdi, məsələ bitmişdi, bundan sonra ədavət saxlamağın nə mənası vardı. Amma Mərdan iti bu günə salmış Fərruxu bağışlaya biləcəyinə heç cür inanmırdı. Bu məsələdə Mərdanın, bacısı Səfurəyə də deyiləsi sözü çox idi: "Türməyə mənim üçün pay gətirir. Mənə pay gətirincə insafın olaydı, bu itin qabağına bir parça çörək ataydın. Allaha şükür, aclıq deyil, qıtlıq deyil. Bu saat dünyada çörəkdən bol nə var..."

Mərdan öz-özünə danışırdı. Qaplan sobanın qabağında aram-aram nəfəs alırdı və bir dünya zülmətin içində dördgöz pəncərə şüşəsi soyuq-soyuq bozarırdı...

Gecənin bir aləmində o, işığı yandırdı, sobanı qaladı. Gecənin bir aləmində ay çıxdı və o ayın işığında Mərdan həyətdə, divarın dibində dərin bir quyu qazıb, ölü iti, palaz parçası qarışıq, o quyunun tərkinə qoydu. Ay səhərəcən batmadı. İşıq səhərəcən yandı və yarısı yerə dağılmış hərra səhərəcən sobanın yanında qaldı.

Yalnız səhərə yaxın Mərdan azca yuxulaya bildi və səhərin gözü açılan kimi Mərdanın da gözləri açıldı. Şalvarı, köynəyi əynində idi. Hətta ayaqqabılarını da çıxarmamışdı. Bircə pencəyini çıxardıb stulun başına atmışdı. Üşüyürdü (yorğansız yatmışdı), ancaq pencəyi götürüb üstünə salmağa ərdəmi çatmadı. Ürəyi papiros istəyirdi, əlini uzadıb, böyründəcə – stolun üstündəki papirosu götürməyə tənbəllik elədi.



Mərdan gözlərini tavana zilləyib, uzun müddət tərpənmədən fikirləşdi. O vaxtacan fikirləşdi ki, otaq lap işıqlandı. Gün çərtdi, pəncərənin lap başdakı şüşəsini qızartdı. O vaxtacan ki, həyətin qapısı cırıldadı. Fərrux içəri girib, toyuqları hindən buraxdı, hüştürək çala-çala onlara dən səpdi. Fərrux öz vəzifəsini layiqincə yerinə yetirib getmək istəyəndə, birdən başını qaldırıb, yuxarıdan, eyvanın məhəccərinə söykənib, dinməz-söyləməz aşağı baxan dayısını gördü.

– Dayı, gəlmisən? – dedi və elə ürəkdən sevindi ki, bunu Mərdan istəməsə də, hiss eləməli oldu.

– Toyuqlarını yaxşı bəsləyirsən, bacıoğlu. Dəndən-sudan korluq vermirsən.

Fərrux sevindi, aşkar qürrələndi:

– Builki cücələri görürsən? – dedi. – Hamısı yumurtlayır, dayı. Yumurtlamayan bir dənə də yoxdur.

– Deynən, sən öl.

– Sən öl!

– Ə, sən mənə "sən öl" deyirsən?!

– Yalan demirəm ki, istəyirsən anamdan soruş.

Fərruxun heç nədən xəbəri yox idi. Bilmirdi ki, dünəndən bəri dayısı dişini qıcıyıb, onu döyməyə hazırlaşır. Bilmirdi ki, it ölüb və bu toyuq söhbətinin altında nə gizləndiyini Fərrux ağlına gətirmirdi. Məsələ burasındadır ki, Mərdan da çaşmışdı. Dünən axşamdan bəri gözlədiyi qatilin, əzazilin yerinə həmişəki Fərrux gəlib çıxmışdı. Həmin Fərrux: mehriban, işgüzar, üzüyola... Səhərin gözü açılan kimi gəlib toyuqları yemləmişdi, indi qaçıb dayısının gəldiyini sevinə-sevinə anasına xəbər verəcəkdi, sonra yenə nə desələr – eləyəcəkdi. nə versələr – yeyəcəkdi və məktəbə "beş" almağa gedəcəkdi... Vəziyyəti istədiyi məqama gətirib çıxartmaq üçün Mərdan heç olmasa özünü hirsləndirməyə çalışırdı, buna görə də həyətə enib, lap qəfildən Fərruxun başının üstünü aldı:

– Sən çox padles adamsan, Fərrux!

Fərrux yenə gülümsədi, mehribanca dayısının üzünə baxdı:

– Niyə ki, dayı? – dedi. – Niyə hirslənmisən, dayı?

– Niyəsini bu saat göstərəcəyəm sənə!

Mərdan bacısı oğlunun qolundan yapışdı, çəkib eyvanın altına gətirdi.

– Hanı it? İti neynəmisən? De görüm, svolıç, mənim itim hardadır?

Bir ucu otun üstündə, bir ucu eyvanın dirəyində olan boş zənciri görəndən sonra Fərrux eyvanın dörd bir tərəfinə elə-belə, vaxtı uzat-

maq üçün baxdı. Yəqin ki, gözlərinə inanmırdı. Bir neçə saniyə, Fərruxun doluxsunmağı üçün də, itin taleyinə ürəkdən acıyıb ağlamağı üçün də tam kifayət elədi.

– Dünən burdaydı! – dedi. – Həzrət Abbas haqqı, dayı! Bu gecə qurd gəlib aparıb, ya da itlər aparıblar... Xəstə idi, onsuz da öləcəkdi. Çörək-zad yemirdi.

O başdan, itin yatdığı yerdən Fərrux qorxa-qorxa dayısının üzünə baxırdı. Mərdan iki dirəyin arasında durmuşdu. Özü də elə durmuşdu ki, guya Fərrux bu saat qaçacaqdı, onu tutmaq lazım olacaqdı. Ancaq Fərruxun duruşunda qaçmaq deyilən şeyin heç əsər-əlaməti də yox idi. Buna görə Mərdan ürəyində tutduğunu eləyə bilmirdi.

– İti sən öldürmüsən, suka, acından öldürmüsən.

– Yox, dayı! On iki imam haqqı, dayı! Hər gün çörək vermişəm.

– Sən mənə yalan deyirsən, ə?! Bu boyda boyunnan məni aldatmaq istəyirsən?!

Mərdan irəli cumanda Fərrux elə bildi ki, dayısı onu vuracaq. Ancaq yenə də qaçmadı. Mərdan da Fərruxu vurmadı. Otun arasındakı zənciri götürdü, bir göz qırpımında Fərruxun boynuna keçirdi. Sonra uşağın öz cibindəcə, içində toyuqlara dən gətirdiyi iri dəsmalı dartıb çıxartdı. Fərruxun qollarını da arxada cütləyib, dəsmalla bərk-bərk sarıdı.

– Burax, dayı, neynirsən, dayı? Vallah, dayı, məndə taxsır yoxdur...

Fərrux bir az susdu. Nəsə fikirləşdi:

– Dəli olmuşdu, – dayı, – dedi, – küçədən adam-zad buraxmırdı. Xoruşundan daşı-torpağı çeynəyirdi, axşamacan didib-dağıdırdı özünü.

– Sən eləmisən də, öz-özünə dəli olmayıb ki!

Fərrux yazıq-yazıq dilləndi:

– Mən eləməmişəm, dayı...

– Bəs kim eləyib?

– Anam tapşırıb ki, sənə deməyim.

Mərdan bir-iki addım irəli yeridi, Fərruxun lap gözünün içinə baxdı:

– Kim eləyib? De, qorxma, heç kəsə demərəm.

– And iç, deyim.

– Nəyə and içim?

– And iç ki, anama deməyəcəksən.

– And içirəm: sən öl, deməyəcəyəm.

Fərrux dedi:

– Məhəmməd eləyib! – Və yalnız bu ikicə sözü dayısına dedi. Qalanını daşa dedi, torpağa dedi, quruca havaya dedi: – Bir yekə ətin arasına mal iynəsi ilə dərman vurmuşdu. Əti hasardan həyətə atmışdı. Biz gecə itin zingiltisini eşitdik. Gəlib gördük ki, ölür. Ağzından qan gəlirdi. Ətin yarısını yemişdi, yarısı qabağında qalmışdı. Bildik ki, Məhəmmədin işidir. Səhərisi gün toyuqlara dən verməyə gələndə mən

## ÜRƏK YAMAN ŞEYDİR...

### I

Sərvər əsgərlikdən bir ayrı vaxt gəlmiş olsaydı, bəlkə kənddə belə tez darıxmayacaqdı. Ancaq o, payızda gəldi. Payızın lap axırlarında. Gəlib gördü ki, çöl-bayırdan əl-ayaq kəsilib, atasının hər il kolxoza əkdiyi bostan sovuşub... Dağlarda ayrı vaxt adam boyunca qalxan otələf son çöpünəcən biçilib-daşınmışdı; bağların mer-meyvəsi çoxdan dərilmişdi, xəzəli yandırılmışdı; Sərvərgilin heyva ağaclarındakı beş-altı heyva və döşlərdə, kolxoz xırmanlarında saralan üç-dörd taya saman – meşəli, bağlı-bağçalı Buzbulaq kəndinin bir dünya payızından qalan xırdaca xatirə idi, özgə bir şey deyildi.

Əsgərlikdən gələn günü Sərvər kənd arasına çıxıb üç il görmədiklərinin hamısını bir neçə saatda nə ki var gördü. Gördü ki, yenə qızlar, qadınlar çeşmələrdən su daşıyır, kişilər çayxanada çay içir, uşaqlar klubda domino oynayır. Gördü ki, axşamüstü adamlar yenə çinarın dibinə yığışırlar, futboldan, siyasətdən danışırlar, sonra küçə-küçə məhəllə-məhəllə evlərinə dağılışırlar və üç il bundan qabaqkı kimi, yenə də gedə-gedə, yol uzunu eyni sözlər deyib, eyni qayda ilə bir-birlərini axşam çayına-çörəyinə dəvət eləyirlər.

O axşam evə qayıdanda küçənin bir yerində Sərvər təzəcə papiros çəkməyə başlayan bir dəstə oğlan gördü; küçənin başqa bir yerində, təzəcə pıqqıldaşmağa başlayan bir dəstə qız gördü. Gördü ki, yenə kənddə atasına Pişik Ağalar deyirlər, anasına Cücəli Xanım deyirlər. Və birdən-birə hiss elədi ki, darıxır.

Sərvər birdən-birə yəqin elədi ki, qışı kənddə keçirmək onun üçün çətin olacaq: nə bir hərəkət, nə bir maşın dırıltısı; qarlı dağlar tam üç-dörd ay göyün ətəyinə dirənib duracaqdılar – Buzbulağın dünyadan əli üzüləcəkdi... Ev – çayxana, çayxana – ev... Qış Sərvəri qorxutdu, dəhşətə gətirdi və Sərvər bu dəhşətlə yatıb, yuxusunda isti və işıqlı bir yay gecəsi gördü.

O, atasının bostanında idi, çalanın üstündə yatırdı, həm də elə bil onu yerdən-bostandan çalaqarışıq bir xeyli yuxarı qaldırmışdılar və buradan Sərvər bütün bostanı rahatca görə bilirdi. Bostanın üstündə



süd kimi ay işığı vardı və iri-iri, ağ-ağ qovunlar bu işıqda, qoyun sürüsü təki yatışmışdılar. Sərvər qovunlara baxırdı, həm də bostandan aralıda, dağın dibində böyürtkən kollarına oxşayan qara kölgələr görürdü. Kölgələr qımıldaşırdılar, pıçıldaşırdılar – nəsə qorxulu bir iş görməyə hazırlaşırdılar. Sonra kölgələr sürətlə hərəkətə gəldilər, bostanın üstünə yeridilər və böyürtkən koluna oxşayan bu kölgələrin içindən zil qara yapıncılı nəhəng bir çoban çıxıb, çomağını yuxarı qaldıran kimi tağlarda, bostan boyunca yatmış iri-iri, ağ-ağ qovunlar tərpəşib hərəkətə gəldilər və o saatca bir ağ qoyun sürüsü olub, sürətlə dağ səmtə gedən qara yapıncılı nəhəngin arxasınca töküşdülər. Sərvər qışqırmaq istədi, qışqıra bilmədi, yerindən durmaq istədi, dura bilmədi. Sonra birdən hava işıqlandı, səhər açıldı və Sərvər həmin qara yapıncılı adamın Əjdər olduğunu gördü. Əjdər dağın lap kəlləsində dayanmışdı; Sərvərə əl eləyirdi: "Bakıya gəl... Bakıya gəl... Bakıya... Bakıya... Bakıya..."

Hələlik yuxu yuxuluğunda, Əjdər Əjdərliyində qalsın, əsas mətləb burasındadır ki, səhərisi yataqdan duranda Sərvər, özlüyündə, qışın məsələsini tamam həll eləyib qurtarmışdı. Əl-üzünü sevinə-sevinə yudu, çörəyini tələsə-tələsə yedi, küçəyə çıxıb qonşuluqdakı çoxdan kimsəsiz qalmış bir evin qapısında bir müddət ayaq saxladı... Bu ev Əjdərin idi: həyətini qanqal basmışdı, damını ot basmışdı... Əjdərin Bakıda olduğunu Sərvər çayxanada öyrəndi. Bir də Teymur Bakıda idi; Kömürçü bazarında alver eləyirdi. Teymur Sərvərin sinif yoldaşı idi, buna görə Sərvər daha da ürəkləndi, hətta o qədər ürəkləndi ki, atasına bir söz deməmiş, anasından pul almamış, qayıdanbaş, məhəllədə özünün yol tədarükünü də elədi. O, heç vaxt heç yerə alverə getməmişdi, ancaq alış-veriş üçün bir qozun, bir də badamın başqa meyvələrdən sərfəli olduğunu kimdənsə eşitmişdi. Buna görə də Sərvər bağında, bağçasında qoz ağacı, badam ağacı olan bir neçə adamın qapısını döydü. Bir neçə evin darvazasında dayanıb ev yiyələri ilə əsl alverçilər kimi danışdı, sövdalaşdı; axırda, Şövkət arvadda otuz-qırx kilo badam yeri elədi, Gülgəz arvadda əlli-altmış kilo cövüz yeri elədi; sonra evə gəldi, anasını yola gətirdi, sonra onlar ikisi bir yerdə Ağalar kişini də birtəhər yola gətirdilər... Və bütün bunları eləyə-eləyə Sərvər xəyalında böyük Bakını gördü, orada alver eləyib, pul qazanıb, əynində təzə kostyum,

təzə palto Leninqradın bir zaman yalnız "uvolneniye" vaxtı ehtiyatla gözə bildiyi küçələrini xəyalında doyunca və ləzzətlə gəzdi. Və eyni vaxtda da o, Əjdəri və Əjdərlə bağlı olan əhvalatı xatırladı.

Əhvalat isə çoxdanın əhvalatı idi, yeddi-səkkiz ilin əhvalatı

Yay idi, qovunun təzəcə ağaran vaxtı idi. Və o yay qovunun təzəcə ağardığı vaxt, gecələrin birində Xanım arvadın bostanda, dəmir tor arasında saxladığı fərələrdən biri yoxa çıxdı. Fərənin yoxa çıxmağı səhər bilindi və o səhər Ağalar kişi ilə Sərvər bostanın dörd yanını gəzib ayaqdan saldılar, ancaq heç yerdə toyuq tükü, toyuq nişanəsi tapmadılar. O biri gecə bir fərə də yoxa çıxdı. Bu dəfə Ağalar kişi gecəni yatmayıb, səhərəcən hinə keşik çəkməyi qərara aldı. Əlində tüfəng, kolların arasında gizləndi, ağacların dalında pusdu, ancaq onun səhərə yaxın dözməyib, oturduğu yerdə bir balaca mürgüləməyi ilə səhər hindən bir toyuq da qeyb olub, əlli-ayaqlı göyə çəkildi. Ağalar kişi möhkəm dilxor oldu, çünki bu, yaxşı əlamət deyildi; çünki bu iş, heç şübhəsiz, adam işi idi – yer üzünün heç bir heyvanı o dəmir torun arasından toyuq apara bilməzdi. Bir də bu söhbət təkcə toyuq söhbəti deyildi, burada adama sataşmaq məsələsi vardı. Və bu cür adama sataşmağın axırı çox pis qurtara bilərdi, çünki bu gün-sabah qovun yetişirdi. Ağalar kişi çox fikirləşdi, kənddəki düşmənlərini çox götür-qoy elədi, hətta üç-dörd qonşu kəndin şübhəli hesab elədiyi cavanlarını da ürəyində birbəbir sayıb-sadaladı, ancaq heç bir dürüst qənaətə gələ bilmədi. Ağalar kişi o fərə oğrusunu heç vaxt görə bilmədi, onu Sərvər gördü; gecələrin birində oğru özü öz ayağı ilə gəlib çıxdı. Özü də bostanın lap ortasına, çardağın lap yanına... Ağalar kişi yatmışdı, xoruldayırdı, ancaq Sərvər yatmamışdı, çardaqda üzüqoylu uzanmışdı, aşağıda ayın süd kimi işığında bozumtul tağlar boyunca ağara-ağara səpələnib gedən yemişlərə baxırdı. Birdən Sərvər arxa

uzaqlaşıb, ta bostandan çıxanacan onlar dinməz-söyləməz yeridilər; bostanın qurtaracağında bir qoz ağacının dibində Əjdər dayandı.

– Otur.

Sərvər oturdu.

– Malades, oğulsan, səs-küy salmadın. – Əjdər gülümsədi, əlini Sərvərin çiyninə vurdu.

Bir müddət bir-birlərinə baxdılar.

– Bərk qorxdun?

Sərvər dinmədi.

– Dur bir tikə çörək tap gətir, acından lap nəfəsim kəsilir... Amma, bura bax, kişi ol, Pişik Ağaları oyatma.

Sərvər durub çörək dalınca getdi. İki lavaş gətirdi, bir qac pendir gətirdi və Əjdər çörəyini yeyib qurtarandan sonra o, ehmalca, ehtiyatla soruşdu:

– Toyuqları aparan sən idi?

– Mən idim...

– Kənddə səni bərk axtarırdılar.

– Bilirəm.

– Beş-altı milsener gəlmişdi.

- Hə?..

– Bizdən də soruşdular. Dədəm dedi ki, Bakıdasan. Bəs sən Bakıda deyildin?

– Bakıdaydım.

– Bəs niyə orda qalmadın ki?..

– Yerimi bilmişdilər. Bir əclaf satmışdı məni.

– Bəs indi neyləyəcəksən?

– Gizlənib, ara soyuyanda yenə gedəcəyəm.

Bu yerdə Sərvər sualların arasını kəsdi, çünki qalan şeylər onsuz

*muşdu. İndi burda, gecənin bu vaxtında, çölün düzündə* bu adamla yanaşı oturmaq da Sərvər üçün, əlbəttə, qəribə idi...

Sərvər susdu, Əjdərin barəsində xeyli vaxt öz-özünə düşünəndən sonra, yenə də ehmalca, ehtiyatla soruşdu:

– Bəs gecələr harda qalırsan?

Bu dəfə, cavab verməк əvəzinə, Əjdər uzun müddət Sərvərin gözlərinin içinə baxdı, onu çaşdıranacan, hətta hürküdüb qorxudanacan baxdı və bu uzun-uzadı baxışdan sonra nəhayət ki, dilləndi:

– Gedib satmazsan ki?

– Yox, ə... Nə danışırsan, heç kəsə deməгəm!..

– And iç!

– Nəyə and içim?

– Nəyə inanırsan?

Sərvər çox fikirləşdi, ancaq and içməyə bir şey tapmadı. Əjdər göydəki Ayı göstərib:

– Ona inanırsanmı? – dedi.

Sərvər başını qaldırıb aya baxdı. O gecəki ay isə elə böyük idi, elə qəribə idi ki, o aya inanmamaq doğrudan da mümkün olan şey deyildi... Buna görə də Sərvər lap ürəkdən:

– İnanıram! – dedi.

– And iç.

– O Ay haqqı, heç kəsə deməгəm!

– Di dur dalımca gəl...

Və onlar bir xeyli yol gedəndən sonra gəlib dağın dibinə, Buzbulaq camaatının "İlanmələşən" dediyi yerə çıxdılar. Burada – saysız-hesabsız böyürtkən kollarının arxasında – üstünü, dörd yanını kol basmış, tikan basmış əzgil ağacının sallaq budaqları altında Əjdər özünə yer eləmişdi. Buraya girmək üçün üzüqoylu yerə sərilib böyürtkən kollarının dibi ilə uzun müddət sürünmək lazım idi. Üstəlik, kolların dibinə ay işığı da düşmürdü. Əgdərin cib fənəri, kol-kos yığnağı olan bu sehrli aləmi azca işıqlandıra bilirdi. O gecə Sərvər, hər şeydən çox, Buzbulaq camaatının ilan yığnağı hesab elədiyi bu yerdə bir dənə də ilan görməməyinə təəccübləndi. Xeyli sürünəndən sonra onlar nisbətən açıqlığa çıxdılar. Və Əjdərin, nəhəng höpümçək toruna bənzəyən, koması qabağında Sərvər heyrətindən donub qaldı: komanın qabağındakı xeyli sahənin kol-kosunu Əjdər son çöpünəcən biçib təmizləmişdi, yeri qazmışdı, hamarlamışdı, hətta hamarlanmış yerə su da səpmişdi. Komanın dal tərəfində dağın dibində bir sısqa bulaq süzülürdü. Bulağın qabağında Əjdər əməlli-başlı bir hovuz da düzəltmişdi və hovuzun içindəki su, ay işığında, ərinmiş qurğuşun kimi parıldayırdı; komanın qabaq tərəfində – ocaq, ocağın yanında – hisli, qara çaydan; Əjdərin bostandan oğurladığı toyuqların sür-sümüyü də burada idi.

Sanki Sərvəri daha da təəccübləndirməkdən ötrü Əjdər, hələ içəri girməmiş, komanın ağzında dayanıb, astadan bir fit də verdi: elə bil küçük çağırırdı, ancaq içəridən küçük çıxmadı, kirpi çıxdı. Sərvər kirpiyə təəccüblənmədi, burada kirpinin, başını çıxarıb, çox asudə dolanmağına təəccüb elədi. Çünki kirpinin başını çıxarmağından ötrü onu uşaqlar suya salırdılar, hovuza atırdılar, yazıq heyvanın başına min cür oyun açırdılar. Kirpinin adam qabağında belə gəzməyini Sərvər birinci dəfə görürdü. Elə bil kirpi də bunu hiss elədi, Sərvərin iyini alan kimi yumurlandı, başını gizlətdi və onun bu hərəkəti, nədənsə, Əjdərin bərk xoşuna gəldi.

– Qardaşımdır. – dedi. – Mənim kimi yetimin biridir, özü dilə çox vicdanlı kirpidir, ilanlara göz verib işıq vermir... Yatanda qarovulumu çəkir.

İçəridəki şeylər isə Sərvərə tanış idi: Əjdərin sırıqlısı, neft qabı, neft çırağı, rəhmətlik Xavər arvadın su vedrəsi, xörək qazanı... (bütün bunları Əjdər bir gecə xəlvətcə kəndə girib, öz evlərindən gətirmişdi).

O hörümçək toruna oxşayan komanı, o sısqa bulağı, o kirpini, hətta o qara çaydanı və hisli çırağı da Sərvər əsgərlikdə olduğu vaxt hər gün xatırlamışdı. Zarafat deyil, bir ay, ayyarım sərasər o, atasını yuxuya verib, yaxud onu – bostanı gəzmək bəhanəsi ilə aldadıb, hər gecə o dağın dibinə qaçmışdı – Əjdərə yemək aparmışdı. Bir ay, ayyarım sərasər onlar gecə kolxoz zəmilərindən buğda yığıb, noxud yığıb, lobya yığıb hədik bişirmişdilər və Sərvər ömründə o hədikdən dadlı bir şey yeməmişdi. Və Sərvər ömründə o günlərdən gözəl günlər görməmişdi, – nə olsun ki, ürəkdə qorxu vardı, hürkü vardı. Bu boyda sirri saxlamaq, əlbəttə, asan deyildi, üstəlik, Əjdəri hələ də axtarırdılar. Hələ də onun dalınca kəndə milis gəlirdi. Məktəbdə, xüsusən Zinyət Şəkərək qızının dərslərində Sərvərin vəziyyəti daha çıxılmaz olurdu. Çünki hər dərsdə direktor igidlikdən, cəsarətdən və hər cür düşmənə

qarşı həmişə ayıq-sayıq olmaqdan danışırdı. Zinyət Şəkərək qızının təliminə görə, Əjdər də, heç şübhəsiz ki, düşmən idi, əsl "şpiyon" idi. Üstəlik, Sərvər də o vaxt uşaq deyildi, altıncı sinifdə oxuyurdu, hökumətin o qədər pulunu qaçırmağın nə olduğunu bilirdi. Buna baxmayaraq, o sirri açmaq, o yeri milsənerlərə nişan verib, Əjdəri tutdurmaq cəmisi bircə dəfə Sərvərin ürəyindən keçdi. Ancaq elə həmin gecə orada, o kolluğun-tikanlığın arasında, o hörümçək toruna oxşayan komanın qabağında Əjdərin üzünü görən kimi Sərvər özü öz fikrindən iyrəndi. Çünki orada, o hörümçək toruna bənzəyən komanın qabağında, o ayın işığında Əjdər "düşmən", "şpiyon" deyilən şeyə qətiyyən oxşamırdı; adicə Əjdər idi – uzun, arıq, hətta, bir suyumu da rəhmətlik Xavər xalanı yada salırdı...

O il bütün sentyabr ayını Sərvər həm qorxu-təlaş, həm də qəribə bir sevinc içərisində keçirdi. Elə vaxtlar olurdu ki, o, gecədə bir-iki saat da yata bilmirdi. Ancaq Əjdər bekarçılıqdan bütün günü yatırdı, yatmaqdan Əjdərin gözləri şişmişdi. Bekarçılıqdan Əjdər dağlardan ot yolub, səbətə, vedrəyə, küzəyə oxşayan qəribə şeylər qayırırdı; sısqa bulağın qabağındakı hovuzu tez-tez sökürdü, təzədən düzəldirdi, hətta arada bir şeir də quraşdırırdı:

"Yetim kirpi, çək mənim keşiyimi,
Doğma yurda qaçaq düşüb gəlmişəm.
Buraxmışam evimi-eşiyimi,
Tülkü kimi kol dibinə girmişəm".

"Zalım dünya, göylərə bax, ay çıxıb... Zalım dünya, göylərə bax, ay çıxıb..." Əjdərin lap axırıncı şeirinin əvvəli belə idi. Öz komasının qabağında oturub, göydəki Aya baxa-baxa Əjdər o sözləri beş-on dəfə təkrar elədi. Ancaq şeirin dalısı gəlmədi. Şeirin sonuncu sözlərindən Sərvərin xəbəri olmadı. Payız düşəndə, yağışlar başlayanda gecələrin birində onlar o komanın qabağındaca sözsüz-söhbətsiz vidalaşdılar. Gedəndə Əjdər təkcə sırıqlısını götürmüşdü, bir də kirpini qucağına almışdı. Və nə qədər qəribə olsa da, Sərvərə elə gəlirdi ki, Əjdər kirpini də Bakıya aparmaq istəyir. Sonra Əjdər kirpinin yaş burnundan öpüb onu ehmalca yerə qoydu. Sonra Əjdər Sərvəri qucaqladı, nədənsə Sərvərin də məhz burnundan öpdü və sısqa bulağın yanındaca



dağa dırmaşıb quş kimi, qırğı kimi yuxarı şığıdı və bir göz qırpımında dağın təpəsinə qalxıb, oradan Sərvərə əl elədi: "Bakıya gəl... Bakıya gəl... Bakıya... Bakıya... Bakıya..."

## II

İndi onlar Bakıda Təzəbazarın qapısı qabağında üz-üzə dayanmışdılar. Əjdər ağlagəlməz dərəcədə kökəlmişdi, qarın bağlamışdı, buxaq sallamışdı. Boğula-boğula nəfəs alırdı, hirsli-hirsli Sərvərin üzünə baxırdı və bu hirsin səbəbini Sərvər heç cür anlaya bilmirdi.

– Nəyə gəlmisən? – Əjdərin birinci sualı bu oldu.

Sərvər dedi:

– Alverə gəlmişəm. Bir az şey-şüy gətirmişəm. Satıb, sonra Leninqrad tərəfə getmək istəyirəm.

Sərvərin ütülənmiş şalvarına və onun qara pencək altdan geydiyi, bu dünyada yalnız Buzbulaq qarılarının toxuya bildiyi, qırmızı naxışlı ağappaq yun köynəyinə Əjdər çox baxdı. Baxıb nəsə fikirləşdi, nəyisə götür-qoy elədi:

– Bu vid-fasonla, – dedi, – bazarda oturacaqsan?

Əjdər cibindən quru ota oxşayan bir şey çıxartdı. Onu iyləyib xeyli öskürəndən sonra boğula-boğula soruşdu:

– Nə gətirmisən?

– Badamdır, bir də cövüz. Cəmisi yüz on beş kilodur.

– Harda qoymusan?

– Kömürçü bazarında, Teymurun yanındadır.

Bir müddət Əjdər fikirli-fikirli yola baxdı. Sonra yoldan keçən bir boş taksini saxlayıb Sərvəri oturtdu:

– Get, qoy maşına gətir! – dedi.

Çox keçmədi ki, onlar iki nəhəng kisəni həmin taksidəncə düşürüb, bazarda Sərvərin tanıdığı bir adamın yanında qoydular. Özləri bazarın yuxarı qapısından çıxıb, yavaş-yavaş Basin küçəsinə endilər... Qar yağırdı, yağdıqca əriyirdi, yerdən buxar qalxırdı və bu nəm havada Əjdər, bir kəlmə də dinib-danışmadan, başını aşağı salıb, tramvay xətti boyunca Sərvəri harasa aparırdı. Sərvər hara getdiklərini soruşmaq istəyirdi, ancaq soruşmağa ürək eləmirdi. İstəyirdi toyuq əhvalatını yada salsın, o yaydan, o komadan, o kirpidən danışsın, o şeiri deyib,

Əjdərin kefini dəyişsin, üzünü güldürsün. Ancaq susurdu, demək istədiklərini dilinin ucundan birbəbir geri qaytarırdı: qorxurdu ki, bu söhbəti Əjdər ayrı cür başa düşər, elə bilər ki, Sərvər onun boynuna minnət qoyur, elədiyi yaxşılığı yada salıb, bu yaxşılığa əvəz istəyir. Ayrı bir söhbət isə Sərvərin ağlına gəlmirdi... Beləcə – dinməz-söyləməz onlar bir xeyli də yol getdilər və hələ mənzilbaşına çatmamış Sərvər dözməyib, birdən-birə dilə gəldi:

– Bura bax, Əjdər, – dedi, – mən sənə əngəl-zad olmağa gəlməmişəm ha! İşin var get... Şəhərdə birinci dəfə deyiləm ki, üç il Leninqradda olmuşam.

Əjdər:

– Əcəb eləmisən, – dedi. Və başqa heç nə demədi.

Onlar bir tindən burulub, bir xırdaca həyətə girdilər. Köhnə ev idi, qabağında aynabəndi vardı və ahıl, ağsaçlı bir qadın o aynabənddə paltar ütüləyirdi.

Əjdər Sərvəri həyətdə qoyub, pilləkənlə yuxarı qalxdı, qarı ilə xeyli söhbət elədi, sonra Sərvəri də yuxarıya çağırdı.

– Bəri gəl burda qalacaqsan, – dedi və aynabəndə açılan iki qonşu qapıdan birini itələyib açdı. – Bu sənin otağın, o da qıravatın... Çay iç, yat, dincəl. Çıx gəz, kinoya get... Bu da Marqodur, tanış ol, gürcüdür. Tək arvaddır... Pul-zad lazım olsa, bundan alarsan... Sənin bazarınan işin olmasın, bazarın işinə mən baxacağam.

Belə görüş şübhəsiz ki, Sərvərin ürəyindən ola bilməzdi: elə bil Əjdər onu hələ də uşaq hesab eləyirdi. Teymur bazarda ola-ola, Əjdərin onu bazara buraxmamağı Sərvərə toxundu, bərk toxundu, ancaq Sərvər Əjdərin məsləhətindən çıxa bilmədi, onun üzünə durmağa ürək eləmədi. O gün Sərvər axşamacan şəhəri dolandı, axşam evə qayıdıb Əjdərin yolunu gözlədi, çünki onun fikrincə, Əjdər o axşam mütləq bu evə gəlməli idi. Ancaq o axşam Əjdər o evə gəlib çıxmadı; onun səhərisi də Əjdər o tərəflərdə görsənmədi. Sərvər günortayacan gözlədi. Günorta bazara cumdu, ancaq orada da Əjdəri tapmadı. O, bazarda öz şeylərini də tapmadı; bazarı oldən-ayaqdan saldı; dünən şeylərini tapşırdığı o adam da elə bil əlli-ayaqlı göyə çəkilmişdi... Əjdərin yer-yurdunu öyrənmək üçün bazardan Marqo arvadın evinə qayıdanda yol boyu Sərvər çox fikirləşdi, çox baş sındırdı, ancaq bu işdən heç nə anlaya bilmədi. Üstəlik, Marqo arvad da Əjdərin yerini demədi. Elə bil qəsdən demədi. Əlac bircə Teymura qaldı və o gün axşamüstü – bazar bağlanana yaxın – Kömürçü bazarında Sərvər Teymurun üstünü kəsdirdi:

– Ə, Teymur, Əjdəri görməmiçən ki?

– Görmüşəm. Səhər tezdən Tiflisə getdi.

– Necə yəni Tiflisə getdi?

– Getdi də. Necəsi yoxdu ki.

Sərvər az qaldı ki, uşaq kimi ağlasın.

– Bəs mənim barəmdə bir söz demədi?

– Dedi. Dedi ki, gəzib-dolansın, çıxıb getsin kəndə. Dedi, ondan alver eləyən çıxmaz.

Sərvər səsi gəldikcə bağırdı:

– Bəs mənim pullarım, bəs mənim şeylərim?!

Teymur heç halını da pozmadı:

– Mən pul işini bilmərəm, – dedi, – onu özünüz bilərsiz. Mənə söz tapşırıblar, mən də sənə deyirəm... Dedi ki, tək gün getsin, cüt gün getməsin. O günlər Əjdərin tanış pravadniki var – yeddinci vaqonda. Dedi ki, bilet-zad almasın, vaqonun pravadnikinə səni tapşırıbdır. Poyez gecə bir tamamda gedir, pravadnikə Əjdərin adını verəcəksən... Yeddinci vaqon, yadından çıxmasın...

Əgər onlar on il bir yerdə oxumuş olmasaydılar, bəlkə söhbət buradaca bitəcəkdi. Ancaq söhbət burada bitmədi, çünki onlar on il bir yerdə oxumuşdular. Çünki söhbətin lap axırında, özü də lap axırıncı sözü deyəndə Teymur azca ehtiyatsızlıq eləmişdi, bir balaca qımışmışdı və bu anda onun gözünün içindən nəyinsə qaçıb gizləndiyini Sərvər aşkar sezə bilmişdi və qaçıb gizlənən o bapbalaca işartıda Sərvər haçanınsa fırıldaq Teymurunu görmüşdü. Buna görə də o, qəfildən Teymuru yaxaladı:

– Əjdər Tiflisə-zada getməyib, – dedi. – Sən mənə yalan deyirsən. Sən Əjdərin yerini bilirsən, məndən gizlədirsən!..

Teymur əl-ayağa düşdü:

– Əjdərin yer-yurdu nə gəzir. On ildir ki, Əjdər nizakonnı yaşayır, heç yerdə propiskası-zadı yoxdur.

– Deyirsən, Tiflisə gedib, hə?.. Adam ol, ə, vicdanın olsun!.. Axı görürəm ki, yalan deyirsən, gözlərinin içindən görürəm!

Bir müddət Teymurun səsi gəlmədi. Sərvər hiss elədi ki, Teymur yumşalıb, özü də yumşaq danışmağa başladı:

– Mən onu adam bilirdim, – dedi. – Nə biləydim ki, əclafın, diləncinin biridir... Yüz kilo şeyi götürüb çıxıb aradan... Belə də vicdansızlıq olar?!

Teymur dedi:

– Taxsır özündədir, özün oturub sataydın.

Və Sərvər yenə də özündən çıxdı:

– Vicdansız qoydu ki, satım?! Mən haradan biləyim ki, bu adam afirisdir, alçağın, julikin biridir.

Teymur yenə də səsini çıxarmadı. Beləcə səssiz-səmirsiz də onlar piştaxtanın üstündəki şeyləri yığışdırdılar. Bir yerdə, kisələrin ağzını bağlayıb, bazarın qaravulçusuna tapşırdılar. Bazardan çıxdılar və bir müddət Əjdərin söhbətini eləmədilər.

– Havanı görürsən?

– Yaman soyuqdur!

– Amma təmizdir, görürsən?.. Lap Buzbulağın havasına oxşayır.

Sərvər dedi:

– Buzbulağa da qar yağıbmı görəsən... Mən gələndə yağış yağırdı.

Bu yerdə Teymur özü Əjdər söhbətinin üstünə gəldi:

– Belə havalarda Əjdərin pristupu tutur, – dedi.

– Nə pristup?

– Bəs bilmirsən? Əjdər naxoşdur da... Asmadır, nədir, bir axmaq naxoşluqdur. Hava soyuq olanda yazıq nəfəs ala bilmir. Hava ki belə oldu, Əjdəri bazarda-zadda görməzsən, dəniz tərəfdə bir restaran var, badvaldır, gedib orda oturur.

– Deyirsən, indi də orda olar?

– Bəlkə olar, nə bilim, ancaq mən ölüm, mənim adım olmasın!

Daha Sərvər heç nə soruşmadı. Teymuru yolda qoyub, dəniz tərəfə qaçdı və o, "badval" restoranın qaranlıq bir küncündə Əjdəri tapdı.

– Paho!.. Tiflisə gedən burda imiş!.. Afirist!.. Əclafın biri, əclaf!..

– Otur görüm, Pişik Ağaların oğlu, artıq-əskik çərənləmə.

Sərvər dedi:

– Dur gedək mənim şeylərimi ver, mən sənin kimi əclafnan oturmaram.

Əjdər onun əlindən dartıb oturtdu:

– Şeylərini satmışam, – dedi. – Görürsən də – bala-bala ötürürəm içəri. – Deyib, qabağındakı araq şüşəsini göstərdi.

– Pullarımı verməsən... – Sərvər yumruğunu Əjdərin üstünə tuşladı.



Əjdər ehmalca onun qolundan yapışdı:

– Çıxarıq bayırda vurarsan, – dedi, – burda olmaz, Pişik Ağaların oğlu!..

– Deməli, dədəmə də sataşırsan! Yaxşı, baxarıq, çöldə danışarıq!

Əjdər dedi:

– Mən o Pişik Ağaların xayasından öpərəm, sənin kimi oğul böyütdüyünə görə!

O, Sərvər üçün də araq süzdü. Ofisiantı çağırıb yemək sifariş elədi. Ancaq Sərvər nə o arağı içdi, nə o yeməyə əl vurdu.

– Gərək o vaxt mən səni tutduraydım, – dedi. – Əgər o vaxt səni tutdurmuş olsaydım, indi belə əclaf olmazdın.

Əjdər hirslənmədi, güldü. Sonra gözlənilmədən soruşdu:

– Leninqrada nəyə gedirdin?.. Düzünü de, qızın-zadın var, yoxsa gedib alver eləyəcəkdin?

Sərvər dedi:

– Sənə dəxli yoxdur, sən mənim pullarımı ver!

Əjdər bir müddət susdu. Sonra bir cibindən beş-altı badam çıxartdı, o biri cibindən üç dənə cövüz çıxartdı və onları stolun üstünə qoyub altdan-altdan Sərvərin üzünə baxdı:

– Tanıyırsan?

– Tanıyıram! Hamısını sənin xirtdəyindən çıxardacağam!

– Arağını iç.

– İçmirəm!

– Çörəyini ye.

– Yemirəm!

Əjdər stolun üstünə qoyduğu badamdan birini götürdü:

– Şövkətin badamındandır, düz tapmışam?

Sərvər təəccübləndi.

– Bu da Gülgəz arvadın bizim barının yanındakı cövüzündəndir, sizin dal həyətdəki pişpişənin bu tərəfində. O pişpişənin böyründə bir əncir ağacı vardı, yarpaqları payızda da gömgöy olurdu. Bir də bir alça vardı, tövlə tərəfdə, divarın lap dibində, payızda çiçək açırdı... O alça dururmu hələ?..

Sərvər dedi:

– Durur, niyə durmur... Sən mənim başımı bişirmə. Mənim pullarımı ver.

– Pişpişə də durur?

– Məni dolayırsan?

– Dolamıram, soruşuram, durumu o pişpişə?

– Durur, nə olsun ki?

– Mən o pişpişənin dibində Əli oğlu Mürsəlin qızını öpmüşəm.

Sərvər dedi:

– Sən piyansan, ağzına gələni çərənləyirsən!

Əjdər susdu, xeyli vaxt körük kimi fısıldadı, sonra öskürdü, sinəsindən dəhşətli xırıltı qopdu və birdən bu xırıltının içindən qəribə, vahiməli bir səs çıxdı:

– O pişpişəyə deyərsən ki, Əjdər ölür!..

Və birdən-birə Sərvər baxıb gördü ki, Əjdərin gözləri dolub, gördü ki, Əjdər ağlayır, gözlərinin gildir-gildir yaşı pencəyinin yaxasına tökülür. Onun Əjdərə yazığı gəldi, bərk yazığı gəldi, bir xoş söz demək istədi, deyə bilmədi, bunun yerinə qabağındakı arağı götürüb başına çəkdi...

– Çörəyini ye.

– Meylim çəkmir.

– Bir araq da gəlsinmi?

– Özün bilərsən.

Və stolun üstünə bir araq da gəldi.

O arağın çoxusunu Sərvər içdi, qəsdən içdi. İçdi ki, Əjdər çox içib lap sərxoş olmasın. Ancaq Əjdər onsuz da sərxoş idi.

– Bu gün ayın neçəsidir?

– On üçüdür.

– Bu gün mənim ən xoşbəxt günümdür.

Sərvər dedi:

– Dur gedək, restoranı bağlayırlar.

Və restoranın işıqları sönəndən sonra onlar ayağa durdular. Əjdər stolun üstünə üç dənə onluq qoyub, ofisianta heç nə demədən bayıra çıxdı. Bayır soyuq idi: yer donmuşdu, küçə ay işığında bomboş işarırdı.

– Saat neçədir?

– On ikiyə qalır.

– Bu gün sən gedəcəksən.

– Niyə axı?

Əjdər bulvar tərəfə döndü və üzünü dənizə sarı tutub xeyli vaxt təngiyə-təngiyə getdi və nəhayət:



– Səndən alverçi çıxmaz, – dedi.

– Mən alverçi olmağa gəlməmişəm.

– Bə niyə gəlmisən?

– Demədim? Gəzməyə gəlmişəm, istəyirəm Leninqrada gedim.

Əjdər dedi:

– Mən də gəzməyə gəlmişdim, görürsən də – hələ də gəzirəm.

– Axı səndən mənə nə?.. Mən ki hökumətin pulunu qaçırtmamışam.

Və məhz bu yerdə Əjdərin sinəsindən qopan dəhşət o sözləri deməyinə Sərvəri peşman qoydu. Əjdər döşünü tutub əyilə-əyilə özünü dənizin lap qırağındakı dəmir məhəccərin üstünə saldı. O öskürdü, Sərvər dediyi sözlərin peşmançılığını çəkdi; aradan xeyli vaxt keçdi və bir xeyli keçəndən sonra Əjdər bir az dikələ bildi. Dikəldi, ancaq dinib danışmadı. Onlar gözlərini dənizə zilləyib durdular... Ay işığı idi, ay göyün tən ortasında dayanmışdı və onun gur işığında dəniz soyuq-soyuq alışıb-yanırdı...

– Deyən, sözüm bərk dəydi sənə... Bağışla, mən elə demək istəmirdim.

– Yox, əşi, o nə sözdü ki, mən ayrı şey fikirləşirəm.

– Nə fikirləşirsən?

– Bu gün bazarda bir qəribə şey görmüşəm. Səhərdən beynimdən çıxmır. Bir xırdaca ev köpəyi bir yekə küçə itini qabağına qatıb qovurdu... Ağappaq, əl boyda bir şey. Heç tüllab, itə də oxşamırdı...

– Nə olsun ki?

– Necə nə olsun? Top boyda bir şey, o boyda iti!.. Özü də görəydin necə qovurdu. Camaat da baxıb hırıldaşırdı.

Sərvər:

– Sən piyansan, – dedi, – sayıqlayırsan.

Əjdər dedi:

– Bilirsən, o it niyə qaçırdı?

Sərvər dedi:

– Bilmirəm, gəl çıxaq gedək.

– Hara gedək?

– Hara deyirsən.

Əjdər dedi:

– Onda vağzala tərəf gedəcəyik.

## DƏYİRMAN ƏHVALATI

### I

Buzbulağın çayxanasında heç vaxt çox adam olmur, o ki qaldı günün bu vaxtı ola: hələ heç on bir də yox idi.

Çayxanada vur-tut dörd nəfər adam vardı. Özləri də bir tərəfdə, pəncərənin qabağındakı nərdtaxtanın yanına yığışmışdılar; ikisi oynayırdı, ikisi baxırdı – növbə gözləyirdi.

Buzbulaq çayxanasının dörd vedrə su tutan yekəcə samovarı təzəcə qaynamışdı, təzəcə dəmlənmişdi. Çayxananın, səhərdən sulanıb-süpürülmüş kərpic döşəməsinin nəmi hələ tamam çəkilməmişdi. Qapıdan içəri düşən gün işığı o nəm kərpiclərin üstündə olduqca təzə və təmiz görsənirdi. Və nərd oynaya-oynaya bayaqdan bəri o işığa tamaşa eləyən Qərib birdən-birə zərləri yerə qoyub, dik ayağa qalxdı.

– Oynamıram!

– Oyunu qurtaraq da.

Qərib hirsli-hirsli:

– Qurtarmıram, – dedi. Bir manat pul çıxardıb nəlbəkinin altına qoydu. Yəni: əl çək, hesab elə ki, uduzmuşam, çünki Buzbulaq çayxanasında əksər adamlar nərdi ancaq baş qatmaqdan, vaxt keçirməkdən ötrü oynayırdılar: uduzanın cəriməsi bir-iki manat çay pulu, bir də bərk ayaqda, bir qutu siqaret pulu idi. Hər halda Qərib ayrı şeydən, indiyəcən heç vaxt nərd oynamamışdı.

O, yerini başqasına verib, bu dəfə üzü pəncərəyə tərəf oturdu. Pəncərədən bir dağın yastı təpəsi görsənirdi; ordakı gün işığı da, eynən bu çayxananın kərpic döşəməsinin üstündəki işıq kimi, təptəzə idi, tərtəmiz idi. Və Qəribin könlündən keçdi ki, elə indicə durub gedib o dağın təpəsinə çıxsın, ordan göz gördükcə hər yana tamaşa eləsin. Ancaq Qərib durmadı: dağın ətəyindəki badam, zoğal ağaclarının ağlı-sarılı çiçəyi onu bu fikirdən asanca azdıra bildi. Sonra çayxananın pəncərəsi qabağından keçən arxın qırağındakı yarpıza, bənövşəyə baxa-baxa, Qərib az vaxtda özü üçün tam yəqin elədi ki, yer üzündə bir sarsaq şey varsa, o da hər fəslin öz vədəsində gəlməməyidir və bu qənaətlə də durub çayxanadan çıxdı.



Bu ilin yazı doğrudan da baş çıxarılası şey deyildi. Hələ fevral qurtarmamışdı, amma zoğal, badam hər yerdə çiçək açmışdı. Belə getsə, beş-on günə o biri ağaclar da çiçək açacaqdı. Budurana, elə bu çayxananın böyründəcə, bir qozbel ərik ağacının günə sarı budaqları doğmağına lap az qalan düyə yelini kimi şişmişdi, qızarmışdı. Görən, bundan belə qar olacaqdımı?.. Qərib ürəyində: "Yox, olmasa yaxşıdır", – dedi, çünki Qəribin gözləri ərik ağacının budaqlarında idi və o budaqlar, doğmağına lap az qalan düyə yelininə doğrudan da yaman oxşayırdı.

Qərib bir müddət dükanın qabağında gəzindi. Fikirləşdi ki, bəlkə bir şüşə araq götürüb, aparıb içib yatsın, bir də sabah ayılsın; bunun sonrakı əzabı Qəribin gözünə durdu. Qərib gedib bir müddət də idarə tərəfdə dolandı ki, bəlkə kolxoz sədri Cümşüdə rast gələ. Deyə ki, vaxtdı, nə durmusan, əmr elə çıxaq kolxoz üçün arxdan-marxdan qazıyaq; bəsdi, nərd oynamaqdan əlimiz qabar oldu. Amma orda Cümşüdü görəndə Qərib heç özü də bilmədi ki, bu fikirdən niyə o saatca vaz keçdi. Üstəlik, Cümşüdü görəndə o, addımlarını yeyinlədib, idarənin qabağından da tələm-tələsik elə əkildi ki, guya onun fikrindən keçən bu saatca Cümşüdün də ağlına gələ bilərdi.

O gün Qərib bütün günü kolxozun çöl-biyabanını dolanıb, günorta evə çörək yeməyə də getmədi. Axşamüstü Qərib yenə çayxanaya qayıtdı, ancaq nərdə yaxın durmadı; əllərini arxasında cütləyib, bir-iki dəfə çayxananın o baş-bu başına gedib-gələndən sonra, samovarın yanından, birdən-birə elan elədi ki, bəs:

– Dəyirmanı işə salacağam. – Və Allah tərəfi, onun dediyinə gülüb eləyən-zad olmadı. Çünki indi axşam çağı idi, çayxanada adam nisbətən çox idi və bu adamlardan bircəciyinin gülməyi ilə bu iş bəlkə də pis qurtara bilərdi.

Sonra Qərib yenə əllərini arxasında cütləyib, çayxananın o baş-bu başına gedib gələ-gələ dedi ki:

– Bir vaxt bu kəndin gül kimi dəyirmanı vardı. Ununun bir evdə çörəyi bişəndə bütün kənddən çörək iyi gəlirdi. O çörəyin, – dedi, – tamı da ayrı idi, ləzzəti də ayrı idi. – Üzünü camaata tutub soruşdu ki: – Düzmü deyirəm?

Və çayxanada oturanların çoxusu bir ağızdan:

– Elədi, – dedi. – O çörəyin ləzzəti ayrı idi.

– Bəs o dəyirmanı biz indi niyə işlətmirik?

Yaşlı kişilərdən biri:

– Ona görə ki, indi un boldu, bala, – dedi. – Pervi sortu otuz bir qəpey, iftaroy sortu iyirmi yeddi qəpey. İyirmi iki manatı verib bir tay, yetmiş kiloluq, birimçi növ buğda ununu alıb atırsan eşşəyin belinə, aparır qoyur evə. Hələ sənə otuz qəpey də gəlib burda çay içməyə pul qalır.

– Birdən hökumət o unu gətirmədi, bəs onda necə? – Bunu deyənin də adı Qərib idi (o Qəribin dəyirman söhbəti, deyəsən, bu Qəribin də beyninə batmışdı). – Mən də bu fikirdəyəm ki, kənddə dəyirman olsa yaxşıdı.

– Bəs o pekarnını neyləsinlər? Bağlasınlar?

– Sən hər gün hökumət çörəyi yeyirsən? (Dükandan alınan çörəyə Buzbulaqda "hökumət çörəyi" deyirdilər).

– İndi heç o buğda da yoxdu axı. İndinin buğdasını üyütsən, o çörəyin ləzzətini inanma verə.

– O dəyirmanın daşı çoxdan çürümüş olar. Gör havaxtdan başlıbaşınadı.

Dava vaxtındandı da. Ondan sonra dəyirman bəyəm işləyib ki?

– İşləyib. Nə danışırsan? Düz əlli beşinci iləcən işləyirdi. Sonra işləmədi.

Hələ yaxşı ki, Mirəli kişi ot yığır ora. Yoxsa o dəyirmanın bu saat damı-divarı da uçub tökülmüşdü.

Bu yerdə Pesmis Qulu da söhbətə qarışdı:

– Siz hardan bilirsiz ki, bir də dava olmayacaq? – dedi. Hirsli-hirsli deyib, hikkəli-hikkəli camaatın üzünə baxdı (vuzbulaqlılar o ləqəbi bu adama nahaq yerə verməmişdilər: "pesmis" dediyin Buzbulaqda "pessimist" demək idi).

– Biz burda dəyirmandan danışırıq, bunun davaya nə dəxli var?

– Çox dəxli var!

– Heç bir dəxli-zadı yoxdur.

– Çin orda qan-qan deyir bu saat.

– Ədə, Çin nədi, zad nədi! Sən o şeyi de ye, zadı... hökumətin başçısın vurub öldürüblər. Nədir oranın adı?..

Və Qərib gördü ki, bu söhbət çox uzun çəkəcək. Məsələni, necə deyər, xətm eləmək istədi.



– Dəyirmanı işə salmaq mənim boynuma, – dedi. – Sizinki – dən gətirməkdi. – Və azca fikirləşib, əlavə elədi: – Ancaq elə olmasın ki, mən gedib dəyirman düzəldim, sonra oturub orda dən gözləyim.

Qəribə birinci hay verən yenə o biri Qərib oldu.

– Sən işində ol, – dedi. – Dənin fikrin eləmə.

– Sağ ol, adaş... Ə, Pesmis, yenə nə bərk fikrə getmisən? Sən də dən gətirəcəksənmi?

Pesmis Qulu:

– Bəli, gətirəcəyəm, – dedi və yenə hikkəli-hikkəli camaata baxdı (guya onun dəyirmana dən aparmağına burda etiraz-zad eləyən vardı).

## II

Dəyirman əhvalatı belə başladı. Elə ordanca Qərib gedib Mirəli kişini tapdı (Mirəli kişi dəyirmanın lap yaxınlığında olurdu. İçəridəki otun dərdindən o, dəyirmanın qapısını həmişə qıfıllı saxlayırdı). Və həmin Mirəli kişi bir azdan köhnə dəyirmanın daşını çəliyinin ucu ilə tıqqıldadıb: "– Yox, oğul, bundan daş olmaz" – deyəndə də Qərib zərrə qədər kefini pozmadı. Çünki o, bir ayrı daş yeri də bilirdi. O daş qonşu Darıdağ kəndinin dəyirmanında idi və uşaq vaxtı Qərib o daşın, o dəyirmanın tərifini çox eşitmişdi (o vaxtlar buranın dəyirmanı tünlük olanda, hətta Buzbulağın özündən də camaat Darıdağın dəyirmanına dən daşıyardı). İndi, çoxdan idi ki, o dəyirman da işləmirdi. Demək, gedib daşı gətirib, bunun yerinə qoymaq olardı. Və Qəribin bu fikrini Mirəli kişi də bəyəndi.

– Bu daş, – dedi, – azı həştad ilin daşıdı. Amma Darıdağın daşı təzə daşdı. Özü də yaxşı daşdı. Çünki onu erməni ustası düzəldib.

– Deyirsən, gətirmək olar da?

Mirəli kişi:

– Olar, – dedi. – Lap yaxşı olar. Uşaqlardan da beş-altısın götürərsən, maşın tutub qoyarsız gətirər. Nə var onu gətirməyə!

O axşam, hələ cayxana bağlanmamış, Qərib bu məsələni də əlbəəl həll elədi: elə o nərdtaxtanınca yanına yığışanlardan beş nəfərinə xəbər verdi ki, sabah tezdən Darıdağa, dəyirman daşı gətirməyə gedəcəklər. Kolxozun şoferi Möhsün o daşı gətirməyinə əvvəl on manat istəyib, sonra üççə manata quzu kimi razı oldu. Axşam evə qayıdanda

du, amma ölənəcən top kimi idi; doxsan yaşda, pürrəngi çayını içib, səhərdən axşamacan qızdan-arvaddan danışırdı (kefikök olmayanın qızınan-arvadınan nə işi qalıb?) Bəli, qoca olanda da o cür qoca olmaq lazımdır. Yoxsa bu Cümşüd ki var, elə o çayxanadaca adamı bekarçılıqdan çərlədib öldürər...

Xülasə, Darıdağa daş dalınca gedəndə bu dünyada Qərib üçün bir layiqli iş vardısa, o da rəhmətlik Məşdislam kişinin dəyirmançılıq peşəsi idi... Ancaq o daş, sən demə, durub orda Qəribin yolunu gözləmirmiş. Dam uçmuşdu, daşı basmarlamışdı, hələ yaxşı ki, dəyirmanın təknəsinin altında daşa xətər toxunmamışdı; bu isə kənddən bel tapıb, qazma tapıb, o xarabanın içində, altı igid, üç-dörd saat əlləşəndən sonra məlum oldu. Çayın qırağında oturub ləzzətlə yeyib-içəndən sonra, bir-iki möhkəm taxtanın üstündə onlar dəyirmanın daşını rahatca qaldırıb maşına qoydular. Və çox keçməmiş Mirəli kişi onu çəliyinin ucu ilə taqqıldadıb, çubuğunu ləzzətlə sümürə-sümürə mərhum erməni ustasının şərəfinə yaxşı-yaxşı sözlər dedi.

## III

Yox, balam, bu dəyirmanın üstündə Allahın da nəzəri vardı. Yoxsa Mirəli kişiyə nə düşmüşdü ki, sinninin bu vaxtında buralarda səhərdən axşamacan fırfıra kimi fırlanaydı. Yaxud durub kəndin böyüklərinin ayağına gedəydi ki, nə var, nə var iş "zakonnı" olsun, sabah heç kəs deməsin ki, bu işi Qərib özbaşına eləyib.

Mirəli kişi dəyirmanın hər dərdini, azarını bilirdi. Qərib hələ bir işi görüb qurtarmamış, Mirəli kişinin o biri iş barədə tədbiri hazır olurdu (hətta evi beş addımlıqda ola-ola, qoca çox vaxt çörəyini də gətirib burda yeyirdi). Və təsadüfi deyil ki, dəyirmanın siftə unu da elə o Mirəli kişinin öz toyuqları üçün aldığı bir tay arpanın unu oldu.

O gün Qəribin həyatında bəlkə ən ləzzətli gün idi. Onun divarlarınacan ağardıb, qapı-pəncərəsinəcən rənglədiyi dəyirmanı o səhər Süsənbər tezdən gəlib, silib-süpürüb gəlin kimi bəzəmişdi: kətildən, cecimdən tutmuş, gül dibçəyinəcən. Qərib unluğun qabağına keçə salıb, Məşdislam kişi sayağı əyləşmişdi: bir yanında çay, bir yanında samovar. Hətta dəyirman ovaxtkı dəyirmana oxşasın deyə Qərib bura bilə-bilə, elektrik işığı da çəkməmişdi: bir köhnə neft çırağı tapıb



gətirib divardakı dədə-babadan qalma yoğun mıxdan asmışdı... Qərib çay içirdi, Mirəli kişi kətil üstdə oturub çubuq çəkirdi. Dəyirmanın daşı fırlanırdı. Və yerdə, onların hər ikisinin gözü qabağında – samovardan, qənddandan, iki armudu stəkandan savayı bir də bir pəncərə boyunda, kvadratşəkilli gün işığı vardı və o işıq dəyirmanın torpaq döşəməsinin üstündə təptəzə idi, tərtəmiz idi...

Toyuqları üçün aldığı o bir tay arpanın ununu Mirəli kişi o gün axşamçağı kisəyə yığıb, indi ondan umac qayırıb elə o toyuqlaraca verməyə apardı. Ertəsi gün Qərib neçə vaxtdan bəri birinci dəfə kənd içinə çıxdı ki, dəyirmanın işləməyini camaata öz dili ilə xəbər eləsin, yolüstü çayxanaya da girdi.

Çayxanada elə həmişəki adamlar oturmuşdular. Nərd dəstəsi də elə köhnə dəstə idi. Buralara beş-altı gün çıxmadığına görə Qərib çayxanadakı adamların hamısı ilə əl tutub görüşdü. Sonra gedib samovarın qabağında dayanıb, təntənə ilə:

– Dəyirman hazırdı! – dedi. Və ovaxtkından fərqli olaraq, bu dəfə çayxanada oturanlardan bir gülüşmək qopdu ki, Qəribin heyrətdən gözləri kəlləsinə çıxdı. – Niyə gülürsüz?

– Deyirsən dən gətirək? Ə, bu hansı zəmanədə yaşayır?

Qərib naəlac o biri Qəribin üzünə baxdı. Sonra Pesmis Quluya baxdı, istədi bilsin ki, bunlar da gülür, ya yox. O biri Qərib gülmürdü, amma Pesmisin gülməyi Qəribə hər şeydən çox yer elədi.

– Ə, Pesmis, it oğlu it, sən haçandan gülmək öyrəndin?

Pesmis Qulu heç halını da pozmadan:

– Sən dəyirmançı olandan, – dedi. Boğazını qabağa uzadıb hinduşka kimi hökküldədi (zalım oğlu doğrudan da elə bil bu gün Qəribin başında gülmək dərsi keçirdi).

Daha Qərib heç kəsin üzünə baxmadan:

– Yaxşı, siz gülməyinizdə olun! – dedi. Özünü tez bayıra saldı ki, əlindən xata çıxmasın. Birbaş evə gedib, Süsənbəri tövlədə inək sağdığı yerdə tapdı.

– Süsənbər, qurban olum sənə, – dedi. – Baramanın pulu hardadır? – Qərib öz arvadına heç vaxt belə yalvarmamışdı.

Süsənbər o saatca bildi ki, yenə Qəribin ağlına nəsə yerləşib.

– Evdədi də, – dedi, – harda olacaq? – Gülüb əlavə elədi. – Deyəsən, insafa gəlmisən axı: məni Leylinqrada aparırsan?

Qərib kəsəsinə:

– Gedib buğda alacağam, – dedi. Və Pesmis Qulunun sir-sifətini yadına salıb, tövlənin qapısına bir yaxşı təpik ilişdirdi.

– Buğdanı neynirsən ki?

– Üyüdüb satacağam. Qoy camaat ağzının dadını bilsin. Onda dəyirmana dən gətirərlər...

Hərəsi altmış kilodan qırx tay taxıl idi və o qırx tay taxılı Darıdağ kolxozunun maşınında Buzbulağa aparanda Qərib fikirləşirdi ki, dünya yaman dəyişib, çörək yaman ucuzlaşıb, çünki müharibəni, aclığı görməsə də, Buzbulaqda çörəyin kasad vaxtlarını Qərib görmüşdü. İndi o, Süsənbərin bircə ildə baramadan qazandığı pulun yarısına bu qədər taxıl almışdı. Vur-tut beşcə yüz manata. Özü də tərtəmiz toxumluq buğda idi. Durub çərənçilik eləsəydi, bəlkə bundan da bir az ucuz ala bilərdi. Darıdağın anbarında hələ inişildən buğda qalırdı.

Taxıl üstdə oturmağı günah bildiyi üçün Qərib elə kabinanın üstündəcə bir qıraqda əyləşib, ayaqlarını aşağıdakı iki taxtanın arasına keçirmişdi. Maşın Buzbulağa çathaçatda idi: "Dayanın, bu saat gəlirəm. İndi baxıb görərik analar necə oğullar doğub!.."

Qərib əyilib şoferə dedi ki, Buzbulağın çayxanasının yanından keçəndə maşını lap yavaş sürsün, özü yerini rahatlayıb, pəsdən oxumağa başladı... Amma maşın çayxananın yanına gedib çatmadı. Kolxoz idarəsinin qabağında, yolun ağzında iki nəfər əlini yuxarı qaldırıb durmuşdu: biri nəzarət idarəsinin sədri idi, o birini Qərib tanımırdı.

Çayxananın qabağından boylanıb bu tərəfə baxan bir dəstə adamı Qərib uzaqdan-uzağa gördü. Sonra onu ayrı maşına əyləşdirdilər və Qəribin taxıl maşınının üzünü rayon səmtə döndərdilər...

## IV

Beş-altı gündən sonra Buzbulağın klubunda Qəribin açıq məhkəməsi oldu. Amma o məhkəmə, deyəsən, elə-belə "quş qoymaqdan" ötrü idi. Çünki məhkəmədən qabaq Mirəli kişi rayona üç-dörd gün ayaq döymüşdü və Mirəli kişi sözü yerə düşəsi kişi deyildi (onun beş igid oğlu davadan qayıtmamışdı). Mirəli kişinin bu üç-dörd gündə orda raykomun, nəzarətin, məhkəmənin işçilərinə dediyi cürbəcür



duzlu-məzəli sözlər bir yana qalsın, hətta Qəribə zamin durmağı barədə kağızda, onun (kəmsavadlığı ucbatından) qol yerinə nəsə – balıq başına oxşayan – bir şey çəkdiyini də Buzbulaqda hamı bilirdi...

Bununla belə, klub ağzınacan adamla dolu idi (çoxusu, əlbəttə, vaxt keçirməyə gəlmişdi, məhkəməyə gəlməmişdi). Süsənbər də bir tərəfdə, uşaqları sağ-solunda əyləşdirib kirimişcə oturmuşdu, Mirəli kişi səmtə tez-tez baxa-baxa, elə bil Qəribə demək istəyirdi ki, qorxma, işlər yaxşıdır, səni indicə buraxacaqlar. Və Qərib də arabir Süsənbər tərəfə baxıb ehmalca başını yırğalayırdı, çünki bütün bu işlərdən Qəribin də xəbəri vardı: Mirəli kişinin onu zaminə götürməyini Qəribə demişdilər.

...Qərib o məhkəmədən də Mirəli kişi ilə bir yerdə çıxdı. Yenə hava yaz havası idi. Qəribin kənddə olmadığı beş-altı günün içində əriklər, alçalar da hər yerdə çiçək açmışdı.

Qərib yol boyu o əriklərə, alçalara tamaşa elədi və ürəyində fikirləşdi ki, hər fəslin öz vaxtında gəlməməyi doğrudan da pis şey imiş, olduqca pis şey imiş, çünki Qərib, hələ türmədə olanda, özü üçün tam yəqin eləmişdi ki, əgər bu ilin yazı belə tez başlanmasaydı, bütün bu hengamə də, şübhəsiz ki, onun başına gəlməzdi...

*1976*

## BÜLLUR KÜLQABININ NAĞILI

### I

Mirzə Manaf yuxusunda bir qəribə trolleybusa minmişdi; bir suyumu Bakıdakı funikulyorun tramvayına oxşayan, sarımtıl-çəhrayı rəngli bu trolleybus Buzbulağın bir yaşıl yamacı ilə, bir yaşıl arx boyunca, arxın qırağındakı otlara sürtüşə-sürtüşə gedirdi və bu gediş Mirzə

dənə vurub, axşamkı sarımsaqlı yarpaq dolmasının hesabına, hələ də alışıb-yanan ürəyinin yanğısını heç vaxt söndürə bilməyəcəkdi və həmişəki 8 nömrəli trolleybusuna minib, kefikök, damağıçağ işə getmək güya bir də Mirzə Manafa heç vaxt nəsib olmayacaqdı...

Yuxudan tamam ayılıb gözlərini açanda o arx da, o yamac da Mirzə Manafın gözünün qabağından tamam çəkilib getmişdi. Amma o çay haradasa hələ də axırdı və ordan-burdan, onun-bunun həyətindən o çaya sarı sallanan iri-iri, qırmızı-qırmızı balqabaqların qəribə, göz

ki, Bakıya qayıdandan sonra o, övlad-uşağını başına yığıb, hətta mitinqvari bir tədbir də keçirmişdi. Bu tədbirdə Mirzə Manaf illər boyunca gecə-gündüz təriflədiyi Buzbulağı, çox tutarlı dəlillərlə, elə əsaslı bir şəkildə pisləmişdi ki, pıqqıldayıb gülməmək üçün uşaqlar çox ciddi əziyyətə qatlaşmalı olmuşdular və hətta iş gəlib o yerə yetmişdi ki, həmin o Bikə arvad da bu dəfə Buzbulaq sözünü eşidəndə – qaşınmağı yerli-dibli unudub, gülməyini saxlamaqdan ötrü çox nataraz şəkildə öskürməyə başlamışdı.

Trolleybusda, bir cavan oğlanın yerində, dünyagörmüş portfelini dizinin üstünə qoyub, rahatca əyləşəndən sonra Mirzə Manaf yenə öz ömrünü götür-qoy eləməyə başladı və ömrünü götür-qoy eləyə-eləyə yenə bu qərara gəldi ki, ömürdən qalan beş-üç günü rahat yaşamaq üçün onun hər cür imkanı vardır: yaxşı ev-eşik – hamamı, balkonu... Alacağı pensiyanın da maaşdan bir o qədər fərqi olmayacaqdı. "Qızlarını ərə vermisən, – dedi. – Oğlunu evləndirmisən, hamısı rahat, hamısı evli-eşikli... Pensiyaya çıxmağın əsl vaxtıdır, Mirzə Manaf. Çıx otur evində, bala-bala dolan bu dünyada... Daha sənə nə lazımdır ki?.."

Bu sözləri ilhamla öz-özünə deyə-deyə, lap axırda Mirzə Manafın əhvalı birdən-birə dəyişdi, çünki onun fikrincə, bu dünyada bir qurumsaq vardısa, o da Mirzə Manafın işlədiyi idarənin müdiri Qurban Atabalayeviç Qazməmmədli idi və hələ pensiyaya çıxmamış, bu adamın taxtdan düşməyini görməyi Mirzə Manaf bir Allah bilir ki, necə arzu eləyirdi. Həm də Qazməmmədlinin taxtdan düşəcəyi barədə son vaxtlar orda-burda ciddi söz-söhbət gedirdi. Amma kim bilir ki, bu söhbət həvaxtacan çəkəcəkdi – Mirzə Manafın pensiyaya çıxmasına vur-tut bir ay qalırdı və hər dəfə "Daha sənə nə lazımdır ki?" deyib, öz-özünə sual verəndə məhz bu nöqtədə Mirzə Manaf möhkəmcə ilişirdi.

Bu sualın meydana çıxması münasibəti ilə bu dəfə də Mirzə Manaf dərindən köks ötürdü, daha bundan sonra heç vaxt bu sualı öz-özünə verməyəcəyini möhkəm qət eləyib, bütün bu, Qazməmmədli söhbətini başından-beynindən qovub çıxartmağa tələsdi, çünki trolleybus Mirzə Manafın iş yerinə yaxınlaşırdı və hələ səhərin gözü açılmamış, bu baş-beyinlə o idarəyə girmək Mirzə Manaf üçün o qədər də səpfəli deyildi.

Mirzə Manaf başıaşağı, təvazökar bir adam idi və bu cəhət onun adicə portfelindən də bilinirdi. Və portfel bir yana dursun, əgər Mirzə



Manaf həqiqətən təvazökar bir adam olmasaydı, öz gül kimi işinin adını "çızmaqaraçı" qoymazdı və öz gül kimi idarəsinə "çızmaqara idarəsi" deməzdi. "Harda işləyirsən, Mirzə Manaf?", "Cızmaqara idarəsində". Nə iş görürsən, Mirzə Manaf?" "Peronun ucu ilə gor qazıram"... "İynənin ucu ilə gor qazmaq" ifadəsinin xalqa məxsus olduğunu savadlı yoldaşlar yəqin ki, bilərlər. "Peronun ucu ilə gor qazmaq" isə məhz Mirzə Manaf təvazökarlığının məhsulu idi...

Mirzə Manaf Qazməmmədli söhbətini beynindən qovub çıxara bilmədi, ancaq nə qədər qəribə olsa da, bu dəfə, bu fikir beynində ola-ola o, idarəyə girməkdən bir o qədər ehtiyat eləmədi. "Neyləyəcək? – dedi. – Pensiyamı azaldacaq, yoxsa məni işdən çıxardacaq?" Və cəsarətlə pilləkənləri qalxmağa başladı. Amma Mirzə Manaf o pilləkənləri axıracan qalxa bilmədi. Bir-iki pilləni qalxıb dayandı. "Bu köpəkoğlundan nə desən çıxar!" – dedi və gələndə qəzet almağı unutduğunu məhz bu məqamda yadına salıb, qayıdıb qəzet almağa getdi.

– Salam, Mirzə!

– Sabahın xeyir, Mirzə!

– Necəsən, Mirzə?

– Günbəgün cavanlaşırsan, Mirzə, xeyir ola?

– Yenə aqurçikdi Mirzə! Malades, Mirzə, malades, heç qocalıb-eləmirsən!

İş günü bu səhər də belə başladı, bununla da məsələnin təntənəli hissəsi qurtardı. İndi, asudəlik olsa, Mirzə Manaf aldığı qəzetləri bala-bala oxuyacaqdı; arabir durub çay dəmləyəcəkdi və arabir xəyala gedib, pensiyaya çıxandan sonrakı həyatının planını çızacaqdı. Yox, daha Mirzə Manaf peronun ucu ilə gor qazmayacaqdı, onun bu sahədəki otuzillik fəaliyyəti nəhayət ki, qurtarmışdı. Mirzə Manafın pensiyaya çıxmasına hələ bir ay qalsa da, daha ondan iş tələb eləyən yox idi. Mirzə Manaf yol üstəydi. Mirzə Manaf qonaq idi – bundan sonra Mirzə Manafa təzə iş tapşırası deyildilər. Mirzə Manafla onun otuz il işlədiyi idarənin arasında vur-tut ikicə qovluq qalırdı və o qovluqların da birini Mirzə Manaf özü üçün bir növ məşğuliyyətə çevirmişdi.

Əgər kefi istəsə, Mirzə Manaf o qovluğu stolunun siyirməsindən çıxarıb, o məşğuliyyəti yenə başlayacaqdı... Yazının adı "Anama məktub". Mirzə Manaf: "Məktub, məktub, – deyəcəkdi. Bərəkallah,

namxuda, nə olar, qoy məktub olsun..." Sonra Mirzə Manaf o yazını gətirən müəllifin imzasına girişəcəkdi: "Qələndər Şahin...", "Şahin... Buravestnik, pəh, pəh".. Yavaş uç, bala, yavaş uç..." Bunun dalınca, o yazının lap əvvəlinci səhifəsindəcə, Mirzə Manafın öz əlinin səliqəsi ilə xətlədiyi bir-iki cümlə gəlirdi ki, o cümlələri oxuyan kimi nədənsə hər dəfə Mirzə Manaf durub bir yaxşı çay dəmləmək fikrinə düşürdü və o çayı dəmləyə-dəmləyə Mirzə Manaf həmin o bir-iki cümləni dodağının altında əda ilə, şövq ilə əzbərdən deyirdi: "Canımda yel xəstəliyi var, ana, hərdən sümüklərim sızıldayır... Bir az evimizin rütubətindən, bir az Bakının nəmişliyindən... bir az da sənin göz yaşlarındandır..."

Hekayətimizin bu yerində mütləq qeyd etməliyik ki, təvazökar olmaqdan əlavə, Mirzə Manaf həm də çox səliqəli və çox işgüzar yoldaş idi. Əgər ona təzə bir iş tapşırılası olsaydı, bu iki qovluğu da o, heç vaxt stolunun siyirməsində saxlamazdı. Əslində, Mirzə Manafın stolunun siyirməsindəki bu iki qovluğun da birinin məsələsi bir növ həll

də ərəb əlifbası ilə qeydlər elədiyi o yazının Qazmommodlini möhkəm maraqlandırdığını, lap bu dünyanın ən maymaq vətəndaşlarından sayılan (bu şöbənin işçisi) gənc şair Sərvər Sadıq da bilirdi. Və bəlkə bu gethaget məqamda Mirzə Manaf, heç olmasa, həmin o Sərvər Sadığın nəzərində bir balaca müsbət adam olmaq istəyirdi?.. Nə isə, sözümüzün canı budur ki, Mirzə Manaf öz işində həmişə səliqəli olmuşdu və indi onun bu işlə vidalaşmasına vur-tut bir ay qalırdı.

Və Mirzə Manaf işlə vidalaşmaq ərəfəsində bir də ara-sıra onu fikirləşirdi ki, pensiyaya çıxandan sonra bəlkə yenə öz keçmiş yazıçılığına qayıtsın. Bircə o Qazməmmədlinin obrazını yaradıb, gələcək nəsillərin mühakiməsinə verməkdən ötrü Mirzə Manaf çox gecələri yuxusuz qalmağa hazır idi, çünki onun Qazmommədliyə nifrəti həddi-hüdudu olmayan bir dərya idi. On beş ildən də çox olardı ki, Mirzə Manaf bu dəryanın içində üzürdü və bu dəryada boğulub batmadığı üçün gündə bir neçə dəfə Allaha şükür eləyirdi. Üstəlik, orası da vardı

olunmuş kimi idi. Yəni o qovluqdakı yazını Mirzə Manaf yarıyacan vərəqləmişdi, quş qoyulası yerlərdə quş qoymuşdu, sual işarəsi qoyulacaq yerlərdə sual işarəsi qoymuşdu və hətta o yazının bir neçə vərəqində Mirzə Manaf ərəb əlifbası ilə, bir sıra qeydlər də eləmişdi ki, bu da onun (yəni Mirzə Manafın) öz işinə məsuliyyətlə yanaşmağının nəticəsi idi. Mirzə Manafın, bayaq haqqında danışdığımız yazını özünə bir növ məşğuliyyət eləməyinin də çox güman ki, müəyyən bir səbəbi vardı, amma bu səbəb çox dolaşıq bir səbəb idi və o yazının elə birinci səhifəsində, sümük və rütubət barədəki o bir-iki cümlədəcə ilişib qalmağı Mirzə Manafın bəlkə lap özü üçün də bir növ sirr idi, müəmma idi. Bəlkə Mirzə Manaf o qovluğu gətirən cavan oğlanın o biri sürtük müəlliflərdən olmadığını, o yazının birinci səhifəsindəncə hiss eləmişdi, beləsinin öz yazısının dalınca tezliklə gəlməyəcəyinə arxayın idi, – buna görə də tələsməyi mənasız hesab eləyirdi... Bəlkə, Mirzə Manaf o bir-iki cümlədə nəsə tapmışdı və bəlkə o cümlələr öz keçmiş yazıçılığını Mirzə Manafın yadına salmışdı: "Manaf Maarif...

ki, bu on beş ildə Mirzə Manaf Qazməmmədlinin unvanına ürəyində yüzlərcə monoloq demişdi və təkcə həmin o monoloqlar bir yox, bir neçə əsər yazmaq üçün kifayət eləyərdi. Bu on beş ildə Mirzə Manafı bu idarədə saxlayan bəlkə də onun belə-belə monoloqları deyəndə dodaqlarını tam tərpənməz bir halda saxlamağı bacarmağı idi. Bir də Mirzə Manaf kefi istədiyi vaxt, kefi istəyən qədər xəyala gedə bilirdi, – Mirzə Manafın bu işi lap möcüzə idi və bu işdə Buzbulaq vaxtlı-vaxtında Mirzə Manafın dadına çatırdı. Məsələn, hələ beş-on il bundan qabaq, yayın isti günlərindən birində bir dəfə Qazməmmədlinin kabinetində Mirzə Manaf o qədər dərini bir xəyala getmişdi ki, orada, mudirin işım-işım işaran stolunun üstündəki büllur külqabının altında çox qəribə bir mənzərə kəşf eləmişdi: o büllur külqabının stolda əks olunan kölgəsində Mirzə Manaf əvvəl bir-iki salxım dumduru buz görmüşdü, sonra o buzlar sürətlə çoxalmışdı və Buzbulağın uzaq, çox uzaq bir qışı birdən-birə gəlib Mirzə Manafın gözünün qabağında durmuşdu. O isti yay günü Qazməmmədlinin kabinetində Mirzə Manaf

baq ola... Bəlkə o səhər məhz o balqabağa görə Mirzə Manafın yaddaşında belə möhkəm həkk olunmuşdu?.. Bəlkə o gün Bakı bərk isti idi, buna görə Mirzə Manafın könlünə buz düşmüşdü?.. Qəribə burasında deyil. Qəribə burasındadır ki, o vaxtdan bəri o qış, bütün buzları ilə birgə, həmin o külqabının altında qalmışdı və indi hər dəfə müdirin kabinetinə girəndə Mirzə Manaf gözlərini o külqabıya zilləyib dururdu. Xüsusən iclas vaxtları o külqabı Mirzə Manaf üçün lap göydəndüşmə olurdu, çünki Qazməmmədlini tanıyan bir adam üçün onun iclaslarda söylədiyi nitqlərə qulaq asmaq sözün əsl mənasında çox böyük bir müsibət və məşəqqət idi. Və elə məsələ də burasında idi ki, Mirzə Manaf Qazməmmədlini yaxşı tanıyırdı: "De gəlsin, qurumsaq, yaxşı deyirsən... Ayağının altında "Volqa"n, başının üstündə Allahın yox... Bağında şollar suyu fontan vurur... Bir mənzil oğlun üçün, bir mənzil qızın üçün... pulların ayaq açıb gəzir Bakını... Ayda iki yüz qırx beş manat maaş alırsan, haramzada, hələ məşuqən üçün də mikrorayonda mənzil tikdirmisən... De gəlsin, ağzından dürr tökülür. Sən de, məşuqən yazsın... Deyin, yazın, protokol bağlayın... Görək, havaxtacan yazacaqsız..." – Mirzə Manafın Qazməmmədlinin ünvanına dediyi monoloqların üslub və məna xüsusiyyətləri təxminən bu səpkidə idi və bu monoloqları deyəndə Mirzə Manaf bir an belə gözünü o külqabıdan ayırmırdı.

Əgər bu gün də Qazməmmədli – ya maraqlandığı o qovluğa görə, ya da bir başqa məsələdən ötrü Mirzə Manafı yanına çağırası olsaydı, yenə Mirzə Manaf gözünü o külqabıya zilləyib duracaqdı; o buzlara tamaşa eləyə-eləyə ürəyinin nifrətini birtəhər soyudacaqdı və kabinetdən çıxıb öz iş otağına daxil olanda, hətta güc tapıb, qüvvət tapıb bir anlığa gülümsəyəcəkdi də. Mirzə Manaf ona görə gülümsəyəcəkdi ki, onun Qazməmmədlinin kabinetində alçalıb, təhqir olunduğunu heç kəs hiss eləməsin, amma Mirzə Manafın bu gülümsəməyinin özünü də başqa cür yozanlar tapılacaqdı və heç kəs fikirləşməsə də, hər halda həmin o Sərvər Sadıq yenə mütləq fikirləşəcəkdi ki, Mirzə Manaf müdirin kabinetində nəsə bir əclaflıq eləyib və bu əclaflığın məhz ona, yəni Sərvər Sadığa aid olub-olmadığını bilməkdən ötrü o, gecələr bol-bol boğazına tökdüyü zəhərin-zəhrimarın təsirindən gündüzlər qan kimi qızaran qorxunc, şübhəli gözlərini yenə altdan-altdan Mirzə Manafın oturduğu səmtə tuşlayacaqdı...



Amma o gün Qazməmmədli Mirzə Manafı o kabinetə çağırmadı. Heç sabahısı gün də çağırmadı. Günlərin bir günü həmin o Sərvər Sadıq, nahar fasiləsindən sonra, qapını ayağı ilə açıb, Kefli İsgəndər qiyafəsində içəri girəndə və otağın tən ortasında dayanıb, "ölülər, ölülər" – deyib sarsaqlamağa başlayanda Mirzə Manafa məlum oldu ki, Qazməmmədli daha o kabinetdə yoxdur və Qazməmmədli o kabinetdə daha heç vaxt olmayacaqdır. Otuzillik məhsuldar fəaliyyətdən sonra pensiyaya çıxmaq ərəfəsində, Mirzə Manafı son dərəcə maraqlandıran "Daha sənə nə lazımdır ki?" – sualının cavabı belə həll olundu. O gün işdən evə qayıdanda Mirzə Manaf yol boyu öz-özünə bu sualı verdi, evə yetişib oğluna, kürəkənlərinə zəng elədi və hamını bir yerə toplayandan sonra, üzünü Bikə arvada tutub, cəmisi əllicə qram konyakın köməyi ilə, elə parlaq bir monoloq dedi ki, Bikə xanım düz otuz doqquz il belə ağıllı bir adamın arvadı olduğunu hiss eləyib, əvvəl gülümsədi, sonra azca kövrəldi və lap axırda tamam kövrəlib, xırdaca qız nəvəsi Yeganənin ipək tumanının ətəyi ilə özünün iki damcı qiymətli göz yaşını sildi.

## II

Mirzə Manaf barədəki bu gülməli əhvalatın qələmə alındığı vaxtdan bir ay keçmişdi. Bir ayda çox sular axmışdı, çox küləklər əsmişdi, bircə yağış yox idi ki, onun da olmamağı fəslin yaya doğru getməyindən irəli gəlirdi.

Səhər idi. Axırıncı dəfə işə getməyi münasibəti ilə Mirzə Manaf yaxşı-yaxşı yuyunandan sonra, bir yüngülcə də sığallanıb, yemək stolunun dalında əyləşmişdi. Mirzə Manafın axırıncı dəfə işə getməyi münasibəti ilə Bikə arvad mətbəxdə kükü bişirirdi və o kükü bişib stolun üstünə gələndə Mirzə Manaf Bikə arvadın dilindən elə qəribə bir sual eşitdi ki, az qaldı qulaqlarına inanmasın.

– Necəsən, kişi?

Bu qəribə sualı eşitməyinə Mirzə Manaf qəlbən sevindi, amma sevincini büruzə vermək istəmədi. Ömründə birinci dəfə eşitdiyi bu nəcib suala Mirzə Manaf bundan da nəcib bir cavab axtardı, amma tələsdiyindənmi, nədənsə ayrı söz tapa bilmədi.

– Mən lap əntiqəyəm, arvad. De görüm, bəs sən necəsən?

– Yuxuda sayıqlayırdın.

– Nə deyirdim ki?

– Nə bilim? Min cürə şey deyirdin: çaydan belə gəldi, çaydan belə getdi... Sonra da başladın ki, canımda yel azarı var... Belə ki gecələr canın ağrıyır, bəs niyə özünü doxtura göstərmirsən?

Mirzə Manaf hiss elədi ki, bir az qanı qaralıb, çünki Bikə arvadın yanında üzə vurmasa da, yuxuda sayıqlayıb çərən-pərən danışmağından Mirzə Manafın heç xoşu gəlməmişdi. Xüsusən o çaydan əhvalatı Mirzə Manafı lap dilxor eləmişdi. Əvvəla, ona görə ki, çaydan təkin

*xırda bir şeyin gəlib yuxusuna soxulmağı Mirzə Manafa bir növ təhqir* kimi görünürdü. İkincisi, söhbətin hansı çaydandan getdiyini Mirzə Manaf, Bikə arvad ağzını açan kimi, hiss eləmişdi. Bu çaydan olsa-olsa, Mirzə Manafın iş yerindəki dəm çaydanı ola bilərdi ki, onu da işdən tamam üzülüşəcəyi gün, Sərvər Sadığa bağışlayacağını Mirzə Manaf çoxdan qət eləmişdi...

Evdən çıxıb öz 8 nömrəli trolleybusunun dayanacağına gedəndə də o sovxa dəm çaydanı xeyli vaxt Mirzə Manafın ürəyini bulandırdı və yalnız trolleybusun gəlib yetişməyi Mirzə Manafı o çaydanın əlindən qurtara bildi, çünki axır vaxtlar trolleybusa əyləşəndən sonra Mirzə Manaf Qazməmmədli barədəki əsərinin süjetini fikirləşməyə vərdiş eləmişdi; pensiyaya çıxan kimi oturub bu əsəri yazacağına Mirzə Manafın daha heç şübhəsi-zadı qalmamışdı və bu əsərin süjetini fikirləşməyə başlayan kimi, Mirzə Manaf yerdə qalan şeylərin hamısını asanlıqla unudurdu.

Və madam ki, söhbət hərlənib-fırlanıb yenə bu əhvalatın üstünə qayıtdı, bu yerdə mütləq qeyd etmək lazımdır ki, beynində neçə-neçə hazır monoloq olsa da, bu əsəri yazmaq barədəki tam qətiyyətə Mirzə Manaf çox da asan bir yolla gəlib çıxmamışdı və bunun əsas səbəbi o idi ki, Qazməmmədlinin obrazını xalis mənfi planda nəzərdə tutduğu

ki, var!" – demişdi və onun öz gələcək əsəri barədəki tam qətiyyəti də məhz bu anda hasil olmuşdu.

İndi, 8 nömrəli trolleybusda, axırıncı dəfə işə gedərkən, ovaxtkı qətiyyətin bir sıra əlamətlərini Mirzə Manafın sifətində asanlıqla görmək mümkün idi. Mirzə Manaf Qazməmmədlinin yerində əyləşmiş o

çatmaqaş cavan oğlanla ilk görüşünü xatırlayırdı, çünki bu görüş də onun əsərində mütləq qələmə alınacaqdı və bəlkə o əsərin ən maraqlı yerlərindən biri də elə o görüş olacaqdı:

"– Buyurun, Mirzə, əyləşin... Bəlkə pensiya məsələsini təxirə

salaq, Mirzə? Sizin kimi təcrübəli bir yoldaş bizə çox lazımdır..."

Və əgər söhbətin bu yerində Mirzə Manafın gözləri yenə o sovxa külqabına zillənməsəydi, canına yağ kimi yayılan bu sözlərdən bəlkə o, hələ çox eşidəcəkdi. Amma (Allah Qazməmmədlinin evini yıxsın) vərdiş öz işini görmüşdü, – Mirzə Manafın gözləri külqabıya zillənmişdi və bunu hiss eləmiş təzə müdir bu dünyanın nəcib insanlarına xas olan bir tərzdə dodaqaltı gülümsəyirdi:

"– Deyəsən, külqabıdan xoşunuz gəlir, Mirzə. Buyurun, qurbandır sizə..."

Mirzə Manaf özünü güc-bəla ilə ələ alıb: "Yox", – dedi.

Amma təzə müdir, deyəsən, inanmadı.

"– Çəkənsiz, Mirzə?"

Mirzə Manaf:

"– Hərdən birin" – dedi, çünki Buzbulaq uşaqlarının o nanəcib əməlindən sonra, qatara minib Bakıya qayıdanda kupedə bir qoca Zəngəzur ermənisindən bir siqaret alıb çəkməyi Mirzə Manafın yaddaşında, nədənsə, çox möhkəm həkk olunmuşdu.

Bəlkə də məhz o külqabının dərdindən Mirzə Manaf o gün təzə müdirlə doyunca söhbət eləyə bilmədi, təcrübəsinə verilən yüksək qiymətə görə müdirə çox-çox təşəkkür eləyib, pensiyaya çıxmağını

yavaş gedirdi, yaxşı gedirdi, silkələnib Mirzə Manafın fikrini başından dağıtmırdı. Və əgər Mirzə Manaf barədəki bu qondarma nağılımızda biz – zəmanəmizin bir sıra qiymətli əsərlərinə xas olan – təbiət təsvirlərinə də əvvəlcədən lazımınca yer ayırmış olsaydıq, indi Mirzə Manafın trolleybusda əyləşib, axırıncı dəfə işə getdiyi bu munis səhəri təsvir eləmək, əlbəttə, lap yerinə düşərdi. Amma vaxtında nəzərə alınmamış bu vacib məsələni də biz, öz qondarma nağılımızın saysız-hesabsız naqis cəhətlərindən biri kimi, axıracan saxlamağı daha çox məqsədəuyğun hesab edirik. Və məhz buna görə də o səhərin yalnız munisliyini qeyd etməklə kifayətlənib, nağılımızı, bu nağılın öz üslubuna uyğun bir tərzdə davam etdirmək məqsədi ilə, Mirzə Manafın mindiyi 8 nömrəli trolleybusu nəhayət ki, gətirib onun iş yerinin yaxınlığında saxlamaq istəyirik.

Mirzə Manaf trolleybusdan düşəndə küçə adamla dolu idi və bu adamların bir qismi də o başdakı qəzet köşkünün yanında idi. Mirzə Manaf da gedib o köşkün qabağında növbəyə durdu, qəzetlərini aldı və öz iş yerinin qapısından içəriyə girib, pilləkənləri qalxdığı yerdə necə oldusa, birdən-birə ağlına gəldi ki, yuxusunda dəm çaydanı barədə nahaq yerə sayıqlamayıb: başa düşdü ki, o çaydanın məsələsi o qədər də xırda məsələ deyil, çünki Sərvər Sadıq deyilən adam ki var – tərs oğlu tərsin biri idi; bu adamın Mirzə Manafın dəm çaydanını rədd eləməyi olduqca mümkün bir şey idi və hələ rədd eləməyi cəhənnəm, o çaydana görə Sərvər Sadıq bir axmaq söz deyib, bu axır gündə, bu əziz gündə Mirzə Manafı təhqir də eləyə bilərdi.

Buna baxmayaraq, öz iş otağının qapısını açanda Mirzə Manaf o çaydanı məhz Sərvər Sadığa bağışlayacağını möhkəm qət eləmişdi. Otaqdan yenə həmişəki səslər gəlirdi:

– Salam, Mirzə!

– Sabahın xeyir, Mirzə!

– Yenə aqurçikdi Mirzə, malades, Mirzə, malades!..

Və o səslərin içində bu səhər o qaraqabaq, lal-dinməz Sərvər Sadığın da səsi vardı.

Sonra iş gününün axırına bir-iki saat qalırdı və həmin o dəm çaydanının məsələsini müvəffəqiyyətlə həll eləmiş Mirzə Manaf bir əlində bir qovluq tutub, o biri əli ilə müdirin kabinetinin qapısını ehmal-ehmal açmaqda idi.



– Buyurun, Mirzə. Yaxşı gəlmisiniz. İndicə özüm sizin yanınıza gəlmək istəyirdim. Əyləşin.

Və Mirzə Manaf əyləşən kimi birdən baxıb gördü ki, o külqabı stolun üstündə yoxdur; o külqabını Mirzə Manaf heç yerdə görmədi. Bircə onu gördü ki, yenə müdir gülümsüyür, görünür – Mirzə Manafın həmin o külqabını axtardığını da müdir hiss eləmişdi. Buna görə də Mirzə Manaf gözlərini öz əlində tutduğu qovluğa zilləyib dayandı. Deyəsən, müdir də Mirzə Manafın əlindəki qovluğa baxırdı.

– Şahin müəllim... (səs Mirzə Manafın səsi idi.)

Təzə müdir:

– Şakir müəllim, – deyib, gülümsəyərək, Mirzə Manafın müraciətinə bir balaca düzəliş verdi və: – Buyurun, eşidirəm, – dedi.

– Mənim sizdən bir xırdaca xahişim var, Şakir müəllim: mümkünsə, bu yazını bir özünüz vərəqləyin...

Mirzə Manaf bunu deyib, tələsə-tələsə qovluğu açdı. Ordakı yazını müdirin lap qabaq-qənşərindəki stolun üstünə qoyub, ayağa durmaq istədi, amma durmadı, çünki müdir o yazının birinci səhifəsini götürüb diqqətlə oxuyurdu və oxuya-oxuya çox məmnun bir şəkildə başını tərpədirdi. Mirzə Manafın intizarda keçirdiyi bir-iki xoş dəqiqədən sonra müdir o səhifəni oxuyub qurtardı. Vərəqi yerinə qoyub:

– Çox əcəb, oxuyarıq! – dedi. – Əvvəli çox yaxşıdır. Adı da orijinaldır: "Anama məktub". Çox əcəb, Mirzə, çox sağ olun. Mənə dair başqa nə qulluğunuz var?

Gəlib boğazına dirənmiş sevincini gizlətmək üçün Mirzə Manaf bir müddət yalandan öskürməli oldu. Sonra ayağa durub:

– Çox sağ olun, – dedi. Və hörmətli oxucunun nəzərinə indicə çatdırdığımız həmin səbəbə görə yenə yalandan öskürməyə başladı.

Müdir isə ayaq üstdə dayanıb, çox günahkar bir tərzdə Mirzə Manafa baxırdı:

– Gərək məni bağışlayasınız, Mirzə. Sizin bugünkü əziz məclisinizdə yaxından iştirak edə bilməyəcəyəm, çünki yuxarıda bir balaca iş var. Getməsəm, mümkün deyil.

Mirzə Manaf ürəyində "həmişə yuxarılarda olasan, bala" dedi. Amma məclis məsələsindən heç nə başa düşmədi, çünki səhərdən bəri iş gününün az qala yarıdan da çoxunu Mirzə Manaf o sovxa dəm çaydanını Sərvər Sadığa bağışlamaq üçün bir münasib məqam axtarmağa

sərf eləmişdi və özünün pensiyaya çıxmağı münasibəti ilə qonşu otaqda düzəldilmiş cah-cəlaldan Mirzə Manafın heç bir xəbəri yox idi.

Mirzə Manafı məclisin başında əyləşdirdilər. Şampanları açıb, Mirzə Manafın şərəfinə sağlıqlar dedilər. Sonra Mirzə Manafa hədiyyələr verildi: Həmkarlar Təşkilatının adından bir qızıl saat, komsomol təşkilatının adından bir dəstə qızılgül... Və şəxsən müdirin adından verilən sonuncu hədiyyəni görəndə Mirzə Manaf özünü saxlaya bilməyib, bir müxtəsərcə ağladı, çünki arif oxucu yaxşı bilir ki, müdirin adından bağışlanan o hədiyyə olsa-olsa məhz o büllur külqabı ola bilərdi və o külqabının altında neçə illərdən bəri Buzbulağın buzları yatırdı...

Dəsmalını çıxarıb, gözünün yaşını siləndən sonra, Mirzə Manaf müdirin sağlığına qaldırılmış badəni axıracan içdi. "Həmişə yuxarılarda olasan, bala!" sözləri ilə ürəyinin ən böyük arzusunu bu gün ikinci dəfə qısa, mənalı, konkret bir şəkildə ifadə eləyib, mandarindən bir dilim də qopartmaq istəyirdi ki, bir də baxıb Sərvər Sadığın qabağındakı konyak şüşəsinin tamam boşaldığını gördü. Mirzə Manaf o səmtə bir də nəzər yetirdi və həmin Sərvər Sadığın sifətində nəsə monoloqa oxşayan bir şeyin də bala-bala qaynayıb-qalxmağa hazırlaşdığını aşkar görəndən sonra məclisi tərk etməyin əsl vaxtı olduğunu başa düşdü...

Sonra Mirzə Manaf bala-bala evə tərəf gedirdi: bir əlində portfeli, bir əlində kağıza bükülü həmin o büllur külqabı...

Və bir az gedəndən sonra Mirzə Manaf bir müddət ayaq saxlayıb, o büllur külqabını da portfelinə yerləşdirdi, çünki o gün günəşli Bakımıza yenə də gün düşmüşdü və guya ki, o günün istisi vursaydı, Mirzə Manafın əlində tutduğu külqabının içindəki buzlar əriyə bilərdi...

*1973*



# SON SÖZ YERİNƏ

## QƏDİM, QARA KÜLƏK

Siz heç təsəvvür də eləyə bilməzsiniz ki, mən – qırx ilin yazanı – əlimə qələm alandan bəri həmişə bir qara küləyin barəsində nəsə yazmağa can atmışam. Mən o qara küləyin öz yazısını indiyəcən yaza bilməmişəm. Ancaq, elə bilirəm ki, hər yazımın yazılması ərəfəsində o külək mənim içimdə həmişə əsib və indiyəcən yazdığım hər bir yazılı sözdə o qara küləyin xofu, həniri, havası var. Küləyin də yaşı, yaddaşı ola bilərmi görəsən?.. Yəqin ki, ola bilməz. Onda, bəs indi niyə mənə elə gəlir ki, o külək çox qədim külək idi, haradansa – sirli-sehrli bir aləmdən Əylisin göyüzünə özüylə bir topa qapqara bulud da gətirmişdi.

O bulud həm də isti idi. Qara qoyun yunu kimi yüngül və yumşaq idi. O qara külək də, söz yox, o qara buludun küləyiydi. Və o qara külək bir xırdaca qoz bağında – qələmə ağacı kimi dikinə uzanıb gedən – uca qoz ağaclarının lap başdakı çılpaq budaqlarının arasında xəfifcə əsə-əsə elə bil o qara buludların sirli-sehrli nağılını bu dünyaya danışırdı.

Dörd bir yandan açıq daş hasarı olan o qoz bağının yol üstdəki girəcəyində bir ağ şallı cavan gəlin durmuşdu. O gəlinin adı Yetim Səfurə idi. O bağcada sıx-sıx yan-yana düzülüb, qələmə ağacı kimi, dikinə uzanıb gedən o qoz ağaclarına da Əylisdə "Yetim Səfurənin qozları" deyirdilər.

Yazın lap əvvəlləriydi. O qozlar hələ heç yarpaq da açmamışdı. Bəs o Səfurə ilin bu vədəsində orada neynirdi görəsən: o bağın girəcəyində o, niyə eləcə tərpənmədən dayanmışdı?.. Səfurə o qoz ağaclarına elə bil ürəyində ovsun duası oxuyurdu, ya da sanki o uca qoz ağaclarının baş budaqlarının arasında qəribə bir uğultu qoparmış o qara küləyin bu dünyaya danışdığı sirli-sehrli nağıl o gün Səfurəni də mənim kimi ovsunlamışdı, onu da əməllicə qorxudub, heyrət içində dondurmuşdu... Hər halda mənə belə gəlirdi. Çünki mən bu dünyanın buludundan, küləyindən o günkü qədər heç vaxt qorxmamışdım.

* * *

Bizim evlə o xırdaca qoz bağının arasındakı real məsafədən danışmağın indi heç bir mənası yoxdur. Çünki uşaq gözü ilə görülən

dünyanın məsafə ölçüləri bambaşqadır: uşaqlıqda öz ayağımızla ilk dəfə getdiyimiz yolun hər qarışı sirr ilə, sehrlə dolu olur və bir uşağın ilk dəfə gördüyü adicə bir çay kənarından və ya dağ yamacından aldığı ilkin təəssürat Kolumbun – Amerikanı kəşf edəndə aldığı təəssüratdan bəlkə çoxdur ki, az deyil.

Bu sözləri yaza-yaza evimizdən o cəviz bağınacan olan yolu gözümün qabağına gətirirəm: əvvəl – evimizin lap qabağındakı həyətimizdən daş hasarla ayrılan bağçamız. O hasardan o yanda da bir bağ vardı və Səfurənin cəvizliyi də elə o bağın o biri tərəfindəydi. Və deməli, tamam başqa bir aləmdə olduğumu zənn etməkdən ötrü o gün elə o bircə bağı ilk dəfə öz ayağımla keçməyim mənə artıqlaması ilə bəs eləmişdi. Bəs, görəsən, mən ora niyə getmişdim? Və, görəsən, o vaxt mən ömrümün neçənci ilini yaşayırdım ki, göyüzünün o qara buludunu həyatımda ilk dəfə görürdüm və dünyanın o qara küləyi məni o dərəcədə sehrləyib, vahimələndirə bilmişdi... İndi yadımda qalan budur ki, o günün leysan yağışı hələ başlanmamış mən özümü qaça-qaça evə yetirə bildim. Sonra hava birdən-birə açıldı və dünyanın o qara buludları sanki o qara küləyə qoşulub, göyüzündən, elə gəldikləri kimi də, qəfılcədən çəkilib getdilər.

Təzəcə batmaqda olan günəşin işığında mən o gün – o çağacan heç vaxt görmədiyim – bir təptəzə Əylis gördüm.

O necə Əylis idi, Pərvərdigara: o rəngləri o dağların üstünə Sən Özünmü çəkmişdin... O rəng, görəsən, doğrudanmı rəng idi: bəlkə rəng deyildi, sənin işığın idi... Və o gün Sənin – o işığın dili ilə – mənə anlatmaq istədiyin nəydi ki, indi, bu qədər vaxt keçəndən sonra da, mən onu anlamaqda acizəm.

Acizəm! Acizəm! Acizəm!.. Və yəqin ki, elə buna görə də az qala 60 il bundan qabaq (bəlkə 4–5 yaşım da tamam olmamış!) körpə gözlərimlə gördüyüm o günün əvvəlki o qara küləyini və sonrakı o, dünya dolusu işığını indi mən hansısa mistik ucalıqlardan bir anlığa yerə enib, sonra qeybə çəkilən sehrli bir vaqiə kimi xatırlaya bilirəm. Və hələ bu, harasıdır, indi – sinnimin bu kövrək vədəsində hətta hərdənbir buna da inanıram ki, o işıqla o qaranlığın arasındakı – bəlkə yarım saat da çəkməyən – o xırdaca vaxtın içində o gün ilk dəfə Allah mənimlə öz dilində danışmaq istəmişdi. Özünün milyon illərdən bəri gördüyü, tanıdığı dünyanı o gün, birinci dəfə, Allah mənə də tanıtmağı lazım bilmişdi. Və əgər belə olmasaydı, əvvəla, mən o günü – bu qədər



aydınlığı ilə – indiyəcən yadımda saylaya bilməzdim. İkinci – bu dünyanın işıqla qaranlığın əbədi çarpışmasından və daimi kontrastından ibarət olduğuna belə dərindən-dərinə inana bilməzdim. Və üçüncüsü də – bu kontrast sonralar mənim nəinki yaşayışımın, elə ömür boyu bütün yazdıqlarımın da əsaslı və həlledici üzvi kefiyyətinə çevrilməzdi.

* * *

Həyatımın hansı işıqla hansı qaranlığın arasında keçdiyini özüm yaxşı bilirəm. Bu kostrastın yazılarımda da daim əks olunduğunu heç olmasa beş-üç oxucum yəqin ki, bilməmiş deyil. Bu acılı-şirinli qisməti Tanrının mənim taleyimə məhz o gün yazdığını düşünməkdə ola bilər ki, bir qədər ifrata da varıram. Ancaq buna tamamilə əminəm ki, əgər yazıçılıq doğrudan da Allah vergisidirsə, Allah o vergini mənə məhz o gün və məhz o küləyin gözəgörünməz qara qanadları üstündə uca göylərdən göndərmişdi. Və bunun bir baiskarı da yəqin ki, o gün – o xırdaca cəviz bağında – o qara küləyin vahiməli uğultusu içində donub qalan o ağ şallı gəlin olmuşdu.

## VƏ SƏN DEMƏ, O GƏLİN ELƏ O GÜN, AXŞAM QATARI İLƏ ƏYLİSDƏN HƏMİŞƏLİK BAKIYA GEDƏCƏKMİŞ!..

"...hə, yazıq Səfurə!.. Deyir: istansıya gedəndə gözünnən minnərmin yaş tökürmüş. Yazığın ürəyi buralardan ayrılmaq istəmirmiş".

"– Axmaqdı da. Burada qalıb guya ağ günə çıxacaqdı? Yenə ərdi də, necə olsa. Öz yaxın qohumdu da, yad deyil ki... Yaşı çox olanda nə olar?"

"– Yaşın demirəm. İndi hanı ki, cavan? Cavannarın hamısı davadadı. Ancaq, deyirlər, arvadı ölməyib o kişinin, qoşulub birinə, uşaqlarını da atıb bunun üstünə, çıxıb gedib. O kişi elə o Səfurəni də burdan alıb aparır ki, orda o uşaqlara baxsın".

"– Baxsın da, uşağa baxmaq nə çətin şeydi ki! Burada qalsaydı, nə olacaqdı?.. Atası yox, anası yox, beş-adtı cəviz ağacından savayı burada nəyi vardı ki, Səfurənin!"

Anamın qonşu evin gəlini ilə elədiyi bu söhbəti mən elə o gün, axşam düşəndə eşitdim. Və bayaq Səfurənin o bağa öz ağacları ilə vidalaşmağa gəldiyini əlbəəl başa düşüb, bəlkə ömründə ilk dəfə

ürəyimdə – səbəbini anlaya bilmədiyim – bir qəribə sarsıntı keçirmişdim, qüssə, kədər duymuşdum. O kədər, əlbəttə, mistik kədər idi: yəni o kədərin mənim qəlbimdə doğulmağının o zaman heç bir aydın, ya real səbəbi ola bilməzdi. Axı o Səfurə heç mənim qohumum-zadım da deyildi və o Səfurənin barəsində mən o çağacan heç vaxt fikirləşməmişdim!..

* * *

Bax, elə məsələ də burasındadır. Bayaqdan məni Allahla, Yerlə-Göylə əlləşməyə vadar eləyən də elə bu, səbəbsiz kədərə az-çox ağlabatan bir səbəb tapmaq istəyidir. İndi, gəlin, o mənzərəni öz xəyalınızda siz də canlandırmağa çalışın: hər yeri bağ-bağatlı bir kəndin içində bir xırdaca cəviz bağı. Göyün üzündə qara buludlar. Yarpağı tökülmüş hündür cəviz ağaclarının çılpaq budaqlarının arasında uğultu, gurultu salmış mülayim yaz küləyi. Bir də – o bağın girəcəyində, öz ağ şalına bürünüb, hərəkətsizcə dayanmış bir gənc qadın. Vəssalam, şüttamam!..

İndi, siz deyin, bu dünyada 60 il ömür sürən – təbiətin həssas bir adamın həyatda müşahidə edə biləcəyi minlərlə əhvalatın içində məhz bu epizodu xüsusilə yadda saxlamağının səbəbi nə ola bilər?

* * *

Qonşuluqdakı gəlinin anamla o söhbətini eşidəndən sonra o Səfurənin barəsində az qala hər gün fikirləşməyə o vaxt məni vadar eləyən nəymiş görəsən: bəlkə sevdalı-müəmmalı xəstəhal Freyd kompleksi idi?.. O gün Səfurənin öz bağı ilə o təhər vidalaşmağında bəlkə mənim gələcək taleyimdən də nəsə vardı və o gün məni o sayaq vahimələndirən o qara külək də bəlkə elə məhz o "nəsə"nin küləyi idi?..

Bunları ayırd eləmək yəqin ki, insan dərrakəsinin işi deyil. Və elə yazıçını da Allah, görünür, bu dünyanın sirlərini açmaq, araşdırmaq üçün yaratmayıb. O, bizi bu sirlərin mövcudluğunu, sadəcə, qeydə almaqdan ötrü yaradıb.

Bəli, sadəcə, qeydə almaqdan ötrü!.. Belə isə bu yazını elə buradaca bəlkə bitirmək olardı – əgər o qədim küləyin qara vahiməsi bir gün məni Bakıda da qəfilcədən yaxalamasaydı...



...1950-ci illərin ortalarıydı. Bakıda texnikumda oxuyurdum və elə o Əylisin eşqinə hərdən şeir də yazırdım. Və günlərin bir günü mən, həyatımda ilk dəfə, şeirlərimi redaksiyaya aparanda Bakının böyük bir binasının beşinci mərtəbəsində yerləşən o redaksiyanın birinci mərtəbəsinin qabağındakı pilləkənin başında Səfurəyə rast gəldim.

Səhər idi. Mənim şeir apardığım o redaksiyada yəqin ki, iş gününün də hələ lap başlanğıcıydı... Və orada – o pilləkənin başında Səfurə (işə bax ki!) samovar salırdı.

Açıq qapıdan Səfurənin yaşadığı alaqaranlıq mənzilin içərisi görünürdü və orada (eynən Əylis qaydası!) yerdə – palaz üstdə yan-yana salınmış yorğan-döşəkdə beş-altı uşaq böyür-böyürə uzanıb yatırdı.

* * *

Və məsələnin mistikliyi bir də burasındaydı ki, o gün də yaz idi. Yazın lap erkən çağıydı və o gün göyüzündə qara bulud olmasa da, ilk dəfə redaksiyaya ayaq basmağımın içimi doldurmuş vahiməsindən açıq-aşkar o qədim küləyin qara iyi gəlirdi.

*1999*

## MÜNDƏRİCAT





**ƏKRƏM ƏYLİSLİ**

**SEÇİLMİŞ ƏSƏRLƏRİ**

"ŞƏRQ-QƏRB"

BAKI-2004

